**SÜLEYMAN RƏHİMOV**

# SEÇİLMİŞ ƏSƏRLƏRİ

**İKİ CİLDDƏ**

**I CİLD**

"ŞƏRQ-QƏRB"
BAKI-2005

*Bu kitab “**Süleyman Rəhimov.** Seçilmiş əsərləri. On cilddə. IV cild”
(Bakı, Azərnəşr, 1971) və “**Süleyman Rəhimov.** Əfsanələr”
(Bakı, Gənclik, 1981) nəşrləri əsasında təkrar nəşrə hazırlanmışdır*

**894.3613 - dc 21**
**AZE**
**Süleyman Rəhimov. Seçilmiş əsərləri.** İki cilddə. I cild. Bakı, “Şərq-Qərb”, 2005, 288 səh.

Xalq yazıçısı Süleyman Rəhimovun adı 1930-cu illərdən yeni Azərbaycan romanının doğuluşu, təşəkkülü və inkişafı ilə sıx bağlı olmuşdur. Milli nəsrimizdə roman janrının diqqətəlayiq nümunələrini yaradan görkəmli yazıçının əsərləri janr baxımından əlvan və müxtəlifdir. S.Rəhimov usta bir romançı olmaqla yanaşı, həm də hekayə və povestlərin, romantik və satirik-yumoristik səpkili nəsr əsərlərinin müəllifidir.

Bu kitaba müəllifin üslubca və mündəricəsindəki oxşar cizgilərin rəngarəngliyi ilə seçilən povestləri, eləcə də xalq yaradıcılığı motivlərinə əsaslanan əsərlərindən seçmələr daxil edilmişdir. 1960-cı illərdə qələmə alınan və nəsrimizdə psixoloji üslubun parlaq nümunələrindən sayılan “Məhtaban”da dərin ictimai-siyasi məsələlərə toxunulur.

“Kəsilməyən kişnərti” əfsanə-povesti isə nağılvarı təfəkkürün orijinal təzahürü olub, müasir problemlərə folklor estetikası baxımından yanaşmağın parlaq ifadəsidir.

“Güzgü göl” əfsanəsində xalq həyatından və xalqa inamdan gələn saf, insanı ucaldan, qanadlandıran romantik pafos var.

Kitabda toplanan maraqlı lövhələr dolu əsərlər müəllifin xalq yaradıcılığına dərin bələdliyini, yüksək istedadını, həyat və insanlar barədə son dərəcə zəngin təsəvvürünü bir daha nümayiş etdirir.

**ISBN 9952-418-84-9**



Azərbaycan Respublikasının Prezidenti
İLHAM ƏLİYEVİN
**"Azərbaycan dilində latın qrafikası ilə kütləvi nəşrlərin həyata keçirilməsi haqqında"**
12 yanvar 2004-cü il tarixli sərəncamı ilə nəşr olunur və ölkə kitabxanalarına hədiyyə edilir



## ÖN SÖZ

Süleyman Rəhimov yeni dövr Azərbaycan ədəbiyyatının görkəmli nümayəndələrindən biridir. Onun yaradıcılığı Azərbaycan nəsrinin böyük bir inkişaf dövrü ilə sıx surətdə bağlıdır. S.Rəhimovun romanları milli nəsrimizdə bu janrın diqqətəlayiq hadisələrindən sayılır. Bu romanlar üçün epoxal hadisələri əhatə etmək, epiklik, insanı əsrin mürəkkəb siyasi-ictimai hadisələrinin burulğanında göstərmək, realizm, psixologizm, xalq dili zənginliklərindən sənətkarlıqla bəhrələnmək kimi gözəl xüsusiyyətlər səciyyəvidir.

* * *

Süleyman Hüseyn oğlu Rəhimov 1900-cü il mart ayının 22-də Qubadlı nahiyəsinin Əyin kəndində dünyaya gəlmişdir. Atası yoxsul olmuşdur, lakin oğlunun təhsil almasına çalışmışdır. S.Rəhimov kənd mollasından əlifbanı öyrənmiş, sonra Qubadlıda beşillik rus məktəbində oxumuşdur. Gələcək ədibin uşaqlıq və gəncliyi çətin illərə, inqilabi mübarizələr və sarsıntılar dövrünə təsadüf etmişdir. O, milli dövlətin qurulduğu və fəaliyyət göstərdiyi illəri görmüşdür. O vaxt S.Rəhimovun 18-20 yaşı var idi. Azərbaycanda sovet hakimiyyəti milli demokratik respublikanı devirdikdən sonra S.Rəhimov nahiyə inqilab komitəsində kənd mirzəsi işləmişdir. 1921-ci ildə Şuşada açılmış pedaqoji kursa göndərilmiş və burada təhsilini başa vurduqdan sonra Qubadlı, Laçın, Zəngəzur rayonlarında bir müddət müəllimlik etmişdir. Müəllimliklə yanaşı o, çalışdığı kənd və rayonlarda həm də ictimai işlərdə fəal iştirak etmişdir. Təhsilinin azğınlığını hiss edən S.Rəhimov 1928-1931-ci illərdə Azərbaycan Dövlət Universitetinin tarix fakültəsində oxuyur, həm də fəhlə rayonlarında savadsızlığı ləğv edən kurslarda dərs deyir.

Ədibin yazıçılıq fəaliyyətinə başlaması da bu illərə təsadüf edir. O, hələ universitet tələbəsi ikən “Şamo” romanının ilk variantını yazmış və roman 1931-ci ildə çapdan çıxmışdır. Universiteti bitirdikdən sonra S.Rəhimov bir müddət partiya və dövlət işlərində fəaliyyət göstərmişdir. Rayon partiya komitəsinin katibi, Bakı partiya komitəsində təbliğat işləri üzrə katib, Azərbaycan partiya komitəsində təbliğat-təşviqat şöbəsinin müdir müavini vəzifələrində çalışmışdır. O, 1941-45-ci illər müharibəsi dövründə Sovet qoşun hissələri ilə Təbrizə gedir. Cənubi Azərbaycanın bir çox şəhər və kəndlərini gəzir. “Vətən yolu” qəzetində “Səngərli” imzası ilə çıxış edir, Təbriz uşaqlarının ağır həyatını təsvir edən “Nənənin ölümü” hekayəsini çap etdirir.

S.Rəhimov Azərbaycan Yazıçılar İttifaqına rəhbərlik etmişdir (1954-1958). İctimai və ədəbi fəaliyyətinə görə orden və medallarla təltif olunmuş, Sosialist Əməyi Qəhrəmanı adına layiq görülmüşdür (1975).

S.Rəhimov 1983-cü ildə oktyabrın 11-də vəfat etmiş, Bakıda Fəxri xiyabanda dəfn edilmişdir.

* * *

S.Rəhimov yeni – sovet dövrü Azərbaycan ədəbiyyatında nəsrin inkişafı sahəsində misilsiz xidmətləri olan bir ədib kimi tanınmışdır. Yarıməsrlik yaradıcılıq fəaliyyəti ərzində o, nəsrdə ədəbiyyatımızın bu dövrünün ən mühüm vəzifələrini həyata keçirmiş, xalqımızın tarixini və həyatını əks etdirmək yolu ilə irəliləmişdir.

S.Rəhimov hər şeydən əvvəl, məşhur bir romançıdır. 30-cu illərdə yeni Azərbaycan romanının doğuluşu, təşəkkülü və inkişafı bilavasitə və yazıçının yaradıcılığı ilə sıx surətdə bağlı olmuşdur. Maraqlıdır ki, S.Rəhimov ədəbiyyata romanla gəlmiş və roman bütün çoxillik yaradıcılıq fəaliyyəti dövründə onun nəsrinin əsas janrı olaraq qalmışdır. Düzdür, S.Rəhimovun nəsri janr cəhətdən əlvan və müxtəlifdir. O, hekayə və povestlərin, romantik və satirik-yumoristik səpkidə yazılmış nəsr əsərlərinin də müəllifidir. Lakin bununla belə, S.Rəhimov hər şeydən əvvəl, mahir və usta bir romançıdır. Roman ədibin yaradıcılığında əsas və mərkəzi yer tutur. Onun qələmindən çıxmış romanlarda xalqımızın həyatı, milli xarakteri elə geniş və realist dərinliklə əks olunmuşdur ki, bu romanlar yalnız ədibin yaradıcılığında deyil, yeni dövr Azərbaycan ədəbiyyatında mühüm hadisələrdən hesab edilir.

S.Rəhimov çoxcildli romanların müəllifidir. "Şamo", "Saçlı" bu cəhətdən xüsusilə diqqətəlayiq əsərlərdir. Həmin romanlarda yazıçı qəhrəmanlarını əsrin və həyatın böyük ictimai hadisələri və konfliktləri içərisində alıb təsvir etmiş, əsas obrazların xarakterlərini açmış, insani keyfiyyətlərini göstərmişdir. Belə qiymətli romanlardan biri "Şamo"dur. S.Rəhimov bu romanla ədəbiyyata gəlmiş və əsər üzərində əlli ilə yaxın gərgin işləmişdir. Romanın 1931-ci ildə işıq üzü görmüş variantı çox yığcam və kiçik həcmli olmuşdur. Xeyli keçəndən sonra, 1940-cı ildə əsərin hadisələrin epik təsvirini verən yeni variantının birinci cildi, 1949-cu ildə isə ikinci cildi çapdan çıxmışdır. Bu roman müasir Azərbaycan ədəbiyyatının böyük bədii nailiyyəti olaraq qarşılanmışdır. Romanın üçüncü cildi 1964-cü ildə, sonuncu cildi isə 1978-ci ildə nəşr olunmuşdur. Beləliklə, "Şamo" ədibin demək olar ki, yaradıcılıq fəaliyyətinin böyük bir dövrü ərzində onun yol yoldaşı olmuşdur. Arada "Saçlı" (1939-1948), "Ağbulaq dağlarında" (1955-1956), "Ana abidəsi" (1961-1967), "Qafqaz qartalı" (1966-1970) romanlarını, bir neçə povestini yazsa da, yazıçı fikrən "Şamo"dan, onun qəhrəmanlarından ayrılmamışdır. Romanın gələcək taleyi, hadisələrin necə inkişaf edəcəyi, qəhrəmanların mübarizəsi və həyatı onu heç vaxt rahat buraxmamışdır. S.Rəhimov məqalələrinin birində yazırdı ki, "bədii yaradıcılıq dərin tədqiqat və psixoloji axtarışdır". Ədibin romanlarının hər biri, o cümlədən "Şamo" da bunu təsdiq edir. Roman üzərində yazıçının çoxillik işini həqiqətən də "dərin tədqiqat və psixoloji axtarış" hesab etmək mümkündür.

Roman əsrin əvvəllərində, daha dəqiq desək, 1917-1920-ci illərdə Azərbaycanda cərəyan etmiş hadisələri, xalq hərəkatını, mürəkkəb ictimai prosesləri epik vüsət və genişliklə əks etdirir. Vaxtilə bu cür əsərlərin mövzusu və buna uyğun olaraq onların janrı inqilabi-tarixi mövzu və janr kimi təyin edilirdi. Lakin qeyd edilməlidir ki, inqilabi-tarixi cəhət bu romanın mövzu və janrının yalnız bir xüsusiyyətidir. Əslində "Şamo" yalnız inqilabi proseslərin yox, XX əsrin əvvəlində Azərbaycan xalqının milli azadlıq hərəkatını əks etdirən bir romandır. Burada yazıçı Azərbaycanın ucqar rayonlarının birində – Şehli kəndində baş vermiş hadisələri, yoxsullarla varlı təbəqələr arasında mübarizəni qələmə almışdır. İlkin mərhələdə bu mübarizə yoxsulların öz namuslarını, ailə və nəsil qeyrətlərini qorumaq mübarizəsi kimi meydana çıxır, lakin tədricən bu ailə-məişət mübarizəsi zamanın ictimai prosesləri ilə birləşərək, ölkədə cərəyan edən siyasi hərəkatla əlaqədə dərinləşir və vüsət alır, azadlıq hərəkatı miqyası kəsb edir. Şehlidə bu mübarizənin bir qütbündə Hatəmxan, Turabxan, Maro və başqaları, o biri tərəfində Alo, Safo, Şamo, Fərzəli və başqaları durur. Roman yoxsul Safonun qızı Gülsənəmin Hatəmxanın oğlu Maro tərəfindən qaçırılması ilə başlanır və bu hadisə ilə əsərin epik axarı şaxələnir. Gülsənəm qaçırılmışdır, beləliklə, Maro yoxsul Safonun, onun oğlu Şamonun namusuna toxunmuşdur. Ancaq yazıçı romanı yalnız bu hadisə ilə çərçivələndirməyib, onun vasitəsilə Azərbaycan kəndinin 1917-1920-ci illərdəki sosial mənzərəsini canlandırmağa daha böyük əhəmiyyət vermişdir. Yazıçının qəhrəmanları Şamo və Fərzəli də bu mübarizənin alovları içərisində bərkiyir və mətinləşir. Şamo romanda böyük bir mübarizə məktəbi keçir, siyasi mübarizədə yeniləşir. Yazıçı Şamonun simasında siyasi hadisələr burulğanına düşmüş yeni Azərbaycan gəncliyinin obrazını təcəssüm etdirə bilmişdir.

Aydındır ki, S.Rəhimov "Şamo" romanını sovet ədəbiyyatının prinsipləri mövqeyindən yazmışdı və buna görə romanda bir çox tarixi hadisələri, məsələn, 1918-1920-ci il hadisələrini, türk ordusunun xilaskarlıq məqsədilə Azərbaycana daxil olmasını, müsavat hökuməti dövrünü indi başa düşülən mənada göstərə bilməmişdi. Lakin bu cəhətlərlə yanaşı, əsərin əhəmiyyətini, Azərbaycan romanının inkişafında tutduğu yeri də danmaq olmaz. Qeyd olunmalıdır ki, 1917-1920-ci illərin hadisələri tariximizin son dərəcə mürəkkəb və ziddiyyətli hadisələrindəndir. Müxtəlif zamanlarda bu hadisələrə münasibət də, o cümlədən onların bədii ədəbiyyatda inikası da mürəkkəb olmuşdur. S.Rəhimov həmin hadisələri 30-40-cı illərin ideoloji meyarlarından çıxış edərək romanında əks etdirmişdir. Hazırda isə həmin hadisələrə daha obyektiv münasibət yaranmaqdadır və təbiidir ki, onları indi biz tamamilə yeni şəkildə, yeni siyasi təfəkkürlə izah etməli və qiymətləndirməliyik. Ancaq bu cür yanaşma romanın roman olaraq məziyyətlərini, onda dövrün mürəkkəb hadisələrinin əks olunması xüsusiyyətlərini görməyimizə və qiymətləndirməyimizə mane olmamalıdır.

“Şamo” mürəkkəb, ziddiyyətli, hətta faciəvi və dramatik bir epoxanın gerçəkliklərini, insanlarını təsvir etmək sahəsində milli romanımızın ilk təşəbbüsüdür və bu cəhəti ilə həm yazıçının yaradıcılığında, həm də ədəbiyyatımızın inkişafında mühüm bir hadisədir.

“Şamo”nun üzərində işlədiyi dövrdə S.Rəhimov ikinci romanı olan “Saçlı”nı yazır və 1944-cü ildə romanın ilk cildini çap etdirir. Bu romanda da yazıçı böyük bir dövrü – 30-cu illərdən başlamış müharibənin qurtardığı ilk illərə qədərki bir dövrü əhatə etməyə çalışırdı.

Əsərdəki hadisələr çoxşaxəli olsa da, bu hadisələrin axınında çoxlu insanlar göstərilsə də, onun əsas, mərkəzi surəti – işlədiyi kənddə hamının Saçlı adlandırdığı Ruxsarə adlı həkim qızdır. Bakıda tibbi təhsil alan Ruxsarə 1931-ci ildə uzaq bir kəndə göndərilir. O, Bakı fəhləsi Xəlilin, təmiz və alicənab Nənəqızın qızıdır. İndi o, ucqar bir rayona düşmüşdür. Qoşa qalın hörükləri olduğu üçün hamı onu Saçlı adlandırır. Ruxsarə nəinki təmiz və namuslu qızdır, həm də qeyri-adlı gözəlliyə malikdir. Ədib romana həsr etdiyi “Müəllif qeydləri”ində onun haqqında belə yazmışdır: “Kənardan dayanıb süzəndə Ruxsarə ucaboylu, qoşa hörüklü, ala gözlü füsunkar bir qız, bəlkə də gözəllik ilahəsidir. Bu gözəllik ilahəsi” dərhal hamının diqqətini cəlb edir. Belələrindən biri də rayon icraiyyə komitəsinin sədri Qəşəm Sübhanverdizadədir. Qəşəm sovet quruluşunda məsul vəzifə daşısa da, əslində o, bu quruluşa qarşıdır, onun qəddar düşmənidir. O, xarici kəşfiyyat üçün bu rayonda fəaliyyət göstərir. Ruxsarənin düşdüyü rayonda banditizmə qarşı mübarizə gedir. Bu mübarizəyə rayonun yeni adamları – Tahir Dəmirov, Xosrov və başqaları başçılıq edirlər. Ruxsarə də bu mübarizədən kənarda qalmır, ona qoşulur, silah götürüb Zülmət kimi banditlərə qarşı atışmalarda iştirak edir, bu mübarizənin qəhrəmanlarından biri olan Xosrov onun əlləri üstündə keçinir.

Romanda S.Rəhimovun daha böyük diqqət yetirdiyi, epik hadisələrin mərkəzinə çəkdiyi ikinci surət Tahir Dəmirovdur. O, rayon partiya komitəsinə başçılıq edir. Tahir dərin insani keyfiyyətləri ilə də romanın əsas surətlərindəndir. O, Moskvada təhsil almışdır və Bakıda qalıb yüksək bir vəzifədə işləyə bilərdi. Lakin Tahir geridə qalmış ucqar bir rayona könüllü olaraq işə gəlir və o, burada Sübhanverdizadə kimi qapalı düşmənlərlə mübarizə aparır. Yazıçı özü deyirdi ki, bu romanı iki surətə görə qələmə almışdır. Onlardan biri Ruxsarədirsə, ikincisi Tahir Dəmirovdur. Tahir işə gəldiyi rayona yenilik gətirir, yol çəkdirir, burada maarifi, mədəniyyəti inkişaf etdirir. Yazıçı onu həm də insan kimi ətraflı göstərmişdir. Müəllif bu surətdən danışarkən yazırdı: “O, vaiz deyil, insandır, pərəstiş etməli, öyrənməli, layiqli insandır”. Tahir romanda belə də göstərilmişdir.

S.Rəhimovun başqa romanları da vardır. Bu romanlarda da yazıçı ictimai problemlər qaldırır, real həyat həqiqətlərini əks etdirir. “Ana abidəsi”, “Ağbulaq dağlarında” və s. romanları belə əsərlərdəndir.

S.Rəhimov xalq qəhrəmanlarının obrazına əsərlərində geniş yer verən bir yazıçıdır. "Aynalı" (1942) povestində o, xalq qəhrəmanları Qaçaq Nəbi və Həcərin təkrarsız obrazlarını yaratmışdır. "Aynalı"da, habelə başqa əsərlərində yazıçı folklordan yaradıcılıq yolu ilə bəhrələnmişdir.

Satirik nəsrin də bir sıra gözəl nümunələrini yaratmış görkəmli ədib üçün psixoloji üslub daha çox səciyyəvidir. Müharibə illərində yazdığı "Medalyon" (1944), habelə 60-cı illərdə qələmə aldığı "Məhtaban" povestləri nəsrimizdə bu üslubun parlaq nümunələri sayılmağa layiq əsərlərdəndir.

S.Rəhimovun realist psixoloji üslubda yazdığı nəsr əsərlərindən biri "Mehman"povestidir. Ədib onu 1944-cü ildə yazmışdır. Şamo, Ruxsarə, Tahir kimi təqdirəlayiq qəhrəmanlar cərgəsində bu povestin qəhrəmanı Mehman da qeyd olunmağa layiqdir. Hətta belə demək olar ki, Mehman ədibin yaratdığı müsbət qəhrəmanlar sırasında özünəməxsus, fərdiləşdirilmiş xüsusiyyətlərə malik bir insan portretidir və ədibin yaradıcılığında o, xüsusi bir yer tutur.

"Mehman" povestində yazıçı bölgə prokurorunun həyat və mübarizəsini təsvir edir. Başqa sözlə, qanunçuluq, qanunun aliliyi, hamının qanun qarşısında məsuliyyət və bərabərliyi bu povestin mövzusudur. Bu mövzu müəyyən dərəcədə "Saçlı" romanında yazıçını maraqlandırmışdır. Lakin povestdə o, əsas və aparıcı mövzu kimi qoyulub, bütün hadisələr həmin mövzu ətrafında mərkəzləşdirilibdir. Əsərin mövzusu onun ideyasını, burada təsvir olunan insanların xarakterini və simasını təyin edir. Qanunun aliliyi uğrunda mübarizə – povestin əsas ideyası kimi müəyyən edilə bilər. Qanunun aliliyini təmin etmək isə ədalətsizliyə qarşı mübarizə etmək, qeyri-insaniliyi, özbaşınalığı kəskin mühakimə etmək deməkdir. Yazıçı bu ideyanı povestin əsas qəhrəmanı Mehmanın obrazında təcəssüm etdirmişdir. Mehman povestin baş qəhrəmanıdır və əsərin ideyası, konflikti və bilavasitə onun mübarizəsi, hadisələrin inkişafında mövqeyi ilə bağlıdır.

Mehman gənc hüquqşünasdır. Onun qarşısında iki yol vardır: bu yollardan biri Bakıda qalıb hüquq alimi kimi yetişməkdir. Onun müəllimi professor Məlikzadə də belə düşünür və hesab edir ki, Mehman kafedrada qalıb elmi işlə, hüququn nəzəriyyəsi ilə məşğul olsa daha yaxşıdır. Lakin Mehman özü belə düşünmür. O, həyat sınağından çıxmaq istəyir. İstəyir ki, ali məktəbdə qazandıqlarını həyata tətbiq etsin. Ədalətsizliyə qarşı tədqiqat vasitəsilə yox, prokuror kimi, təhqiqat vasitəsilə şəxsən mübarizə etsin. Ədibin də əsas qayəsi belədir. O, Mehmanın simasında namuslu bir ədliyyə işçisinin, təmiz və pak bir qanun müdafiəçisinin obrazını yaratmaq istəmişdir. Göründüyü kimi, yazıçı qəhrəmanın qarşısında böyük, ciddi, çətin və eyni zamanda şərəfli vəzifə qoyur: xəyanəti, cinayəti mühakimə etmək, hətta bu cəhətdən ən yaxın və doğma adama qarşı da ədalətlə hərəkət etmək vəzifəsini! Aydındır ki, belə bir ciddi vəzifə üçün qəhrəman hər şeydən əvvəl, şəxsiyyət olaraq yüksək və ali prinsiplərlə yaşamalı, onun apardığı mübarizənin mənəvi əsasları sağlam və etibarlı olmalıdır. Bu yaradıcılıq vəzifəsini yaxşı dərk edən yazıçı qəhrəmanını

mürəkkəb həyat hadisələrinin burulğanı içərisinə salır, onu real çətinliklərlə üzləşdirir, həyat və qanunun sınağından keçirir. Bu isə təbii olaraq povestdə konfliktin dərin və kəskin şəkildə qurulmasını şərtləndirmişdir. Belə ki, Mehman cinayətin izinə düşərkən bu iz onu hətta öz ailəsinə, qaynanası Şəhla xanıma doğru aparır. Başqa sözlə, o, cinayətə qarşı ədalətli mübarizəni yalnız kənar mühitdə yox, ailəsində də aparmalı olur.

Mehman fəaliyyətə başlarkən ağ saçlı müəllimısi Məlikə ona demişdi ki, prokuror olmaq çətin işdir, burada çox asanlıqla ləkələnmək olar. “Unutma ha!.. Ləkə pis şeydir. Heç unutma!” Prokuror kimi fəaliyyətə başlarkən müəllimısinin bu sözünün həqiqət olduğunu Mehman bir daha dərk edir. Mehman yaxşı, namuslu, təmiz adamlar mühitində tərbiyə almışdır. Hətta anası onun prokuror olmasını istəmir. Ana oğluna belə deyir: “Yox, oğlum, yox! Bu adamların dalınca həmişə danışıq olur”. Bu mənada professor Məlikzadə də öz aləmində haqlıdır. O, məhz asanlıqla ləkələnmək qorxusundan Mehmanın rayona getməsinə razı ola bilmir. “Yox, oğlum! Mən razı ola bilməyəcəyəm. Səbəbi? Ləkə! Gül kimi uşaqlar qurtarır, nə olur?”

Əlbəttə, anası da, müəllimləri də təşvişlərində müəyyən qədər haqlıdırlar. Həyatda Mehman kimi təmizlər çox ləkələnir, məhv olur, yaxud pozulur, hüquqşünas adını ləyaqətlə daşıya bilmirlər. Belə bir çətinliklə Mehman da üzləşir və qəhrəmanın mənəvi sifətləri, əqidə və vicdan saflığı, aldığı tərbiyəyə sədaqəti də məhz belə məqamlarda onun köməyinə gəlir. “Daxilən vicdanı təmiz və pak ol!” – Mehmanın aldığı tərbiyənin əsas prinsiplərindən biri budur. Daxilən təmiz vicdanlı olmadan ədalətli olmaq, qanunun aliliyini qorumaq qeyri-mümkündür. Mehman bu həqiqəti yaxşı bilir və dərk edir, fəaliyyətində də onu gözləyir, ona əməl edir.

Mehman öz arzusu ilə ən ucqar bir rayona gəlir və burada prokuror kimi fəaliyyətə başlayır. Onun işə başladığı rayonda isə vəziyyət həqiqətən pisdir və dözülməzdir. Rayon cinayətlər yuvasıdır. Baş ittihamçı Mehmanı rayona işə təyin edərkən belə deyir: “Düzünü desəm, bizim canımızı lap xirtdəyimizə yığıblar. Biz buraya adam göndərməkdən yorulmuşuq, onlar ləkə vurmaqdan yorulmayıblar”. Beləliklə, Mehman məhz belə bir rayonda qanunçuluq fəaliyyətinə başlayır.

Bu rayon həqiqətən prokurorun fəaliyyəti üçün əsil sınaq meydanı olur. Çünki rayonda cinayətkarların çoxu dövlət adamlarıdır, vəzifəli şəxslərdir. Bunlardan biri rayon icraiyyə komitəsinin sədri Kamilovdur. O, ətrafına natəmiz və cinayətkar adamları toplamışdır, bilavasitə cinayətkarlarla əlaqə saxlayır. Bunlar Sərrafzadə, Məmmədxan, Zərintac və başqalarıdır. Bu adamların Bakıda ədliyyə orqanlarında da Əbdülqədir kimi havadarları vardır. Onlar Mehmanın meşşan təbiətli qayınanası vasitəsilə daha böyük vəzifə sahiblərinə, Bakıda oturan “böyüklərə” yol tapırlar.

Yazıçı təsvir edir ki, Mehmanın işə başladığı ərazidə ağır cinayətlər baş vermişdir. Müstəntiq Murtuzov Kamilovla birləşərək bu cinayətlərin üstünü

hər vasitə ilə örtür. Belə cinayətlərdən biri anbardar Məmmədxanın öz arvadını öldürməsidir. Kamilovun təhriki ilə müstəntiq Murtuzov qatili hər vasitə ilə təmizə çıxarıb. Prokuror Mehman isə qatilin izinə düşür və cinayətin üstünü açmağa başlayır. Bundan vahiməyə düşən qüvvələr hər vasitə ilə Mehmana mane olmağı qərar alırlar; buna görə də Qaloşlu adam vasitəsilə Mehmana təzyiq göstərirlər. Beləliklə, povestdə Mehman cinayətin vahiməsi ilə həm işdə, həm də ailəsində üzləşməli olur.

Onun üçün Məmmədxan kimi qatillər dəhşətli deyildir, dəhşətli olan arvadının Qaloşlu adam vasitəsilə cinayətkarlarla əlaqəyə girməsi, canilərin onun ailəsinə yol tapmalarıdır. Mehman bunları bildikdə qəti və sərt hərəkət edir. O, iclasda təmizlikdən, qanunun aliliyindən danışdığı yerdə Qaloşlu adamın istehzalı baxışlarının ona çevrildiyini hiss edir və bu məqamda öz arvadının qolundakı qızıl saatı xatırlayır. Hiss edir ki, Qaloşlu adamın istehzalı baxışı bu qızıl saatla bağlıdır. Yazıçı qəhrəmanın bu ruhi vəziyyətini belə təsvir etmişdir: "Ürəyindən bir səs gəlirdi... bir çıqqıltı eşidilirdi... Xırdaca saatın əqrəbi ahəstəcə yeriyir, saat çıqqıldayırdı. Parıltısı aynaya düşən qızıl saat onun gözlərini yumdu, saat ürəyində çıqqıldadı. Elə bil ki, dünya Mehmanın başına uçdu. İclasdakı vəziyyətinin səbəbini başa düşdü. Xal düşmüş ürəkdən bir çıqqıltı ona cavab verdi: çıq-çıq..." Yazıçı Mehmanın gərgin ruhi vəziyyətini, evində gördüyü qızıl qadın saatının məhz Qaloşlu adamın əlilə onun evinə yol tapmasını necə hiss etdiyini psixoloji dəqiqliklə ifadə edə bilmişdir.

Lakin cinayətkar qüvvələr Mehmanı qorxutmur. O, nəinki kənardakı canilərlə, evindəki adamlarla da, qayınanası Şəhla xanımla da, arvadı Züleyxa ilə də sərt davranır. Züleyxa, əlbəttə, anası Şəhla xanım deyildir. O, səhv addım atdığını bilir və həyəcan keçirir. Şəhla xanım isə son dərəcə hiyləgər və meşşan bir qadındır.

Povestdə yazıçı bir sıra nəcib insan surətləri yaratmışdır. Məlikə xanım, Məlikzadə, onun qızı Dilgüşa belə təsir bağışlayırlar. Bunlardan Mehmanın anası Xatun xüsusi qeyd olunmalıdır. Yazıçı povestdə ona bir qədər az diqqət vermişdir, buna baxmayaraq bu qadın – Xatun ana nəcibliyi, ana qəlbi ilə oxucusunu mütəəssir edir, yadda qalır.

Mənfi tiplər içərisində xüsusilə Qaloşlu adam çox canlı və dolğun çıxmışdır. O, povestdə cinayətkarlığın rəmzi kimi ifşa olunur.

"Mehman" ədibin realist-psixoloji üslubda yazdığı yüksək dərəcədə maraqlı bir povestdir.

Yazıçının "Məhtaban" (1962), "Güzgü göl əfsanəsi" (1967), "Kəsilməyən kişnərti" povestləri isə üslubca və mündəricəsindəki oxşar cizgilərin maraqlı rəngarəngliyi ilə fərqlənir. Müəllif əgər "Öz minnətinə" povestində heç kimə əyilməyən, məğrur təbiətli bir insanın obrazını yaradırsa, "Məhtaban"da dərin ictimai-siyasi problemlərə toxunur. Yoxsul, lakin azadlıq ideyaları ilə çırpınan Məhtabanın mənəvi gözəlliyi, onun hər cür saray çəkişmələrindən yüksəkdə dayanan və azadlıq arzuları ilə döyünən qəlbi, fikir

və hissləri ustalıqla qələmə alınmışdır. Öz taleyini qoca Məmalik xanla bağlayan Məhtabanın saf duyğuları yaşadığı mühitin dar çərçivəsinə sığmır. Onun həyatını Məmalik xanın yaxın adamları zəhərləmək üçün yeganə övladının əmgəyinə riyakarlıqla iynə yeridib, faciəli ölümünə səbəb olurlar. Bu povestdə insanın yaşayıb-yaratmaq eşqi, məhəbbət hissləri, qoca Məmalikin həyat eşqi və Məhtabana olan saf duyğuları xüsusi hərarətlə, humanist mövqedən əks etdirilmişdir.

S.Rəhimovun bütün yaradıcılığına xas olan saf, insanı ucaldan, qanadlandıran romantika bu povestin bütün ruhuna hopdurulmuşdur. Xalq həyatından və xalqa inamdan gələn bu romantik pafosu biz onun "Güzgü göl əfsanəsi"ndə də görürük. Maral əfsanəvi gözəlliyə malikdir. O, müqəddəs suda yuyunub, daranıb özünə məftun olur və istəyir ki, hamı onu tərifləsin. Onun yeganə həmdəmi həmişə şadlıq elçisi Qəcələdir. Qəcələ başa düşür ki, hədsiz tərif insanı yıxa bilər. Çaqqal Maralın bu zəifliyindən istifadə edib onu boş, yağlı vədlərlə tərifləyir. O, guya Maral xanımın yolunda ölümə belə getməyə hazırdır. Buna görə onu ağızdolusu tərifləyib, Güzgü göldən uzaqlaşdırıb parçalamaq istəyəndə Qəcələ Çaqqalın gözünü deşir. Maral xəyanəti görüb, səhvini başa düşür. Yersiz tərifdən ancaq çaqqallar qazanır. Həm də gözəllik bitib-tükənməyən sərvət deyildir, onu qorumaq, qədrini bilmək, bəd nəzərlərdən hifz etmək lazımdır.

"Kəsilməyən kişnərti" povestində də xalq yaradıcılığından süzülüb gələn obrazlar bir növ günün vacib problemlərilə qaynayıb-qarışır, yazıçı qələmi ilə yeni məna alıb yüksək sənət səviyyəsinə qalxır. Povestdə hadisələr Göyəzən dağında cərəyan edir. Göyalı və Qaratelin yeddi qızları var. Bütün ailə oğul həsrətilə yaşayır. Nəzir-niyazdan sonra Göyalının oğlu olur. Körpənin adını Şükran qoyurlar. Oğul Şükran böyüdükdən sonra ona ən yaxın həmdəm atı Ulduz olur. Şükran gözəl, mərd və cəsarətlidir. Onun atı Ulduz fədakarlıq, zirəklik, cəsarət rəmzidir. Mozalan isə bədxahlığın, riyakarlığın, şərin uğursuzluğun timsalıdır. Yazıçı bütün bu obrazlara şərti-metaforik bir libas geyindirsə də, onların təmsil etdikləri ideyalarda dərin müasirlik ruhu var.

"Bəhram və Zərəfşan" povestində də təlim-tərbiyə, saf insani münasibətlərə, həmçinin insan həyatını bəzəyən və gözəlləşdirən məhəbbətə toxunulmuşdur. Bəhram da, Zərəfşan da müəllimdir və gəncliyin tərbiyəsində nümunə olmağa layiqdirlər.

"Uğundu" (1965) povestini S.Rəhimov böyük ədibimiz Cəlil Məmmədquluzadənin xatirəsinə həsr etmişdir. Povestdə əliəyrilərin, rüşvətxor və fırıldaqçıların əməlləri ifşa olunur. Eyni yazı tərzi, yəni əyriliyi, oğurluğu, müftəxorluğu tənqid, halal zəhməti, əməyi təbliğ "Pirqulunun kürkü" povestində də mühüm yer tutur. Bu əsərlərin əsas qayəsi saflığın, təmizliyin qorunmasından ibarətdir. Təsadüfi deyil ki, yazıçı surətlərin birinin dili ilə deyir: "Haramı buraxsan, daraşıb dünyanı yeyər". Povestin əsas qəhrəmanı düzlüyün, hala zəhmətin, dözüm və iradənin canlı ifadəsidir.

“Kəpəz” povestində isə S.Rəhimov yenə də xalqın gözəl adət-ənənəsinin, təbii gözəlliklərinin qorunması məsələsinə toxunmuşdur. Öz ailəsi ilə Kəpəz dağı ətəyində istirahət edən professor Ərşad Ərşadzadə xalqın varlığı ilə bağlı el havalarını, sazı, bayatıları, təbiət gözəlliklərini dərin məhəbbətlə sevir. O, oğlu Şahini də bu ruhda tərbiyə edir. Onun arvadı Cavahir xanım isə ərinin saza, el havalarına olan aludəçiliyini köhnəlik əlaməti kimi qiymətləndirir. Professorun sazı xalçanın üstündən asması onu əsəbiləşdirir. Yazıçı obrazlı şəkildə belə bir fikri təlqin edir ki, insan təbiətin ecazkar gözəlliyindən zövq almalı, mənsub olduğu xalqın mütərəqqi və işıqlı adət-ənənələrini qorumalı, onlardan bəhrələnməlidir.

S.Rəhimov hekayə janrında klassik nümunələr yaratmışdır. Ədib “Pəri çınqılı” (1959), “Gülən balıq” (1964), “Gülsabah” (1968) kimi kitablarında topladığı əsərlərində xalq yaradıcılığı motivlərinə əsaslanıb uşaq dünyasından rəngarəng, maraqlı lövhələr yaratmışdır. Onun folklordan istifadə edib yazdığı hekayələri müəllifin xalq yaradıcılığını mükəmməl bildiyini, canlı, həyati lövhələr yaratmaq, qüvvətli yumora və satirik qələmə malik olduğunu, yüksək istedadını, müdrikliyini, həyat və insanlar barədə zəngin təsəvvürünü bir daha nümayiş etdirir.

S.Rəhimov nəsrin müxtəlif janrları arasındakı sərhədi çox gözəl bilir və hər janra uyğun həyat materialı seçir. Psixoloji dərinlik, surətin düşdüyü vəziyyətin, mühitin bədii təhlili onun nəsrini səciyyələndirir. Bu xüsusiyyət ədibin roman və povestlərində olduğu kimi, “Su ərizəsi”, “Üzsüz qonaq” kimi hekayələrində də aydın görünür.

* * *

S.Rəhimovun bir sıra ədəbi-tənqidi məqalələri vardır ki, onların bir qismi “Yazıçı və həyat” kitabında toplanmışdır. Bu məqalələrdə zəngin həyat təcrübəsinə malik yazıçının xalq yaradıcılığı, xəlqilik, konflikt, müsbət qəhrəman, ədəbi tənqid və s. barədə mülahizələri öz əhəmiyyətini saxlamaqdadır.

S.Rəhimov xalq dilinə, Azərbaycan dilinin bədii ifadə imkanlarına dərindən bələd yazıçıdır. Onun üslubunda klassik və müasir ədəbi-bədii dilimizin ən yaxşı ənənələri birləşmişdir. S.Rəhimovun dil və üslub cəhətdən Azərbaycan nəsrinin böyük klassiki C.Məmmədquluzadəyə yaxın olduğunu deyənlər haqlıdırlar. Xalq danışıq dilinin və onun zəngin ifadə xüsusiyyətlərinin incəliklərindən məharətlə istifadə hər iki sənətkarı dil və üslub cəhətdən bir-birinə yaxınlaşdırır. Ölməz ədibin duzlu yumoristik və kəskin satirik üslubunu S.Rəhimov böyük ustalıqla mənimsəmiş, onun yaxşı davam və inkişaf etdiricilərindən biri kimi tanınmışdır.

*Balaş Azəroğluna və*
*Mədinə xanım Gülgünə*
*ithaf olunur*

1

Ərdəha xanı Məmalikin yaşı yetmişə çatmışdı. Yeganə qızı Ərmağanı ərə verəndən, əzazil xanımı Sərəncamı xanlıq sərdabəsində dəfn edəndən sonra tənha qalmışdı. Son vaxtlar xanın gözü Pəhləvan Məmmədin yetim qızı Məhtabana düşmüşdü. Qoca xan daima girəvədə durur, Məhtabanı ələ keçirmək üçün fürsət axtarırdı.

Xan bir gün qonum-qonşusunun palaz-paltarını çayda yumağa aparan Məhtabanı gördü. O, axşamüstü kəsmə cığırla çayın qırağına endi... Günəş batdı... Ay ulduzlar arasında göründü... Xan ətrafı dinlədi...

Məhtaban yan-yörəsinə göz gəzdirdi. O, zığ-zımrığa bulanmış cırcındasını tez-tələsik əynindən çıxarıb daşlara çırpa-çırpa yudu, sıxıb açdı, iydə kollarının üstünə sərdi. Sonra dönüb uşaqların irili-xırdalı daş, qaya ilə çayın qabağını kəsib düzəltdikləri ağ köpüklü gölə düşdü. Qız əzəlcə yaxşıca yuyundu, qayıdıb üzü üstə üzməyə başladı. Özünü iydə kollarının arasına verib marıqda duran qoca xanın ağ bığları tir-tir titrəyirdi. Sanki ayın bir parçası qopub gölə düşmüşdü...

Qoca xan dikəlib göldə üzən qızı həris nəzərlə süzdü:

– "Xudaya, nə xilqətdir!.."

Xan öz qocalığını unudub bir könüldən min könülə Pəhləvan Məhəmmədin yetim qızı Məhtabana vuruldu, gününə tək bircə gün də qalsa onu özünə gəlin edəcəyinə söz verdi:

– "İlahi, bu nə xilqətdir!.. – Xan təkrar etdi... – Əgər bu qız yamaqlı cır-cındır içindən, bozarmış çadradan çıxıb, barigahda xanımın köhnələrindən geyinsə, gör onda nə qiyamət olar?!".

Bəli, onda xan hansı möcüzə ilə isə cavanlaşar, ömrü-günü təzədən başlar. Bu nazlı sənəmlə gün keçirmək onda gör neçə-neçə Ərdəha xanlığına dəyər!

Xan boğazını asta-asta arıtladı. Məhtaban insan hənirtisini aldı. O. tez göldən çıxıb iydə kollarından cır-cındasını götürdü, yaş-yaş əyninə aldı, büküb kənarda sərdiyi yamaqlı çadrasını da başına saldı. Xanın gözündən gözəlliyini gizlədi...

Amma xanın təsəvvüründə Məhtaban yenə ağ köpüklü göldə üzdü, ay nuruna qərq olan sularda qıvrılıb açıldı, qızın qumral saçları köpüklərdə buruldu.

İndi xan nə etsin? O, sinninin bu çağında qızın üstünə necə atılsın?.. Yox, əsla!.. Xan pəhləvan qızı ilə bacarmazdı, qızın qüvvəti qarşısında qoca qəşş edib yıxılar, ya qıjıltılı çaya düşər, ya da göldə boğulardı.

Belə yalquzaq cəsarəti xanın cavanlıq çağlarında ola bilərdi... Qoca xanda o güc, o nəfəs indi harda idi ki, Məhtabanın qollarını qatlasın, cır-cındasını parçalayıb əynindən çıxarsın, onun ağzını qapayıb öz niyyətini yerinə yetirsin?! İşdir, qız səs-səmir çıxarsa, onun izini-tozunu yer üzündən itirsin. Yox, Məmalik xan qocalmaqdan artıq kaftarlaşmışdı... Onun sir-sifəti qırışmış, əl-ayağı bürüşmüş, dizləri də əsməyə başlamışdı. Yalnız çuxura düşən gözləri qurd gözləri kimi ac idi...

Xan çöldən qırışan, içəridən acıxan gözlərini yumduqca Məhtabanı necə varsa, eləcə də görürdü. Sanki heykəltəraş bu qızı ağ mərmərdən yonubdur!.. Yox, qız heykəl deyil, nəfəs alır, canlıdır. Nəfəs aldıqca qocanın da canını alır:

– "İndi necə olsun, ilahi?!" İydə kollarından çıxmayan qoca xan, quruyub-qurumayan paltar-palazı üst-üstə toplayıb, başına alıb aparan Məhtabana qıyılan gözlərlə baxırdı...

Qoca xan Məhtabanı üzüyuxarı, Ərdaha kəndinə tərəf buraxdı, özü gölün kənarına endi. Köpüklü dalğalara xeyli baxdı... Üryan gözəl qocanın təsəvvüründə qıvrıla-qıvrıla üzdü... Xanın gözlərində odlu yaşlar giləléndi:

– Xudaya, sən məni sinnimin bu çağında divanəmi etmək istəyirsən?.. – Qoca cibindən dəsmalını çıxarıb torbalanan gözlərini sildi. – Axır mən sənin dərgahına düşüb tövbə etmişdim. Axır mən öz günahlarımı yumaq üçün Məkkəyə getməyi, sənə dəxil düşməyi qət etmişdim. Axır mənim öz anasına oxşayan zalım qızım Ərməğandan başqa kim-kimsənəm yoxdur... Belə görünür taleyin hökmü ilə mal-mülk biganələrindir... Mənim varisim yoxdur, olmayacaqdır, indi bu nə oyundur ki, mənim başıma açırsan, Xudaya!.. Xudaya, bu nə anlaşılmaz oyundur ki, gözlərim dünyadan doymur? – Xan, Savalandan üzüaşağı səs-səda sala-sala gələn qıjıltılı çayın qırağında dayanıb, gölə həsrətlə baxdı. O, Pəhləvan Məhəmmədin yetim qızının gözəlliyi qar-

şısında səcdəyə düşdü. – Mənim Məkkəm! – deyə qoca üzünü qızın qədəmləri dəyən qumlarda gəzdirdi. – Ölüncən, öləndən sonra da mənim qibləgahım!..

2

Qoca xan imarətinə döndü. O, nə yerdə olduğunu bilmədi. Özünü tanımadı. Bilmədi ki, müqəddəsləşib ya kafirləşib? Zalımlaşıb, ya məzlumlaşıb? Xan qəribə vəziyyətə düşdü. Od tutdu, alışıb yandı. Elə ki, qocanın sümükləri çöllərin quru çırpısı kimi çırtaçırtla alovlandı, tütünü təpəsindən çıxdı... Görünür, qoca son nəfəsinədək sönməyəcəkdi. Məhtaban xanın gözlərindən getmədi, cır-cındır geyinmiş, ağ mərmər heykəl öz varlığı ilə onun gözlərinin qabağında dayandı:

– "Xudaya, bu nə cəncəldir, mən düşdüm?!".

Qoca xan neçə gün, neçə gecə öz-özü ilə əlləşdi. Bu yoldan dönüb qayıtmağa çalışdı. Ancaq hər necə etsə də, mümkün olmadı:

– "Bəlkə xudanın qisməti belədir", – deyə xan gecənin bir aləmində imarətindən düşüb, darvazadan çıxdı, Pəhləvan Məhəmmədin uçulub-tökülən, çalsız-çəpərsiz daxmasına yollandı. Xan daxmanın yeldən-küləkdən \cırıldayan qapısının astanasında dayandı. Ona elə gəldi ki, Pəhləvan Məhəmmədin yetim qızı Məhtabanın qapısında deyil, şahənşah qəsrinin qapısında durubdur, içəri qədəm qoymağa cürəti çatışmır. O, çaşıb qalıbdır! Bilmir, burada necə edərlər, şaha necə təzim göstərərlər, necə onun müqabilində durarlar?!

Gözəlliyin zəhmi qoca xanı basırdı... Xan özünü dabanlı qapıya verib komanın içini dinlədi... Məhtaban mışıl-mışıl yatırdı... Onun nəfəsi qönçədən çıxan qızılgül kimi ətirli idi. Qoca xan burnuna dəyən bu ətirli nəfəsi lap yaxından alıb-udmaq istəyirdi. Titrəyən ürəyini toxtatmağa çalışan xan qapını astaca açıb içəri girdi. Dörd dirəkli damın orta bacasından düşən ay Məhtabanın surətində bədirlənirdi. Qız yenə də həmin cır-cındıra bükülü idi. Cır-cında özü də kəfrəm-mitil içində idi:

– Xudaya, sən məni darta-darta haraya gətirmisən? – Xan yenə də bilmirdi, nə etsin. – Bəlkə bu daxmada Pəhləvan Məhəmməd sağ olaydı?.. Gör nə qiyamət qopardı?.. Pəhləvan Məhəmmədin gözü qızardı, qeyzə dolub qocanı qucağına alar, onu çıxarıb qapıdakı küllükdən üzüaşağı tullardı, sabahı nə olacaqdı, vecinə də almazdı... Amma

indi qız yetimdir... Yetim qıza dəyib-dolaşmağın nə qorxusu-ürküsü? Bir də ki, dəyib-dolaşan Ərdəha xanı ola, Ərdəhanı əhatə edən neçə-neçə kəndin cah-calallı əmiri ola!..

Qoca xan özünü cəmləşdirdi. Səcdəyə gedir kimi dizləri üstə düşdü, başını əyib kilkə kimi yumşaq, qar kimi ağ saqqalını qızın bədirlənən üzünə söykədi... Qız xanın saqqalını sifətinə toxunan pişik quyruğu hesab etdi, ağır yuxusundan asanlıqla tərpənmədi, pişiyin çəkilib gedəcəyini güman etdi. Bir az keçincə Məhtaban insan nəfəsi duydu, əlini qaldırıb yoxladı, duyduğuna inana bilmədi! Axı, belə yumşaq tüklü nə olar? Əgər öz həddini aşan cavansa?.. Yox, cavan deyildir! Məhtaban quruyub yerində qaldı, qoca xan qırışıq əlini qızın qabarıq döşündə gəzdirdi, vücuduna qığılcım dolmuş kimi dilləndi:

– Qız Məhtaban!

– Sən kimsən?

– Mən? Ərdəha xanı!

– Bəlkə xan yol azıbdır?

– Yox, qız, səni deyib gəlmişəm!

– Xan gündüz kənizini hüzuruna çağıra bilməzdimi?

– Özüm qəsdən gecə pünhani gəldim!

– Bir yetimi rüsvayi-cahan etmək üçün?

– Yox, qocalan eşqimi cavan gözələ elan etmək üçün!

– Xanın bu hərəkəti gülünc sayılmazmı?

– Nə üçün gülünc sayılsın, qız?

– Xan... Babam yerində...

– Qız, eşq-məhəbbətə sərhəd-sünür yoxdur!

– Sərhəd-sünürü pozan xan, Pəhləvan Məhəmmədin yetim qızını tapdalamağa gəlibdir!.. – Məhtaban qalxıb, cır-cında geyimində, cında mitilində oturdu:

– Mənim atam küştüdə bütün xanlığın başını nə qədər uca eləyib!..

Qoca xan, palaz parçasının üstündə yerini rahatladı:

– Bu sözlərin mənası nədir, Məhtaban?

– Mənası budur ki, qoca xan mərhum pəhləvanın məzarını təhqir etməyə gəlibdir!

– Əsla, qız, əsla Məhtaban!

– Bəs gecənin bu aləmində böyük xanın belə hərəkətinə nə ad vermək olar?

– Ancaq ağlı başından oynayan bir qocanın sərsəmliyi!

– Ağlı başından oynayan xanın sərsəmliyini araya çəkən kimdir? Ancaq yetim rüsvay olacaqdır. Qız birdən için-için hıçqırdı:

– Xanı Quran qəsəminə çəkirəm, dursun, getsin!

– Sonra bəs, Məhtaban?

– Gündüz qapısında kəniz durmağa gələrəm!

– Mən Məhtabanı sübhün tülundan imarətimin yuxarı eyvanında gözləyəcəyəm!..

– Qurana qəsəm qılıram, sübhün gözü açılar-açılmaz xanın hüzuruna gələcəyəm!

– Mən də imarətimin yuxarı eyvanından enib gözəlin qədəmlərinə düşəcəyəm!..

– Mən gözəl deyiləm, xan! Bu cır-cında içində nə gözəl?

– Mən gözəli köpüklü göldə ay nuruna qərq olanda görmüşəm!..

– Axır xan öz məhrəmindən başqa bir qıza, bir qadına göz yetirməməlidir!

– Mən gözəl Məhtabanı özümə məhrəm etmək qərarına gəlmişəm!

– Xudaya, xan yuxu görür, ya mən?

– Nə xan yuxu görür, nə də Məhtaban, – deyə qoca titrəyən əllərini bacaya doğru qaldırdı:

– Bir Xuda bilir ki, mən eşqimə əsir düşmüşəm. Hər ikisi heyrət içində dayandı... Sanki onlar yuxu ilə həqiqəti bir-birinə qatıb-qarışdırırdılar. Nəhayət, qoca xan yerindən qımzanınca Məhtabanın pərakəndə saçlarını qırışıq əli ilə tumarlayıb, ehtiram əlaməti olaraq onun alnından öpdü, dabanlı qapıdan çıxıb çəkildi...

Nə vaxtdan sonra qız özünə gəldi:

– "Bu qoca xandır, ya xanın qiyafəsinə girən başqa bir kəs?!" Hər kimsə, təcavüzə keçmədi, istər-istəməz nəcib tərpəndi, bakirə qıza toxunmaq qəsdində olmadı. Yalnız yumşaq saqqalını qızın həyəcandan qızaran üzünə söykəyib, əlini qızın qoşa narında gəzdirdi. Durub gedərkən də qızın saçlarının arasından öpdü...

İndiyə qədər uçub tökülən daxmada tənha yaşayan Pəhləvan Məhəmmədin yetim qızı heç kəsdən hürkməmiş, qorxub çəkinməmişdi. Hətta, o, dabanlı qapının dalına daşdan-qayadan qoyub, buranı bağlamamışdı da. Məhtaban yəqin etmişdi ki, bu obada heç kəs pəhləvan Məhəmmədin namına toxunmaz, onun qürurlu adını ötüb aşmaz...

Əgər bir adam bu adı ötüb aşmağa cəsarət etsə, Ərdaha camaatı onu daş-kəsəyə basar. Axır Pəhləvan Məhəmməd nəinki başqa xanların meydana çıxardığı pəhləvanlarla güləşdə qalib çıxmışdı, hətta Tehranda belə şahənşah pəhləvanlarının da kürəklərini yerə gətirdiyi az olmamışdı. İndi Pəhləvan Məhəmmədin qızı, dam-daşı uçuq-sökük, həyət-bacası çalsız-çəpərsiz komasında gecələməsin, istəyir lap kəndin kənarında bir çavustanda məskən salsın, kimin həddi nə idi ki, onun dörd dövrəsinə dolansın, həndəvərində belə nagüvara iş görsün? Deyirlər ki, "igid ölər adı qalar, öküz ölər gönü".

Pəhləvan Məhəmməd on il əvvəl Sərdar-millinin dəstələrinə qoşulmuş, bir mücahid, bir fədai kimi Qacar qoşunlarına qarşı qızğın döyüşlərdə unudulmaz şöhrət qazanmışdı. O, qızına var-dövlət qoymasa da, vüqarlı bir ad qoyub getmişdi...

Lakin hər necə olsa, Məhtaban Quran qəsəminə əməl etməli idi! Hər necə olsa, qız bu qəribə "röyanı" yoxlamaq istəyirdi.

... Sübhün gözü açılar-açılmaz, Məhtaban yerindən qalxdı, əl-üzünü yudu, pərakəndələşən saçlarını darayıb düzəltdi. Cır-cında geyimini səliqə-sahmana saldı ki, əndamı görünməsin... Qız durub xanın imarətinə yollandı. Darvazaya çatar-çatmaz imarətin yuxarı tağbəndinə baxdı, qoca xanı intizarda dayanan görüncə qızın qədəmləri qurudu:

– "Deməli, əsla röya deyildir! – Məhtabanın əti çimçişdi. – Deməli, Pəhləvan Məhəmmədin komasına gecə gələn xan özü imiş!.."

Məhtabanı darvaza ağzında dayanan görən qoca əhdinə vəfa etdi, tağbənddən düşüb darvazanı açdı, qızı salamladı, onu içəri dəvət etdi. Məhtaban naçar qaldı, cınqırını da çıxarmadı. O istəmədi ki, başqası bir söz bilib-eşitsin. Pəhləvan Məhəmmədin adına şübhəli şayiələr deyilsin...

## 3

Qoca xan cır-cında içində itən Məhtabanın əlindən tutub, imarətin əndərununa[1] keçirdi... Bir neçə mərtəbədən ibarət imarətin içəri həyətində tikilən, qabağında gülüstan düzələn çarhovuzlu guşəni, tağbənd eyvanlı qoşa otağı göstərdi:

---

[1] Ə n d ə r u n – imarətin içəri, naməhrəm görməyən həyətidir.

– Məhtaban xanım üçün hələlik imarətlə əlaqəsi olmayan bu əndərun otaqlar ayrılır!

Xan birinci otağın qapısını açdı, içərisi əlvan fərşlə döşənən otaqda tək çarpayı qoyulmuşdu. Otaq çarhovuzun dövrəsində açılıb, papaqlayan qızılgüllər kimi gözəl və rəngarəng idi. Məhtaban vaxtilə mərhum anası ilə buraya gələn zaman xan imarətinin birununu[1] gördüyü halda, əndəruna buraxılmamış, bu pünhan hissəni görməmişdi. Əndərun Sərəncam xanımın öz ixtiyarında idi. Həyətdəki tağbənd eyvanlı otaq isə Tehrandan Ərdahaya dəvət edilən xarici həkimin məsləhətinə görə ayrıca tikilmiş, sulu qəlyan aludəsi olan, döşü xəfənək bağlayan xəstə xanım üçün düzəldilmişdi. Xarici həkimin məsləhətinə görə sulu qəlyanını tərgidən Sərəncam xanım ömrünün qalan qismini bu otaqda, qızılgüllər arasında keçirmişdi. Məhtaban da, Sərəncam xanımsayağı birunda olan qulluqçu-qırmızısaqqal, genşalvar, tənzifqurşaqlı bağban, xidmət edəcəkdi. Hələ ki, Məhtabanı başqa bir kəs görməyəcəkdi. Məhtabanın xörək-çörəyini gətirən, qab-qacağı yığışdırıb aparan da bu bağban olacaqdı.

Məhtaban qaşlarına qədər ağaran qoca xanın bu əcaib əməlbazlığına təəccüb edirdi... Ancaq hələ ki, xan da nəzakətlə tərpənir, qıza qarşı heç bir güc işlətmir, cavan qızın onun eşqinə necə cavab verəcəyini, gözləyirdi. Həm də demək olar ki, qoca bağbandan başqa Məmalik xan özü də Məhtabanın xidmətində dayanırdı. Xan, xanımı Sərəncamın hələ cavan ikən tikdirdiyi bir dəfə də olsun əyninə almadığı paltarlardan üzünə salıb Məhtabana geydirir, qiymətli zərrin libasda ola Məhtaban Məmalikin gözlərində dünya gözəllərinin ən gözəli kimi cilvələnirdi. Belinə qızıl kəmər bağlamış, başına zərli papaq qoyub, haşiyələri zərli, pürqiymət kəlağayı örtən, qızıl başmaq geyən qız Şərq nağıl və əfsanələrində söylənən qızlardan da gözəl idi! Əlbəttə, Məhtaban, gecə Qurana qəsəm qıldığı üçün gəlmişdi. Özü də istər-istəməz qoca xanın toruna ilişib, qızıl qəfəsə düşmüşdü. İndi Məhtaban kənara çıxsın, necə çıxsın? Çıxmasın, necə çıxmasın?! Bir də hər yan qıfılbənd idi!.. Məhtaban əynindəki zər-zibanı çıxarıb, balaca sandıqçaya yığdığı cır-cındasını təkrar geyinib, uca hasarın aşsınmı, ya aşmasınmı? Məhtaban istəsə belə bu hündür hasardan aşa bilərdimi? Bu nə tilsimdir, Məhtaban düşübdür?! "Bəlkə qoca xan hə-

[1] Birun – imarətin çölə baxan həyətidir.

qiqətən olan-qalan ağlını biryolluq itiribdir? Bəlkə xidmətində dayanan bu qırmızısaqqal bağbana yalvarıb-yapışmaq, onu vasitəsilə xanın qızı Ərmağana xəbər çatdırmaq ki, durma, gəl, atanın başına bir damcı da olsa, ağıl qoy?!" Bəlkə onda Məhtaban onu sıxıb-sıxışdıran zər-zibalı libasdan çıxar, öz cır-cındasını geyinər, buradan uzaqlaşar, yenə qonum-qonşunun palaz-paltarını Savalandan üzüaşağı gələn qıjıltılı Ərdaha çayına aparıb, zoğal dəyənəyi ilə çırpa-çırpa yuyar, gün batıb, toran qovuşunca ay nur çiləyən göldə çimər, zığ-zımrığını töküb, kəndə dönər, öz zəhmətinin çörəyini, öz minnətinə yeyər, kəfrəm mitilinə bürünüb, dabanlı qapının arxasında mışıl-mışıl yatar? Əgər qisməti olarsa, Ərdahanın bir naxırçısına, yaxud çobanına ərə gedər, olmasa, pəhləvan atasının ad-sanını gözləyib, ləkələnməyə qoymaz... Məhtaban qoymaz ki, əvvəlləri əlində toppuz oynadan pəhləvanlar kürəyini yerə gətirən, sonralar Qacar qoşunlarını dağıdan Məhəmmədin adına bir ləkə düşsün. Qız istəməz ki, əziz atasının xatirəsini özündən incik salsın, hər cümə axşamı komasına gələn müqəddəs ruhu incitsin, küsdürsün!..

Məhtaban düşünə-düşünə naz-nemətdən az-çox dada-dada bir növ güzəran keçirir, qoca xanın qızışan başının haçan, necə soyuyacağını gözləyirdi... O, qoca gülçüyə söz deyincə, cavab almadığına heyrət edirdi. Görünür, Məmalik xan qoca gülçüyə nə isə təkidlə tapşırmışdı. Buna görə gülçü də ağasının əmrinə əməl edir, Məhtabanla kəlmə kəsmirdi. Dünya görmüş bağban duyurdu ki, iş nə yerdədir. Axı, pirani gülçünün nə borcuna ki, xanın xanımı ilə kəlmə kəssin, pusquda dayanan ağasının qəzəbinə gəlsin? Özü də ömrünün bu vaxtında əndərundan çıxarılıb, güllükdən qovulsun. Deməli, Məhtaban tilsimə düşmüşdü!

Günlər keçir, Məhtaban tağbəndli otağından çıxıb, rəngarəng güllərə tamaşa edir, şırıltılı fəvvarənin müqabilindəki daş kürsünün üstündə əyləşir, qoca xanı gözləyir... O, daha xandan başqa heç kəsi gözləmir, gözləyə də bilmir... Məhtaban qoca xanı mülayim bir insan kimi, düşdüyü ağır vəziyyətdə ona hami olan bir adam kimi gözləyir... "Bəlkə xan hansı bir səbəbə görə məni sınağa çəkir? – deyə Məhtaban hərdən fikrə, xəyala gedir. – Əgər məni sınağa çəkirsə hansı sınağa, nə sınağına?".

Məhtaban baş tapmırdı! O, baş tapa bilmirdi ki, qoca sinninin bu çağında nə oyun çıxarır, hansı eşqindən dastan açır?.. Axı, bu qocada

hansı eşq ola bilərdi ki, Məhtabanı sarsıtsın, yerindən tərpətsin?! Atasından yaşlı, babası yerində qoca ilə qabaq-qənşər dayananda Məhtaban qıpqırmızı qızarırdı. Daha doğrusu, qız qocanın yerinə utanırdı. Qoca xan səbir göstərib Məhtabanı tumarlayır, onun qumral hörüklərini tutub sinəsinə gətirir, palaz-paltar yumaqdan kobudlaşan barmaqlarına üzüklər taxıb oxşayır, özü də çox vaxt dilsiz oxşayırdı... Görünür, qoca xan gözləyirdi. O, gözləyirdi ki, bir gün Məhtaban dilə gəlsin, həyəcan içində titrəsin, nəhayət, başını qocanın sinəsinə söykəyib: "Səni sevirəm!" desin.

Qoca xan ha çalışsa da, Məhtabanın dilindən qıfıl götürülmürdü. Sanki qızın həmin gecə açılan dili daha bağlanmışdı. Elə bağlanmışdı ki, ömründə açılmayacaqdı!..

Məhtabanın kədərli gözləri qan-yaşla dolub-boşalır, dərdə-qəmə qərq olan xan asta-asta geri çəkilirdi. Axı, o zor-güc işlətməklə deyil, öz oyanan eşqi ilə qızın ürəyinə hakim olmaq istəyirdi.

Yenə də günlər keçir, yenə də Məhtaban cınqır çıxarmır, gəldiyi oyla həsrətlə baxır, sanki xana yalvarır, onun könlünə rəhm salmaq istəyir. Məhtaban istəyir ki, qoca Məmalik rəhmə gəlsin, Ərdəha pəhləvanı Məhəmmədin ruhunu təhqir etməkdən çəkinsin, onu kənara buraxmasa da, əndəruna köçürsün, qulluqçu-qaravaşın içinə buraxsın!..

Yox, Məhtabanın gözlədiyi baş vermirdi. Həftələr dolanıb, aya calanır, xanın yumşaq sifəti birdən turşuyur, xan arada bir qəzəbə dolur, qızın gözündə zəhmlənirdi. Məhtaban da istər-istəməz, atası Pəhləvan Məhəmmədsayağı qəzəbə dolduğunu duyurdu. Qocanın gözləri cavan Məhtabanın gözlərinə saplanırdı. Birində hökmranlıq, birində vüqar! Xan addım-addım geri çəkilir, yumşalmağa məcbur olurdu...

Üstüörtülü oyun bir aydan da artıq davam edəndən sonra bir gün nahardan əvvəl xan çarhovuzun kənarında əyləşən gözələ yanaşıb salam verdi. Məhtaban da ehtiram göstərən qocanın müqabilində ayağa durdu. Bu dəfə daha başı ilə yox, xanın salamını dili ilə aldı. Xan şad-xürrəm oldu: "Deməli, Məhtabanın bir ay əvvəl gecədəki dili açılmışdır!".

– Gedək, Məhtaban xanım!

– Hara, xan?

– Barigaha!

– Hansı barigaha?

– İmarətimizə!

– Sizin imarətin, mənə nə dəxli, xan?
Qoca əli ilə qızın zər-ziba geyiminə işarə etdi:
– Daha hamısı aydındır ki, Məhtaban!
– Nə aydındır, xan?
– Bu libas çoxdan səni xan xanəsinin xanımı edibdir!
– Mənim üçün öz cır-cındam xoşdur, xan!
– Nə üçün, Məhtaban?
– O paltar mənə azadlıq verirdi!
– Yox, Məhtaban! Yoxsulluqda, kasadlıqda nə azadlıq? – Xan Məhtabanın biləyindən tutdu, onu əndərun tərəfindən imarətinə keçirdi. Birinci mərtəbədən üçüncü mərtəbəyə qədər gəzdirdi. Əlvan xalılarla bəzənmiş otaqlar güllü çəmənzarı andırırdı.
Xan otaqlara işarə ilə qızdan soruşdu:
– Hə, necədir? Məhtaban xanım?
– Allah sahibinə qismət eləsin, xan!
– Sahibi sən, sənin övladın, – bizim oğlan varisimiz!
– Mən sizdən acizanə təvəqqe edirəm, xan!
– Daha iş-işdən keçibdir, Məhtaban!
– Mən sizi Quran qəsəminə çağırıram, xan!
– Mən də sizi Quran qəsəminə çəkirəm, saf eşqimi daşa çırpmayın!
– Siz doğru danışırsınız, xan, ya qoca vaxtınızda zarafat edirsiniz?
– Bu qədər də zarafat olarmı, Məhtaban?
– Qızınız Ərməğan bilsə, qiyamət qoparmazmı?
– Nə üçün Ərməğan qiyamət qoparsın, qız?
– Çünki siz mərhum xanımın xatirəsini təhqir edirsiniz!
– Ərməğan mənim vəkilim deyil!
– Ərməğanın övladlıq haqqı var!
– Ərməğan öz haqqını-cehizini çoxdan alıb bu malikanədən gedibdir!
– Yenə də Ərməğan sizin varisinizdir!
– Ərməğan mənim dədə-baba düşmənimin oğlu Ərdəhana ərə gedibdir!
– Axır nə üçün siz onu dədə-baba düşməninizin oğluna ərə verirdiniz?
– Guya aramızdakı köhnə ədavət alovlanmasın!
– Bəlkə köhnə ədavət izdivacdan sonra sönübdür?
– Yox, ədavət qiyamətə qədər sönən deyil. – Məmalik xan nəfəsini dərdi, – bu ədavət üstünü qor basan, için-için yanan közə bənzər!..

– Siz indi məndən nə istəyirsiniz, xan?
– Mən sizdən saf eşqimin meyvəsi olan oğul övladı istəyirəm!
– Xan baba mənim yetimliyimə rəhm etsin!
– Yetim sən yox, mənəm! – Qoca xan göl qırağında cibindən çıxardığı dəsmalla gözlərini sildi. Özünü saxlaya bilməyən qocanın çıxıq umuzları aramsız atılıb düşdü...

4

Məhtaban naçar qaldı. Qocanın səssiz-səmirsiz için-için ağlamağı, onun ağ, yumşaq saqqalından göz yaşlarının süzələnməyi qızı çaşdırdı. Məhtaban bilmədi bu nə deməkdir? Oğlan övladı, xan mal-mülkünə varis, Məhtabanın xanzadə anası olması – hamısı, hamısı ona yuxu kimi gəlir. Pəhləvan Məhəmmədin bikəs qızında, heç bir sevinc doğurmurdu. Ancaq qoca xanın pərişanlığı nə isə, qızın ürəyində tərəhhüm hisslərini, tərpədirdi... Bu hisslər heç də məhəbbətdən nəşət etmirdi. Bu hisslər cavan qızın babası yerində bir qocaya qarşı yazıqlıq hissləri idi. Qocanın hədsiz təlaşı getdikcə qəribə görünürdü. Axı, qoca xan niyə bunca təlaşa düşsün, niyə öz bəzəkli imarətini yetim qıza göstərsin, ondan öz saf məhəbbətinin meyvəsi ola bilən övlad, oğul varisi istəsin?! Gör bu zəhrimar qocalıq xanı necə də çaşdırıbdır!
Ölüb-getmək, bu qədər mülki-dövləti öz köhnə yağısının övladına qoymaq, xanın beynin necə də yerindən oynadıbdır! Bu hiss Məhtabanın həvəsinə düşən xana doğrudan da güc gəlirdi! Elə güc gəlirdi ki, qocaya aman-iman vermir, Məhtabanın gözəlliyi ilə birlikdə onun qoca beyninə hakim kəsilirdi. Əgər qoca yıxılıb ölsə, oğul varisi olmayan xanın bütün əmlakı qız varisinə, düşmən sicillisindən olan nəvələrinə qalacaq, bir qədərdən nəvələr də ana-babalarını unudacaq, xanın mal-mülkü düşmən mal-mülkünə qarışacaq, Məmalik ad-sanı itəcəkdir... Pəhləvan Məhəmmədin bikəs qızı olmasın, lap üstü unlu bir dəyirmançı qızı olsun, xana varis gərək idi – oğlan varisi!.. Elə oğlan varisi ki, xanın yurdculu olsun, onun öz sicillisini daşısın, dədəbaba düşməninə dəri diddirməsin... Bu varis gərək Məmalik xanın cavanlığından da tikanlı, kəsərli, ötkəm olsun, düşmənə bac verməyən qədim xanlıq ocağının tüstüsünü Savalana doğru dik çıxarsın, nəinki atasının mülkünü, malını əlində saxlasın, hətta bu mal-mülkün üstünə də gəlsin, böyük hökmran olsun.

O mətləb ki, xan cavanlığında düşünməmişdi, indi düşünürdü... Məhtabana vurulmağının daxili səbəbini də özünə aydın edirdi. Qoca xan daha tutduğunu buraxmayacaqdı. Bir halda ki, Məhtabanın dünya gözəlliyi qocanın ruhunu oxşayıb, onu məftun etmişdi, ona cavanlığını da olmasa, az-çox cavanlıq hisslərini qaytarmışdı, daha qocanın yuxuları gecə ərşi-əlayə çəkilmişdi. Məhtaban bir an belə qocanın gözlərindən çəkilib getmir, üryan qız ay nur səpələyən göldə üzür, birdən də əndəruna dönüb, gümüşü fəvvarədə, xanın məhrəmi kimi onun gözlərinin qabağında çəkinmədən çimirdi. İki iştiyaq bir-birinə qarışır, qocanın qətiyyətini artırırdı. Ağsaçlı, ağsaqqallı qoca xan başını itirsə də, öz qərarını itirmirdi:

"Nə Ərmağan?! Hansı Ərmağan xanımla nə məşvərət, nə məsləhət?!".

Yəqin ki, Ərmağan xanım atasının yersiz iştiyaqına qarşı şaqqa çəkib güləcək, qocanın ağ yunlu başının tamam xarab olduğunu deyəcək, onun qayınatası, qırışıq sifətli Həlaku xan da fürsəti fövtə verməyib əlinə şeypur alıb var gücü ilə çalacaq, qohumunu oynadıb mozalan tutan dana kimi dingildədəcək, az qala ağsaqqal xanı ala-bəzək danaya döndərəcəkdi. Bəlkə də Həlaku xan girəvəni əlinə keçirib, qohumunun təamına zəhər də qatıb onun son niyyətini pozacaq, onu gözəl-göyçək Məhtabanla gün keçirməkdən, həm də oğul varisi olmaqdan binəsib edəcəkdi!..

Yəqin Həlaku xan elə məhz buna görə öz vaxtında axund-üləmanı araya salıb Məmalikin yuxuda olduğu bir vaxtında onunla qohum olub ki, işi belə udsun! O, bəlkə elə Ərdaha mülkünə yiyələnmək üçün oğlunun adını yaraşdırıb Ərdahan qoymuşdu. Bəlkə oğluna ona görə açıq-aydın "Ərdaha" adı qoymayıb ki, birdən Məmalik xan düşmənin niyyətini tez başa düşər. "Ərdaha mülkü, Ərdaha xanındır!" – deyə tez oyanar, dədə-baba düşməninə qarşı ayıq-sayıq dayanar.

Hələ gərək Ərmağan xanım da heç Həlaku oğlu Ərdahana ərə getməyəydi! Özü də bir deyil, bir-birinin ardınca Həlaku sicillisinə mənsub dörd oğul doğmayaydı...

Məmalik xan nəvələrini istəmirdimi? – İstəyirdi! Ancaq Məmalik düşündükcə, əsnəyib oyandıqca, nəvələrinin sicillisi ox olub onun gözlərinə batırdı... Axı, bu sicilli düşmən sicillisi idi! Axı, bu sicilli nəinki Məmalik xanla, nəinki onun dədə-babası ilə, hətta onun lap qədim əcdadı ilə vuruşmuşdur. Onlar qoşunkeşlik edib qanlı döyüşlərə

meydan açmışdılar. Axı, o tərəfdən də, bu tərəfdən də nə qədər desən kənd, oba, ev, daxma odlanmışdı. Nə qədər desən acı-acı tüstü başı dumanlı Savalana dikəlmişdi. Bəs necə olmuşdur ki, düşmən Həlaku Məmalik xanın ağlını birdən, qəfildən belə oğurlamışdır?! Məmalik yeganə qızı Ərmağanı düşmən sicillisinə ülfət naminə ərə vermişdi. Gör düşmən Həlaku necə hiylə işlətmiş, nə cür məkrlərə əl atmışdı?!

Bəlkə xan qızını qonşuluğundan xeyli uzaqda başqa bir xanın oğluna ərə verəydi, ya Tehranda, Təbrizdə bir tacirbaşı ilə qohum olaydı? Artıq gec idi!

Bir də, Məmalik xan Ərmağanı kimə ərə vermiş olsaydı, yenə də bir idi – onun varisi yad sicilli olacaqdı. Hər necə olsa ona öz varisi, öz sicillisi gərək idi!

Gec oyanıb, gec əsnəyib, gec ayılan xan hər necə pərişan olub, olmasa da, bütün bunları düşündükcə, gözəl-göyçək Məhtabandan ikiəlli yapışırdı. O, gözünün Məhtabana düşdüyünü də, göl qırağına getdiyini də, gecənin yarısında Pəhləvan Məhəmmədin daxmasına yollanmağını da, qızı Quran qəsəminə çəkib sübhün tüluunda imarətinə gətirməyini də, əndərunda ona yer verməyini də, qolundan tutub imarətini gəzdirməyini də, qızın eşqində süzan olmağını da doğru-dürüst sayır, gec də olsa, faydalı hesab edirdi... Ancaq bəs necə etmək ki, Məhtaban ipə-sapa yatsın, xanın döyünən, çırpınan qoca ürəyinə ürəklə cavab versin? Qocanı qəbul etsin, onu özünə ər saysın, xanın dediklərinə inansın!.. İnansın ki, burada riya yoxdur...

Xan görürdü ki, Məhtabanda ona qarşı tərəhhüm-ehtiram hissindən başqa həvəs yoxdur. Məhtabana görə qoca xan yanıb-yanıb sönən bir ocaqdı. Məhtaban isə sönən ocağın qır-qırıntısı ilə əylənmək, onu təzədən qalamaq, alov düzəldib qızınmaq istəmirdi. Qızın cır-cında içində döyünən ürəyi qocanın zahiri təmtəraq və dəbdəbəsi ilə heç vəchlə razılaşa bilmir, özünü şöhrətə, əgər olsa, oğlunu varisliyə-vəliəhdliyə sata bilmirdi. İş yaman düyünə düşmüşdü. Bu düyünün necə açılacağını nə qoca xan, nə də çarhovuz kənarındakı daş kürsüdə oturan Məhtaban bilirdi. Hər ikisi taleyin hökmünü gözləyirdi:

“Görək Məhtaban könülə gələcəkmi?..”. “Görək pərişan qoca qızı qızıl qəfəsdən buraxacaqmı?..”.

Hər ikisi bir-birini sınayırdı. Məmalik qoca səbri ilə, Məhtaban cavan iradəsi ilə!.. “Görək!” Bu “görək” də ağır tərpənib uzun çəkir, ayaqlarından daş asılan gündüz gecəyə, gecə də gündüzə qarışıb gedirdi...

Nəhayət bir gün xan Məhtabandan xəbərsiz mühüm bir işə iqdam etdi. Axundu evinə çağırıb, Məhtabanın kəbinini kəsməyi təklif etdi:

– Xan sağ olsun, Məhtaban Məhəmməd qızının izdivaca razıməndliyi varmı?

– Bəli, bir aydan artıqdır ki, Məhtaban Məhəmməd qızı mənim əndərunumdadır!

– Bəs, xan sağ olsun, belə gec kəbin kəsdirməyə nə ad vermək olar? – kotul dişli axund irişə-irişə soruşdu. – Xəlayiq deməzmi daldan atılan daş topuğa dəyər?

– Xeyr, axund, heç də daş topuğa dəyməz! – Xan qəzəbə doldu. – Sən mənim və bütün xan nəslimin necə izzətli-şərəfli olduğunu bilməmiş deyilsən!

– Bişəkk, bişübhə!.. Leyk siz də Allahın əmri, peyğəmbərin şəraitinə bizim necə cavabdehində olduğumuzu da bilməmiş deyilsiniz!

– Mən heç zaman Allahın əmrindən, peyğəmbərin şəriətindən çıxmamışam, axund! O qız ayağıyla atası evindən necə gəlibsə elə də bakirə halında qalıbdır!

– Fətabarakallah, əhsənul xaliqin!..

– Bəli, Allah-taala Pəhləvan qızı Məhtabanı elə hüsndə xilqət edibdir!

– Xaliq özü bu ayəni gözəl xilqətə risalə buyurubdur, xan!

– İndi şəkk-şübhəniz qalmadı ki, axund... İstəsəniz Məhtaban xanımı hüzura da dəvət edə bilərik!

– Xan özü buyurandan sonra başqa şəxsin şəhadətinə nə ehtiyac?

Axund nikahı cari edəndən, muzdunun müqabilində xandan qiymətli ənam alandan sonra əba-qəbasını yığıb-yığışdırıb, dalı-dalı çəkildi, pillələrdə büdrəsə də yıxılmadı. Xan darvazasından çıxan kimi daban alıb qaça-qaça getdi...

Axund varıb gedəndən sonra xanı fikir götürdü: "Yaxşı iş gördüm, ya pis?". Ancaq xana elə gəldi ki, qızın tərəddüdünə xitam vermək üçün əqdnamə zəruri idi! Ona görə zəruri idi ki, bəlkə Məhtaban izdivaca inanmır? Qızın beyninə batmır ki, həqiqətən xan onu özünə ərus, məhrum edər? Nə isə, qoca Məmalik özünü fırtına içində hiss etdi. Bir də düz, ya əyri nə olmuşdusa, artıq olmuşdu!.. İndi Məmalikin bu dünya üzündə Məhtabandan savayı ürəyinə yapışan, onu özünə aludə edən kimi var idi?

Xan kəbin kağızını diqqətlə oxudu, Allahın əmri, Məhəmmədin şəriəti ilə, Pəhləvan Məhəmmədin qızı Məhtaban Ərdaha xanı qoca Məmalikə halal olmuşdu! Bəs Məhtabanın könlü necə? Qız nə deyir? Bəlkə səbri tükənən xan əhd-ilqarına xəyanət etmişdir?

Qocanın ürəyi yerindən qopmaq dərəcəsinə gəlirdi... O, indi kimin yanına gedə bilərdi?.. Kiminlə öz ürək döyüntülərini bölüşdürə bilərdi? Pəhləvan Məhəmmədin yetimçəsindən başqa!

Bəlkə axund cari edən kəbin kağızını sabaha saxlamaq, axundu çağırmaq, ona iki o qədər də ənam verib, qeyri-mütəqabil təlaqı geri oxutdurmaq? Bəlkə məhbus qızı qəfəsdən azad edib, ona pərəstarlıq göstərib, öz tayı-bərabəri olan bir cavan çobana, naxırçıya, rəncbərə ərə vermək?

Yox, Məmalik xan, bütün dünyanı öz əlindən versə də, Məhtabanı verə bilməzdi, verməzdi. Nə qədər gülünc və namünasib görünsə də, qoca xan gözəl Məhtabanı bütün varlığı ilə, ürəyinin olan-qalan qığılcımı ilə sevirdi.

Belə isə bəs dünya görmüş xan niyə tərəddüd göstərir. Ona görə tərəddüd göstərir ki, könülsüz yaşamağın duzunu-tamını dadıbdır. O, könülsüz yaşamağın cəhənnəm əzabını çəkibdir. Xan ömrünün qocalan çağında tək bir gün, lap bir saat da olsa könüllə yaşamaq istəyirdi... Xan istəyirdi ki, bircə dəfə də olsa Məhtaban onu öz qüvvətli qolları arasına alsın, bütün gücü ilə qocanı sıxsın, sıxsın, gərəksə, canını da çıxarsın! Qoca Məmalik canını pəhləvan qızından əsirgəməzdi. Əgər qoca bacarsaydı, ətraf xan və xan onu istehzaya qoyub, onu dəli-divanə saymasaydı bütün Ərdaha xanlığını Məhtabanın adına salar, qoca gülçünü əndərundan biruna çıxarıb, özü bağbanlıq edər, nazəndə mələyə qulluq göstərər, ölüncə xidmətində dayanar, bu işi özü üçün əvəzsiz səadət sayardı.

Ancaq Məmalikin ürəyindən keçən mümkün idimi? Axı, xan xandır! Kimdi xanı özbaşına buraxan? Məhtaban söyləyən kimi hələ gör Ərmağan xanım bu əcaib izdivaca nə deyəcək, nə hoqqa çıxaracaq! Qırışsifət Həlaku xan, oğlu Ərdahan necə rişxənd edib Məmalikin yersiz hərəkətinə güləcək, bəlkə də nalayiq sözlərlə onu bihörmət edəcəkdilər.

Əl-ayağı titrəyən qoca xan başqa yana yollanmadı. Əndəruna endi, çarhovuzun qırağındakı daş kürsüdə əyləşən, günəşin qürubunu kədərlə yola salan qıza yanaşdı, səssiz-səmirsiz kəbin kağızını çıxarıb

ona uzatdı. Məhtaban yarım səhifəlik ağızı aldı, qart-qalın kağız parçasında bağdadi qələmlə cızılan yazıları birtəhər höccələyə-höccələyə oxudu, dili-dodağı təpidi, qart-qalın kağız qızın əlində kor-kobudluqla titrədi...

5

Qoca xanın övzai dəyişdi. O, axund əli ilə kəsdirdiyi əqdnaməni bir cadugər kimi Məhtabanın titrək əlində qoyub çəkiləndən sonra bütün yollar-rizlər Məhəmməd qızının üzünə bağlanan kimi göründü. Bismillahla başlanan əqdnamə hər şeyi kilidə saldı. İndi bu kilidi kim açacaqdı? Başqa əl görünmürdü! Deməli, qoca xan öz nəzakət qaydalarını pozub istər-istəməz birtərəfli hərəkət etmişdi. O, qızın razılığını gözləmədən zorakılığa salıb əqdnamə yazdırmış, Məhtaban Məhəmməd qızını şərən özünə arvad etmişdi! Bəs aradakı azman fərq? İyirmi beş yaş! Yetmiş yaş! Məhtabana görə indi bu fərqin təfərrüatına varan, aradakı yaş uçurumuna baxan hanı? Qacar səltənətində belə qanunsuzluğa qarşı başqa bir qanunla çıxan hanı? “Papağınla vur, yıxılmadı qız malındır!”. Halbuki Məhtaban papaqla yıxılan deyildi! O ərgən oğlan kimi qüvvətli, zərli əlbisədə lap gözəldi. Heç bir yetim-yesirlik Məhəmməd qızını meşələrin cır alması kimi vaxtından əvvəl bürüşdürə bilməmişdi! Heç bir yetim-yesirlik pəhləvan qızını sındırıb qırışdıra bilməmişdi.

Məhtaban mühitinin amansız məkrlərinə baxmayaraq yenə də həyat istəyirdi. O özü kimi bir cavanla, uzaqbaşı özündən on-beş yaş yuxarı olan bir oğlanla öz həyatını qurmaq istəyirdi.

Məhtaban gözəldi, ancaq nə edəsən ki, taleyi zəbundu. Bir gör tale əqdnamə kağızından qızın üzünə nə oxuyur! Məhtaban buraya bağlanmışdı, qəsəm qıldığı Quran ehkamının gücü ilə buxovlanmışdı. İndi yetmiş yaşlı xan olmasın, həştad yaşlı şil-şikəst bir əfəl olsun, qız əl-ayağından sarınmışdı. Görünür, Məhtaban daha xanın sərəncamında idi, onun halalı idi. Onun dediklərindən çıxa bilməzdi, çıxsa, o dünyanın zəbanə çəkən cəhənnəm odlarını gözləməli idi!

Bax, kəbin kağızı qızın əlində necə də titrəyir, qızın gözlərindən axan leysan yağışı bağdadi qələmlə yazılan ehkamın üstünə səpələnir, ancaq yazılanı yuyub apara bilmir, silə bilmirdi! İndi Məhtaban nə etsin, necə etsin, hayana tərpənsin? Məhtaban bismillahla başlayan bu kağızı cırsınmı? Tikələrini də bu küllüyə səpələsinmi? Əgər Məhta-

ban belə etsə, yenə də kağız qırıntılarından birimi, parasımı gizlənib qalacaqdı. Əsən yellər belə bu qırıntıları buradan başqa yana apara bilməyəcəkdi. Bəlkə də gülçü qoca bu qırıntıları səylə yığışdıracaq, Quran yazısını görüncə əzəlcə mat qalıb quruyacaq, sonra qorxu-ürkə xana təqdim edib ərz-bəndəçilik edəcəkdi.

– Bu belə nədir, qoca?

– Xan sağ olsun, Quran ayəsidir.

– Haradan tapdın bunları, kişi?

– Güllükdən!.. Çarhovuzun ətrafından!

– Bunu belə kim cırıbdır, gədə?

– Qurana qəsəm qılıram xan, mənim gümanım çatmaz!

Yəqin qoca xan qəzəblə Quran yazılarını tutuşduracaq, bəlkə də kağız parçalarını yapışdıracaq, əqdnaməni oxuyacaqdı. Xanın bərələn gözləri zəhmlənib dairələnəcək, genişlənəcəkdi... "Deməli, əncüмənçi Məhəmmədin qızı öz yolunu azmışdır!".

Xan nə qədər gücmü, hiyləmi, səbirsizlikmi göstərib birtərəfli hərəkət etmişdirsə, artıq şərən əqdnamə bağlanmışdı. Xan şərən Məhtabanı özünə halal etmişdi! Artıq Məhəmməd qızı Məhtabanın özü də bismillahla başlanan əqdnaməyə əl vurmaqda, onu cırmaqda acizlik çəkirdi! Yalnız qız öz göz yaşları ilə könlündən kənar bağlanan əqdnaməni yumaq, yazılarını pozmaq istəyirdi. Ancaq hanı ehkam halını alan əqdnaməni yuyub-aparan göz yaşları?! İndi Məhtaban bir saat deyil, istəyir lap bir gün ağlasın, faydası nə idi?! Yox, əqdnamə bağlanmış, Məhtabanın taleyi düyünlənmişdi. Axı, Məhtabanın ağlı kəsən, qulağı söz alan gündən mərhum anası qızını yatıranda da, yatağından qaldıranda da bismillah demişdi. Arvad isti suyu yerə tökəndə, kuzəsini çeşmədən dolduranda da bismillah demişdi. Məhtabanın tənumənd-hünərmənd atası geyinəndə də, meydana girəndə də bismillah demişdi. Onlar süfrə başına toplaşanda da bir-birinin üzünə baxabaxa hamısı birdən bismillah demişdi. İndi bu bismillahlar uca barının üstündən bir neçə qat da barı çəkib Məhtabanın gözündə alınmaz istehkama, aşılmaz qalaya çevrilmişdi. İndi Məhtaban üçün nə buradan tərpənmək, nə barını aşmaq, nə də qoyub qaçmaq olardı. Bismillahla başlanan əqdnamə cavan Məhtabanla qoca Məmaliki hər hansı zəncirdən də möhkəm bir-birinə bağlamışdı.

Məhtabanın qoca xana qarşı tərəhhüm hissləri gün altına düşən qar kimi əriyirdi. Xan Məhtabanın gözündə başqalaşırdı. Axı o, güc gös-

tərib Məhtabana toxunmur, qıza güldən ağır bir söz demirdi. Qızın dövrəsində dolanır, xidmətində dayanır, ara-ara özünü büruzə verən qeyz-qəzəb də çəkilib gizlənirdi.

Məhtaban durdu, tağbənd otağa girdi, balaca sandığın qapağını qaldırdı, əqdnaməni cır-cında pal-paltarının üstünə qoydu. O, qapağı yavaşca buraxdı. Qapaq səsləndi, otağa çökən qaranlıq içində Məhtaban səksəndi:

– Bismillah! Bismillah!

Qoca gülçü ağzına su alıb sussa da, gördüklərinə göz yumub, eşitdiklərini qulaqardına verib əndərundan biruna söz çıxarmasa da, yenə söz çıxdı. Xanın hərəkətinə göz qoyan, axundun buraya gəlib-getdiyini görən birun hər şeyi bildi. Birun bildi ki, iş nə yerdədir. Bildi ki, qoca xan cavan qızla izdivaca başlayıbdır. Bu sirr xan imarətinin əndərununda da qalmayıb, daha uzaqlara yayıldı. Bütün Ərdaha xanlığı bildi ki, bəs yetmiş yaşlı Məmalik xan Məhəmməd pəhləvanın iyirmi beş yaşlı qızının kəbinini kəsdirib, özünə halal edibdir.

Kimisi xanın rəiyyətə tənəzzül etdiyinə görə onun alicənablığından dedi, kimisi də yetmiş yaşlı qocanın bədəməl işlətdiyini, Məhəmməd pəhləvanın fədailik xatirəsini təhqir etdiyini söylədi: Kimisi qoca xanın cavan qıza bir könüldən min könülə aşiq olduğunu söyləyib, onun əcaib əməlinə bəraət verdi, kimisi də varis həsrətində olan xanın ayrı çarəsi olmadığını iddia etdi.

Əlbəttə başqa cür də deyən oldu. Bu xəbər qanadlanıb Məmalik qızı Ərmağanın gəlin getdiyi Həlaku xan barigahına da çatdı. Həlaku xanun oğlu Ərdahan öz xanımının qabağında o qədər güldü ki!.. Ərdahanın ağlı kəsən, ağlı kəsməyən uşaqları da bəsdi deyincə gülüşdülər. Təkcə Ərmağan gülmədi, bu xəbər onu sarsıtdı. Ərmağan rəng verib, rəng aldı, özünün necə düşmən mühasirəsinə düşdüyünü dərk etdi.

– Nə əcəb Məmalik babanız sizi toyuna dəvət etməyib? – deyə Ərdahan oğlanlarının qara, qıvrım saçlarını qarışdırdı. – Babanız sizə təptəzə nənə alıbdır, özü də heç kəsi xəbərdar eləməyibdir!

– Bəlkə sənin də könlündən cavan qızla izdivaca girmək keçir? – deyə Ərmağan ərinin üstünə qabardı. – Xan, xandır, ya bu xan, ya o xan.

– Əsla, Ərmağan xanım, əsla! Heç kəs özünü sənin atan Məmalik xan kimi təlxəkliyə qoya bilməzdi! – Ərdahan köhnə ədavətin təzə-

lənməsini istəməsə də, özünü yığışdıra bilmirdi. – Xudanəkərdə bəlkə möhtərəm atamızın başı?..

– Bəlkə Məmalik qocanın başı xarab olubdur, demək istəyirsiniz, Ərdahan Həlaku?

– Xudanəkərdə, xanım! Nə mən, nə də mənim atam Həlaku belə bədbəxtliyi istəmərik!

– Biz məmaliklər özümüz bilərik. Bunun siz həlakulara heç bir dəxli yoxdur!

– Bəs bunlar? – deyə Ərdahan boya-boy dayanan oğlanlarını göstərdi. – Dəxli bu dörd oğlan nəvəsidir!

– Onlar da sənin sicillindəndirlər, həlakulardır!

– Əlbəttə, həlakulardır, məmaliklər deyildir! – deyə Ərdahan arvadının diluzunluğuna xitam vermək istədi. – Heç bir kəsin siz məmaliklərin mülkündə gözü yoxdur, çün Şahsevənin yarısı bizimdir!

– Məmaliklər mülkünün də varisi vardır!

– Olsun! Daha qoca Məmalik yatıb-yatıb yetmiş yaşında əl-ayağa düşüb, bizi qohumluqda rüsvay eləməsin! – Ərdahan bir daha dörd oğlunu nəzərdən keçirdi. – Atam demişkən, eyib də olmasın, bizi məmaliklərlə qan qarışdırıb, qohum olmuşuq. Mən sənin atanı da özümə ata hesab edirəm!

– Onda xıxıltı ilə gülməyinizin nə mənası Ərdahan xan?

– Bəlkə Ərmağan xanım atasının istehzaya layiq əməli müqabilində utanmaqdansa, həlakuların evində oturub, onların ağzını qapayıb, dilini bağlamaq istəyir?!

– Mən həlakular xanlığından gedə də bilərəm, Ərdahan!

– Arada dörd oğul övladı ola-ola, bir də təzədən iki xanlıq arasına od-alov salıb, fitnə-fəsad törətmək üçünmü?

– Qoy nə olur-olsun, Ərdahan Həlaku!

– Axı, biz əhd etmişdik ki, – deyə söhbətin üstünə gəlib çıxan əhvalatın nə yerdə olduğunu bilən Həlaku xan danışığa qarışdı. – Daha biz Qurana qəsəm qılmışdıq ki, qanı qanla yox, qanı su ilə yuyaq! Biz bildirmişdik ki, daha bundan sonra gərək nəsillərimiz bizi lənətləməsinlər! Onlar deməsinlər müsəlmançılıqda bu nə ədavətdir siz qoyub getmisiniz?

– Qoy ədavətimiz təzələnsin, Həlaku xan!

– Yox təzələnməsin! – Həlaku xan dörd nəvəsini iki yana ayırdı. – Tutaq ki, sən Ərmağan buranı tərk edib gedəndə bu gədələrdən ikisini də özünlə apardın.

– Mən heç bir həlaku gədəsini özümlə aparmaram!
– Xub, xub, aparmazsan. Ərmağan xanım!.. Tutaq ki, necə oldusa ikisini özünlə Məmalik imarətinə apardın?
– Bəli, tutaq ki, siz buyuran kimi ikisini özümlə apardım?
– Tutaq ki, ikisi o yanda böyüdü, ikisi də bu yanda.
– Bəli, ikisi o yanda böyüdü, ikisi də bu yanda. Onda məmaliklərlə həlakular yox, həlakularla həlakular vuruşmalı olacaqlar!.. Onlar o yana çəkəcəklər, bunlar bu yana! Yenə də Quran qəsəmi pozulacaq, köhnə ədavət təzələnəcək, arada çoxlu-çoxlu qan töküləcək. Bax, biz bu qanlı ədavətin hər iki xanlığın arasından silinməsini istəmişdik!
– Siz həlakular mənim atam Məmalikin yamanca aldatmısınız!
– Bəs sizi necə, Ərmağan xanım?
– Elə məni də aldatmısınız!
– Onda yol açıqdır! – Qoca Həlaku dinməsə də, oğlu Ərdahan qəzəblə, kinlə, küdurətlə söyləndi. – Tamam-kamal açıqdır üzünüzə yol, Ərmağan Məmalik!
– Yolun açıq vaxtını mən özüm səndən əcəb bilirəm, Ərdahan Həlaku!
Ərmağan xanımın gözlərində odlu qığılcım yandı. O, pörtüb qızardı, axşamüstü titrətmə tutub, yorğan-döşəyə düşdü.
Sabahı ayılan Ərmağan xanım bağdadi qələmini əlinə alıb atasına namə yazdı. Ağır xəstələndiyini, hər necə olsa, qocanın durmayıb yanına gəlməyini təvəqqe etdi.

... Qoca Məmalik məktubu alıb fikrə getdi.
– Nə namədir, xan?
– Ərmağan yazıbdır, Məhtaban!
– Nə yazır, Ərmağan?
– Yazır ki, xəstələnmişəm, yanıma gəl!
– Yəqin sizi töhmətləmək üçün çağırır!
– Axır nə barədə Ərmağan məni töhmətləməlidir?
– Bu nagüvara hərəkətinizə görə!
– Onun heç bir hüququ yoxdur ki, məni düşmən evində töhmətləsin!
– Haqqı vardır, xan!
– Bəlkə sən də qızlığına tərəfdar çıxırsan, Məhtaban?
– Xan gülməlidir!
– Bəlkə ağlamalıdır?

– Burada göz yaşından savayı heç nə görünmür, – deyə Məhtaban dönüb o biri otağa girdi. Nəmli gözləri ilə aynada saralan bənizinə baxdı.

Bəli, bismillahla başlanan əqdnamədən sonra Məhəmməd qızı Məhtabanın bətnində övlad nüftəsi düyünlənmişdi.

6

Həlaku xan gəlini Ərmağanın gözlənilmədən üzə ağ olduğunu, pəjmürdəhal rəxt-xaba düşdüyünü görüncə kobud hərəkət etdiyini başa düşdü. O, oğlu Ərdahanı xəlvət guşəyə çəkib ona təkidlə tapşırdı ki, bu cəngəlli işdə bitərəf dayanmaq daha faydalıdır. Məmalik xanın özünə varis qazanmaq iştiyaqına düşməsi onları nə qədər göynətsə də, gərək hisslərini dərində gizləsinlər, hələ-hələ üzə açılışıb, bir söz deməsinlər. Çünki qoca Məmalik nə qədər atılıb-düşsə də, daldan atılan daş topuğa dəyəcək, Məmalik mülkü həlakuların olacaqdır! Qəzanın qədərindən oğlan övladı olmadığı üçün qoca uduzubdur, indi daha onun vaxtsız banlamağı, Pəhləvan Məhəmmədin yetimçəsini özünə gəlin gətirməyi bicadır.

– Birdən qocanın bu əməli baş tutdu? – deyə Ərdahan atasının qarşısında öz nigarançılığını gizlətmək istəmədi. – Birdən Məhəmmədin yetim qızı düzmü, əyrimi pəhləvan babasına bənzəyən bir oğlan varisi doğdu, onda bəs necə?

– Ondanın sözünü onda danışarıq, oğul – deyə Həlaku xan oğluna anlatdı ki, bu xəmir hələ çox su aparacaqdır. Bu barədə gərək onlar qınlarına girib bacardıqca özlərini gizləsinlər. Məmalikə boz sifət göstərməsinlər. Hətta Ərmağanla baş verə bilən hər hansı ixtilafın da üstünü örtüb malalasınlar. Məmalik xanın hərəkətini veclərinə almasınlar, bu işi qocanın öz daxili işi sayıb, ona müdaxilə etməsinlər.

– Oğul, bizim kəndlilər yaxşı deyirlər ki, cücəni payızda sanarlar!

– Yəni buyurursan ki, ata, bu barədə əlimizi ağdan qaraya vurmayaq?.. Yəni durub gözümüzü döyək ki, o boyda məmalik mülki qocanın dörd nəvəsi burada dura-dura əlimizdən çıxıb Pəhləvan Məhəmmədin nəvəsinə getsin?

Həlaku xan üzünü qaşıyıb, çal-cod bığlarını eşdi:

– Dovşanı araba ilə tutmaq ustalıqdır... Yoxsa bica yerə qaç-qov salmağın mənası yoxdur!

– Səni necə başa düşmək olar, ata?

– Qoy Məmalik qızı Ərmağan anasının rəxt-xabına soxulan günü ilə özü vuruşsun, – deyə Həlaku xan hər iki əlini qaldırdı. – Bizə heç cür dəxli yoxdur. Atası bilər, bir də qızı...

– Yəni tamam-kamal bu işi öz axarına buraxmaq?.. Ya bəlkə qoca Məmalik buraya gələndə bir əncam çəkək?

– Nə əncam?

– Zəhərdən-zaddan xörəyinə bir çay qaşığı da olsa, qarışdırmayaq?

– Bu çox ağ olar – deyə qoca Həlaku başını buladı. – Biz Qurana qəsəm qılmışıq, qan qarışdırıb qohum olmuşuq, vəssalam!

– Bəs haçanacan bu oyunu gözləyək, haçanacan gözlərimizi döyə-döyə duraq?

– Ta məqamınacan? – deyə Həlaku xan çal-cod bığlarını adətincə yenə də möhkəmcə eşdi. – Qoy Ərmağan xanım özü atasının qabağına çıxsın. Sən əsla qarışma. Hələ lazım gəlsə, öz qoca qayınatanın tərəfində dur. Bəli, bəli, Ərdaha xanı Məmalikin ehtiramını saxla!

– Gərək ürəyindən gələ ki, qoca tülkünün ehtiramında dura biləsən də!..

– Ta məqamınacan! – deyə Həlaku xan dediyini təkrar edib oğlu Ərdahanı yaxşı-yaxşı başa saldı ki, daha baxyanı üzdən vurmaq olmaz. Yan-yörədə başqa-başqa xanlar marıqda durub, girəvə gözləyirlər. Bir tərpəniş oldumu alov qalxacaq, onda Məmalikin tərəfdarları çox olacaq, nəhayət it də gedəcək, ip də!

– Məmalik mülkü Həlaku nəvələrinin qismətidir! – deyə əllidən artıq kəndin, obanın, əldən çıxacağını güman edən Ərdahan xan qana həris canavar kimi qulaqlarını şəklədi. – Fürsət fövtə vermək olmaz, ata!

– Orası elədir, hələ mən Məmalik qızını sənə elçiləyəndən qabaq bütün bunların hamısını düşünmüşəm, oğul!

Qızışıb, özündən çıxan Ərdahan dünyanı yorub-yortan atasının tapşırığına əməl etməyinə and içməyincə qoca xan oğlundan əl çəkmədi. O öz hiylələrini Ərdahanın beyninə yeritdiyinə inanandan sonra başa düşən böyük nəvələrini də ayrı dillə bişirib dedi ki, Məmalik baba buraya təşrif gətirəndə heç bir zarafata yol verməyin, onun ehtiramında əl-əl üstə dayanın. Elə edin ki, babanızın hüzurunda naqabil söz, hərəkət olmasın!..

– Yəni heç nə deməyək? Deməyək Məmalik babaya niyə nənə almısan, bizə bildirməmisən?

– Heç vaxt!.. – Xan mətləbi başa düşən nəvələrini gözdən keçirdi, onların məmaliklər yox, həlakular olduğunu dürüst təyin edincə, toxtadı.

Həlaku xan gəlini yatan otağa girməsə də, qıraqdan onun qayğısına qaldı, şəxsən özü xəstə Ərmağanın xörək-çörəyində göz oldu, özünü abid kimi göstərib, Məmalik qızını şəkk-şübhədən çıxarmağa cəhd etdi.

Hərarəti azalmayan Ərmağan atasının yolunu dörd gözlə gözlədi. O, dilinə bir tikə vuranda, birini vurmadı. Hikkələnən xanım çox vaxt xörəyini soyudub geri qaytardı...

Məmalik xan hələ də tərəddüd içində idi. O, qızının onu nə üçün çağırdığını da, nə üstündə xəstələndiyini də, nə deyəcəyini də əcəbcə bilirdi. Elə buna görə də qəsdən ayaq sürüyür, qızının sinəsinə vurduğu yaranın köhnəlməyini istəyirdi. O, istəyirdi ki, Ərmağanın hirsi, hikkəsi soyusun, qulaqları bu söz-sova alışsın, necə deyərlər, qızdırsın, titrətmə keçirsin, qalxsın, qalxandan sonra yenə qızdırsın, yenə titrətmə keçirsin, zəifləsin, qəzanın qədəri ilə razılaşsın, atasının qərarını bilib daşa düşsün, kükrəyən sel sovuşsun.

Axı, iyirmi il bundan əvvəl ərə gedən qızın atasının işinə nə dəxaləti? Qoca xanləngiyib ayaq sürüyüncə, bir gün Məhtaban özü işə qarışdı, qocanı dilə tutub yeganə qızı barəsində onun daşa dönən ürəyinə rəhm salmağa çalışdı. Məhtaban istəmədi ki, ata ilə övladın arasında nifaq olsun, özü qızıl qəfəsə düşüb bədbəxt olduğu halda, onun üstündə başqası bədbəxt olsun. Ya azarlasın, ya da başına bir iş gəlsin.

– Bu müddət ərzində niyə bu qədər tərəddüd göstərirsiniz, xan?

– Nə barədə, Məhtaban?

– Belə görürəm ki, Ərmağan xanımın yazdığı naməni qəsdən cavabsız qoymaq istəyirsiniz...

– Əgər Məhtaban xanım istəsə, cavab yazıb, çapardan göndərə bilərəm!

– Xeyr, xan!

– Nə üçün, Məhtaban?

– Çünki Ərmağan xanım sizin özünüzü gözləyir.

– Əgər mən qəsdən getmək istəmirəmsə?

– Haqqınız yoxdur, xan!

– Yenə də Ərmağanı müdafiə edirsən, qız?

– Mən övladlıq haqqını müdafiə edirəm, xan!

– Axı nə üstündə?

– Onun üstündə ki, gərək mən bədbəxtə görə ata ilə qızının arasında ixtilaf olmasın!

– Məmalik səni öz göz bəbəyi kimi istəyib, sevdiyi halda nə üçün bədbəxt olasan, qız?!

– Xan, xoşbəxtlik heç də mənim düşdüyüm qızıl qəfəsdə deyildir!

– Bəlkə mən səni buraxam öz yurd-yuvana uçasan!

– Artıq o da gecdir, xan!

– Niyə gecdir?

– Mən hamiləyəm, ikicanlıyam, xan!

– Onda mən xoşbəxtəm, Məhtaban!.. Qoy həlakular yanıb-yaxılsınlar! Qoy onlar Ərmağanı mənim üstümə qılınc kimi itiləməsinlər!.. İgid atamın ərvahına and içirəm ki, mən sənin üçün Şeyx Sənan olacağam, qız!.. Lazım gəlsə, qəsəmimi pozub Quranı yandıracağam, donuz otaracağam!..

– Siz Qafqaz səyahətini xatırlayırsınız, xan. Pəhləvan Məhəmməd oradan Ərdahaya dönəndə xeyli danışmışdı.

– Bəli, mən sənin atan Məhəmməd söyləyən Sənan dağına çıxmışam. Orada demişəm ki, ilahi eşq ancaq belə olar!..

– Orada ilahi eşq qarşılıqlı olubdur, xan!

– Deməli, biz ikimiz bir övladın valideyni olandan sonra siz mənə etibar etmirsiniz, mənim ilahi eşqimə inanmırsınız?

– Siz mənim nikahımı cari etdirəndə nə üçün razılığımı almadınız, xan?

– Mən sizin daxili tərəddüdünüzə xitam vermək istədim, Məhtaban!

– Əgər, mənim sönük eşqim indi də tərəddüd içindədirsə?

– Elə etmə ki, Məhtaban, ağır halında sənə yol göstərim.

– Bismillah qabağımı kəsməsəydi, xan yolumu bağlaya bilməzdi!

– Sən şəriətə asi kəsilmə, qız! Taleylə razılaş! Alicənab ol, həqiqi sevgini qiymətləndir. Axır mən necə qocalsam da, artıq sənin əsirinəm!

– Mənim qoca xana tükənməz ehtiramım vardır!

– Nə kimi ehtiram?

– O ehtiram ki, qoca xan bətnimdə düyünlənən övladımın atasıdır, gözü yaşlı Məhtaban əlini uzadıb qocanın qar kimi dümağ saqqalını sığalladı. – Sən taleyin hökmünə bax!

– Xudaya, mən nə xoşbəxtəm!

– Xudaya, mən necə də bədbəxtəm!

Xan bu əsrarlı düyündən baş açmadı, aça da bilmədi. Axırda Məhtabanın təkidi müqabilində gədələrinə tapşırıq verib atlandı, ikinci gün başının on nəfər süvarisi ilə özünü həlakular imarətinə yetirdi. Həlaku xan da, oğlu Ərdahan da, nəvələr də xan dərbarında olan mötəbər şəxslər də Məmalikin pişvazına çıxdılar. Hətta Həlaku xan özü Məmalik xanın mindiyi atın cilovundan yapışıb, onun yəhərdən düşməsinə kömək etdi. Həlaku xan qoca Məmalikin gəlişinə son dərəcə sevinən adam kimi gözləri yaşara-yaşara qohumunun boynunu qucaqladı, ağ tük basmış solğun yanaqlarından öpdü. Həlaku xan təlim etdiyi kimi, Ərdahan xan qayınatasını, nəvələr də babalarını hərarətlə qarşıladılar. Nəinki Məmalik xana, onun süvarilərinə də həlakular xanədanında olmazın ehtiram göstərdilər. Həlaku qohumun qulağına əyilib mübarəkbadlıq da etdi. Hər iki xanın dodaqlarında bir-birinə bənzəməyən təbəssüm göründü. Tez tələsik burmabuynuz qoç kəsildi, süfrədə bolluq olsun deyə, toğludan, əmlikdən də kəsilib buraya əlavə edildi. Bir an içində cəmdəklər soyuldu, şaqqalar yan-yana asıldı. Həlaku xanın aşpazxanasından Savalan dağının ətəklərinə doğru çalkeçir tüstülər ucaldı. Məmalik xanın öz qızını görməmək üçün tələsmədiyini görən çalbığ Həlaku səbir göstərdi. Üstündən xeyli keçəndən sonra təhəmmül etməyən Məmalik ayağa qalxdı, Həlaku da, Ərdahan da ayağa durdular.

– Ərmağanı görmək istəyirəm, – deyə Məmalik Həlakuya üz tutunca Ərdahan öz kiçik oğlunu qabağa verdi. Məmalikin kiçik nəvəsi babasının əlindən tutub, onu anası yatan otağa keçirdi. Məmalik xan içəri girincə Ərmağan hıçqıra-hıçqıra ağladı. Məmalik nəvəsini otaqdan çıxarıb qapını bağladı:

– Sənə nə olubdur, qız?

– Yeganə qızının ürəyini oxlamısan, bivəfa ata!

– Bəlkə sənin atanın bu dünya üzündə heç nəyə haqqı yoxdur?

– Hər nəyə haqqı olsa da, müsünn və ixtiyar çağında qızın bunca xar etməyə, əğyar içində şəmatətdə qoymağa haqqı yoxdur!

– Neyləmişəm ki?

– Yetmişində özünə ərus gətiribsən! – Ərmağan rəxt-xabının içində oturdu, döş-başının açıq olub-olmadığını vecinə almadı, atasına da kürsü göstərib “əyləşib” demədi. Ata ilə qızın gözləri bir-birini düşməncəsinə süzdü.

– Yaxşı, buyur görək həlakular evinə atanı təhqir etmək üçünmü çağırmısan?

– Atam məni həlakular evində daha artıq təhqir edibsə?

– Nə babətdən atan səni təhqir edib, Ərmağan Həlaku?

– Mən qəsdən özüm üçün Məmalik sicillisini saxlamışam!

– Yaxşı, Məmalik sicillisi, buyurun, görək nə üçün namə göndərib qocanı hüzurunuza çağırıbsınız?

– Məmalik sicillisi Ərmağan xanım öz qoca atasını hüzuruna çağırıbdır ki, ona əmr etsin ki, anası Sərəncamın, ulu xan nəslinə mənsub olan xanımın rəxt-xabına soxulan Pəhləvan Məhəmmədin yetimçəsi Məhtabanı, babası yaşında qocanın başını tovlayan sehrkarı bir göz qırpımında məmaliklər malikanəsindən rədd etsin!..

– Əgər qoca xan Pəhləvan Məhəmmədin yetim qızı Məhtabanı ilahi eşq ilə, Sənansayağı sevirsə?

– Ola bilməz, əsla ola bilməz, xan!

– Nə üçün ola bilməz, Ərmağan xanım!

– Sənan bütün Ərəbistanı özünə güldürdüyü kimi, sən də külli İranı özünə güldürmək istəyirsən!

– Əgər böyük Allah özü mənim ürəyimə sönməz eşq atəşini doldurubsa?

– Sən cadulanmısan, qoca!

– Mən Allahın əmri, peyğəmbərin şəriəti ilə Pəhləvan Məhəmmədin qızı Məhtabanın kəbinini kəsdirmişəm, onunla izdivaca daxil olmuşam!

– Deməli, şərən kəbin də kəsdirmisən?

– Bəli, mən böyük Xudanın qabağında nə inamımı, nə də imanımı dana bilmərəm!

– Deməli, qoca Məmalik fərzəndi zükür-vəliəhd iştiyaqına düşübdür?

– Tək Tanrının iradəsi ilə düşübdür, bəli!

– Tək Tanrının iradəsi ilə qoca başını itiribdir!

– Əgər qoca öz başını itirməyibsə?

– Qoca başını hökmən itiribdir!

– Nə üçün hökmən, Ərmağan xanım?

– Yetmiş yaşına dolan, əpriyən qocadan fərzənd ola bilməz!.. Nə ünas, nə zükür!

– Əgər ulu Tanrı özü indidən qoca xana övlad müjdəsi verirsə?

– İlahi, mənim atam divanədir! – deyə döşü-başı açıq Ərmağan xanım əllərini yuxarı qaldırdı. – İlahi, sən aqibətindən saxla! İlahi, bu qoca öz doğma nəvələrindən birisini aparıb ağ-açıq özünə varis edib bunca xəcalət girdabına düşməyə bilməzdimi, Xudaya, sən bizi düşmən şəmatətindən, əğyar tənəsindən, yaman dildən hifz elə!

– Daha qurtardınmı duanı, qız?

– Duanı qurtarsam da sinəmdə yanan sözlərimi qurtarmadım, xan!

– Onda sinəndə yanan sözlərini də qurtar, qız!

– Sözlərim budur ki, quru yerdən özünə süni varis düzəltmə, ata!

– Necə quru yerdən sünai varis, qız?

– Mən Məmalikə indidən dedim, bir də məqamında deyərəm. – Ərmağan kinli gözləri ilə dəlicəsinə atasını süzdü, dönüb yorğanına büküldü, onun hönkürtüsü otağı başına götürdü.

Qapı ağzında pusquda dayanan Həlaku xan oğlu Ərdahanı dirsəklədi, onlar ayaqlarının ucunda geri çəkildilər. Özünü heç nə eşitməmiş, bilməmiş kimi göstərən qoca Həlaku qohumunun şərəfinə açdırdığı təam süfrəsinin hazırlanması üçün uca səslə sərəncam verdi. Ancaq içəridən qəzəbli çıxan qoca Məmalik süfrəyə meyl etmədən öz nəvələri ilə görüşüb, qohumları ilə salamlaşmadan gədələrinin üstünə qışqırıb atları çəkdirdi, heç bir köməkçi gözləmədən atının belinə qalxıb, həlakular imarətini tərk etdi. Həlaku xan pörtüb tərləyən oğlu Ərdahana müraciətlə:

– Atası bilər, bir də qızı! – deyə ilan başına oxşayan şəhadət barmağını qaldırdı. – Bizə heççə cürə dəxli yoxdur!..

## 7

Daşlı yolda dördəm gedən qığılcım qoparan nal səslərindən səksənən Ərmağan öz rəxt-xabından dik atıldı, balaca pəncərənin qabağında müztərib dayanıb toz burulğanında gedən atasını, onun dövrəsindəki silahlı süvariləri güclə gördü... Deməli, qoca Məmalik qızı Ərmağanın iynəli sözlərini udmamışdı. Deməli, o, dədə-baba düşməni həlakular evində sınmağını istəməmişdi... Qızı gəlin olan, dörd nəvəsi oynaşan imarət qoca Məmalikə pusquda durub, girəvə gözləyən düşmən səngəri kimi görünmüşdü. Məmalikə görə düşmən səngərində dayanmaq olmazdı! Ona öz səngəri, öz istehkamı gərəkdi...

Onların münasibətləri bu məqama çatınca, qoca yeganə qızından da biryolluq əlini üzürdü. Axır yeganə qızı qocanı dinləmir, onun dərdinə qalmır, əksinə, atasının mənliyini düşmən malikanəsində təhqir edib: "özünə süni, qondarma varis düzəldirsən" – deyə onu ana bətnində nəşv-nüma tapan övladını şübhə altına alırdı. Qoca Məmalikə görə indi bir Allah özü onu sındırmamalı, onun mülkünü, əmlakını düşmən həlakulara qismət etməməli, Pəhləvan Məhəmmədin yetimçəsindən ona öz varisini, mütləq oğlan varisini verməlidir!.. Yoxsa Məmalikin gözündə Allah ədalətsiz olar. Fürsəti fövtə verən, yuxudan gec ayılan Məmalikin sümükləri qəbirdə od tutub çırtaçırt yanar, tüstüsü də Savalana doğru dumanlanar...

Məmalik üçün mətləb aydın idi. Ancaq Ərmağan üçün qocanın yeni sevgisi yersiz görünən izafi pərdə idi. Ərmağana elə gəlirdi ki, atasının vücudunda od-atəş deyil, heç cüzi qığılcım da yoxdur. Qocanın ürəyində eşq-məhəbbətdən iz də qalmamışdır! Atasında hər nə od vardısa, hamısı sönmüşdür, hər nə vardısa, Sərəncam xanımın dəfni ilə məzara getmişdir! Ərmağanın nəzərində yetmiş yaşında qocada nə sevgi, nə eşq-məhəbbət? Bunların hamısı ondan ötrüdür ki, qoca xan Ərmağan xanımı da, onun həlakular sicillisi daşıyan oğul övladlarını da Məmalik mülk-əmvalından binəsib, bibəhrə eləsin, Pəhləvan Məhəmmədin yetimçəsindən də olsa, özünə varis düzəldib, Məmalik mülk-malikanəsinə oyuq qoysun!..

Ərmağan xanım balaca pəncərədən yol uzunu burulan toza baxır, atasının elə bu toz içində də itib-batıb, bu dünyadan getməsini istəyirdi. Üstəlik, qocanın indiyə qədər də itib-batıb getməməsinə təəssüf edir, əlini dizinə döyürdü... Əgər qoca Məmalik vaxtında ölüb getsəydi, eybini də özü ilə aparardı.

Ərmağan hiddətlənir, mırıldanırdı.

Ərmağan toz içində uzaqlaşan süvarilər baxdıqca daha artıq oyalanırdı:

"Bir gör mehmannəvazlıq göstərib özünü xahan kimi gözə soxan çalbığ Həlaku məqamı çatanda mənim üstümə necə şəmatətlər yağdıracaq. Qoca Məmalikin səfil anadan təvəllüd tapan vaxtsız varisinə necə güləcək, üstəlik məni, öz gəlinini gözükölgəli edib, getdikcə günümü göy əskiyə düyəcəkdir! Yəqin Həlaku oğlu Ərdahan da artıq sir-sifəti qırışan Ərmağanın üstünə növrəstə qız gətirib istehza ilə deyəcəkdir: "Sənin atanın əkdiyini biçirik!".

Ərmağan yetim qalan yeddi yaşlı qız kimi hər iki əlini üryan sinəsinə çarpazladı:

"Bu yandan da əlim carda, o yandan da. Bu Həlaku balalarına gəlincə, oğullarım da olsa iplərinin üstünə odun yığmaq xam xəyaldır!".

Qızdırmasını vecinə almayan Ərmağan xanım geyinməyə başladı, yıxılıb yatmağı, yetim kimi boynu buruq dayanmağı yersiz saydı. İndi Ərmağan hər iki tərəflə vuruşmağa hazır idi! Burada həlakularla, orada məmaliklərlə. Ərmağana görə Pəhləvan Məhəmmədin yetimçəsi də artıq Məmalik idi!.. Deməli, Ərmağan xanım iki cəbhəyə qarşı tək-tənha vuruşmalı idi. Deyəsən, Ərmağan üçün iki tərəfin də əmlak-əmvalını caynağına keçirmək, oğlunun ikisinə Həlaku əmlak-əmvalını vermək, o biri ikisinə də Məmalik əmlak-əmvalını vermək, nəticədə vahid Ərmağan xanlığı düzəltmək gərək idi: Ərmağanilər!.. Ola bilməzdimi?.. Qadın sicillisi yaramazdımı?.. OLmazdısa, Ərmağan xanım özü başqa bir erkək sicillisi düzəldə bilməzdimi?

Ərmağan xanımın toz burulğanına baxa-baxa dumanlanan beyni ayazıyırdı... Birinci növbədə onun qarşısında bir düşmən dayanırdı. – O da Allahın qocaya müjdə verdiyi, Pəhləvan Məhəmmədin yetimçəsinin bətnində nəşv-nüma tapmaqda olan kiçicik vücud idi! Əgər bu kiçicik, vücud qocanın dilədiyi kimi oğlan deyil, qız olsa, onda necə?.. Ərmağan onu bacılığa qəbul edərmi? Əsla! Nə oğlan, nə də qız! Yox, əprimiş qocadan, heç bir övlad ola bilməz, oğlan varisi deyil, qız varisi də olsa, heç zaman Həlaku xanın indi susan, məqamı çatanda isə açılan ağzını yummaq olmaz!..

Həlaku xan da, oğlu Ərdahan da, Ərmağanın gözü su içmədiyi böyük oğlu Ərşad da, o qaradinməz oğlu Gürşad da, bəlkə xırdaların ikisi də qoca Məmalikdən söz salıb gülüşəcəklər, çalbığ babanın ürəyindən xəbər verir kimi, şaqqanaq çəkəcəklər.

Belə olan surətdə Ərmağan xanım Məmalik qızı olduğunu unudub dədə-baba düşmənləri sayılan həlakulara qarışacaqdımı? O, həlakuların istehzalı hərəkət və söhbətlərini görməməzliyə, eşitməməzliyə qoya biləcəkdirmi?..

Məmalik qızı Ərmağan xanım getdikcə yaman tutulur, dəmir barmaqlıq arasına salınan dişi canavar kimi dişlərini bir-birinə sürtürdü. O öz sabahı üçün həyəcan keçirirdi. Sabah ona daha tufanlı, çovğunlu, qasırğalı, fırtınalı görünürdü!.. Ona elə gəlirdi ki, nə Həlaku, nə də Məmalikdi. Əli hər iki tərəfdən üzülüb, havadan asılı qalıbdır. Nə

məmalikləri istehzaya qoyan həlakulara qarışa bilir, nə də dörd oğlunu, burada qoyub Məmalik tərəfdən yapışa bilirdi.

Deməli, indidən vaxt-vədəni itirmədən öz qılıncını itiləmək, elə zəhər suyuna çəkdirmək gərəkdir ki, kimə toxunsa, çürütsün, qəhr etsin!..

Ərmağanın qızaran gözləri genişlənir. Allahın müjdə verdiyi qardaşınamı, bacısınamı – Pəhləvan Məhəmmədin qızı Məhtabanın bədənində düyünlənən düyünü görürdü. "Bax birinci düşmən bu vələdüzzinadır! Budur burada məni dilə-dişə salan. Budur orada məni, mənim övladlarımı əmlak-əmval vərəsəliyindən məhrum edən! Düşmən – günüdür!.. O günüdür ki, Sərəncamın rəxti-xabına soxulmuşdur! Anamın ruhunu təhqir etmişdir. Bax, gör mərhum Sərəncamın müztərib ruhu necə də mənə yazıq-yazıq baxıb deyir:

– "Niyə sən öz atanı başlı-başına qoyurdun? Niyə sən evlənmək iştiyaqına düşən atanı abırlı bir tərəfə yönəltmirdin, niyə öz vaxtında xalaqızılarının birini xanəmizə gətirmirdin ki, belə bədnamçılıq olmaya?! İndi bax gör, mənim tör-töküntümlə böyüyən, tikəmlə-təamımla boynunu yoğunladıb pəhləvanlıq eləyən Məhəmmədin yetimçəsi barigahımızda necə tovuz kimi sallana-sallana xanımlığa başlayıb? Buna nə deyərlər qız? Məni çərəldib öldürən atanın adını indi nə çağırmaq olar? Külli İranda hansı xan bu qədər üfunətli lehməyə, rüsvayçılıq bataqlığına düşübdür?".

Sanki ana ağlayırdı. Bala isə doğrudan da gözlərindən yaş tökürdü. Ərmağan üşüdüyünə görə çiyinlərinə atdığı zərli çarqatının ucu ilə gözlərini silirdi. O, boğuq-boğuq ağlayır, kinindən ovunmaq bilmirdi.

Heç kəs də içəri girmir, onu ovundurmaq istəmirdi. Elə bil ki, bu imarətin içində də bəri başdan iki cəbhə açılmışdı – birində həlakular durmuşdu, birində də Ərmağan tək-tənha dayanmışdı.

Ərmağan xanım, özlüyündə hansı yanı hər necə asıb-kəssə də yenə də zar-zar ağlayır, çırpınırdı. O, indi bir də təzədən qayıdıb yerinə girsinmi, yaxud göz yaşlarını silib dədə-baba düşmənləri həlakuların qabağına çıxsınmı? Heç düşmən qabağına gözü yaşlı çıxmaq olar? Bəs necə olsun? Axı, niyə Ərmağan qız doğulurdu ki, ata evindən də köçürüləydi! Özü də axund-üləmanın araya girməsi ilə, əslində əntər Həlakunun qurğusu ilə, Quran qəsəmi ilə Ərmağan köhnə dədə-baba düşməni həlakular evinə gəlin gəlibdir. İndi də onun uşaqlarından heç biri – nə davakar Ərşad, nə də qaradinməz Gürşad onun

yanına qədəm qoymurlar. Bəs kiçiklər necə? Görünür, kiçikləri də Həlaku o biri yana ötürüb ki, analarının yanına girib, onu ovundurmasınlar. Qoy dədə-baba düşməni məmaliklər qızının bağrı çatlasın! Əgər bu Ərmağan özü ilə məmaliklər mülkünü dartıb gətirməyəcəkdisə, daha onun bu xanimanda olmağının nə lüzumu?

Ömrü uzunu usta tərpənən çalbığ Həlaku indi də ayrı bir ustalıqla Ərmağanı qoca atasının üstünə yönəltmək istəyirdi. Həlaku xan Məmalik deyən müjdədən hələ xəbərdar olmasa da bilirdi ki, yetmiş yaşlı qocanın evlənməkdən məqsədi nədir. Həm də Həlaku yaxşısını bilirdi ki, cüzi ehtiyatsızlıq edib, Ərmağana toxunan bir söz desə, gəlin mütləq hürküb gedər, öz atası ilə birləşər, bəlkə də Pəhləvan Məhəmmədin qızından doğulan varisə ürək yandırar.

"Qoy biz zahirən bitərəf qalaq!" – deyə Həlaku bu düyünün ancaq Ərmağanın öz əli ilə açılmasını istəyirdi. Əlbəttə, düyün bir deyildi, düyün-düyünə calanmışdı. Həddi-zatında düyünlər calana-calana, dəmirə dönə-dönə qılınc kimi itilənir. Ərmağanın əlində getdikcə zəhərli gürzəyə dönür, indidən Məhtabanın bigünah balasının, qaranlıqda qorunan kiçicik xilqətin üstünə yönəlirdi.

Məhtaban görməsə də, bilməsə də Ərmağanın məktubundan, atanın, qızına olan münasibətindən vəziyyətin gərginliyini duyub, görməyə başlayırdı. O özü də Qurana qəsəm etməklə, bismillah barısını aşa bilməməklə özünü düyünə salmışdı. Bu düyün haçan, necə açılacaqdır?!

Məhtaban ildə bir neçə dəfə atası evinə qonaq gələn, əndərunu biruna, birunu əndəruna qatıb-qarışdıran Ərmağanı təsəvvürünə gətirdiyi kimi, kin-küdurətə dolan Ərmağan da bənizi saralan, geyindiyi xanım libası əynindən torba kimi sallanan, övlad gözləyən Məhtabanı təsəvvürünə gətirirdi. Bu anda iki nəzər sanki bir-birini süzürdü.

Deyəsən Məhtabanın əzəlki gözəlliyi də, cəsarəti də azalırdı. Onun gözlərində qorxaqlıq, acizlik, yazıqlıq, hələ ümidsizlik də sezilirdi. Deməli, quduzlaşan Ərmağan dişi canavar kimi qəsdinə dolduğu qurbanını parçalaya, təkcə ətini yox, onun sür-sümüklərini də gəmirə bilər! Ərmağan sanki qovula-qovula yorulan, gözlərindən qanlı yaş axıdan ceyran üstünə atılırdı!

Ərmağan anası Sərəncamın hikkəsi ilə yad günü üstünə cumurdu. Sanki burada, xan imarətində heç bir haqqı-hüququ olmayan bir gününün gözlərini çıxarıb, onun öz ovcuna qoyurdu. Sanki Ərmağan bu gününü saçlayıb sürüyür, oyulub yerə tökülən gözlərini də tapdalayırdı:

– Rədd ol burdan öz cəhənnəminə, goruna, səfil! – deyən ana-balanın səsi Məhtabanın qulaqlarında bir-birinə qarışırdı: – Rədd ol, çəkil get, xan xanəsindən!.. Get daha bizim gözümüz sənin kimi bihəyanı görməsin!.. Get, möhkəm bir qəzil çatı götür. Özünü Savalan palıdlarının birindən as! Sən hara, Sərəncam xanımın xallı-xalçalı imarəti, bərli-bəzəkli rəxti-xabı hara? Sən hansı hədd ilə xanımın libasını utanmaz-utanmaz öz əyninə geyibsən?! Sən cadusan, sən iblissən, sən şeytansan! Sən haradan gəlib Pəhləvan Məhəmməd qızının adı ilə buraya soxulubsan? Bəlkə sən heç Pəhləvan Məhəmmədin qızı da deyilsən?! Axı, o, əncümən də olsa, qeyrətli kişi idi. Bəlkə sən xan evinə dürtülüb, varis doğmaq istəyən cadugərsən, sehrkarsan?!

– Mən Pəhləvan Məhəmmədin qızıyam, nə cadugər, nə də sehrkaram!

– Əsla biz inana bilmərik ki, Pəhləvan Məhəmmədin qızı belə, nankorluq, nanəciblik edib, hədd-hüdudunu aşsın!

– Mən Pəhləvan Məhəmmədin doğma qızıyam, xanımlar! – deyə vahiməyə düşən Məhtaban üstünə hücum çəkən ana-baladan özünü qorumağa çalışırdı. – Məni bura Qurana qəsəm qılmaq vədim dartıb gətiribdir!

– Nə Qurana qəsəm qılmaq?

– Bəli xan neçə ay əvvəl aylı bir gecədə bizə gəlmişdi.

– Qoca xan aylı, ya qaranlıq gecədə sizə necə gələ bilərdi? Sən cadusan, hamısını özün quraşdırıb düzəldibsən? Biz cadugər sehrkardan doğulan haram övladın halal xanəmizdə gəzməyinə, hələ dönüb varis, vəliəhd olmağına dözə bilmərik! Biz bütün İran axund-üləmasını çağırıb bura tökərik!

– Elə İran axund-üləmasının özü bizim kəbinimizi kəsibdir, heç mənim razıməndliyimi də almayıbdır!

– Bu yalandır, quru, qara böhtandır! Bu sehrlə sən lap müctəhidin də başını tovlayıb, ağlını oğurlaya bilərsən!

– Mən heç kəsi tovlamamışam, ağlını oğurlamamışam, xanımlar! Əksinə, mənim ürəyim oğurlanıbdır!

– Ürəyim, ürəyim!.. Səndə ürək nə gəzir, Savalandan enən səfil-sehrkar?!

– Mən dönə-dönə iqrar edirəm, nə sehrkar, nə də səfiləm! Mən bədbəxtəm, Elə bədbəxtəm ki...

Xəyalında rəqiblərilə deyinən Məhtaban doğrudan da ağlayırdı. Qoca ərinin yolunu gözləyən qız amansız ana-balanın hücumlarına məruz qalmış kimi iztirab keçirirdi. İndi Məhtaban dəmir məngənə arasına alınan günahkar kimi sıxılırdı... Sərəncam xanımın həyulaya çevrilən kölgəsi, hücuma keçən Ərmağanın köz kimi yanan qanlı sifəti Məhtabanı boğazlayıb təngnəfəs edirdi. Xan imarətində Məhtabana hava çatmırdı... O, bətnindəki övlad düyününü açmaq, ağır yükdən yapışmaqla bətnindəki düyünü dağıtmaq məqamına çatırdısa, analıq hissi onun qabağını kəsir, aman vermirdi. O, övladının əlindən yapışıb başqa xanlıqları dolaşmalı, palaz-paltar yumaqla uşağını saxlamalı olsa da, özünü analıq istəyindən məhrum edə bilmirdi...

Ərmağan xanım otağın içində vurnuxanda Həlaku babasının gözündən güclə yayınan, nə vaxtdan bəri qəzəbə dolan Ərşad anasının yatdığı otağın qapısını çəkməsinin burnu ilə açıb içəri girdi:

– Gördün də, Ərmağan xanım, neçə saat əvvəl nə boyda ehtiramı yerə çırpıb, müsəlləh gədələrini də götürüb buranı tərk edən bişərəf qocanın nadan oyununu?

– O sənin babandır, biədəb!

– Mən o biədəb qocanı kürəyindən odlu fişənglə nişan alardım!

– Bəs niyə nişan almadın, dərisinə sığmayan Ərşad Həlaku?

– Çünki Həlaku babam mane oldu. Mən atlanıb qocanın ardınca qoşmaq istədim. Ancaq kişi dedi ki, qonağı nə qapıda, nə də yolda atmazlar!

– Sən doğma babanın qatili olub, ona əl qaldırmaq istəyirdin, nəməkbəharam?

– Elə baş töhməti babaya əl qaldırmaq da azdır!.. Onu atının quyruğuna bağlayıb meyitini evinə sürütdürmək gərəkdi!

Ərmağan xanım hiddətlə irəli durub oğlu Ərşadın qabağında dayandı:

– Səndə bu ədavət haradandır, Məmalik babasının duz-çörəyini tapdayan gədə?

– Hər nə olsa da biz həlakular heç kəsinadan hərəkətini udan deyilik!

– Sən nə yaman cilov gəmirirsən, yumurtadan təzə çıxan, babasının pulu ilə geyinib-kecinən qotazlı!

– Mən yumurtadan təzə çıxan qotazlı deyiləm!

– Bəs nəsən?

– Qüdrətli Qacar hərbiyyə dənişgədəsinin zabiti!

– Səni ora indi buradan acıq edib gedən bədbəxt baban qəbul etdiribdir!

– Mən Tehranda təlim alan Qacar zabitləri sırasında Həlaku sicillisindənəm!

– Onda mən də Ərdaha xanlığında Məmalik sicillisindənəm! – Ərmağan xanım oğlunun üzünə tutarlı bir şillə çəkdi. – Biədəb həlakular! Siz heç vaxt bizim məmaliklərin daxili işlərinə müdaxilə etməyin!..

8

Qızı Ərmağanın evindən tündməcaz dönən Məmalik xanın qaşqabağı Məhtabanın təsəvvürə gətirdiklərinin, duyub düşündüklərinin çoxunu təsdiq edirdi. Məhtaban nə qədər nəcib hərəkət edib, xanı öz qızının yanına yollamaqda alicənab iş görmüşdüsə, Ərmağan bir o qədər nanəciblik eləmişdi.

Məmalik xanın pirani gülçüyə qarşı rəftarı dəyişmişdi. Xan addımbaşı pirani gülçünün üstünə qışqırıb: "Güllərə pis baxırsan, səni qovacağam!" deyə onu təhqir edirdi. Guya xanın gecikən izdivacına gülçü qoca günahkarmış!.. Guya pirani gülçü, qoca xanı vaxtında ayıltmayıbdır, yaşca özündən kiçik olan Məmalikə ağsaqqallıq etməyibdir, onun başına ağıl qoyub, deməyib ki, "Pəhləvan Məhəmmədin yetimçəsidir, indi ki, gətirmisən, beş-üç günlüyə xidmətində saxla, gecənin bir aləmində qolundan tut, at bayıra!..".

Üstündən neçə gün keçsə də, Məmalik xanın qəzəbi görəsən niyə soyumurdu? Niyə Məmalik xan əndərunun qulluqçu-qaravaşına söyüş yağdırırdı? Hansı acığa-ədavətə görə isə o, mübaşirlərini, məmurlarını silahlandırıb kəndlərə göndərir, neçə ildən bəri tökülüb qalan vergiləri, bəhrələri yığdırırdı. Nə vaxtdan mum kimi yumşalan, Məhtabanın eşqinə giriftar olan, saç-saqqalı nurani görkəm alan Məmalik bunca təbəddülata uğrayıb başqalaşmışdı?!

Qoca xanın bu hərəkətləri Məhtabana əsrarlı görünürdü. Sanki söyülən də, təhqirlərə məruz qalan da Məhtaban idi. Xan, şəxsən Məhtabana güldən ağır bir söz deməsə də, bəzən əzəlki rəftarına qayıdıb Məhtabanın qumral saçlarını tumarlasa da, onun halından əhval tutsa da, Məhtaban yenə də kədərli idi. Məhtabana elə gəlirdi ki, Məmalik

xan üzə açılışıb ona bir söz deməsə də, qoca xanda olan bu təbəddülata səbəb ancaq və ancaq Məhtabandır! Əgər bu izdivac olmasaydı, Ərmağan xanım atasını hüzuruna çağırmaz, xan həlakular evindən qəzəbli dönüb qılıncını əlinə almazdı. Əgər Məhtabanın övladı sağ-salamat təvəllüd tapsa, özü də xanın arzu etdiyi kimi oğlan olsa, böyüyüb qocanın yerində varis, vəliəhd qalsa, deməli o da atasının yolu ilə gedəcək, yenə də bu hasarın o biri yanında ah-nalə ərşə bülənd olacaqdır!.. Onda bəlkə xandan sonra uzun ömür sürən Məhtaban özü də Sərəncam xanım kimi bədrəftar və əzazil olacaqdır?!

Məhtaban fikirdən-fikrə düşür, öz-özünə əylənib deyirdi:

– "Mənim oğlum gərək adil olsun, tamam-kamal adil! Yoxsulları ağır vergilərdən xilas etsin! Kəndlərdə camilər tikdirsin, öz tikəsini bismillahla kəsib, süfrəsini əlhəmdüllahla yığışdırsın! Olmasın varlı xan, olsun ortabab xan! Qoy mənim xan balam rəhmli olsun, özü də Məhəmməd babası kimi şücaətli olsun! Cır-çolpa xan balalarından cəsarətli olsun! Lap Ərmağanın uşaqlarından bir boy uca olsun! Daha Ərmağanın zabitlik dərsi alan oğlu Ərşad kimi obada it döyən, başıaçıq gəzib rəiyyətə öcəşən, arvad-uşağa nalayiq söz deyən, küçələrdə atını dördnala çapıb, adam basan olmasın!".

Məhtaban öz mühakimələrində bəzən lap irəli gedirdi: "Adı nə olmalıdır, bu tifilin?.. Xan razı olsaydı, tifilin adını Məhəmməd qoyardıq. Axır mənim atam da bivarisdir! Ancaq Pəhləvan Məhəmməd varis axtarmadı, axır varis onun hansı əmval-əmlakına sahib olacaqdır? Ömrünün axırında Təbriz əncümənçilərinə qoşulan, əlinə silah götürüb Qacara qarşı aparılan döyüşlərdə şəhid olan Pəhləvan Məhəmməd kaş öz yurdunda Məhtaban adlı qızını da heç qoymayaydı! Onda bikəs, bipənah qızı belə müşkülə də düşməzdi! Axı, Məhəmmədin nəyinə gərəkmiş Məhtaban kimi başı qovğalı qız?!".

Məhtabanın oğlu olsa, yəqin ki, ondan soruşan da olmazdı ki, uşağın adını nə qoyaq, bu ad sənin xoşuna gəlir, gəlmir, razısan, ya narazısan? Necə ki kəbin kəsdirəndə Məhtabandan rəy soruşan olmadı. Hələ bəlkə uşağın tərbiyəsi fədai qızına yox, bir mötəbər dayəyə tapşırılacaqdı. "İlahi, bəlkə sən məni də, bətnimdəki balamı da təvəllüd zamanı həlak edəsən? – deyə Məhtaban haldan-hala düşür, hərarətdən uçunmaya keçirdi. – Bəlkə elə bizi həlak etsən yaxşıdır ki, ikimiz də biryolluq xan sərdabasına yox, başı daşsız, ayağı nişansız qəbiristana gedək, orada itib-bataq!".

Məhtaban özünü xan sarayında deyil, zülmət zindanda sayırdı. Nə xanın üzü əzəlki kimi ona güləş görünür, nə də bu ev-eşik onun ürəyinə əzəlki kimi yapışırdı. Gün ötüb, həftə keçib, ay dolandıqca Məhtabanı daha artıq xof basırdı. O, hansı qaranlıq guşəyə qədəm qoyurdusa, "bismillah" deyirdi. "Bismillah" Məhtabanın dilindən düşmürdü. Məmalik xan isə Məhtabanı gözdən qaçırmırdı.

– Qız sən nə bismillahın quyruğundan tutubsan?

– Xan, xofa düşürəm!

– Xan evində, hasar içində, keşikçilər qoyduğum vaxtda bu kaşanədə nədən çəkinirsən?

– Hər şeydən qabaq sənin zəhmli qaş-qabağından!

– Qız, mən rəiyyətin, rəncbərin, qulluqçu-qaravaşın, veyl gülçünün üstünə acıqlanıramsa, bunun sənə nə dəxli?

– Elə bil hamının əvəzində xan mənə acıqlanır, mənə qəzəblənir!..

– Axı, sən xan hərəmi ola-ola təzədən niyə rəiyyətliyə qayıdıb hər cövri-cəfanı üstünə götürmək istəyirsən?

– Heç özüm də bilmirəm, xan!

– Bəlkə səni qara basır, qız?

– Bəli, xan, halım çox pərişandır!

– Bəlkə axundu çağırım sənə dua yazsın?

– Hansı axundu?

– Elə lap bizim kəbinimizi kəsən axundu!

Burulğandan-burulğana düşən Məhtaban birdən-birə yumşalıb rəhmə gələn, gözlərində əzəlki eşq işıltıları görünən xana sığınıb, qaç-qova düşən adam kimi ağır-ağır nəfəs aldı, xanın qəzəbi soyudu, hamilə ananın halına yandı:

– Qız, istəyirsən ki, rəiyyət-rəncbərə, qul-qaravaşa qarşı öz qaraqışqırığımı yığışdırım?

– Yığışdırsan, qulun ollam, xan!

– Qız, mən səni bura nə qul, nə də kəniz gətirmişəm, – xanın saçsaqqalı müztərib Məhtabana yenə də əzəlki kimi nurani göründü.

– Mən bilirəm ki, bizim izdivacımızı sübut edən qalın kağız, bismillahla başlanan əqdnamə sandıqçadadır!

– Bax, onu möhkəm saxla qız!

– Görək hələ Ərmağan xanım bizə nə buyuracaqdır?!

– Ərmağan xanımın buyurduqları ancaq həlakular üçündür!

– Ərmağan sənin doğma qızındır, xan!

– Doğma qız düşmən yanında öz qoca atasının ehtiramını saxlamalıdır!

– Xan, bütün qovğa və cəncəl mənim üstümdədir!

– Bütün qovğa və cəncəl vərəsəlik üstündədir, qız!

– Nə olar, Məmalik mülkünün yarısını Ərmağana verəndə?

– Həlakulara?

– Nə üçün həlakulara, öz nəvələrinizə!

– Bəs o biri yarısı?

– O biri yarısı öz sərəncamınızda qalsın!

– Bəs mənim sərəncamım işləməyəndən sonra kimə qalsın?

– O Xuda təyin edən bir qismətdir!

– Yox, Məhtaban xanım, əsla yox!.. Mənim öz varisim, öz vəliəhdim olacaqdır! – Yumşalan xanın sifətində bir an qəzəb alovları gəzindi. – Özü də mütləq olacaqdır! Adını da Məmalik qoyacağam!..

– Axı adətə görə sağ adamın adını uşağa qoymazlar, xan!..

– Ancaq dədə-baba düşmənim həlakuların acığına! O nanəcib sicillinin acığına! Qoy bütün həlakular da, Ərmağan da, çalbığ babasına çəkən Ərşad Həlaku da o, nəməkbəharam da görsün ki, xudanın qüdrəti ilə məmaliklərin tüstüsünü Savalana ucaldan vardır!

Qəzəblənmiş Məmalik xanın səsi dəyişdikcə Məhtaban da haldan-hala, təbdən-təbə düşürdü. Bəzən o bilmirdi ki, öz düşündüyü kimi bədbəxtdir, ya qoca ərinin söylədiyi kimi xoşbəxt?! Əgər qocanın söylədiyi kimi xoşbəxtsə, niyə bəs ürəyi açılmır?.. Hətta axund yazan qıyqacı duanı alt köynəyinə tikəndən sonra da yenə xof-qaraltı üstündən çəkilib getmir. Yenə Sərəncam xanımın eybəcər kölgəsi ondan aralanmır. Ərmağan xanımın köz kimi qızaran gözləri ondan üzülmür. Yenə ana-bala birləşib Məhtabanın üstünə düşürlər. Onlar qaranlıqda deyil, işıqda da Məhtabandan əl çəkmirlər. Məhtaban hərdən istəyirdi ki, pirani gülçünün komasına getsin, dərdini ona açsın, ya xan əndərunda olmayanda onu öz yanına çağırsın. Ancaq Məhtaban belə bir addım atmağa cürət etmirdi. Axı, Məmalik xanın pirani gülçüyə qarşı qəzəbi soyumurdu. İndi qoca Məhtabana aşpazxanadan xörək-çörək də daşımırdı.

Məmalik xanın qoyduğu qaydaya görə Məhtaban nə əndərun, nə də birun qulluqçu-qaravaşı ilə heç bir əlaqə saxlamamalı, kəlmə kəsməməli idi. Cana doymuş Məhtaban bir gün cəsarətə gəlib xandan soruşdu:

– Xan nə mənzurla məni pünhan saxlayırsınız?

– Çünki, qız, xan qul-qaravaşı çox söz gəzdirən olur!
– Daha nə söz? Onsuz da hamısı aləmə bəllidir!
– Bəli, Allahın əmri, peyğəmbərin şəriəti ilə!
– Bəs onda daha bizim aramızda aydın olmayan nədir, xan?
– Sən sözü az çərlət, qız!
– Nə üçün sözü çərlədirəm?
– Ona görə çərlədirsən ki, bilmirsən bu əndərun-birundan kim Ərmağan Həlakunun casusudur, kim casusu deyildir!
– Xan, əgər siz buyuran kimi isə daha Ərmağanın üstündən altı ay keçən izdivaca nə dəxaləti?
– Birdən içəridən Ərmağana xəbər çatdı, birdən burada içəridə hiylə quruldu, Ərmağan da öz Həlaku oğlanlarını götürüb gəldi?
– Ərmağan öz oğlanlarını götürüb gəlsə, kim bu qapıları onun üzünə bağlaya bilər, xan?
– Nə üçün biz bu qapıları bimürvət qızın üzünə bağlaya bilmərik, Məhtaban?
– Bu, sizin xanlıq şəninizə kəsir gətirər! Deyərlər ki, Məmalik xan yeganə qızını öz ata mülkünə qoymur!
– Bu, xanın öz işidir!
– Onda xanı yox, ögey ananı qınayarlar. Deyərlər ki, Ərmağandan kiçik olan analığı – rəiyyət qızı nanəcibliyinə salıb, xan qızı Ərmağanı ata qapısından geri qaytarıbdır!
– Sən Ərmağanın adını tez-tez təkrar edirsən, Məhtaban!
– Çünki xandan gərək gizli qalmasın ki, nə Ərmağanın, nə də Sərəncamın kölgəsi bir ləhzə məndən əl çəkmir!
– Qız, səni yenə də qara-qura basır?
– Bəli, xan!
– Axund yazan qıyqacı duadan sonra daha əlacımız nədir?
– Özüm də heç bilmirəm, xan! Özüm də naçaram..
– Qız, bəlkə səni Tehrana müalicəyə aparım?
– Əsla, xan!
– Nə üçün, Məhtaban?
– Axı, ikicanlıyam, bu halımda imarətdən kənara çıxmağa utanıram!
– Onda sən öz bari-həmlini yerə qoyandan sonra bir çarə taparıq!
– Görək hələ qəza nə göstərir, xan.
– Mən mütləq Tehrandan mamaça gətirdəcəyəm!
– Tez gətirsəydiniz, bəlkə mənə də qulaq yoldaşı olardı!

– Ancaq qorxuram o mamaça Ərmağanla əlaqə bağlaya, Məhtaban?

– Necə əlaqə, xan?

– Belə əlaqə ki, övladımızın başına bir iş aça!

– Deməli, bizim dərdimiz dərmansızdır, xan?

– Xeyr, Məhtaban, mən mamaçanı tamam öz məqamında gətirdərəm...

– Deməli, xan öz qızı Ərmağandan heç vəchlə arxayın deyil?

– Düzü Məhtaban xanım, xan sarayında daxili düşmən xarici düşməndən çox və qorxuludur!

– Düzü Məhtaban xanım, xan sarayında

– Ərmağan hər yana dönsə, yenə də sizin doğma qızınızdır, xan!

– Ərmağan çoxdan həlakudur!..

Məmalik xan gözlərindən qanlı yaş axıdan Məhtabanın qara kirpiklərini dəsmalla sildi. Ancaq Məhəmməd qızı Məhtabana heç bir təsəlli, toxtaqlıq kömək etmədi, onu öz əzəlki halına qaytara bilmədi. Ərmağanla Sərəncamın qoşalaşmış kölgəsi onu daha şiddətli təqib etməyə, onu bu otaqdan o otağa qovmağa başladı.

Qəribə idi! Məhtaban gözlərini açır, Ərmağanı yanında, çalxaq sümüklü Sərəncamı böyründə duran görür, gözlərini yumur, yenə də onları görürdü...

9

Məmalik xan öz əhdinin üstündə durdu. O, doğum günündən iki həftə əvvəl Tehrandan Qacar sarayına yaxın dairədən saçları xınalanmadan, anadangəlmə şabalıdı olan xarici həkim-mamaça dəvət edib, imarətinə gətirtdi.

Ərdaha xanı tərəfindən hörmətlə qarşılanan xarici mamaça ilk əvvəl ikicanlı xanımın əhvalını qocadan soruşdu. Məmalik Məhtabanın üzüntülü, ruhi əzablarından xeyli və yana-yana danışdı. Tehrandan toz-torpağa bata-bata gələn mamaça xanım tez-təcili yol libasını dəyişdi, əllərini tər-təmiz yudu, bədənnüma güzgü qabağında dayandı. Xarici xanım şabalıdı saçlarını darayıb, xəstəsinə təsirli görünsün deyə özünü Avropa üsulu ilə artıq səliqə-sahmana salmağa çalışdı.

O, xandan izin alıb Məhtabanla tanış oldu, onun əlindən tutub yataq otağına adlatdı. Həkim-mamaça Məhtabanı dinməz-söyləməz tibbi müayinədən keçirtdi. Sonra xarici xanım Məhtabandan firəngcə

bir neçə söz soruşdu. Məhtaban dinmədi, fars dilinə keçdi, Məhtaban başını buladı. Onu öz ana dilində dindirincə Məhtabanın cavab verdiyini görüb:

– Yaxşı olacaqsan, xanım! – dedi.

Məhtaban gözlərini fərşə dikib qəhərləndi.

– Nə üçün ağlayırsınız, xanım?

– Heç, elə-belə...

– Ağlamaq yaramaz. İndi əsəbiləşmək sizin səhhətinizə ziyandır, xanım!

– Halım xeyli fənadır, həkim!

– Əsla yox! – deyə mamaça cavan xanımın qumral saçlarını tumarladı, doğumdan əvvəl onu toxtatmaq, bacardıqca ruhi sarsıntılarından xilas etmək istədi: – Gərək Şərq xanımları da bizim avropalı xanımlar kimi cəsur olsunlar... Gərək yəqin biləsiniz ki, yer üzündə heç bir əcinnə-filan yoxdur!.. Bunları yaradan sizin Şərqin xurafatıdır. Ürəyinizdə nə sirr varsa, hamısını mənə açın... Mən həkiməm, mənə hər sözü söyləyə bilərsiniz...

Məhtaban göz yaşlarını yaylığının ucu ilə silincə xarici xanım qırağı zərli dəsmallarından birisini çantasından çıxarıb ona uzatdı:

– Siz gözəl gözlərinizi təmiz dəsmalla silin, xanım! Özü də qəmi, kədəri özünüzdən uzaqlaşdırın! Əgər yanılmıramsa, təcrübəm gücünə güvənib deyə bilərəm ki, siz xana varis doğacaqsınız... Gör, sizi nə böyük xoşbəxtlik gözləyir!.. O, qoca atasının dizləri üstündə oturub onun qar kimi ağ saqqalını sığallayacaq, ona yenidən uzun, sağlam ömür bəxş edəcəkdir! Bəlkə xan oğlunun toyunu edib, hələ nəvələrinin də toyunda oynayacaqdır!.. Bəli, bəli! – deyə xarici xanım sözünə davam etdi:

– Şərqlilər çox fikirli olmadıqlarına görə uzun ömür sürürlər. Yüzdən yuxarı! Siz cavansınız, heç nəyə darılmayın. Şərq belədir. Şərqli kişi cavan xanımı yamanca xoşlayır!.. Mən neçə xan evində olmuşam. Xanın yetmiş yaşı, sonuncu xanımının on beş yaşı... Olur xanım, belə də olur. Şərq, müsəlman belədir! – Xarici xanım dönüb Məhtabana yumşaq kürsü göstərdi. Özü də ev sahibəsi kimi başqa bir kürsü çəkib əyləşdi.

– Sizin təvəllüdnamənizə əsasən neçə yaşınız var, gözəl xanım?

– Atamın mis camın qırağında yazdırdığına görə gərək iyirmi beş yaşım olsun?

– Atanız sizin təvəllüdünüzü camın qırağında yazdırmışdır? Təəccüb, çox təəccüb! Məgər xanın axundu olmayıb ki, İran adətinə görə isminizi, təvəllüdünüzü Quranın kənarında yazdıra?!

– Xeyr, mənim atamın axundu olmayıb!

– Bəs sizin atanız nə cürə xandır ki, onun axundu olmayıb?

– Mən rəiyyət qızıyam.

– Rəiyyət?! Nə olar, indi bizim Avropada izdivac zamanı kimin hansı zümrəyə mənsub olduğuna etina edən yoxdur... Görünür, Məmalik xan Avropa səyahətində olanda bizim demokratik qaydalardan aşılanıbdır... Fərqi nədir? Siz Şərq nağıllarında rəvayət edildiyi kimi gözəl, Şərqin həqiqətən füsunkar gözəllərindənsiniz. Bax, qaşlar necə qara, gözlər necə ala, kirpiklər ox kimi uzun, bəniz ağ, saçlar da qumral!.. Boy-buxunda da heç bir avropalı qızından aşağı deyilsiniz. Sarayda hər şeyə öyrənərsiniz, necə deyərlər, gör-götürdür. Xan malikanəsində təlim alarsınız. Zabitəli xanımlardan biri olarsınız. Ömrü boyu bənövşə kimi boynubükük olmaq – daha böyük xan xanımına yaraşmaz!

Xarici xanım Məmalik xanın xanımına əməlli-başlı Avropa mühazirəsi oxudu, bu təvəllüddən heç bir fənalıq, qəmginlik gözlənmədiyini elan etdi. Özü də xanı oğul müjdəsi ilə muştuluqlayıb, ondan azı-azı bir kənd qoparacağını bildirdi. Nəhayət, xarici xanım Məhtabanı güldürüb, az da olsa, onun qaşqabağını açdı:

– Nə qədər ki, mən buradayam, nə özünüzdən, nə də balanızdan qorxunuz olmasın, xanım!..

Məhtaban şirindil qonağa hörmət etmək istədi. İstədi ki, üst eyvana çıxıb, on ay əvvəl sübhçağı xanın intizarda dayandığı sütunlu tağbənddən aşpazı səsləsin, tez xörək-çörək bişirilməsini, qonaq üçün ləzzətli təamlar hazırlanmasını tapşırsın. Ancaq çəkindi. Düzü, heç kəs Məhtabana belə hüquq verməmişdi. Bu müddət ərzində Məhtaban Məmalikdən başqa heç bir kəslə kəlmə kəsməmişdi. Məhtaban pirani gülçüdən savayı heç kimin üzünü də görməmişdi. O, sanki qəfəsdə idi. Düzdür, Məmalik xanın kaşanəsi çox bərli-bəzəkli, Məhtabanın geydiyi paltarlar olduqca zərli-zibalı, daddığı təamlar ləzzətli, hamısı da xan xanımına yaraşan idi, ancaq bütün bu dəbdəbənin içində Məhtabanın müstəqilliyi yox idi, ixtiyaratı məhdud idi. Hər şey xanın fərmanından, sərəncamından asılı idi. Məhtaban öz evlərində istədiyi xörəyi – əriştəni, umacı anasına bişirtdirib, çox ləzzətlə yediyi halda, burada onların birini də dilinə gətirməmişdi. Məhtabana elə gəlmişdir ki:

– Qız nə əriştə, nə umac? Onlar çoban-çoluq istılığıdır, – deyə Məmalik xan arvadının bu arzusunu eşidincə, əlini əlinə vurub güləcəkdir. Deməli, Məhtabanın öz istədiyini deməyə, yaxud bir kəsə göstəriş verməyə cürəti, ərki çatmırdı. Mamaçadan sonra bir az cürətlənən Məhtaban xanın yanına döndü, tutula-qızara soruşdu:

– Xarici xanım üçün nə hazırladaq, xan?

– Necə nə hazırladaq, qız?

– Xörəkdən, təamdan ərz etmək istəyirəm...

– Nə lazımsa, mən özüm mətbəxə tapşırmışam, sən nigaran qalma!

– Yaxşı, belə olsun, xan!.. Bəs xarici xanım hansı otaqda yatacaq?

– Onu da özüm tapşırmışam, qız! Mənim qonağım, sənin mamaçan kallayı otaqda məskən salacaq!

– Deyəsən, xan, mən o otağı heç görməmişəm?!

– Bəli, o vaxt göstərə bilmədim, indi sən də görərsən.

Məhtaban çəkinə-çəkinə soruşdu:

– Xarici xanım sizə varis bəxş edəndən sonra burada neçə gün qalmalı olacaq?

– Belə şeylərin zəhmətinə qatlaşıb, özünü üzmə, – deyə Məmalik xan Məhtabanı öpüb oxşadı. – Sənin Məmalik kimi nökərin olandan sonra heç nəyin qəmini çəkmə, qız! Tək sən balana pərvəriş verən dayənin üstündə göz ol!..

– Mən özüm balamıza pərvəriş vermək niyyətindəyəm, xan.. Siz gərək bu ixtiyaratı mənim əlimdən almayasınız...

– Deməli, siz övladımızı başqasına arxayın olmaq istəmirsiniz?

– Xan, mən qıjıltılı çayda Ərdaha obasının palaz-paltarını yuyan bir qızdım. Yolumdan azmaq istəmirəm, istəyirəm ki, övladımızı özüm bəsləyəm!

– Sən hər vaxt uşağı Ərmağandan gözlərsən, qız! – deyə Məmalik xan açıq qapını örtdü. – Sən hər zaman, hər hansı yaşında övladımızı ondan gözlə!.. Uşağın ögey bacısından, – atasının bivarisliyinə sevinən, Ərdaha xanlığının bütün əmval-əmlakına yiyə durmaq istəyən o pörtdəmişdən körpəmizi gözlə!

– Yəni Ərmağan xanım, bura mübarəkbadlığa gələcəkdir, xan?

– Gecmi, tezmi gələcək!.. Qovsan da, o həlaku casus bu qapıdan əl çəkməyəcək!

– Adam da öz doğma atasının yurdçuluna qəsd edərmi?

– Bu boyda Ərdaha torpağının üstündə edər!.. Düşmən həlakulardan dörd oğul doğan xanım, övladının ikisinin xeyrinə nəyə desən gedər!..

– Unutmayın ki, Ərmağanın oğlanları sizin nəvələrinizdir, xan!

– Həlakular bizim dədə-baba düşmənlərimizdir!

– Təkrar edirəm xan, onda bəs siz öz yeganə qızınızı niyə dədə-baba düşməninizin evinə verirdiniz?

– Onlar axund-üləmanı yığıb Quran qəsəmi ilə ağlımı oğurladılar, qız!

– Belə fitnəkarlıq kimin fitvası ilə olubdur?

– Çalbığ Həlakunun hiyləsi ilə! Məqsədi də bizim dədə-baba torpağımızı biryolluq həlakular qəbiləsinə qarışdırmaq, Həlaku xanlığını böyütmək, məmaliklər sərdabəsini yerlə-yeksan etməkdir!

– Daha bu necə Quran qəsəmi, necə qohumluq oldu, xan?

– Mən özüm də bu babətdən yamanca düyünə düşmüşəm, Məhtaban!

– Məni də paltar-palaz yumaqdan əbəs yerə döndərib belə açılmaz düyünə saldınız, xan!

– Dünya dava üstündə bərqərardır, qız! İnnən belə sən tamam ayıq, gözüaçıq ol!

– Yəqin ki, Ərmağan xanım mənim barəmdə da çox naguvara nağıl uydurubdur?..

– Bəli uydurubdur!..

– Onda xanlar arasında düşmənçiliklə qohumluq yamanca bir-birinə qarışıbdır.

– Bəli, bütün İran xanlıqlarında vəziyyət belədir, Məhtaban!

– Siz məni açılmaz müşkülə, çıxılmaz girdaba saldınız, xan!

Məhtaban, xarici xanım söyləyən sayağı bənövşə kimi boynunu bükdü, bir az əvvəl az-çox sevinc içində gülən gözlərindən solğunlaşan yanaqlarına hüznlü göz yaşları süzüldü. Xarici xanım özü də qəhərlənməyə başlayanda o biri otağa keçdi...

## 10

Məmalik xanın birbaşa Tehrandan öz xanımının üstünə xarici mamaça gətirmək xəbəri Ərmağanın başında Savalan şimşəyindən də güclü çaxdı. Vücudunda isti cərəyan gəzdi. Bu cərəyan onun qızışan ürəyində qaynadı. Sanki yanar ocağın üstündə qaynayan qazan nəinki buxarlanmağa, hətta od tutub yanmağa, köz rəngi alıb qızarmağa başladı: – Necə xarici xanım, necə firəng həkimi, necə mamaça?”.

Ərmağan bilmədi yerin altındadır, ya üstündə!.. Yaxud hava qaranlıqlaşanda, Savalanda ildırımlar oynaşanda həlakular imarətinin külafirəngisindədir? Atası atlanıb gedəndən sonra Ərmağanın ürəyində əmələ gələn yara bir də cırmaqlandı, qanadıldı. Məmalik xanın yeganə qızının gözləri cəllad gözləri kimi ağına qədər qızardı. O, qılınc götürüb kimin boynunu desən vurmağa hazır olan mirqəzəb görkəmini aldı. İndi nəinki Məhtabanı, ya onun bətnindəki körpəni öz qanına qəltan etmək, lap qoca Məmalikin də boynunu vurmaq Ərmağandan ötrü bir qurtum su içmək kimi asan bir şeydi. Yalnız onda Ərmağan xanımın alovlanan ürəyi sərinlərdi: “Necə yəni o boyda Ərdaha xanlığını öz əlindən çıxarmaq?! Necə yəni Məmalik mülkündə Ərmağan xan olmamaq, bütün Ərdaha mülkünü Pəhləvan Məhəmmədin yetimçəsi Məhtabanın düzdən-əyridən düzəldib meydana qoyduğu varisinə vermək?! Bu, heç ola bilərmi?! Əsla!..”.

Ərmağan xanımın başında oynayan şimşək sanki Savalan dağının zirvəsində oynayan şimşəyə qarışırdı, Ərmağan arada bir Savalana baxır, xanlara bəla kəsilən, onların təbirincə “qaçaq-quldur” məskəni sayılan Savalan heç də mirqəzəbə çevrilən xanıma havadar durmurdu. Əksinə öz üsyançıları ilə Ərmağana düşmən kəsilirdi. Dağın zirvəsində çaxan şimşəklər Savalan ətəklərini tutur, geniş düzənləri, Həlaku, Məmalik torpağını əhatə edirdi. Ərmağan xanım dəli olmaq dərəcəsinə gəlir, öz-özünə söylənirdi:

– “İldırım olmasın, şimşək çaxmasın, lap bütün dünyanı od-alov tutsun, mən Məmalik mülkünü tutmalıyam! Mən Məmalik ərazisinin bir qarış torpağını belə heç bir varisə verməməliyəm! Yetmiş yaşında qocadan nə varis, necə varis, hansı varis?.. Çoban-çoluqdan, gədə-güdədən özünə varis düzəltmək, səfil-sərgərdan yetimçəni ulu xan qızı Sərəncamın yatağında yatırtmaq, firəng mamaçasını Tehrandan, Qacar sarayının qulağının dibindən çağırmaq, indidən mötəbər şahid düzəltmək ki, Məmalik mülkünün varisi vardır! Qoca tülkünün uzaqgörən fəndgirliyinə baxın! Mən neçə kərə demişəm ki, sən Sərəncam xanımın otağına başqa bir ləçərin qədəm qoymasına cürət edə bilməzsən, qoca! Neçə kərə bəbəyinin içinə söyləmişəm ki, kişi, daha, sənin ələyin ələnib, xəlbirin göydə fırlanır, izdivac iştiyaqına düşüb, aləmi bizə güldürmə. Olan-olmaz beş-üç ilini şərəflə başa vur, abırla öl! Yoxsa əpriyən, titrəyən, bir fincan qəhvəni düz-əməlli dodaqlarına gətirə bilməyən, səpələyib süfrəyə tökən vaxtında ayağa durub oynama!

Başına ağıl qoyanda, sözün düzünü üzünə deyəndə atına minib gədələrinlə qaçırsan?! Ola bilməz, sənin varis niyyətin baş tutmaz! Kaftar!.. Sən qoca Məmalik heç kəsə, heç vaxt sübut edə bilməzsən ki, bu oğlan Məmalikdir, mülk bunundur! Sən gərək biləsən ki, fədai yetimçəsindən vücuda gətirilən, Savalandan gələn qaçaq-quldurun pünhani-vücuda gətirdiyi vərəsədən sənə varis ola bilməz!

Firəng mamaçası! Yaxşısı bu idi ki, sən qocalıb əldən düşən çağında özün üçün həkim çağıra idin! O, həkim də səni təpədən dırnağacan müayinə edib həbb-səlatin verəydi ki, daha təngişən nəfəsin əzab-əziyyətlə çiyinlərindən çıxmayaydı! Daha nəinki belə gülünc təvəllüd üçün dava-dərman alaydın! Görünür, bunların hamısı sabahkı məhkəmə üçün sənəd-sübut düzəltmək, gorbagor olandan sonra bizim üçün cəncəl varis qoymaqdan ötrüdür!.. Ay oldu ha!.. Özün öləsən, Məmalik xan! Ay baş tutdu ha!.."

Ərmağan xanım otağına döndü, qapıları bağladı, lampaları yandırmadan polad sandıqçanı açıb bəzəkli mücrünü çıxartdı. O, qızıl qiymətinə əldə etdiyi zəhər dolu şüşəni yoxladı. Şüşə sopsoyuq idi. Şüşə Ərmağanın odlu barmaqlarında buza dönürdü. – Bu zəhərlə Məmaliki oyanlıq etmək olarmı? Aqibəti necə olar?.. O dünyada cəhənnəm odu məni yandırsa, nə təhər olar?.. Bu sirr qiyamətdə açılsa, nə cavab verərəm?.. Deməzlərmi ata qatili Ərmağan?! Qoy desinlər! Qoy cəhənnəmin zəbanə çəkən alovlarını təmamən mənim üstümə çevirsinlər, yandırıb külümü çıxarsınlar. Sonra külümdən vücudumu düzəldib, bir də təzədən yandırsınlar. Mən yenə məqsədimdən dönməyəcəyəm. Bəli, mən ata qatili olacağam!..

Ərmağan xanım soyuq şüşəni əlləri titrəyə-titrəyə pambığa büküb mücrüyə, atasının bəxş etdiyi daş-qaşın içinə qoydu. O, şüşəni elə ehmalla qoydu ki, heç səs-səmir çıxmadı. Lakin qulaqlarına səs gəldi. Sanki şüşəni daş-qaşa toxundurdu, şüşə sındı, zəhər səpələnib daş-qaşa çiləndi. Ərmağan əyilib axtardı.Pambığa bükülü kiçicik şüşəni götürdü, dönə-dönə əlində yoxladı, bozaran pəncərəyə tutub diqqətlə şüşəyə, şüşənin içinə baxdı. Az qala gözlərinə inanmadı, əlinə də etibar etmədi. Dönüb kibrit çəkdi, küncdə, dəyirmi stolun üstündəki lampanı yandırdı. Pəncərənin pərdələrini çəkdi. Avropa səyahəti zamanı hər ehtiyata qarşı əczaçıdan beş özü ağırlığında qızıla əldə etdiyi zəhər şüşəsini asta-asta tərpətdi, çalxadı, zəhər damcıları – əfi ilan zəhərində də artıq çürüdüb tökməyə amadə olan damlalar aralandı, lampa işığında

zəhərli əfi görkəmi aldı. Deməli, qoca Məmalik zəhərlənmişdir! Onda Ərmağan gözə kül üfürmək üçün sıx saçlarını yolub, Məhtabanı günahkar tutar ki, sənin Savalan adlı aşnan, ya Savalan ot-əncirindən yığıb-qaynadıb, zəhər düzəldib, şüşəyə tutub gətiribdir, ya da aran ətəklərində əfi ilan öldürüb zəhər damlalarını sənə çatdırıb ki, məzlum Məmaliki tezbazar edəsən. Elə bəri başdan mülkü öz oğlunun adına keçirəsən, Savalan dağında gizlənən Savalanı da özünə xəlvəti xidmətkar götürəsən, barigahda eyş-işrətə baxasan! Olmaz, əsla ola bilməz!.. Ərmağan ölməyincə, onun qəbrinin üstünə yekə sal qaya qoyulmayınca, üstündə uca günbəz qaldırılmayınca, günbəzin kəlləsində kollar bitməyincə sənin doğduğundan Məmalik mülkünə varis ola bilməz! Elə bu zəhəri də mən özüm sizə içirəcəyəm!..

Ərmağan əlindəki şüşəni qəzəblə silkələyəndə şüşə oynadı, lampa cilik-cilik oldu, qalxan alovu Ərmağan payəndaz palazla boğdu, bayırda odlu şimşək çaxdı, güclü gurşad yağışda işıq pərdələrdən içəri keçdi, otaqda közə bənzər dil gəzdi. Ərmağan bütöv bir dünyanı başlı-bütünlü itirmiş kimi, pərt olub çöl tərəfə qulaq verdi. Yağışdır, elə yağışdır ki, ucundan tut, göyə çıx! Ərmağan əlinin içində kibrit yandırdı. Guya kibrit yağışa düşəcək, yanmayacaqdı! Ərmağan başqa lampanı yandırdı. Dəyirmi stolun yerə sürüşən, neftə bulaşan örtüyünü götürdü. Zəhərli şüşə qırıntılarını burnuna apardı. Zəhərin zəhmindən yenə də Ərmağanın gözlərinə qan çiləndi:

“Xudaya, sən mənim yolumu bağlamaqmı istəyirsən? – Ərmağan daha da qəzəbləndi. Deməli, xudaya, sən istəmirsən ki, mən ata qatili olam? Bilmirəm hansı haqla sən haqsızlıq tərəfində durursan!”. Ərmağan dəhşətə gəldi. Sanki etdiyi cinayətin izini itirmək məqsədi ilə zəhərli şüşənin qırıntılarını bircə-bircə yığdı, ayrı bir parçada düyünçələyib bağladı. “Bəlkə bu şüşə qırıntılarını yuyub təbəxxürdən keçirib yenə də zəhər damcıları düzəltmək mümkün oldu?”. Ərmağan qapını açıb qaravaşı çağırdı:

– Qız Xədicə.

– Bəli, xanım!

– Ay qız, karsan?

– Eşidirəm, xanım!..

– Pədərsüxtə bura gəl!

– Bə çeşm, xanım!

Xədicə gələn kimi Ərmağan onun saçlarından yapışdı:

– Nə vaxtacan sənin işini görəcəyəm?.. Nə vaxtacan sənin əvəzində şüşə silib, lampa yandıracağam?

– Xanım, toran qovuşanda, şimşəklər çaxanda mən gəldim, qapı bağlı idi!

– Döyə bilməzdin qapını?! Dəqqilbab edə bilməzdin?..

– Xanım, dəqqilbab etdim, eşitmədiniz!

Ərmağan xadimə qızın saçından çəkib ayaqları altına saldı. Savalan kəndlərində dəli inək balasını ayaqlayan kimi, Ərmağan da on beş yaşlı nərmə-nazik qızı ayaqladı, onun qol-qabırğasını qırdı. Sanki o, Məhəmməd qızı Məhtabanı əzib-əzişdirdi. Bir azdan bu inilti-zarıltıyla Tehrandan, zabitlik danişgədəsindən yenicə yay tətilinə gələn Ərşad xan içəri girdi. O, anası ilə ötən küsülülüyü aradan götürmək məqsədi ilə qızın üstünə düşdü. Üç gün əvvəl zorladığı "sirri açsan, dilini dibindən kəsərəm!" – dediyi Xədicənin sümüklərini xurd-xəşil etdi. Ərmağan oğlunu dindirmədi. Ancaq Ərşad ölümcül xadimənin qolundan tutub otaqdan sürüdü:

– Qəm yemə, ana, – deyə o, təkəbbüranə nəzərlə güclə nəfəs alan Xədicəni süzdü. – Ölsə, elə gecə ikən izini itirərik! Nə babam bilər, nə də atam!..

## 11

Xarici xanım ərköyünlüklə xan imarətində dolanır, heç də əndərun-birunun qayda-qanununu tanımaq istəmirdi. O, üzünə salıb arada Məhtabanı da özü ilə əndərun bağçasına endirirdi. Xarici xanım əndərunda olanda qoca gülçü ilə hey zarafatlaşıb əylənirdi. O, qocadan becərdiyi qızıl güllərin növünü soruşur, ağ əllərinə tikan batmasın deyə dəri əlcək geyib, xoşladığı güldən öz balaca qayçısı ilə kəsib dəstə düzəldirdi. Əlvan güllərin ətri bir-birinə qarışır, xarici xanım məst olunca qoxulayır, sonra da Məhtabanın burnuna tuturdu:

– Xanım, qoxulayın, ciyərləriniz üçün faydalıdır! – deyirdi.

– Məhtaban qızılgül dəstəsini burnuna aparır, güllərin məstedici ətrini udsa da, rahatlana bilmir, sıxılan ürəyi açılmırdı. Xarici xanım xəstəsinə qayğı göstərib:

– Xanım, mən sizin kədərinizi qovmağa cəhd etdiyim halda, – deyə şabalıdı saçlı başını bulayırdı, – nə üçün özünüz-özünüzü qəsdən üzürsünüz?

– Düzü həkim xanım, özüm də heç baş açmıram, – deyə Məhtaban mamaçasının müqabilində nəzakətlə gülümsəmək istəsə də, bacarmayıb, yazıq görkəm alırdı.

Xarici xanım saraylarının daxili fitnə-fəsadlarına az-çox bələd olsa da, Məhtabanın dəruni döyüntülərindən baş aça bilmirdi. Onun saysız-hesabsız sorğularına Məhtaban açılışıb cavab verib deyə bilmirdi ki, Ərmağan xanımın anası ilə birləşən məşum kölgəsi onu izləməkdən usanmır, hətta günün günortaçağı güllükdə onu rahat buraxmır.

O, deyə bilmirdi ki, həlakular evinə gəlin gedən Ərmağan namə yazıb öz atasını tələb edib, Məhtaban necə insanlıq göstərib atanın öz qızının yanına getməyini təkid edib, Məmalik xan öz qızının yanından necə dəhşətli xəbərlə qayıdıb...

Məhtaban açılışıb xarici xanıma deyə bilmirdi ki; gərgin doğum günlərində, ölüm-dirim arasında dayandığı vaxtda o, özündən çox bətnində çırpınan, bütün bu çəkişmə-didişməni duymuş kimi vurnuxan balasının taleyi üçün dərd çəkir.

O, firəng mamaçasına deyə bilmirdi ki, ömründə əndərun-birun tanımayan, hicab-örtü nə olduğunu bilməyən, hələ evlərində qız ikən at belinə qalxan, Ərdaha kəndlərində xanlıq eləyən Ərmağan xanım hansı ilan-çəyən yatan yuvanın necə zəhərli xilqətidir!

Məhtaban açılışıb xarici xanıma deyə bilmirdi ki, əgər Ərmağan bu izdivacdan narazıdırsa, atası Məmalik bu narazılıqdan narahatdırsa, qan çanağı kimin başında sınacaqdır?!

Məhtaban açılışmırdı, dərdini açmırdı, bütün bunları xarici xanıma demirdi. Hamısını öz ürəyinə salırdı! Xarici xanımın cidd-cəhdlərinə baxmayaraq Məhtabanın ürəyi dəqiqədən-dəqiqəyə daş yüklənən kimi ağırlaşır, qəfəsə salınmış yaralı quş kimi döyünür, az qala sinəsindən çıxıb qaçmaq istəyirdi! Ancaq bu ürək sinədən çıxıb qaçmır, ana bətnində döyünən ikinci ürək üçün sızıldayır, ağlayırdı. Ana ürəyi nəinki indiyə qədər olanları, hətta ola biləcək hadisələri görürmüş kimi için-için ağlayırdı...

Əgər Məhtaban Qurana qəsəm qılmaqla taleyə əsir düşməsəydi, bismillahla başlanan əqdnamə ilə zəncirlənib bağlanmasaydı, Məmalik xanda nə azarı vardı? Əgər Məhtabanın əri üstü unlu bir qoca dəyirmançı olsaydı, dəyirmandan duzsuz, alaçiy fətir gətirər, arvadına verərdi. Arvadı da alaçiy fətiri tikə-tikə kəsər, duza batırıb iştaha ilə yeyər, tale ilə razılaşar, "tanrımın qisməti belədir!" – deyib sınıq-

sökük komasında rahatlanardı. Əgər Məhtabanın üstü unlu qoca dəyirmançıdan uşağı olsaydı, özü doğduğu kimi, özü də bələyərdi. Özü cırcındaya bürüb-büküb, özü döşünə salıb əmizdirərdi. Məhtabanın özünə qalsaydı, xarici, şabalıdısaç mamaça, yaxud dayə nədi, öz uşağını gözündən qırağa qoydu nədi?!

Zəhər şüşəsini hövlündən çalxayıb lampaya çırpıb sındıran, biçarə Xədicənin nahaqdan ölümünə bais olan Ərmağan Həlakunu məhkəməyə çəkən, cəza hökmünü özünə oxuyan hakim harada idi? Bəs niyə görünmürdü? Niyə, əgər varsa, bir adil hakim cınqır çıxarıb demir ki, ağayi Ərşad Həlaku, ay millət zabiti, bəkarətinə toxunduqdan sonra, ananla barışmaq naminə hansı haqla xadimə Xədicənin olan-qalan nəfəsini də kəsib, onu qətlə çatdırdın, meyitini də gecə ikən uzaq bir xəndək altına atıb quyladın? Biçarə qızcığaz Avropanı gəzmişdimi? Oradan beş qızıl çəkisinə zəhər almışdımı? Yaxud o binəvanın zəhərdən xəbər-ətəri vardımı?!. Zəhər şüşəsinin sınmağında, zəhərin tökülüb dağılmağında o kimsəsizin günahı nə idi?.. Görünür, Xədicənin günahı bu idi ki, cəmi-cümlətanı üç gün əvvəl Ərşad xan onun nazikcə biləyindən yapışıb çarpayısının üstünə fırlatmışdı, otağının qapısını möhkəmcə bağlayıb, qızcığazın ağzını əli ilə qapamış, bəkarətini zalımcasına pozmuşdu?! Elə buna görə də Ərşad ikitərəfli səy göstərmişdi, üzdə anasına xidmət etmək, əslində isə öz cinayətinin izini itirmək istəmişdi.

Ərşad xanın mülahizəsincə babası Məmalik rəiyyət qızının dadına-tamına baxmışsa, niyə nəvəsi baxmasın! Əgər Ərşadın Məmalik babası qocaldıqca başını itirib, bir kənizi özünə xanım edibsə, daha niyə nəvəsi başını itirib, kənizi sağ qoysun ki, sabah gözdən yayınıb, bir guşədə uşaq doğsun, bələyib balasını qucağına alsın, kəndbəkənd, şəhərbəşəhər İranı dolaşıb desin ki: – "Bu uşaq Həlakudur, buna rəhm edin, bu yazıqcığaza yemək verin, tərəhhümə gəlin, bizi xanənizin guşəsində gecələməyə qoyun!".

Axı, Məhtaban özü belə acı taleli qızlar haqqında az eşitməmişdi. İndiyə qədər onu sağ-səlim saxlayan atasının zəhmi, atası öləndən sonra Pəhləvan Məhəmmədin sayəsi, əlinə silah götürən fədainin kölgəsi idi! Pəhləvanın kölgəsinin qorxusundan bir kəs Məhtabana təcavüz edə bilməmiş, qoluqüvvətli qıza yaxın gələ bilməmişdi. Məhtaban belə böyümüşdü!.. Bəlkə Məhtaban ona söz atan Ərdaha cavanlarından

birinin üzünə balaca gülümsəsəydi, qaşqabağını sallayıb palaz-paltarla qıjıltılı çaya tərəf enməsəydi, yaxşı idi?!.

Kaş, Məhtaban qoca xana məhrəm olmaqdan əzəl Quran qəsəmini pozub, daş hasarı aşıb, evlərinə qayıdaydı, heç xan xanımı olub öz ürəyini yeyə-yeyə xarici xanımla bahəm zər-ziba içində "bəxtəvər" görkəmində dolanmayaydı. İçində ilan qıvrılan güllərin arasında gəzməyəydi!..

– Yenə nəyin dərdini çəkirsiniz, Məhtaban xanım?

– Özüm də heç bilmirəm, hörmətli həkim!

– Axır sizə demişəm ki, mən olan yerdə siz heç nəyi özünüzə dərd etməyin!

Xarici xanım güllükdən qayıdıb xan imarətinə girdi, imarətin daxili səliqə-sahmanını öz zövqünə uyğun qurmaq məqsədi ilə başladı.

– Bu nədir, niyə özünüzü belə incidirsiniz? – deyə Məmalik xan çəkinə-çəkinə soruşunca, xarici xanım çəkinmədən gülə-gülə cavab verdi:

– Evinizdə Avropa düzəldirəm, xan!

– Nə Avropa?

– Avropa, Fransa!..

– Şərqdə, Savalanın ətəyində nə Avropa, nə Fransa, xanım?

– Mütərəqqi Avropa, Savalanın ətəyində mütəməddin Fransa! – Xarici xanım Məmalik xanın divardan açıb boşaltdığı, qulluqçu-qaravaşlar vasitəsilə aşağı zirzəmiyə daşıtdırdığı xalı-xalça yerlərini göstərdi: – Bax, buraya Fransadan zövq oxşayan tablolar gətirib asmaq lazımdır! Hələ doğum təntənəsindən sonra xanın yataqxanasına da əl atacağam, gözəl tablolarla, şəkillərlə Avropa düzəldəcəyəm!..

– Nə tablo, necə şəkil, xanım? Bizim evdə necə Avropa düzəldəcəksiniz?

– Biz təcili teleqrafla Parisə sifariş edəcəyik, sizin orada bankda olan pulunuzdan tabloların dəyərini ödəyəcəyik!

– Axır necə, nə təhər, xanım? – deyə məəttəl qalan, ancaq əziz qonağının xatirinə toxunmaq istəməyən Məmalik xan heyrətlə soruşdu. – Düzü, mən xaricdə olanda siz buyuran o tablolara çox baxmışam, ancaq heç biri Təbriz xalı-xalçasınca mənə yapışmayıbdır!

– Üzr istəyirəm, Məmalik xan! – deyə xarici xanım Ərdaha xanının öz zamanından necə geri qaldığına pərt oldu.

Məmalik xan səhvini başa düşüb, tezcə təshih etməyə çalışdı:

– Axır siz necə buyurursunuz, xanım?.. Bəlkə bir də diqqətlə dinləyəndə xoşumuza gəldi? Mən, zərli çərçivələrin qiyməti barəsində əsla çənə-çürüklük etmək iştiyaqında deyiləm!

– Mən ən çoxu Avropa səliqə-sahmanını, mədəni üsuli tərzini, bəri başdan bizim təvəllüd tapacaq cavan xanın zövqünü nəzərdə tuturam!

– Necə, necə?! – Məmalik xan mamaçanın işarəsini bilsə də, məlul-müşkül dayanan Məhtabanın bulud kimi tutulan qaşqabağını açmaq, xarici xanımın yanında yabanı görünən Məhəmməd yetimçəsinin üzünü balaca da olsa güldürmək üçün qəsdən sual verdi. Xarici xanım da öz pərtliyini tezcə bir tərəfə atdı, Məmalikdən xeyli qənimət qoparmaq həvəsi ilə cavab verdi:

– Gələcək xanın, İranın ən mədəni, ən mütərəqqi xanının zövqünü ilk ibtidadan nəfis sənət əsərləri ilə tərbiyə etmək üçün mən deyən mədəni, müasir səliqə-sahman gərəkdir!

– O xan kim ola? – deyə ərköyün uşaq kimi ağzı açıla qalıb, varis həsrəti ilə gülümsəyən Məmalik bilə-bilə yenə xarici xanımdan soruşdu.

Xarici xanım da bilə-bilə üstünü vurmadı:

– Bu böyük xandır! – Utandığından başını gizləməyə yer tapmayan Məhtabana nəzər saldı. – Biz bu xanın yolunu səbirsizliklə gözləyirik! Heç şübhəsiz ki, mədəni mamaçanın əli ilə tutulan xanzadənin çox böyük xan olacağına ümid edə bilərsiniz! O, yəqin vəzir olacaq, sizin öz ibarənizcə desək, sədr-əzəm olacaqdır!..

Məmalik xan daha sözü döndərmədi, söhbət ciddi olsun, ya qeyri-ciddi, onun qırışıq torbalar içində itən gözlərində sevinc yaşları gəzdi. Bütün bu söz-söhbəti özü üçün təhqir sayan Məhtabanın qara kirpiklərində kədərli gilələr dolandı. Qoca ərlə cavan xanım bir-birinə nəzər salınca, birdən eyni narahatlıq içinə düşdülər, onların hər ikisinin təsəvvüründə köz kimi qızaran, mirqəzəb ruhlu Ərmağan göründükcə nəfəslərini güclə dərdilər...

## 12

Məhtaban barhəmlini yerə qoydu. Xarici mamaça körpəni öz qayda-qanunu ilə tutdu. Məmalik xanın əsil arzusunun yerinə yetdiyini, oğlan uşağı doğulduğunu görüncə xarici xanım yerdən göyəcən sevindi. O, əndərundan gətirdiyi cavan xadiməyə ağ xalat geydirdi,

onun köməyi ilə körpəni çimizdirib yuyundurdu, yançaqlarını şapalaqlayıb, bir qədər səsləndirib cığıldatdı. Sonra cavan ananı huşa gətirib:

– Xanım, oğlunuz olubdur, – deyə onu təbrik etdi. – Gözünüz aydın, xanın diləyi yerinə yetibdir!

Olan-qalan rəngi də süddüyan sarısı ikimi saralan Məhtaban hər necə ağrı çəksə də, analıq hissi ilə gülümsədi, razıməndlik əlaməti olaraq, təbibinin müqabilində uzun, qara kirpiklərini endirdi.

Mamaça fürsəti fövtə vermədən özünü nizama salıb bir neçə addım o tərəfdə, öz otağında intizarda dayanan xanın qapısını döymədən içəri girdi:

– Xan, müjdəmizə nə verir?

– Həkim nə buyursa?

– Bütün xanlığı!

– Mümkündür, xanım!

– Zarafatsız xan, oğul varisi-vəliəhd müjdəsinə nəqd nə əta edirsiniz?

– Firəng bankında yatan məbləğin on faizini!

– Bəlkə on beş ola, böyük xan?

Xan əlini sağ gözünün üstünə gətirib:

– Bə çeşm, – dedi. – Olsun on beş!

Mamaça isti-isti masa üstündəki qələmə işarə etdi. Xan dediyində durdu. O cibindəki açarı çıxarıb xaricdən gətirdiyi polad sandığı açdı, dilim kitabçanı çıxarıb əskinası andıran etibarnaməni yazıb doldurdu, imza edib şəxsi möhürünü də buraya basdı, dilim vərəqəni kötüyündən qoparıb xarici xanıma təqdim etdi. Xarici xanım vərəqəni nəzərdən keçirincə gözləri od alıb alışdı, sevincindən vücudu qızışdı, o dünyanı vecinə almadan xanın o üzündən, bu üzündən öpdü, ənnik-kirşanlı üzünü xanın ağ yumşaq saqqalına sürtə-sürtə nazlanıb kəkilli fərə kimi yastılandı:

– Böyük xana başımla söz verirəm ki, onun varisini öz nəzarətim altında böyüdüb, cavan vəliəhdini cah-calalla özünə çatdırım! Ancaq bir şərtlə.

– Nə şərtlə, xanım!

– Şərtin ağırlığını mən öhdəmə götürəcəyəm!

– Bəs yüngülünü kimin öhdəsinə buraxacaqsınız?

– Yüngülünü sizin, Məmalikin!

– Ağır-yüngülü nədən ibarətdir, bilmək olmazmı?

Ağırı budur ki, mənim Parisdə bir mədəni Rəfiqəm var, – deyə xarici xanım dayəliyi mütləq həmin rəfiqəsinə şərt qoydu.

– Məhtaban xanım çox çətin ki, körpəsini gözündən iraq qoya, – deyə Məmalik xan başını aşağı saldı. – Çox çətin ki, Məhəmməd qızı xarici dayəyə razı oldu!

– Axı nə üçün razı olmasın? – Xarici xanım heyrətlə yırğalandı. – İndi Məhtaban Məhəmməd qızı xanım olubdur!.. Onun üçün öz uşağını belə böyütmək əlverişlidir? Qoy cavan xanım bərli-bəzəkli geyinsin. Şərq üslubunda tovuz quşu sayağı sallansın, bizim səxavətli xana uzun ömür bəxş edən səadət gətirsin, onu cavanlaşdırıb daha qocalmağa qoymasın!..

– Sizin rəfiqəniz gəlsə, şərti necə olacaqdır?

– Mənim rəfiqəm çox nəcib xanım, mədəni mürəbbiyədir, – deyə xarici xanım rəfiqəsini vəsf etdi. – Sizin firəng bankında olan məbləğin faizini istəməkdən o yana getməyəcəkdir!

– Oralı-buralı, eləmi, xanım?

– Yəni böyük xan buradakı xərc-məxarici buyurmaq istəyir?

– Əsla! Biz elə də xəsis deyilik. Şərtimiz baş tutsa, sizin rəfiqəniz nəinki oğlumuzun dayə və mürəbbiyəsi, həm də ən əziz qonağımız olacaqdır!

– Onda şərtiniz nədir, böyük xan?

– O sizin fərmayişinizdən asılıdır.

– Fərmayişim belə olar ki, sövdamız baş tutsa, mən sizin xeyrinizə hərəkət edərəm!.. Sizə izafi cəfa olmasın deyə Paris bankındakı məbləğin faizinin yarısını ona verərik!.. Bir qismini də təvəllüd tapan xanın mütərəqqi oyuncağına!..

Məmalik xanın oğlu xəbərindən huşunu itirmək dərəcəsinə gəldiyini görən xarici xanım, rəfiqəsini bir də tərifləyib göyə qaldırdı, onun firəng dilindən başqa üç Avropa dilini – alman, ingilis, ispan dilini bildiyini də əlavə etdi:

– Bəli, mənim rəfiqəm xanzadəyə elə dil açandan bu dilləri də təlim edər! Bütün İran xanları bizim növcavan ən çox dilbilən olar! Beləliklə, şübhəsiz, gələcəkdə taleyini mədəni Avropa ilə bağlayan İranın baş vəziri olar!..

– Mən istəyirəm ki, bizim növcavan Ərdaha mülkünün varisi olsun! – Məmalik xan, ifrata varan xarici xanıma öz əsas məramını bildirdi. – Mənim ümdə məqsədim budur!

– Xeyr, Ərdaha mülkü bizim tərbiyəmizlə böyüyən növcavan xan üçün azlıq edər, – deyə xarici xanım əl-qolunu açdı. – Mənim rəfiqəm ona Firəngistan cahangirliyindən təlim verəcəkdir! O, görəcəkdir ki, öz yerində rahat, firavan yaşamaq üçün qıraqları qarmalamaq, ucqarları çəngələmək zəruridir!..

– Bu, xam xəyaldır, xanım! İran indi öz başını güclə girləyir, təzədən İrana nə cahangirlik?

– Biz xam xəyalı həqiqətə çevirərik. Biz onu mütləq cahangiranə hakim kimi, Napoleon hərbi yürüşləri üzərində tərbiyə edərik! Məmalik malikanəsində möhkəm-müstəhkəm dayanmaq üçün onun öz yan-yörəsini qorxuya salması zəruridir! Yoxsa, darısqal dairədə növcavan xanı sıxıb suyunu çıxararlar!

Xarici xanım yarızarafat, yarıciddi danışıb güldü. Məmalik xan bir qədər sükut edəndən sonra xarici dayə barəsində başlayan söhbəti maraqlı olsa da vaxtından qabaq saydı. Xarici xanım Məmalik xanın fikri ilə çətin razılaşdı. O, dedi ki, firəng dayəsini Məmalik mülkünə gətirib çıxarmaq azı-azı üç ay çəkər.

– Bəs üç aya qədər bizim, körpəyə kim göz olar?

– Məmalik xan öz varisini Həlaku sicillisinə mənsub qız nəvələrindən xeyli yuxarı mərtəbələrə qaldırıb, dədə-baba düşmənlərinə yanıq vermək üçün hər nəyə desən razı olduğunu gizlədə bilmədi. Məmalik istəmədi ki, Avropaya açılan qapı örtülsün, ordan Məmalik malikanəsinə saçıla biləcək işıq qapansın. Fikirləşdi ki, bəlkə də xarici xanımın şərtinə əməl etsin, onun firəng rəfiqəsini şöhrət üçün gətirsin, necə deyərlər, bəri başdan bir verib, o başdan iki qazansın. Onun oğlu Məmalik mülkünün varisi olmaqla, dədə-baba düşmənləri həlakuları xeyli ötsün, məmaliklər sicillisini qaldırıb bütün xanlardan neçə baş uca etsin!

Onda görəsən başqa xanların paxıllığı tutmazdımı? Onlar oturub-durub, hər yanda sulu qəlyan xoruldada-xoruldada deməzdilərmi ki, növcavan Məmalikin zatı qırıqdır? Deməzdilərmi ki bir tərəfi cılda rəiyyətdir? Bəlkə Məmalik mülkünün xanı üçün anasının rəiyyət qızı olması o qədər də irad tutulmasın? Lakin xarici xanım deyən vəzirlik mənsəbində, baş vəzirlikdə zat-nəcabət nəzərə alınmayacaqdımı?.. Məclisi-İran belə şəxsə səs verib, qol qoyub, əl qovzayıb onun dövlət başında durmasına razı olacaqdımı? Hələ Şahənşah Qacarın özü “zatı qırığın” baş vəzir olmasına imza atacaqdımı?..

Əvvəllər Məmalikin başına heç belə dolaşıq fikirlər gəlməmişdi. O, ancaq öz dədə-baba mülkünün dərdini çəkmişdi. İndi birdən huşu başından oynayan, istəyinin ziddinə iştahası itilənən qoca xan ağır vəziyyətdə olan öz xanımının qapısını açıb onun əhvalını soruşmadan, Avropadan açılacaq qapının dərdini çəkirdi.

Axır bu mamaça haradan belə tamlı-dadlı bir zadı qocanın damağına damızdırdı ki, indicə-indicə rahatlanan qocanın başı bunca gicəllənsin?

Məmalik xan ağ bığını, ağ saqqalını tumarladı.

– Deyəsən Məmalik xan daxili gərginlik keçirir? – deyə xarici xanım gözlərindən güldü.

– Düz buyurursunuz, xanım, – deyə qoca xan öz tərəddüdünü gizlədə bilmədi. – Düzü ayazıyan beynim dumanlanmağa başlayır!

– Nə üçün?

– Bu firəng dayəsi barədə.

– O barədə heç də həyəcanlanmayın. Vaxt olar yaxşı-yaxşı fikirləşərsiniz!

– Bəs o dayə gəlincə necə olsun? – Xarici xanım ustalıqla geri çəkilincə, Məmalik xan nəyinsə əlindən çıxa biləcəyindən qorxub irəliləyir, həlakuların acığına öz varisi üçün çox qazanmaq istəyirdi. – Bəlkə biz Məhtaban xanımla bir yaxşıca məsləhətləşib, xanzadənin tərbiyəsini elə lap ibtidaidən, bəri başdan firəng dayəsinin əlinə verək?! Onacan, yəni bizim oğlanın üç aylığınacan özünüz bizdə qonaq qalasınız?

– Bu, mənim üçün çox çətin olar, xan!

– Nə üçün, xanım? Biz sizin qulluğunuzda dura bilmərikmi?

– Çox-çox çətin olar, – deyə Məmalikin nəbzini tutan, onun iştahasını duyan mamaça naz satdı, – başqa tanış-biliş xanların dəvətlərini yerə salıb, xəcalətdə qala bilmərəm!

– Əgər hamı xanların əvəzində, firəng bankına verdiyim çeki təzələyib on beş faiz əvəzinə, iyirmi beş yazsam, necə?

– Onda ayrıca söhbət edərik, – deyə xarici xanım ustalıqla əl atıb qoca xanın biləyindən tutdu:

– Gedək, gedək, xanımınıza gözaydınlığı verin!..

Xarici xanımla qoca xan Məhtabanın yanına girdilər. Məhtaban tabuta qoyulan ölü kimi sapsarı idi. Xanun ay işığında gördüyü gözəllikdən, onun köpüklü göldə çimən çağından heç nə qalmamışdı. Sanki

Məhtaban nəyi vardısa hamısını əsirgəmədən yanında, ağ örtüklü beşikdə yatan körpəsinə vermişdi. İçəri girincə xan da, mamaça da səssiz durdu. Nə etmək lazım gəldiyini düşünən mamaça yuxulu körpəni beşiyindən qaldırıb, yan otağa keçdi, körpənin üzünü açıb xana təqdim etdi.

Əzəlki halına qayıdan xan körpəni qucağına aldı, gözlərini yuxarı dolandırdı, xarici xanımın Avropa mədəniyyəti müqabilində öz müsəlmançılığını büruzə vermədən ürəyində:

– "Xudaya, səd həzar şükür! – dedi. – Daha mənim, dədə-baba düşmənim həlakuların qarşısında parlayan qılıncım vardır! Mənim elə bir qılıncım var ki, gələcəkdə bütün həlakuları kəsə biləcəkdir! Həlakular üçün dörd oğul doğan Ərmağanın özünü də!".

Sanki şadlığından coşan ata ilə uzaqda olan qızı deyil, barışmaz düşmənlər üz-üzə, göz-gözə durdular. Məmalik xan körpəsini bağrına basmaq, ürəyini yarıb içinə qoymaq istəsə də ehmallı tərpəndi, özünü yığışdırıb öz təmkinini pozmaq istəmədi. Dünyanı yorub yortan xarici xanım, dəruni həyəcan keçirən qocaya dəymədi, onu öz körpəsi ilə qoyub zahının yanına döndü, Məhtabanı hüznlə boş beşiyə baxan gördü:

– Xan körpənizi götürdü, siz yatmışdınız!

– Haraya götürdü körpəni? – Vəziyyətinin ağırlığına baxmadan Məhtaban əllərini döşəyə dayayıb çarpayısında oturdu. – Haraya apardı körpəni, xan?

– Xanım, sizin belə tərpənməyiniz, durmağınız əsla yaramaz, – deyə mamaça gülümsəyə-gülümsəyə Məhtabanın çiyinlərindən yapışıb onu öz yumşaq rəxt-xabında uzatdı. – Siz əsla nigaran olmayın, oğlunuz atasının qucağındadır!

– Atası bir əl boyda körpə ilə necə rəftar edə bilər?

– Düzü, xan bilmir övladını yerə qoysun, ya qanadlandırıb göyə qaldırsın! Düzü, qoca az qala başını itiribdir!

– Xan sevinirmi, xanım?

– Bəli, xanın sevinci intəhasızdır!

– Düzü, mən də belə istəyirəm. Qoy iztirab çəkən qoca ömründə bir kərə sevinsin!

– Bəs siz özünüz necə, xanım? Siz niyə sevinmirsiniz?

– Mən xəstəyəm, xanım!..

– Axı nə üçün?..

Mamaça sözünü qurtarmamış, qoca xan qucağında gözlərini açan körpəyə baxa-baxa içəri girdi. Onu Məhtabanın böyrünə uzatdı, titrəyən dodaqları ilə xanımının saralan yanaqlarından öpdü. Xaricdən dayə dəvət edib-etməmək məsələsini sonraya qoydu. Qoca xana qayıdan cavan atalıq hissi onu daha qəmdən çıxıb ayılmağa, bir insan kimi mərhəmətli olmağa çağırırdı. Düzü, bu halında bilmək olmurdu ki, o qoca Məmalikdir, ya Pəhləvan Məhəmmədin cavan kürəkəni...

13

Yetmiş yaşlı Məmalikin oğlu olmaq xəbəri hər yana yayılıb dədə-baba düşməni həlakulara çatdı. Bu xəbərdən bütün həlakuların böyüyündən kiçiyinə sir-sifəti turşudu. Həlaku ilə Məmalikin böyük nəvələri burunlarını bir qarış salladılar. Xırda nəvələr mırıldandılar. Ərmağan xanım qapandığı otaqdan çıxmadı, qana susayan sifətini göstərmədi.

Bu hal qoca Həlakunun xeyli xoşuna gəldi. Yaxşı ki, Məmalik qızı Ərmağan dədə-baba düşməni qayınatasının titrəyən qırışıq sifətini, əsən çal bığlarını, açılıb-yumulan, damarları titrəyən əllərini görmədi. Bəlkə qayınatasının belə övzainə görə Ərmağan xanım inada düşər, adlayıb atasının tayında durar, qoca Məmalikin yetmiş yox, lap yüz yaşı olsun, ona bəraət verər, atasının səngərinə keçərdi. Özü də tərəddüd göstərmədən qılınc siyirib, atasının oğul varisinin keşiyində durar, bu gecikən varisin başından bircə tük əskik olmağa qoymazdı. Onda daha məmaliklər mülkü həlakular torpağına qarışmaz, yenə dədə-baba düşməni sicillisinin tüstüsü Savalana ucalar, gələcəyinə həlakular göz açmağa macal tapmazlar. Birdən Pəhləvan Məhəmmədin nəvəsi ana babasına oxşasa, onun qolunu qatlayan kəs nəinki həlakular torpağında bütün məmləkətdə tapılmaz. Birdən bu əcaib uşaq qalxıb, boy atıb qollu-qanadlı Rüstəm-Zal olar, hər hansı düşmən ondan tük salar. Bəlkə bu çağa pəhləvan, sərkərdə olub öz Məmalik əcdadının intiqamını ögey bacısının həlaku uşaqlarından alar, öz qılıncını onlardan əsirgəməz, hamısını ölüm körpüsündən keçirər, həlakuların başlarını nizələrə taxdırıb kəndbəkənd gəzdirər... Quru küləşə düşən qığılcımdan, ya payız xəzanından meşəyə düşən ildırımdan hansı alov desən çıxmaz? Bəli, alov aləmi bürüyər, kənd deməz, oba deməz, hamısını yaxıb-yandırar.

Birdən firəng mamaçasının əli ilə doğulan uşaq başqa bir firəng dayəsinin əli ilə tərbiyə alar, Avropa dillərini bilər, nəinki şahsevən xanları içərisində, bütün İran xanları arasında öz fəhm-fərasəti ilə fərqlənər! Yox Pəhləvan Məhəmmədin yetimçəsindən doğulan bu əcaib uşaq yekəlib, boy atıb qalxa-qalxa süpəhsalar, vəziri-cəng olar. Hər nə oyun desən bu vələd-xətərdən çıxar! Əslinə dürüstlüklə, diqqətlə baxanda yetmiş yaşlı qocada nə kişilik?!

Qoca Həlaku bütün bunları öz-özlüyündə götür-qoy etdikcə qəzəbə dolur, qeyzə gəlirdi. "Bəlkə oğlum Ərdahan söyləyən sayaq vaxtında açıq-açığına hərəkət etməyinə dəyərmiş?.. Bəlkə Ərdahanın əli ilə Ərmağanı öz atası Məmalikin üstünə birbaşa ovxalayıb itiləmək gərək imiş?! İtiləmək gərək imiş ki, Ərmağan ilk əzəldən işə qarışaydı, uşaq işıqlı dünya üzü görməmiş anası qarışıq rədd ediləydi...".

Bu fikirlə öz otağına çəkilən, gəlini Ərmağandan da ziyadə qan tutan sir-sifətini başqalarından da artıq öz nəvələrindən gizlədən qoca Həlakunun beynində qanlı mühakimələr gəzinirdi. Çalbığ Həlakunun içəridən qan laxtaları tutan qırışıq sifəti göydəki qara buludlardan da bərk tutulurdu! Birdən sanki bu qara buludlar parçalanır, çalbığın gözlərində ayazıyan göy zolaqlar görünürdü. Həlaku vurnuxa-vurnuxa, öz çal bığlarını dartışdıra-dartışdıra düşünür, gəlini Ərmağanın mütləq bu işə qoşulacağını yəqin edincə, tutqun sifəti açılırdı. Əksinə, birdən gəlininin tərəddüd göstərib, qoca atası tərəfində duracağını gümanına gətirincə, yenə də sifətində odlu şimşəklərdən xəbər verən buludlar toplanır, çöhrəsi kömür kimi qaralırdı.

Həlaku işinin çəmini tapınca vurnuxur, adətinə görə ona ariz olan müşkülatı ayıq başla həll edirdi. O, qızışan başla fərman verməkdən çəkinirdi. Hər necə qızışsa da onun ustalığı vardır. Qoca Həlakunun məkri onun astalığı və ustalığı ilə müşayiət olunurdu. Çalbığ Həlakuya görə gərək bu iş elə üstüörtülü, ustalıqla olsun ki, heç şeytan da baş açmasın. Gərək Ərmağan atasının süni varisini məqamında boğsun! – deyə çapalayıb vurnuxan Həlaku hər iki əlini qabağa gətirir, sanki qohumunu boğazlayıb, var gücü ilə boğurdu. – Gərək gələcəyinə azacıq aşın duzu olmayan tifil elə bəri başdan biryolluq qəbrə qoyulsun!

Onda qoca Məmalik bu zərbəyə bir ləhzə tablamaz, öz-özünə kəlləsini atıb, cəhənnəmə gedər! Biz həlakular da atlanıb yollanarıq Ərdahaya!.. Dizlərimizə döyə-döyə elə şəbih çıxarıb, elə şaxsey-vaxsey qoparıb, təziyədarlıq edərik ki, görən deyər, bu nə yasdır, xudaya?!

Mərhumu öz ata-babasının sərdabasında dəfn edərik, bununla da Məmalik xanlığı ilə birdəfəlik hesabı çürüdərik! Sonra?.. Sonra o tərəf-bu tərəf nəvələrimiz arasında qalmaqal baş verməzmi?.. Onlar həlakularla məmaliklər kimi qoşunkeşlik edib o tərəf-bu tərəfi od-alova tutmazlarmı? Qoy məmaliklər yerli-dibli olmasınlar. Bizim qədim qəddar düşmənimizin, dədə-baba rəqibimizin yuvaları belə qalmasın. Axır, Məmalikin qızı Ərmağanı hər necə Qurana qəsəm qılsam da, Ərdaha mülkü üçün almışdım!

Görünür, Sərəncam xanımın ölümündən xeyli il sonra əsnəyib ayılan Məmalik özünə varis düzəldib ki, mənim ustalıqla saldığım körpünü uçursun, özü də indidən əcnəbilərlə dostluğa, mehmannəvazlığa girişsin ki, arxası alınmaz qala kimi güclü olsun! Yoxsa Pəhləvan Məhəmmədin yetimçəsi firəng mamaçasız da ötüşə bilər, çox asanlıqla öz yükünü yerə qoya bilər, doğduğunu da əski-üsküyə bələyə bilərdi!.. Məhtaban Məhəmməd qızı, palaz-paltar yuduğu çayın kənarında, iydə kollarının dibində də doğub, öz çağasını cır-cında tumanına büküb, Ərdaha kəndinə də dönə bilərdi! Gör, tülkü Məmalik işi nə yerə çatdırıbdır ki, yetimçənin üstünə, oğlunun xidmətinə xarici xanım, firəng mamaçası gətiribdir! Bu xaricilərin də barmağı bir yuvaya ilişdimi, Allah özü aqibətindən saxlasın! Üzünə gülə-gülə, başını pambıqla kəsəcək. Üzünə gülə-gülə var-yoxunu sil-süpür edib, qanını da sümürəcək?.. Səni barmaq kimi lüt-üryan qoyacaqdır! – Pəncərələri örtülən otaqda kürsü üstündə oturmuş çalbığ xan şəhadət barmağını ağzına salıb sümürdü, sonra da çal qaşları örtən gözlərinin qabağında fır-fır fırladı: – Bax, xarici belə edir!

Olmazmı bu işdə mən özüm top-tüfəngə əl atmadan, zor-güc işlətmədən, heç bir od-ocaq qalamadan gülə-gülə tərpənim, öz məqsəd-məramıma məqamında çatım?! Gərək indi daha xaricilərdən öyrənəsən!.. İndi gərək dostluq bürüncəyində gizlənən düşmənçilik qəsdini öz məqamınacan çatdırasan!.. Hamısını da yumşaq-yumşaq, gülə-gülə!..

Bax, elə biri mən Həlaku! Məgər mən Quranı əlimdə qalxan edib, Məmalik qızı, Ərmağanı oğlum Ərdahana əbəs yerə gəlin gətirmişəm?.. Bəli, qohum oluruq, dədə-baba ədavətimizi biryolluq torpağa basdırırıq, özümüz də Quran qəsəmi ilə kürək-kürəyə verib qıraq xanlıqlarla vuruşuruq, qənimət gətiririk – demişəm! Demişəm ki, daha qonşuluqda haçanacan gərək biz bir-birimizi qırıb tərk edək? Haçanacan

obalarımızı odlayıb halətdən salaq? Yenə indiyə qədər bir tərəf o biri tərəfi biryolluq bassaydı, dərd yarı idi. Gah bu tərəf, gah o tərəf! Nə Məmalik tərəf biryolluq qırılıb qurtarırdı, nə də həlakular! Arada vergilər batırdı. Əlinə fürsət düşən Qacar qoşunu da tirəndazla sinəmizə çökürdü! Əmin-amanlıq yaratmaq bəhanəsi ilə olan-qalanımızı da talan-qarət edirdi... Amma neçə ildi ki, Ərmağan xanım bizə gəlin gələndən çox qulaq-dincliyidir. Az-çox görürük ki, rəiyyət haradadır, rəncbər harada. Kim vergiyə rayic, kim vergiyə cığaldır! Kim ac olsa da xan müqabilində boyun əyib, borcunu ödəyir, kim tox olsa da dördnala qalxıb Tanrıya təpik atır, xan anbarına bir dənə darı da vermir.

Düzdür, məmaliklər, həmçinin həlakular tərəfindən Savalan dağına çəkilən, kəndlilərə dil öyrədənlər az deyil. İndinin özündə Təbrizdə başlayan Şeyx Xiyabani ixtilal qovğasına görə o qədər artıbdır ki, Qacar qoşunları da onlarla bacarmır. Biz xanlar birləşib, Savalana silahlı dəstələrimizi yeritsəydik, yaxşı idi! Yoxsa Şahənşah Qacar haçanacan məmləkətdə bu xanı qızışdırıb o xanın üstünə salışdıracaq, o xanı qızışdırıb bu xanın üstünə cumdurub, hər ikisini taqətdən salıb boyunduruğa qoşulası öküzlər kimi qulaqlayacaq?!

Öz-özünə söylənən Həlaku durub Təbriz xalıları üzərində gəzindi, fürsəti fövtə verib işi çətinləşdirmədən qapını açıb oğlunu yanına çağırtdırdı. Ərdahan pörtmüş halda içəri girdi, atasına salam verib, təzim etməyi də unutdu.

– Nə olub belə qaralmısan? – deyə Həlaku oğlunu qabaqladı. – Olmaya naxoşlamısan?

– Xeyr, ata!

– Bəs başına ixtilalçı toplaşan Savalan dağının buludları kimi nə tutulubsan?

– Tutulmaq azdır, ata!

– Nə üçün, nuri-çeşmim?

– Qoca qohumunuz ağayi Məmalik bizə rüsvayçılıq, biqeyrətlik, Savalan dağı ağırlığında töhmət gətiribdir! Mən başımı qovzayıb nəinki adamların üzünə, heç günəşə də baxa bilmirəm!

– Məmalikin əməlindən sənə nə?

– Necə mənə nə? Məgər Məmalik mənim qayınatam deyil? Məgər o bişərəf sənin nəvən Ərşadın, Gurşadın, ya xırdaların babası deyil? Sabah Tehran danişgədəsində sənin sicillini daşıyan Ərşad yad balalarının qabağında başını necə yuxarı qovzaya bilər?

– Öz boynuna dağ boyda yük götürmək nə üçündür?
– Bundan sonra daha nə söhbət ola bilər, xan?
– Bunu belə sənə kim deyibdir, Ərdahan?
– Hamı, nə çox İranda söz gəzdirən dərviş, sail!
– Müxtəsəri hansı dərviş, hansı sail deyib?
– Hər kəsdən əvvəl Ərmağanın özü bütün əhvalatı açıb mənə nağıl edibdir!
– Ərmağan xanım?
– Bəli, heç o da başını daldalamağa yer tapmır! Birun ya əndərun bizə mübarəkbadlıq elədikcə, bilmirik ki, başımızı harada gizləyək?! Hələ teleqraf Tehrandan, ətraf xanlardan, xaricdən istehzalı mübarəkbadlıq gətirəndə gör, nə boyda cəncəl olacaq!.. Harada görünüb ki, yetmiş yaşlı əprimiş qocadan övlad törəsin, varis-vəliəhd vücuda gəlsin? Əgər Sərəncam xanım rəhmətə getməsəydi, qoca bunca başını itirməzdi!
– Sinəndə suzan olan sözlərini qurtardınmı, oğul?
– Məgər deməklə qurtarasıdır, ata?
– Səbəb, səbəb, səbəb?!
– Səbəb budur ki, sən qarşımı almasaydın, indi mən düşmən Məmalikin biqeyrət, bişərəf hərəkəti üstündə xəcalət gölündə belə boğulmazdım! İndi dur, sabah Tehrana get, görək. Ya bu yanda Şeyxin şüarıyla çalxanan Təbrizə yön al, baxaq. Görəcəksən bütün tacir-tüccar gözlərini qıyıb, rişxəndlə baxırlar. Deyirlər ki, qoca qayınatan Məmalik Ərdaha gədə-güdəsindən, ya Savalanın başıpozuq çoban-çoluğundan, yaxud əndərunda, birunda şələ dartan hambal-humbaldan sənə qayın, uşaqlarına da dayı düzəldibdir!
– Sənə deyənlərin sənəd-sübutu vardırmı? – deyə Həlaku kibrit çəkib sulu qəlyanı yandırdı, kürsüdə əyləşmədən dilim döşəkcənin üstünə sərildi, yarımsöykəli uzanıb, dirsəyini də qotazlı mütəkkəyə verdi. – Elə qurcalanıb oyalanırsan ki, guya atan Həlaku bir nakuvara iş görüb, səni töhmət-tənə dənizinə tullayıbdır?!
– Atam, ya qayınatam, əğyar müqabilində nə fərqi?
– Fərqi çox-çoxdur! O Məmalikdir, biz Həlaku! Bütün İran bilir ki, biz haçanın qanlı-bıçaqlısıyıq!..
– Bəs onda niyə sən məni öz qanlı-bıçaq düşmənimizlə calaşdırdın, ağıllı ata?
– Ona görə ki, davasız-şavasız məmaliklər mülkünün sahibi olasan!

– Bəs indi bu qondarma varisdən, yalançı vəliəhddən sonra nə təhər?
– Onu tezliklə aradan götürmək gərəkdir!
– Beşikdəki tifilin üstünə qoşun çəkmək, eləmi, Həlaku xan?
– Yox, əsla yox, Ərdahan!
– Bəs necə olsun?
– Sənə dönə-dönə demişəm, Ərmağanın əli ilə! – çalbığ qoca qəlyana qullab vurdu, onun tüklü qaşları altında gizlənən hiyləgər gözləri genişləndi. – Ancaq qızının əli ilə!
– Bəlkə bacısı qardaşının qəsdinə dolmadı?
– Dolacaq!.. Mütləq dolacaq!
– Nə şərtlə, xan?
– O şərtlə ki, sən səbirli ol, bu işə açıq müdaxilə etmə! Öz kinini-küdurətini yenə də bərk-bərk gizlə! Əsil məqsədini büruzə vermə! Qoy qeyrət yükü ancaq Məmalik qızının öz boynuna düşsün!..
– Kişisi dura-dura qeyrət yükü arvadının boynuna düşsün, xan?.. Bu da qeyrətdəndir?
– Dovşanı araba ilə!
Çalbığ Həlaku son günlər tez-tez işlətdiyi misalını yenə də çəkdi.
– Düzü, mən elə bayaqdan tək-tənha fikirləşirdim, öz-özümlə əlləşirdim ki, gərək biz də bu xaricilərdən xeyli əməl öyrənək!
– Necə, ata?
– Üzə gülə-gülə! Bəli, biz Ərmağan xanımın atasının üzünə açılışıb, onları acılamayaq! – Çalbığ öz oğluna təlim keçməyində davam edirdi: – Hələ mən fikirləşirəm ki, gərək biz Məmalik malikanəsinə qucağı qurbanlı yollanaq... Yetimçədən doğulan oğlunun mübarəkbadlığına!
– Hansı oğlunun mübarəkbadlığına? – Ərdahan acı-acı güldü. – Pəhləvan Məhəmmədin yetimçəsindən doğulan, gədə-güdədən, çoban-çoluqdan, törəyən zinanın mübarəkbadlığına!
– Bəli, mütləq!.. Biz gədə-güdədən, çoban-çoluqdan düzələn heç bir uşaq tanımırıq. Biz Məmalikin nuri-didəsini təbrik edirik!
– Ərmağan Məmalik mülkünə əsla qədəm qoymaz!
– Biz səbir göstərsək, Ərmağan tablamayacaq!..
– Hansı babətdən, kişi?
– Biz istəyən babətdən, oğul. Gərək Məmalik xan görsün ki, bizim onun işinə heç bir dəxalətimiz yoxdur! Bəli, biz bu işi qızı ilə atasının öhdəsinə buraxırıq... "İlanı Seyid Əhməd əli ilə!".

– Bəlkə heç Məmalik qızının əlində nə ilan, nə zəhər yoxdur?!

– Ərmağan istəsə, ilan da tapar, sür-sümük çürüdən zəhər də!

– Deyəsən, xarici səyahət zamanı bir şüşə zəhər alıb gətiribmiş!..

Həlaku xan dikəlib döşəkcədə oturdu...

– Bəs necə olub?

– Özü dediyinə görə az əvvəl qurcalananda sındırıbdır!

– Nə üçün qurcalanırmış ki?

– Guya özünə qəsd etmək niyyətində imiş!

– Yox, yox, gəlin əsla özünə qəsd etməsin!.. Sonrasına ikimizlikdə baxarıq!

– Elə bu xəbərin üstündə hirslənən Ərmağan xanım xadimə Xədicəyə acıqlanıb Ərşad da içəri girib diluzunluq eləyən xadimənin qarnına neçə təpik çalıbsa, qız tələf olubdur!

– Nə qədər məndən gizləsəniz də, həmin hal bilmişəm!

– Bəli, Xədicə elə gecə ikən quylanıbdır!

– Bax o varisi də beləcə quylamaq gərəkdir!

– Heç onu xadimə Xədicəsayağı gizli quylamaqmı olar?

– Qoy quylamaq olsun, ya gizli, ya aşkar!.. Qoca Məmalikin oğul varisini quyladınmı, deməli, özü də quylandı!

– Quylayan ancaq Ərmağan olmalıdır, eləmi, Həlaku xan?

– Bəli, bişəkk, bişübhə!.. Qoca sulu qəlyanının müştüyünü damağına alıb, çal bığlarına oxşayan cod qaşlarını zəhmlə endirdi. – Bəli, xaricilərsayağı üzə gülə-gülə, Qacar qəsrində olan sayaq zəhərləmi, nə iləmi, müxtəsərr!!!

– Bəlkə biz bir yandan zəhər tapıb Ərmağana verək?

– Yüz dəfə demişəm, yüz birinci dəfə də deyirəm, Ərmağanı hürkütmək olmaz!

– Bəs necə eləyək ki, biz Tehranda, Təbrizdə baş qovzaya bilək?!

– Həm də məmaliklər mülkünü həlakular torpağına tez zamanda ustalıqla qarışdıra bilək! – deyə Həlaku xan döşəkcədən dik ayağa qalxdı. – Ayının yüz oyunu var, ancaq bir armudun başında!..

– Ata, töhmət yükünü elə aşkara boynumuzdan götürsək, necə? – Hövsələsini yeyə bilməyən Ərdahaq atasından fərqli olaraq nə isə ayrı cürə israr edirdi. – Qoy, külli İran eşidib bilsin ki, biz həlakular hansı qeyrətin sahibiyik!

– Əsla! – Çalbığ Həlaku qeyzə dolan oğlunu danlamaqda davam etdi: – Güc-zor lap sonuncu işdir. Xaricilərsayağı üzə gülə-gülə Ərmağan öz

qardaşını tələf etmək üçün zəhər tapmasa da, başqa çarə tapar!.. – Həlaku xan bir əlini cod bığlarına apardı. O biri əli ilə də oğlunun ara-sıra çəkdiyi tiryəkdən yanıb qaralan dodaqlarını örtdü. – Bu barədə bir daş altda, bir daş üstdə!..

Məhtabanın körpəsi həlakular ailəsində gedən mübahisədən, başının üstündə tovlanan qılıncdan xəbərsizdi. Tifil göz açan kimi anası üçün dodaqlarını büzür, ancaq anasını arayırdı. O, səslənər-səslənməz Məhtaban səksənir, onu qayğı ilə beşikdən götürüb, döşlərinə salıb əmizdirirdi. Məhtabanın oğluna məhəbbəti getdikcə artırdı. İndi Məhəmməd qızı üçün dünyada öz körpəsindən əziz bir xilqət yox idi. Körpə öz anasına həyan olur, Məhtabanın vahiməsini qovub uzaqlaşdırırdı. Məhtaban az qala uca bir dağa söykənən kimi körpəsinə söykənib, güvənirdi. Məhtabanın yer üzündə vəfalı havadarı vardı!.. Dodaqlarını ana döşündən çəkmək istəyən balasını seyr etdikcə, Məhtaban zövq alırdı. O, deyəsən qocayamı, cavanamı ərə getdiyini də unudurdu. Hələ axtarsan, Məmalik xan Məhtabanın nəzərində cavanlaşırdı. Məhtaban ürəkdən arzu edirdi ki, kaş, hansı möcüzə ilə isə qoca Məmalikin ömrü uzun olaydı. Oğluna pərəstar durub, ayağa qaldıraydı, daha Ərmağanın qapazaltısı olmağa qoymayaydı. Ata övladını ərsəyə çatdıraydı. Xarici xanım deyən sayağı, Məmalik nəvəsini görməsə də, heç olmasa oğlunun toyunu görəydi.

İndi əndərun olmasın, birun olsun, bir bığıburma cavan olmasın, lap yüz cavan olsun, Məhtaban gözünün ucu ilə də baxmazdı.

Məhtaban daha özünü düşünmürdü. O, ancaq körpəsinin başına bir iş gələ biləcəyindən qorxurdu.

Doğumdan bir neçə gün ötəndən sonra yavaş-yavaş gözəlləşən, dodaqlarına, yanaqlarına qan gələn, gülümsəyəndə ağ dişləri parıldayan, öz ağzını vaxtından əvvəl süni dişlərlə dolduran xarici xanımı heyran qoyan Məhtaban birdən də dəyişirdi. Gözəl-göyçək sifətinə müdhiş sarılıq gəlirdi.

Xəstəsinə göz qoyan xarici xanımı yenə maraq götürürdü:

– Nə olub ki, xanım, öz-özünüzdən bu qədər vahimələnirsiniz?

Məhtaban başını tərpədirdi:

– Daha mən özüm barədə heç qorxmuram, xanım!

– Bəs kimin üçün qorxursunuz?

– Bax, bu döşümə sığınan günahsız körpə üçün! Məhtabanın ala-calanan gözlərində gəzən əsrarlı gilələr uzun kirpiklərindən xəzan yarpaqlarını andıran solğun yanaqlarına axırdı.

Xarici xanım isə yanıb yaxılırdı:

– Şərq yamanca ağlağandır, Məhtaban xanım!

– Şərqdə məzlum çoxdur, həkim!

– Siz ki, güclü sərvətli bir xanın xanımısınız, daha məzlum deyilsiniz!

– Mən indi daha məzlumam, həkim!

– Nə üçün?

– Ürəyim azad deyil, xanım, qəfəsdədir! Bu məsum körpədən yana aramsız təlaş içindəyəm. Onu xan qızı yox, rəiyyət qızı doğubdur, obanın palaz-paltarını çayda zoğal dəyənəyi ilə çırpa-çırpa yuyan Məhtaban doğubdur!

– Siz ki, Məmalik xanın qanuni hərəmisiniz?

– Düzdür. Ancaq mən xan qızı deyiləm. İranda söylənən sayaq Qacar sarayına yaxın sicillidən deyiləm!

– Bəlkə ərinizin qocalığından narazısınız?

– Əsla, xanım! O, mənim üçün daha qoca deyil. O, mənim körpəmin atasıdır!

Məhtaban əlini sinəsində uyuyan uşağın üstündə gəzdirdi. Körpə göyümtül gözlərini açdı, xarici xanım cəld onu götürüb, qucağına aldı, uşağa diqqətlə baxdı:

– Heç Allahın da şübhəsi ola bilməz ki, qoca Məmalikin öz əməlidir, – dedi.

Xarici xanım çiyinlərini ata-ata güldü, körpə dodaqlarını büzəndə anası ağladı, uşağı qar kimi ağ döşlərinin arasına aldı. Ancaq heç vəchlə yenə göz yaşlarını saxlaya bilmədi...

"Xudaya, sən bu günahsız tifilciyəzi öz pənahında saxla, – deyə Məhtaban xarici xanımdan xəlvəti titrəyə-titrəyə ürəyində yalvardı – Xudaya, mənim başıma hər müsibət gəlir-gəlsin, təki bu tifilə bir şey olmasın!..".

## 14

Təvəllüd günündən iki həftə sonra Məhtaban əndərun hamamında yuyundu, ötən günlərini xatırlayıb, qıjıltılı çayın köpüklü gölündə üzən kimi hovuzda üzdü... Soyunub-geyinmək otağında divara vurulmuş

güzgü qabağında qumral hörüklərini darayıb hördü, öz gözəlliyinə tamaşa edincə utandı, cəld paltarını geyindi. Bir azdan, Məhtaban, yarlı-yaraşıqlı, zərli-zibalı libasında əzəlkindən də gözəl göründü... Üstü qübbəli qızıl kəmər Məhtabanın belini əzəlkindən də artıq boğdu. Qabarıq sinəsi, doğumundan sonra sifətində peyda olan iztirablı gözəllik Məhtabanı xarici xanımın seyrçi gözlərində xeyli füsunkar göstərdi. O, Parisi, o izdihamlı şəhərdə tanıyıb-bildiyi məşhur gözəlləri gözlərinin qabağına gətirib, Məhtabanla müqayisə etdi, onların hərəsində az-çox qüsur tapsa da, Məhtabanda heç bir qüsur tapa bilmədi.

Məhtabanın zoğal dəyənəyi tutan, palaz-paltar yuyan əlləri doğumdan sonra zərifləşmişdi. Onun dür-düyün bağlayan barmaqları da xeyli nazilib uzanmış, dırnaqları şadlıq-şənlik əlaməti kimi xınalanmışdı. Xof-vahimə içində çırpınan Məhtaban sanki bütün ağrı-acısını əndərun hamamında tökmüşdü...

Məhtaban körpəsinin yanına döndü, uşağın uyuduğunu görüb eyvana qalxdı, qoca ərinin haçan dönəcəyini gözləməyə başladı. Məhəmməd qızı istəyirdi ki, qoca xan onu elə beləcə görsün. Məmalik görsün ki, Məhtaban ona yalnız əzab-əziyyət gətirməmişdir. Axı, Məhtaban heç kəs üçün özünü bəzəyib-düzəməmişdi. Deyəsən aradakı yaş uçurumu düzəlməyə başlamışdı. Məhtaban qoca xana elə alışmışdı ki, əzəlki giley-güzarları üçün utanmağa başlamışdı. Qoca xan Məhtabanın gözlərinə daha ayrı cür görünürdü. Onun razılıq almadan axunda kəbin kəsdirməyini də, göldə üzən qıza ay işığında oğrun-oğrun tamaşa etməyini də, Məhəmmədin komasına girməyini də, öz yumşaq saqqalını qızın üzünə qoymağını da güzəştə gedirdi. Sanki elə-belə də olmalıymış!

Məhtabana elə gəlirdi ki, xan getdikcə yumşalıb rəhmə gələcəkdir, Məhtabana ixtiyarat verəcəkdir. Məhtaban da xana təsir edəcək, özü kimi kimsəsizlərə pərəstar olacaq, ac-susuzlara ehsan verə biləcəkdir. Onun xanı başqa xanlardan fərqlənəcək, kəsibkarlıqla məşğul olan rəiyyətə, rəncbərə daha zülm etməyəcək, qalan ömrünü savab işlərə sərf edəcəkdir. Məhtaban özü də uzun müddət bu əndərunda məhbus olub qalmayacaq, bir gün biruna da çıxacaq, öz istədiyi kimi tərpənib izafi yük kimi görünən zərli-zibalı pal-paltarını dəyişəcək. O, daha özünü birun xidmətçilərindən qırağa çəkməyəcəkdir. Nə isə, bu əndərun öz əsasından dəyişəcək, burada elə ədalət hökm sürəcəkdir ki, Məhtabanın nağıllarda eşitdikləri bu işlərin müqabilində çox solğun görünəcəkdir...

Tağbənd eyvanında dayanıb, ərinin yolunu gözləyən Məhtaban xəyallar içində xoşallanırdı. O bilirdi ki, xarici xanım körpənin keşiyindədir! Məhtaban arxayın idi ki, mamaçadan onun uşağına zaval toxuna bilməz. O, nə qədər tamahgir olsa da tifil qatili olmaz...

Məhtaban at milçəyi kimi sırtıqlığına salıb bərk-bərk canına daraşmağa başlayan qaraltıları özündən uzağa qovurdu. Xoşbəxt saatlarını bu qaraltılara təslim etmək istəmirdi. Məhtaban gün üzünə həsrət qalan, qaranlıq, rütubətli zindanda çürüyən, azadlıq üçün həsrət çəkən məhbus kimi qənşərə çıxmaq, günəşə qovuşmaq istəyirdi. Məhtaban istəyirdi ki, qoca Məmalik dünya malına həris və aludə olmasın!..

Oğlu olandan sonra deyəsən qoca xanda tərəhhüm hissləri özünü göstərirdi. O, oğulsuz qocaları, ərsiz qarıları nə vaxtdan bəri qalan vergilərdən azad etmək üçün fərman verməyə başlamışdı. Hələ zülmkar məmurlardan bir neçəsini də xidmətdən uzaqlaşdırmışdı. “Belə xasiyyətlə siz ancaq həlakulara yaraşarsınız!” – deyə qoca xan düşməninin bostanına daş atmışdı.

Məmalik xan müəyyən dərəcədə Ərdaha obalarının abadlıq nəqşəsinə girişmişdi. Yol çəkmək, çaylar üstündən körpü salmaq, dolu anbarlardan aclara ehsan etmək onun qarşısında mühüm vəzifə kimi durmuşdu. O, bütün bunların hamısını öz oğlunun şərəfinə edirdi. “Qoy camaat təzə xana dua oxusun!” – deyirdi.

Ərdahanda çox adam doğrudan da körpənin təvəllüdünə şad olur, ağır biyarlardan, üst-üstə qalanan vergilərdən azad olanlar, səxavət süfrələrindən yeyib toxlananlar əllərini göyə qaldırıb körpənin ömrünə dua-səna edirdilər. Onlar sevinirdilər ki, xanzadənin anası öz ömrünü Təbrizdə mücahidlikdə, fədailikdə bağışlayan Səttar xan sərdari-millinin sağ əli sayılan Pəhləvan Məhəmmədin doğma qızıdır. Buna görə də Məmalik xan Ərdaha camaatının nəzərində dəyişib adil olur. “Yetmiş yaşında qocadan nə övlad?” – deyə boşboğazlıq edənlərin ağızlarından vurulurdu. Məmalik barəsində şübhəli şayiələr yayan hərcayilər məclisdən, mərəkədən qovulur, bəzən də daşa basılırdı. Ərdaha adamı elə güman edirdi ki, bu ehsan-ülfət daima davam edəcək, innən belə onlar süd gölündə üzəcəklər. “Xudaya, səd şükür, Xudaya, həzər şükür!” – sədaları cır-cındaya bürünmüş şəxslərin dilindən düşmürdü. Ərdahalılara elə gəlirdi ki, bu yeni xanzadənin ecazkar doğuluşu ilə onların üstünə ağ gün doğubdur. Nədən ki, Ərdaha obalarında gündən-günə zülm azalır, Savalan dağına çəkilənlər çox olmurdu.

At belinə qalxıb ətraf obaları, kəndləri dolaşan qoca Məmalik özü ədalətə, asayişə göz qoyur, rəncbər-rəiyyətlə dil tapır, sanki gözəl Məhtabana deyirdi: "Ürəyindən keçənlərə görə necə əməl edirəm, qız!" – təcrübəli qoca bacardıqca ondan əvvəlki məmaliklərin etdikləri zülmləri zayil etmək, özündən sonra qalacaq cavan xana düşmən qoymaq istəmirdi...

Məmalik xan Ərdaha obalarını dolaşmaqdan dönüb əndərunda atdan düşəndə Məhtabanı tağbənd eyvanda gördü. Xan Məhtabana daha irad tutmadı. Məhəmməd qızı o qədər gözəlləşmişdi ki... Xan cavanlaşmış kimi içəri pilləkəni üzüyuxarı qaça-qaça qalxdı, xarici xanımı içəri dəhlizdə yumşaq kürsüdə əyləşən görüb, özünü bilməməzliyə qoydu, tağbənddə dayanan Məhtabana yanaşdı:

– Salaməleyküm, Məhtaban xanım!

– Əleykəssalam, mərhəmətli xan!

Onlar ikisi də durub bir-birini seyr etdilər. Məhtabanın gözündə xanın qocalığından iz qalmamışdı. Xan onun əri, o da xanın halalı idi. Onlar bir-birinə elə uyğunlaşıb alışırdılar ki, daha bir-birini gec görəndə darıxmağa başlayırdılar. Bu hal qoca xana olmazın zövq verirdi. Onun qırışıq yanaqları açılır, gözlərinin ətrafını tutan torbalar çəkilirdi. Məhtabana elə gəlirdi ki, qocanın qar kimi ağ saqqalından nur yağır. Xanın yanaqları da, dodaqları da qana gəlir, hifz edib saxladığı dişləri də ağappaq, işıqlı görünürdü. Elə bil ki, Məhəmməd qızı Məhtaban qocanı cavanlaşdırmış, yaxud o, Məhtabanın gözlərinə cavan görünməyə başlamışdı. Bir də Məhtabanın gözləri cavan axtarırdımı? O, oğlunun atasını necə vardı, elə də istəyirdi!

– Mərhəmətli xan Ərdaha obalarını nə çox dolaşır? – deyə Məhtaban ərinin əlini tutdu. Sanki qocanın zahiri deyil, batini də dəyişdi, hərarəti artıb gənclik ehtirasına calandı.

– Övladımızın şərəfinə xeyli iş-güc görmək qərarına gəlmişəm, – deyə Məmalik xan Ərdaha obalarında apardığı islahatdan, fəqirə-dilənçiyə etdiyi ehsandan, ağır vergilərdən azad etdiyi dullardan danışıb dedi ki, gərək Məhtabana agah olsun ki, körpə onun ürəyinə bir daha tərəhhüm bəxş etmişdir...

– Xudaya, min şükür! – deyə Məhtaban Tanrı qarşısında durduğunu cümanına gətirincə abır-ismət naminə barmaqlarını xanın hərarətli ovcundan çəkdi. O, içəridən iki yumşaq kürsü götürüb, tağbəndə

gətirdi, əndərun eyvana yox, birun eyvana, güllüyə baxan səmtdə qoydu. Əvvəlcə xan, sonra da onun xanımı əyləşdi. Onlar bir-biri ilə danışıb, dərdləşmək, öz sevinclərini bölüşdürmək istədilər:

– Deməli, Ərdaha obalarından daha Savalan dağına qaçan yoxdur? – Məhtaban kəndlərdə, obalarda olan vəziyyəti bilmək, eşitdikləri nağılın tədriclə də olsa həqiqətə çevrilə biləcəyini öyrənmək istəyirdi. – Deməli, oğlumuzun təvəllüdündən sonra Ərdaha elində ayrı aləm yaranır?

– Bəli, mən çalışıram ki, bizim Ərdaha elindən qiyama qalxan, silaha sarılan, Savalana üz tutan olmasın. Savalana qaçanları da geri qaytarmaq, əfv etmək əzmindəyəm!

– Onlar heç Savalandan qayıdarlarmı?

– Mən də güman edirəm ki, çox çətin!.. Çünki bütün xanlıqlardan qaçanlar Savalanda birləşiblər. Özləri də Qacar qoşunlarına qarşı vuruşa hazırlaşıblar! Gümana görə Təbrizə varıb, Şeyxin döyüşən dəstələrinə qoşulacaqlar!

– Onların içində bizim ərdahalılardan da var?

– Düz əlli nəfər, hesablamışam, həlakular tərəfindən qaçanlar yüz əllini aşırlar!

– Deməli, Savalana çəkilənlərin əsil qayələri tədriclə Təbrizə yollanmaqdadır?..

– Bəli, yəqin ki, onlar öz qayələrinə dönüklük etməzlər!

– Bu qayənin mənbəyi, necə deyərlər, çeşmənin gözü haradandır?

– Əncümənlərdən! Neçə il qabaq basılan, indi yenə də baş qovzayan əncümənlərdən. Pəhləvan Məhəmmədin mənsub olduğu fədailərdən, mücahidlərdən!

– Deməli, əncümənlər təzədən təşkil tapıb düzəlirlər?

– İran yenə də yanan təndir üstündə qızaran sacdır!

– Aqibəti?

– Gərək məşrutə güclənsin, iş-güc ədalətlə getsin!

– Deməli, bizim xan da başqalaşmışdır?

– Bəli, başqalaşmamaq mümkün deyil, Məhtaban!

– Bəs onda. Məmalik xanda varis-vərəsə cəhdi nədir?

– Məndən ötrü ilkin Məhtabanın ilahi gözəlliyidir, qız!

– Bəs sonra?

– Sonra varis-vərəsə cəhdi!

– Gələcəyinə zülm, xanlıq olmayandan sonra daha varis-vərəsəyə nə ehtiyac!

– Nə qədər ki, dədə-baba düşmənimiz həlakular var, o qədər də bizim Məmalik mülkünün öz varis-vərəsəsinə, vəliəhdinə ehtiyac vardır!

– Bəlkə xan, biz körpəmizi də götürüb xaricə köçək hə?

– Necə xaricə, qız?

– Firəngistana! Sənin pulun toplanan torpağa!

– Bəs bu boyda Ərdaha mülkü?

– Gəlirini ora çatdıra bilməzlərmi?

– Dədə-baba düşmənlərimiz həlakular Ərdaha mülkünü bərbad edərlər!

– Deməli, bizim başıdumanlı Savalan daima qiyamçılar yuvası olacaqdır?

– Belə görünür ki, bu zülm durduqca, qiyamçılar da duracaqdır!

– Deməli, bu məmləkətdə ədalət nağıllardadır?

– Bir də indi az-çox Ərdaha torpağında!..

Məmalik oğlunun şərəfinə apardığı islahatı, verdiyi fərmanları, tökdüyü tədbirləri sayıb öz hərəkətində ardıcıl olacağını söylədi. Sonra söhbəti xarici xanımın təklif etdiyi sayaq Firəngistandan, Parisdən dayə-mürəbbi çağırıb-çağırmamaq üstünə gətirdi. Məhtaban isə bu barədə öz etirazını bildirdi. Eyvandan durub körpəsinin yanına girdi. Xan da xanımının ardınca ayaqlarının ucunda oraya daxil oldu. Ayaq səslərindən oyanan körpə göyümtül gözlərini açdı. Məhtaban qundağı qaldırıb yaxasını araladı, dodağını büzən çağa anasını əmməyə başladı. Qoca xan oğlunun ana südü ilə dolub şişən ovurdlarından və xanımının ağ mərmər sinəsindən öpməyə başladı...

## 15

Həlaku xan marıqda duran yalquzaq kimi kənardan göz qoyur, öz əlaltılarını xəlvəti Məmalik mülkünə göndərir, yeni doğulan varisdən sonra baş verən islahat və təbəddülatdan xəbərdar olmaq istəyirdi. Onun göndərdiyi əlaltılar da müəyyən yerləri gəzib-dolaşandan sonra dönüb Həlaku xana Ərdaha kəndlərində, obalarında başlanan əcaib işlərdən danışırdılar. Çalbığ Həlaku gözünü yumub digərini açır, öz casuslarını diqqətlə dinləyir, Məmalikin gözlənilməz əliaçıqlığına, səxavətinə heyran edirdi! Həlaku Məmalik mülkündə görünən əcaib işlərə heç də biganə qala bilmirdi:

“Necə yəni itaətdən çıxan rəiyyətə-rəncbərə bu əndazədə güzəştə gedəsən, onları neçə ilin vergilərindən azad edəsən, özünü yaxşı xan kimi qələmə verib, qonşuluğunda olan Həlakunu gözdən salasan? Necə yəni qonşuna, qohumuna badalaq gələsən?.. Obaarası yol çəkdirmək, aca-yalavaca ehsan etmək, çay üstündən körpü saldırmaq, çeşmə düzəltdirmək, özünü adil, qonşusunu zalım deyə dilə-dişə salmaq ki, baxın, görün rəiyyətə-rəncbərə güzəştə getməyinin adına nə deyirlər?..”.

Çalbığ Həlaku uzun təsbehini tez-tez o tərəf-bu tərəfə çevirir, Məmalikin qarasınca deyinməyində, söyüb-söylənməyində davam edirdi:

“Sənin yetmiş yaşın ola, oğul təvəllüdündə beynin qızışa, bilməyəsən göy hardadır, yer harda?!. Əgər bu yolla gedilsə, gərək onda külli-İranda hər xan əsil xanlıqdan, özünə görə şahlıqdan çıxa, lat-lüt ola, bir əli ola, bir ağacı? Hərc-mərclik başlaya, İsmayıl oğlu Səttar zamanında olduğu kimi ixtilal dalğalana, papaqaldıqaç düşə, ta Qacarın özünə qədər daş-daşın üstündə durmaya! Hər nə varsa hamısı laxlaya tökülə, İran başdan-başa viran ola! Heç görün xansız, tacirsiz İran dolanarmı?..

Bir çal-çap başlar ki, gəl görəsən! Əlinə silah, balta-dəhrə götürüb Savalana qalxan qarnı aclar Təbrizə qoşub, Şeyx Xiyabani ilə birləşər. Oradan da Tehrana varıb, keçərlər məmləkət başına! İranda hər nə xəzinə varsa, hamısını yerlə yeksan edərlər!..”.

Həlaku xan uzun təsbehini çevirib öz-özü ilə danışır, hərdən sulu qəlyanına güc verir, qırışıq sir-sifəti daha da qırışırdı. Həlakuya görə Məmaliki özbaşına buraxmaq olmazdı ki, ağlını itirsin, gözünü yenicə açan bir tifilə dua-səna oxutdurmaq üçün ağlına gələn min bir pəstah çıxarsın, əsrlərdən, ulu-ulu əcdaddan gələn dəbi pozub İran xanlığını kökündən baltalasın. Nədi, nədi, bəs mənim oğlum olub, ya da kişiliyimi itirdiyim çağımda fədai qızından özümə oğul-uşaq düzəltmişəm. Elə bir oğul-uşaq düzəltmişəm ki, mənim varisim-vəliəhdim olsun, halal qızıma, yaxud onun Həlaku balalarına Məmalik mülkündən bir bıçaq arxası da torpaq düşməsin!.. Guya pədər süxtə Məmalik xan mülkünü də, divar-daşını da özü ilə darta-darta dədə-babasının sərdabasına aparacaq!..

Həlaku xan neçə gün, neçə gecə danışıb-deyinəndən sonra yenə də bu qərara gəldi ki, öz qohumu ilə açıq-açığına ağac-ağaca qoyub, onun daxili işinə müdaxilə etməsin, atı daşlığa sürməsin! Çalbığ xan yenə də

öz əvvəlki mətləbinin üstündə dayandı ki, gərək ilan Seyid Əhməd əli ilə tutula!.. Bəli, ümid təkcə Məmalikin öz qızı Ərmağana idi...

Onsuz da Ərmağan atasının əlindən cilov gəmirirdi. Əgər indi Ərmağanın əlində bütün dünyanın zəhəri olsaydı, heç kəsə bir damcı da qıymazdı, hamısını qoca Məmalikə içdirər, gəbərməşini də xəlvəti xəndəyə atdırıb üstünü qara torpaqla, sal daşla, sonra da Savalanın ətəklərində bitən cir-civirli, tikanlı kol-koslarla örtdürər, yayın qızmarında aran yerlərin bütün ilanlarını da bu daşqalağın içinə ötürərdi ki, hər nə zəhəriniz varsa, hamısını tökün bişərəf qocanın çürüyən cənazəsinə!..

Məmalik xan qohumunun açdığı süfrəni ağzıgünə qoyub gedəndən sonra köhnə ədavət təzədən baş qaldırmışdı. Get-gəl bilmərrə kəsilmişdi. Sanki qoca Məmalikin bu yanda Ərmağan adlı qızı, dörd oğlan nəvəsi yox idi!

"İndi nə etmək ki, bu dərin uçurumu üzdən olsa örtüb malalayasan?! Nə etmək ki, izafi hay-küy qoparmadan xaldar ilanı – Ərmağanı atasının imarətinə keçirmək mümkün olsun? Hansı vasitə ilə, nə yolla? Bəlkə Ərmağan xanım Şah Abbas sayağı təğyir-libas olub əvvəlcə atasının birununa girə, oradan da əndəruna sürünüb, tədriclə öz zəhərini işə sala, Məmalik xanı da, onun ərusu Məhtabanı da, varis-vərəsəsini də cəhənnəmə yollaya! – Həlaku xan uzun təsbehini də, xor-xor qəlyanını da qırağa qoyub, dərisi qırışan barmaqlarını əzişdirdi.

– Yox, Məmalik hər necə olsa təğyir-libas olan Ərmağanı tanıyır, qəsdinə dolan qızından iti qılıncını əsirgəməz!.. Onda Həlaku tərəf tamam rüsvay olar, Qacara qədər külli-İrana aydın olar ki, haçandan bəri qohumluq pərdəsi altında üstünü qor basan köz yenə də göz qabağında cəhənnəm alovlarına çevrilir, yenə də bu xan, o xan davası düşür, kəndlər, obalar, evlər, adamlar yanmaq qorxusu qarşısında dayanır..."

Ustalaşan, xariciləri təqlid edən Həlakuya çox abad halında olan Məmalik mülkü gərəkdi! Daha başdan-başa od alova tutulan, kömür qoxusu verən torpaq bu çalbığın nəyinə gərəkdi?!

Belə olan surətdə Həlaku üçün Ərmağanı – bəzəkli ilanı içəri ötürmək zərurətdən də artıq zərurət idi! Elə zərurət ki, daha düşmən bu qurğudan duyuq düşməsin!..

Böyük Məmalik mülkünün oynayıb əlindən çıxdığını, oğlanlarına qalmadığını görən Ərdahan isə atasından icazə almadan gizlicə qazan qaynatmaq, silahlı yürüşlər düzəldib bacardıqca oranı zəbt etmək istə-

yirdi. Ancaq çalbığ Həlakuya görə içəri əl gərək idi ki, səssiz-səmirsiz iş görsün, birinci növbədə varis-vəliəhdi aradan götürsün! Məhəmməd qızı Məhtabanın gözü qabağında beşikdə yuxuya gedən, ya da cavan anasının döşündən süd əmən tifilin başında ildırım çaxmalı idi!..

Həlaku dinməsə də, göz qoyub görürdü ki, Ərmağan necə də hirs-hikkə ilə daş-divarı gəmirir, heç vəchlə sakitlik tapa bilmirdi. Körpə bütün bu qovğalardan xəbərsizdi. Onun qoca atası, cavan anası isə hər şeyi qabaqcadan görür, həlakular evindəki kinin, qəzəbin, hiylə-məkrin hamısını duyub dərk edirdilər.

Belə vaxtda bir-birinin üstünə qoşun çəkmək mümkün idimi? Tərəflər açıq döyüşdən çəkinirdi. Bəlkə qoca Məmalik özü bir cavan cəsarəti ilə cahada gedər, son günlərdə göstərdiyi rəhmdilliyin, əliaçıqlığın və səxavətin hesabına xeyli müsəlləh süvari toplaya bilərdi. Amma o, belə etmirdi, öz körpəsi – varisi ilə əylənirdi, qoca ər öz cavan xanımını əzəlkindən də artıq sevib-oxşayırdı.

Mamaçılıqdan başqa ayrı sövdası baş tutmayan xarici xanım əlinə keçirdiyi bank vərəqəsindən savayı bir qədər də qiymətli xələt-baratla Tehrana yola düşəndən sonra imarətdə Məmalikə mədəniyyət dərsi deyəcək, başına Avropa ağlı qoyacaq, əslində əl-ayağına dolaşacaq bir kəs qalmamışdı. Təkcə Həlaku qohumlar onu narahat edirdi...

Qoca Həlaku zahirən səbir göstərsə də, əslində cəld tərpənmək istəyir, vaxtı-vədəni itirmək, küləyə verib, bekar oturmaq istəmirdi... Əgər mübarəkbadlıq uzana-uzana ləngisə, Həlaku uduzacaqdı. Həlakuya görə, hər necə ədavət olsa da, qohumlar bir-birinə qarışmalı, dostluq davam etməli, hiylə də öz qaydası ilə işlənməli idi!.. Xeyli vurnuxandan sonra Həlaku xan nəhayət qəti qərara gəldi. Oğlu Ərdahanı hüzuruna çağırdı, onu durmadan qayınatasının evinə yollanmağı, onun oğlunu təbrik etməyi məsləhət gördü.

– Yəni hörmətli xan buyurur ki, dədə-baba düşmənimizə dəxil düşək?

– Nə dədə-baba düşməni, gədə? – Həlaku xan sulu qəlyanın müştüyünü ağzından çıxarıb qırağa tulladı. – Adam da heç Quran qəsəmi ilə başlanan qohumluğu qanlı qələminə verərmi? Özü də kim ola? Sənin qayınatan!

– Görmürsən mənim biqeyrət qayınatam bizim acığımıza necə pəstah çıxarır? Necə özünü yaxşı kişi edib, bizi pis kişi kimi rəiyyət-rəncbərin gözündən salır?!

– Nəyə görə Məmalik belə səxavətli olub?

– Məhz bizim acığımıza!

– Niyə bizim acığımıza olsun, axı? – Çalbığ Həlaku qırışlar içində itən qonur gözlərini qıydı. – Oğlu olub, kişinin varisi doğulub, şadyanalıq eləyir, daha bunun bizə nə dəxli, baba?

– Bəs indi biz nə etməliyik, xan?

– Biz də bu şadyanalığa qarışmalıyıq!

– Tutaq ki, belədir, – deyə pəncərəyə söykənən Ərdahan çalbığ Həlakudan soruşdu, – onda biz çox gecikməmişik?!

– Bəli, gecikmişik, ləngimişik!

– Deməli, uduzmuşuq!

– Ancaq necə deyərlər, ziyanın yarısından qayıtmaq da qazancdır, oğul! Gərək biz özümüzü böyük dəbdəbə ilə qohumumuz Məmalikin şadyanalığına yetirək! Söz düşsə, deyək ki, bəs evimizi tərk edən, süfrəmizi soyuya-soyuya qoyub gedən Məmalikdən qohumluqda bir az incimişdik!..

– Məmalik deməzmi küsmüşdünüz, bəs niyə gəldiniz? Sizə kim ona qənd kəlləsi göndərmişdi?

– Deyərik qohumluqda ürəyimiz durmadı, nəvələrin bizi darıxdırdı, Ərmağan xanım nə yedi, nə içdi. Bizdən rəncidə oldu ki, niyə atamın şad günündə belə kütahlıq göstərirsiniz?

– Bəs bizim bu ağlımız hardaydı, xan?

– Düzü, Ərdahan, mən bu barədə nə müddətdir fikirləşirdim. Gecə-gündüz təsbeh çevirə-çevirə, qəlyan çəkə-çəkə düşünürdüm!

– Deyərlər, nağıl dananı qurda verər, xan!

– Gərək biz elə çevik tərpənək, qiymətli sovqatlarımızı dəvələrə yükləyib, elə karvan düzəldək ki, külli-İranda heç bir xan öz qohumunun mübarəkbadlığına belə dəbdəbə ilə getməmiş olsun!

– Deməli, burada olan-qalan nə varsa, bizim Ərşad Həlakunun qacarilər qumarından hər nə tökülüb durubsa, hamısını yığıb-yığışdırıb oraya – babası Məmalikin malikanəsinə aparaq?

– Oraya aparmasaq, buraya gətirmərik, gədə!

– Birdən Ərmağan buna razı olmadı?

– Biz onu yaxşı-yaxşı başa salarıq, Ərdahan!

– Yəni bütün bunların məğzini əl içi kimi açıb Ərmağana bildirək.

– Əsla! – Həlaku uzun təsbehini dəstələyib cibinə qoydu, sağ dirsəyini qotazlı mütəkkələrə dayayıb ayağa durdu, qapını açıb yan-yörəyə baxdı. Təzədən bağladı, axırıncı olaraq oğlunu yaxşı-yaxşı başa sal-

maq istədi ki, Ərmağan ata-oğlun tük aparan iştahasından heç bir sudur sezməməlidir. Çünki Ərmağanın öz iştahası hamıya bəs edəcək, daha biz həlakulara başqa heç nə gərək olmayacaqdır!

– Yəni xan buyurur ki, Ərmağan xanım qardaşının qətlinə gedəcək?

– Bişəkkə, bişübhə!

– Əgər Ərmağan xanım bişərəf Məmalikin ayağına getməkdən boyun qaçırsa?

– Əsla, Ərmağan boyun qaçırmaz!

– Ata, sən çox etiqadla, çox təlimlənən kimi danışırsan!

– Mən bu son həftələrdə öz-özümlə çox məşvərət etmişəm. Gərək qətl gizli olsun, bir halda ki, qohum qətli ola!

Ata-oğul xeyli xısın-xısın danışıb qət etdilər ki, məmurlara əmr-sərəncam verib tədarükə başlasınlar.

Ərmağan xanım ərindən soruşdu:

– Yəni ciddən Məmalikin ayağına gedirik?

– Bəli, Həlaku xan əmr edir ki, gərək hamılıqla qohumumuzgilə gedək, kişinin oğul varisini ziyarət və təbrik edək!

– Ancaq elə bu?

– Daha başqa nə mənzurumuz ola bilər, xanım?

– Yəni doğrudan heç bir mənzurunuz yoxdur, Ərdahan?

– İnciyərik Ərmağan xanım, billah inciyərik... Arada dörd oğlan övladı olan yerdə heç köhnə yaraların qaysağını qopartmaq olar?.. Məqsəd ancaq mübarəkbadlıqdır!.. Məmalikin oğlu bizim uşaqların dayısıdır!..

– Bu tifil hər kimdən doğulubsa da?!

– Bəli! Daha Allahın sirrinə heç vəchlə çöp salıb qurdalamağına dəyməz, Ərmağan!

Ərmağan xanım məmaliklər tərəfə getməyə, övladlıq borcunu yerinə yetirməyə, qardaşını atıb-tutmağa hazır olduğunu, kinli-küdurətli nəfəsini içəridən dərsə də, üzdə şirin dillə bildirdi.

Ərdahan, xanımının yanından çıxdı, onun yolunu intizarla gözləyən Həlakunun yanına girdi, aradakı söz-söhbəti atasına nəql etdi. Ürəyində gülən qoca Həlakunun çiyinləri atdı...

## 16

Çapar Məmalik xana xəbər gətirdi ki, Həlaku xan öz əyan-əşrəfi ilə, qızınız Ərmağanla, Ərşad, Gurşaddan başqa xırda nəvələrinizlə bahəm xanzadənin mübarəkbadlığına gəlir. Bu xəbər Məmalik xanın

ovqatını qarışdırdı. İndi Məmalik çapara nə desin? Desin ki, birbaş geri dön, öz xanına bildir ki, hansı yolla gəlibsə, o yolla da üztüstə geri dönsün!..

Məmalik Həlaku xanı qəbul etməyib, onu öz yüklü dəvələri ilə geri qaytara bilərdi. Bu, aydındı, heç kəsə də dəxli yox idi. Ancaq icma qarşısında özünün yeganə qızını qapıdan qaytarmaq, atasının belindən gələn körpə qardaşının mübarəkbadlığına gələn böyük övladını evinə buraxmamaq müşküldən də müşkül idi!.. Onda Məmalik xan dilə-ağıza düşərdi, deyərdilər ki, qocanın başı doğrudan da xarab olub. Başqa xanlar arasında müxtəlif şayiələr yayılardı! Üstəlik özünün bir cüt xırda nəvələrini də məyus etmək Məmalik üçün qeyri-mümkün idi! Bu xırdalar Həlaku sicillisini daşısalar da, Məmalikin özü üçün də az-azacıq əziz deyildilər! Onlar hələ məsum uşaqlar idi, nə ədəbaz Ərşada, nə də qaradinməz Gurşada bənzəmirdilər. Xırda nəvələr Məmalik babanı Həlakudan da artıq sevirdilər. Onlar Məmaliki az gördüklərindən qəribsəyirdilər. Düzünə qalsa, Məmalik dədə-baba düşməni Həlaku sicillisini sevməsə də, bu xırda nəvələrinin məhəbbətini ürəyində gəzdirməmiş deyildi!.. Bütün həlakuları geri qaytarmaq, Məmalik üçün xırda nəvələrini də qapıdan qovmaq demək idi. "Bəs indi bu müşkülatı necə həll etmək?!".

Məmalik xan atının dırnaqlarından tər axan, şişpapaq, eşməbığ, müsəlləh çapara etina etmədən əndəruna döndü, körpənin beşiyini asta-asta yırğalayıb, ona həzin layla çalan, ancaq hansı hisslə isə qəm dəryasına qərq olan Məhtabana üz tutdu:

– Yenə sənə nə olubdur, qız?

– Xan, ürəyim birdən qısıldı!

– Bu daha ruzigar olmadı ki!.. – Məmalik xan Məhtabana irad tutdu, amma onun qəlbinə toxunmaq istəmədiyindən tez də sözünün ahəngini dəyişdi. – Sən lap ağlar-gülər Savalan baharına dönmüsən, qız!

– Kaş biz də bu daş hasarlı tağbəndli sarayda yox, Savalanda olaydıq, xan!

– Onda qiyamçılar sənin qocanı Savalanın ən uca palıdından başıaşağı asardılar!

– Mən sənə sədəmə toxunmağa qoymazdım! – O, müti mehribançılıqla ərini süzdü. – Mən sinəmi sinə süpər edərdim! Onlar fədai qızını adlamazdılar!

– Sən şirin nağıl danışırsan, qız! – qoca ər cavan xanımının pərişan saçlarını sığalladı, o üz-bu üzündən də öpdü. – Sən mənim məbədgahım, Məkkəm, Mədinəmsən, Məhtaban! – Xan dərindən köks ötürdü. – Səd heyif ki, bizim nəşəmizi xələldar etməyə gəlirlər...

– Kimlər?

– Həlakular!

– Yəni onlar yenə də bizim Ərdaha eli ilə qanlı savaşa girişmək həvəsindədirlər?

– Savaş olsaydı, nə vardı ki! – qoca xan nəfəsini dərib bir qədər də qeyzlə əlavə etdi: – Onda ölən meydani-cəngdə ölər, qalan da ağ-aşkara sağ-salamat qalardı!

– Yox, xan əsla, yox! – deyə sanki Məhtaban qanlı ədavətin arasına girdi, – qoy qan tökülməsin, xan! Daha Ərdaha ilə həlakular arasında, o tərəfdən, bu tərəfdən gələn qoşunlar arasında qanlı döyüşlər olmasın, xan!

– Qoşunlarımız üz-üzə gəlsəydi, bundan yaxşı idi!..

– Xeyr, sən adil ol, qoy əbəs yerə qan axıdılmasın!..

– Axır, qız, açıq müharibə gizli davadan xeyli asandır, bunca üzücü-yorucu deyil!

– Sən sözlü adama oxşayırsan, xan!

– Bəli! – Məmalik xan çaparın gətirdiyi bəd xəbəri xanımından gizlətmədi, ondan bir söz soruşmadan öz-özünə söyləndi: – Bircə Ərmağanın iki balacası olmasaydı, düşmən həlakuların hamısını üzüqoylu qaytarardım!

– Xan, heç qonağı da qapıdan, ya yarı yoldan qaytararlarmı?

– Əgər ürəyin istəmirsə, onda necə?

– Canını dişinə tutmalı olsan da, gərək öz paxırını açmayasan, qonaqdan da əqdəm, doğma qızını qapıdan qovmayasan!

Məhtaban Ərmağanın gəlişinə razı olmasa da, qocasını qınadı, xeyli söz-söhbətdən sonra onlar istər-istəməz həlakuların yolunu gözləməli oldular. Ancaq Məmalik bu barədə heç kəsə bir sərəncam vermədi...

– Xan, bəs istiqbal üçün sərəncamınız?

– Nə istiqbal, nə sərəncam, qız?

– Bəlkə darvazadan başlayıb imarətin qapısına qədər payəndaz döşəsinlər, hə?

– Yox, qız, mən daha bacardıqca ürəyimin səsinə qulaq asmaq istəyirəm, mümkün olduqca riyakarlığa yol vermək istəmirəm!

– Siz ki, qohumlarınızı qəbul edirsiniz!

– Məcburam, qız, məcburam!.. – Məmalikin çuxura düşən xırdaca gözləri qəzəblə ağardı. – El içində məcburam! Leyk boğazdan yuxarı, dilucu!..

– Xan, bu lap ağ-aşkara soyuqluq olar, qohumlar küsüb gedərlər!

– Belə qohumlar birdəfəlik küsüb xarabalarına dönsələr yaxşıdır!

– Axır, xan, biz danışdıq ki, arada ədavət olmasın, bica yerə günahsız qan tökülməsin?.. Bir də siz öz xələfinizə görə fəqir-füqəraya ehsan verməyə, rəiyyətə-rəncbərə güzəştə getməyə, oğlunuzun şərəfinə bol-bol süfrələr açdırmağa, sülh yolunu tutmağa başlamısınız!

– Ancaq öz xanlığımda, öz xanlığım üçün!

– Xan, axı, siz xanların ədavəti fəqir-füqəraya, rəiyyətə, rəncbərə qan bahasına başa gəlir!

– Mən onu indi daha yaxşı başa düşürəm!

– Əgər ürəkdən belə isə onda böyük xanı yeganə oğlunun başına and verirəm ki, bir daha Savalan ətəyində tüfənglərin işə salınmasına yol verilməsin!..

– Bə çeşm, xanım! – sanki qoca xan tonqalların ordan-burdan qalxan alovlarını tapdayıb söndürməyə çalışdı. – Mən yeganə oğlumuzun, xırda Məmalikin qıvrım saçlı başına and içirəm ki, qonaq düşmən də olsa, özümü səbirli, təmkinli aparmağa çalışacağam!

– Xan, onda buyurun yola fərş döşəsinlər!

– Həlakular buna layiq deyil, qız!

– Nəvələrinizin, qızınızın qədəmlərinə fərş döşəsinlər!

– Onlar da çoxdan həlakudur!..

– Xan dəqiqədə bir öz əqidəsinin ziddinə gedib burulğanlarda boğulmasın!

– Xeyr, mən aylı gecədə, ayna göldə öz cananımı görəndən bəri dəyişməyə, düzü başqa xan olmağa başlamışam!

– Əsla! Xan hər necə ciddi-cəhd etsə də, öz zülmkar xanlıq fitrət və təbiətindən biryolluq çıxa bilmir!

– Görünür, fədai qızı Məhtaban Məmalik xanla açıq-aşkar qaşıq döyüşünə girişibdir!

– Bəli, xan, rəiyyətinki ancaq ağac qaşıqdır, savaş düşəndə onunla da döyüşə bilir!

– Mənim ağıllı xanımım, mənim kamallı Məhtabanım!.. Mən heç güman etməzdim ki, Məhəmməd yetimçəsi belə tədbirli olsun. Xan

birdən ürəyinə xof düşmüş kimi hər iki əlini göyə qaldırdı. – Xudaya, sən bizim xanımanımızı dağıtma!.. Xudaya, sən bizim əmlak-əmvalımızı qohum cildində bizə gələn, mübarəkbadlıq üçün təşrif gətirən, ancaq əslində dədə-baba düşmənimiz olan həlakulara qismət eləmə!..

– Xanın oğul varisi, öz oğlu vəliəhdi var!

– Xudaya, sən bizim oğlumuzu öz amanında saxla!..

Xanın səsi titrədi...

– Siz ağlayırsınız, xan?! Özünüz hər vaxt məni qınayırdınız?!

– Qocalıq ağladır, qız! Ömrün vəfasızlığı, qolların qüvvətsizliyi ağladır! Bu həlakularla döyüşdə qol-qanadımızın qırılmağı məni kövrəldib ağladır? Xudaya, sən bizim İranı nə qədər ziddiyyətli yaradıbsan, mən biçarəni də onun içində!.. Bax, əgər mənim ürəyim balaca tifilim üçün nanə yarpağı kimi əsirsə, həlakular qanına qarışan qırçınsaç, səkkiz-on yaşlı nəvələrim üçün də eləcə əsir... Qızım Ərmağanı isə heç görmək istəmirəm. Çünki Ərmağan indi əsil həlakulardan yüzqat bedtər olubdur...

Məhtaban öz otağına girdi, oyanıb dodaqlarını sovuran körpəsini götürüb, göz yaşları axıdan xanın qucağına qoydu. Qoca qundağı görən kimi ovundu.

– Mənim Tanrım! – deyə o, dizləri üstə düşüb körpəni titrəyən əllərində başından uca qaldırdı. – Xudaya, mən qocalmışam, səndən sonuncu Məmalik varisini boya-başa çatdırmaq üçün möhlət istəyirəm!..

Gözlərindən bir gilə də olsa yaş axmayan, ancaq ürəyi qopmaq dərəcəsinə gələn Məhtaban bu heyrətamiz ziddiyyətin qarşısında mat qaldı. Nə körpəsini qocasının əlindən ala bildi, nə də qocasının qolundan tutub ayağa qaldıra bildi. O, özlüyündə:

“Xudaya, xan evinin çölü necə şəşəli, içərisi necə ilan-əqrəbli imiş!” – deyə üzüstə çarpayıya düşdü.

17

Həlaku xan öz gözləri ilə Məmaliki görməsə də, pişvaza çıxan olmadığından onun necə qeyzləndiyini təsəvvürünə gətirirdi. Məhəbbət mütəqabil olduğu kimi, nifrət də mütəqabildir. Madam ki, az çox müvazinət tapan qohumluq pərdəsi son zamanlar bunca tənəzzülə düşmüşdü, deməli, dədə-baba düşmənçiliyi qarşı-qarşıya dura bilər, mübarəkbadlıq əvəzinə, dava-şava başlaya bilərdi. Yenə də döyüş təbilləri çalınar, beşikdəki körpələrin zəhr-bağırları yarılardı.

İndiki gör-görüşün, mübarəkbadlığın qanlı qalmaqala çevrilməsi çalbığ Həlaku üçün də heç də faydalı deyildi. Çünki açıq savaş qohumluq körpüsünü tamam uçurar, müqabil düşməni vaxtından əvvəl ayıq salardı. Buna görə də Həlaku xan qohumunun evində hər necə soyuq sifət görsə də, çalışıb üzə vurmamalı idi; "Dilin altında zəhər damlaları gizlənsə də, gərək dilin ucundan bal axsın!.. ".

Hər iki xanlığın kəndlərindən, obalarından keçərkən göz qoyunca görünürdü ki, şirəsi sorulub, cecəsi çıxarılan kəndlərin, obaların cır-cındalı sakinləri necə də yol kənarına çıxıb səf düzəldiblər, qorxu içində, istər-istəməz əllərini döşlərinə aparıb Həlaku qafiləsinə baş əyirlər... Ürəkdə isə onu qohumu tərəfə qarğışla ötürürlər. Onlar bu xanların heç birisini görmək istəməsə də, yenə də sevinirdilər ki, nə yaxşı bu qoca xanlar vuruşmurlar, nə yaxşı ki, az-az da olsa görüşürlər, nə yaxşı ki, bizim daldalanmağa dəyəmiz, qışda bürünüb yatmağa mitilimiz vardır! Yoxsa iyirmi ildən artıq davam edən bu qohumluq arada olmasaydı, yəqin ki, tez-tez dava düşər, arada qan sel kimi axardı. Bəli, camaat dincliyi qənimət bilir, bunu Allahın onlara göstərdiyi böyük rəhm sayırdı...

İki xanlığın arasındakı qohumluğun zahiri tərəfi belə idi. Batini tərəfi isə, bilindiyi kimi, bambaşqa idi. Xanlardan heç biri ziyafət süfrəsində sayıqlığını əldən qoymur, çayların rənginə diqqət yetirir, bəzən də şübhələndikləri fincanları soyuya-soyuya qoyurdular. Nə Məmalik, nə Həlaku bunu üzə vurmur, dildə deyib-gülür, içəridə isə bir-birini aldatmağa cəhd edirdilər...

Bir-birinin evində gecələyəndə də qapını daldan bağlayır, qorxudan pəncərə qabağında yatmırdılar...

Xan evi ilə ilan yuvası arasındakı fərq yalnız bunda idi ki, adi ilan yuvası balaca, buradakı ilan yuvası isə böyükdü, bir-neçə mərtəbəli imarətdi!..

Məhtaban bütün bu əsrarı özü üçün aydınlaşdırırdı. Ürəyi onu bu ilan yuvalarının qapı-pəncərələrini açıb havasını dəyişdirməyə, bacardıqca qocasını da insaf, ədalət, mürüvvət uğrunda səfərbərliyə almağa çağırırdı.

Məhtaban heç vaxt Ərmağan kimi olmaq istəmirdi. O, iyirmi beş yaşına qədər başqa aləmdə boy atmışdı. Xan sarayında beşikdən başlayan dedi-qodunun, didişmə-çəkişmənin heç birini görməmişdi. Lakin xanlığın necə namərdlik yuvası olduğunu duymamış deyildi.

Gənc ana öz qoca ərinin necə didişmə-çəkişməyə düşəcəyini düşüncə varından yox olur, olmazın nigarançılıq keçirirdi:

– Xan, indi quruyub-qalmaqdan nə çıxar? – deyə gör-görüş vaxtı yaxınlaşınca Məhtabanın vücudunda buzlu üşütmə gəzinirdi. – Nə cür olsa, yenə qonağı ləyaqət və ehtiramla qarşılamaq vacibdəndir!

– Sən mənə kin-küdurəti bir qırağa qoyub, qarı düşmənimlə ülfətə girməyimi təklif edirsən, qız?

– Bəli, xan, qarşında diz üstə dayanıb yalvarıram, elə də üstünü vurub ağartmayın, qonağı gülərüzlə qarşılayın, mümkün qədər də tez yola salın!..

– Mənim məqsədim onları bir-iki gündən artıq burada saxlamaq deyildi!

– Qoy üç-dörd gün olsun, xan! Ancaq qohumluq pərdəsi yırtılmasın, özü də gərək həftələrlə uzanmasın, onların dönüşü elə də çox təxirə salınmasın.

– Əlbəttə, əlbəttə, gərək bacardıqca düşmən evimizdən tezcə rədd olsun ki, daha gözümüzə tikan batmasın!

– Birdən xan... – deyə Məhtaban titrəməyə başlayan soyuq barmaqlarını ovuşdurub-əzişdirdi, – birdən xan, qızınız Ərmağan xanım sarayda aləmi bir-birinə vurdu, onda necə?!.

Qoca xan qızışdı:

– Onda mən Ərmağanın saçlarından yapışıb barigahdan bayıra ataram!

– Yox, xan, elə də ağ-açıq ədavət yaramaz! – deyə od-alov arasında qalan Məhtaban yalvarmağa başladı. – Yaramaz ki, ağ-açığına ata öz qızı ilə belə bəd rəftara keçib, göz görəsi – ağac-ağaca qoysun!

– Ərmağanın əli ilə qoca Həlaku bizim hamımızı zəhərlədə bilər! – deyə qoca xan qıvrılıb-açıldı. – Dədə-baba ədusi çal-cod pədər süxtə hər cinayətə desən gedə bilər!

– Xudaya, mən bilmirəm bunca amansızlıq nə üstündədir? – Məhtaban gözlərini gəzdirdi, – bu qədər qovğa nəyə görədir, nə üstündədir?

– Hamısı Ərdaha mülkünün vərəsəliyi üstündə!

– Şükür ki, gec də olsa sizin varisiniz, vəliəhdiniz daha vardır, xan!..

– İşdir, zəhərdən sovuşsaq da, – deyə qoca xan ehtiyatla söyləndi, işdir, düşmənçilik bu tərəfindən adlasa belə o biri tərəfindən iti bir qılıncın mənim varisimin başı üstündən necə asılacağını indidən görürəm!

Məhtaban qanı qaçan, buza dönən əllərini göyə qaldırdı:

– Aman Allah, xan imarəti necə ölüm və faciə səhnəsi imiş?!

– Qız, sən bunca üşütməyə düşmə! – deyə qoca xan qılıncın qəbzəsinə əl atır kimi qeyzə gəldi, – mən hələ ölməmişəm!..

– Xan, bəlkə mən körpəmi də götürüb buradan Məhəmmədin köhnə komasına çəkilim, ya bilinməz bir guşədə yenə də palaz-paltar yumaqla məşğul olub, sizin varisinizi böyüdüm? Sonra məqamında əmanəti sizə çatdırıb, ayaqlarım tutduqca qaçıb uzaqlaşım?.. Bəlkə mənəm müqəssir?.. Bəlkə sizin varisiniz bir xan qızından olsaydı, ədavət belə tez təzələnməzdi?.. Onda xanımınız tərəfdən də sizə kömək duran, havadar çıxan olardı!.. İndi siz təksiniz, indi sizin xanzadələrdən yardımçınız, köməkçiniz yoxdur!

– İndi mənim oğlum vardır!

– O, sizin İsmayıl qurbanınızdır, xan!

– Bil ki, İsmayıl Beytullahda qurban kəsilmədi, qız!..

– Mən qorxuram, xan, qorxuram, sizin oğlunuz qurban kəsilsin, – Məhtaban bilmirdi ağlasınmı, yaxud dəlicəsinə gülsünmü?.. – Mən qorxuram ki, mənim ürəyimə damıb ki, səmum körpəmizi solduracaqdır!.. İlahi, mən onu niyə doğurdum?.. İlahi, öz beşiyində arxayın-arxayın, mışıl-mışıl yatan körpə hardan bilsin ki, onun başında qanlı qovğa vardır?.. Hardan bilsin ki, onun bacısı ilə atasının arasında bunca qılınc-qılınca qanlı ədavət başlayıbdır?.. Hardan bilsin ki, iki xan arasında ədavətlə qohumluq bunca eybəcər halında bir-birinə qarışıbdır?.. Xudaya, sən bir gör ki, xan evində xan oğlu doğulmaqdansa, çoban evində çoban oğlu olmaq nə qədər də asan imiş!.. Çoban balası boy atıb ayaq tutunca quzularla oynaşır, amma xan balası göz açmamış, ona qurd-yalquzaq gözləri zillənir! İlahi İranın nə xanlığında, nə də rəiyyət-rəncbərliyində bir sakit güzəran vardır, ilahi!

Məhtaban birdən hıçqıra-hıçqıra ağladı. Məmalik özü də bu açıq həqiqətin müqabilində etiraz etmədi, dönüb əndəruna çıxdı, titrəyən əlini torbalanan gözlərinə gətirdi, tor-top olan süvari bir dəstənin tozun içi ilə yumarlanıb gəldiyini gördü. Bir qədərdən Həlakunun müsəlləh dəstəsi bir neçə yüklü dəvə ilə özünü yetirdi... Onlar atlarından düşüncə Məmalik tərəfin adamları öz xanlarının sərəncamını gözləmədən qohum-qonaqların atlarının zaqqasından tutdular, ehtiram göstərib Həlaku tərəfə təzim etdilər. Sifəti turşuyub, ovqatı təlx olan Məmalik özü də əndəruna baxan tağbənddən enib qohumların qarşısına çıxdı. Hər iki qoca qucaqlaşdı.

– Biz hamılıqca ziyadə şadıq! – deyə çalbığ Həlaku ucadan elan etdi. – Biz balaca Məmalikin təvəllüdü münasibəti ilə mübarəkbadlığa gəlmişik!..

Qoca Məmalik, çalbığ Həlakunun hiyləgərliyi müqabilində hiyləyə keçdi:

– Özü də bir qədər... ləng... gəlmişik, belə deyilmi, Həlaku?!

– Xeyr, əsla Məmalik! – deyə Həlaku bacardıqca özünü onda qoymayıb, qohumunun qolundan tutdu, atdan düşüb, o biri yanda dayanan geyimli-kecimli Ərmağana tərəf çəkdi. – Biz məhz xanzadənin qırxının çıxmağını gözləmişik.

– Biz heç xanzadənin qırxının nə vaxt çıxdığını da bilməmişik!

– Çünki fərəh içindəsiniz. Ancaq biz necə sevinsək də hesabı düz saxlamışıq, bu gün qırx birinci gündür ki, Məmalik mülkünün mübarək xanzadəsi işıqlı dünyaya gəlibdir və bizim intizarlı gözlərimizi güldürübdür!

Çalbığ Həlaku üzünə salıb ata ilə qızını güclə görüşdürdü:

– Belə şad günümüzdə gərək bir küsünü bir kənara qoyub, vahid ailə daxilində təmamən barışaq, Məmalik!

Məmalik xan, çalbığ Həlakunun müqabilində borclu qalmaq istəməyib:

– Qapıya gələn qonağı qovmaq, ya rəncidə salmaq, məmaliklər sicillisində olmayıbdır! – deyə cavab verdi. Çalbığ rəncidəliklə yırğalandı:

– Məgər ki, biz həlakularda belə bir biədəblik olubdur?!

– Bəli, danmağına dəyməz, olubdur!

– Biz elə həm onun üçün də xan, hüzurunuza üzr istəməyə dəxil düşüb, yalvarmağa, həmin günahımızı mərd-mərdanə öz boynumuza almağa gəlmişik!

– Siz kimlə belə tövbə-əstəğfarə gəlmisiniz?

– Öz gəlinimiz Ərmağanla, bir də iki babanın iki nəvəsi ilə!

– Bəs qalan iki nəvəmiz?

– Onlar sizin yeznə Ərdahanla evdə qalıblar ki, birdən Savalan başıpozuqları aşağı şığıyıb evimizə, imarətimizə bir xətər-zad toxundurarlar!..

– Necə xətər-zad toxundurarlar?

– Düzü, indi Məmalik bizim qədim İran yenə də qaynar qazan qapağına dönübdür.

– Necə qaynar qazan qapağına?

– Belə qaynar qazan qapağına ki, bu yan Təbrizdə Şeyxin şurişi başlayıbdır, yuxarı Tehranda Qacar xanədanına rəxnə düşübdür! Belə görünür ki, İranda yeni bir papaqaldıqaç başlayacaqdır!

– Həm də görünür ki, köhnə üsul ilə məmləkəti idarə etmək də xeyli müşkül olacaqdır...

– Belə də görünür ki, şahənşahlıqdan fəzlə İrana daha güclü və müstəqil xanlıq-şahlıq vacibdir ki, ixtilalçı savalançılar kimilərini daha mətin qantada saxlamaq mümkün olsun! Yoxsa gədə-güdələr gündə burnumuza duzlu su dolduracaqlar! – deyə öz ümdə bığlarını eşə-eşə xırda nəvələrini də gətirdi. Məmalik xırdalarla görüşüncə kövrəldi, əyilib hər ikisinin üzündən öpdü:

– Mənim nuri-didələrim!

– Bax, görürsənmi, bizim büzürg xanın mərhəmətli ürəyini! – deyə Həlaku gəlini Ərmağana qocanın yaşaran gözlərini göstərdi. – Qohumluq, qan qarışıqlığı, xüsusən ortalıqda nəvə olmaqlığı belədir ha!

Ərmağan başını əyib təsdiq etdi, irəliyə gəlib atasının qolundan ikiəlli tutdu:

– Ata öz qonaqlarına icazə verərmi əndəruna daxil olsunlar?

– Nəyə görə möhtərəm qonaqlar belə tələsirlər?

– Qardaşımızı görmək, xan fərzəndini ziyarət etmək üçün!

– Rəiyyət qızından olan oğlanı qardaşlığa qəbul edən varmı?

– Sidq səmimiyyətim üçün, həm də evimizdəki naguvara rəftarımıza görə, ürəkdən peşmançılıq çəkib bir Allahın müqabilində dönə-dönə Quran-məcidə qəsəm qıla bilərəm, ata!

– Ay Məmalik, ay Məmalik! – deyə Həlaku qoca qohumuna cavab verməyə macal vermədən öz şişpapaqlı başını buladı. – Bəyəm, neçə yol Qurana əl basıb, qəsəm qılarlar? – Bununla da Həlaku öz qohumuna dedi ki, bəs şübhəyə yer yoxdur, onların ürəyi əl içi kimi açıqdır. Məmalikin gümanına gedən dədə-baba ədavətindən onların ürəklərində də daha iz-toz qalmayıbdır. – Gərəkdir ki, şübhəni qovasan, şeytanı tapdayıb, içəri qurdu öldürəsən! – deyə Həlaku çal bığlarını əsdirə-əsdirə davam edib, qohumunu qabaqlayıb qınadı. – Düz tamam iyirmi ildən artıqdır ki, külli-İran xanları bizim ayrılmaz qohumluğumuza qibtə edirlər və heç bir düşmənin də yan-yörədən qıcanan dişləri bizə batmır!..

Məmalik xan istədi ki, "əlbəttə-əlbəttə" – deyib təsdiq etsin, ancaq bu barədə ürəyinin ziddinə çıxıb dinmədi. Ərmağan atasını ən-

dəruna çəkdi. Məmalikin xırda nəvələri onlardan üzülmədi. Həlaku öz əyanları ilə birun tərəfdən ərklə imarətə qalxdı.

Məmalik xan qızının, nəvələrinin qabağına düşüb, balaca qapını açdı, onları içəridən güllüyə keçirdi.

– Ata, sizin növrəstə xanımınız, əndərun aləmində də olsa, mehmannəvazlıq göstərib qarşımıza çıxmır, – deyə Ərmağan bir an əvvəlki andının ziddinə olaraq qızarıb bozardı, ancaq tezcə də sinəsində alovlanan kini gizləməyə cəhd etdi. Atası isə qızının üzünə baxmadan yenə də atmacalı cavab verdi:

– Məhəmməd qızı Məhtaban, daha Ərmağan xanım kimi xan qızı deyildir ki, istiqbala çıxmağı, əziz qonaqları necə şirin dillə qarşılamağı bilsin!..

– Barı əziz atamız bir az əzəlki Quran qəsəmindən sonra da olsa, bizi həlakuların yanında sancmasın! – deyə Ərmağan işarə ilə atasına bildirdi ki, onun sevimli nəvələri hər necə xırda olsalar da, həm də Həlaku nəvələridir. Bilər-bilməz tünd danışıqları onlar burada Həlakuya, orada da Ərdahana, Ərşada, hətta qaradinməz Gurşada belə çatdıra bilərlər. Barı elə olsun ki, ata ilə qızının arasında olan ixtilaf bacardıqca pünhani olsun, bacardıqca başqaları bilməsinlər. – Əziz atamdan acizanə rica edirəm ki, məni assa da, kəssə də, tənhalıqda, təklikdə assın-kəssin!.. – deyə Ərmağan atasını ciddən xəbərdar etdi...

Məmalik tərəddüd içində ayaq saxladı. Ərmağan ətrafa hər necə diqqətlə göz gəzdirib, sözlü adam kimi boylansa da, atasının ömründə xoşlayıb, əhvalından razı olmadığı Sərəncamın adını dilinə gətirmədi. Demədi ki, bura anamın güzargahı idi. Bəs anam yuxarı imarətdə yox, bu birmərtəbəli otaqda keçinibdir!.. Ərmağan da qayınatası Həlaku kimi belə nəticəyə gəlmişdi ki, burada nə edəcəksə, pünhani edəcəkdi, məqamına qədər üzə açılışmayacaqdır, sinəsində gizlənən kin-küdurətini büruzə verməyəcəkdir!..

Ata ilə qızı əndərundan yuxarıya, imarətə qalxdılar. Məmalik, xanım otağının qapısını açdı:

– İzin olarmı?!

– Xan buyursun!..

– Ərmağan xanım öz balaca qardaşını görməyə təşrif gətiribdir, Məhtaban!..

– Buyursunlar! – deyə bənizi saralan, həyəcandan sinəsi qalxıbenən Məhtaban yana çəkildi. Ərmağan xanım göz gəzdirə-gəzdirə

içəri girib, beşiyin örtüyünü götürdü. Ata bir, ana ayrı qardaşının mışıltısını dərindən dinləyib, onun məsum sifətini süzdü. Ərmağanın xırda uşaqlarının körpəliyi ilə bu körpənin arasında nə qədər də bənzəyiş və müşabihət var idi!.. Ərmağan dönüb Məhəmməd qızı Məhtabanın boynunu bərk-bərk qucaqladı:

– Mən çox şadam, Məhtaban xanım!..

– Mən isə çox günahkaram Ərmağan xanım!

– Niyə, nə üçün?

– Naguvara iş görmüşəm, xanım! İstər-istəməz Sərəncam xanımın yerinə günü gəlmişəm!

– Əsla! – deyə Məmalik, etiraza qalxmışdı. – Məhtabanı mən özüm gətirmişəm!

– Nəticəsinə mən şadam... Mən qoca atamın oğul yurdculu Məmalik atanı bağrıma basıram! – deyə Ərmağan beşiyi tərpədib körpəni oyatdı, qundağı ikiəlli qaldırıb, qucağına götürdü. Bir atanın iki övladının gözləri bir-birinə sataşdı. Bu gözlərin birisi məkrlə, birisi də məsumluqla dolu idi...

– Ata, indi sənin iki balan var! – deyə Ərmağan qalib gələn övladlıq hissi ilə hıçqıra-hıçqıra ağladı. – İndi bizim hər hansı düşmənimizə qarşı dura biləcək, məqamında layiqli cavab verə biləcək oğlumuz, varisimiz vardır!..

18

Necə deyərlər, çalbığ Həlakunun aşığı alçı durmuşdu. Onun kefi kök, damağı da çağ idi. Artıq gəlini Ərmağanı – xaldar ilanı ustalıq və məharətlə atasının evinə ötürmüşdü. Ağla çətin sığa bilən əfi ilan artıq Məmalikin evinin içində idi... Adi ilanla bu ilanın fərqi bu idi ki, adi ilan küncdə-bucaqda gizləndiyi, girəvəsi düşüncə çalıb zəhərlərini cəld töküb bir qırağa çəkildiyi halda, bu ilanın heç də küncdə-bucaqda gizlənməyə ehtiyacı yox idi. Getdikcə Ərmağan öz atasının evində qol-qanad açır, deyəsən tezcə də Sərəncamsayağı əmr, sərəncam verməyə də başlayırdı! Ərmağan xanımın fərmanı ilə qoca xidmətkarlar, məmurlar, darğalar, əşrəflər mübaşirlər işə-gücə qoşulur, bu yanda qoyun kəsilir, o biri yanda aşpazxanada ləziz təamlar hazırlanıb, süfrələr sahmana salınırdı. Məhtaban isə gərdək dalında gizlənən utancaq gəlin kimi aşkara çıxmır, hələ ki, heç kəs də onu təm-təraqla aşkara

çıxarmaq, ev sahibəsini mübarəkbadlığa gələn əyan heyətinin qoca başçısı çalbığ Həlakuya pişnəhad etmək istəmirdi. Həlaku xan isə öz növbəsində ədəb gözləyir, Məhtaban xanımı görmək üçün can atmırdı. O, Məmalikin qaşqabaqlı olub-olmadığına fikir vermir, sahibkarın necə turş-təlx sifətdə olduğunu görmürmüş kimi, üstünü də vurmurdu. Həlaku xan tərəfindən, yaxud Məmalik xan tərəfindən burada cəm olan əyan-əşrəf də yeyib-içməyə keçir, Çalbığ həlaku bic-bic göz vurub, şirin-şirin söhbət edir, deyib-gülür, olmazın şadyanalıq göstərirdi. Çalbığ Həlaku təvəllüd tapan xanzadəyə Məmalik mülkünə bitişik kəndlərdən bir mədaxillisini bağışlamaq barədə möhürlü qərar göndərəcəyini vəd edir, sevincinin intəhasız olduğunu mötəbər məclisdə nümayiş etdirirdi.

– Bu qohumluq ki var ağalar, hər ikimizin xoşbəxtliyidir, – deyə Həlaku tutqunsifət Məmaliki süzüb, arada heç bir buğz yox imiş kimi, ortada dolaşan oğlan nəvələrinə işarə edirdi. – Bax, bizim xırdaların burunları daima bu Məmalik baba üçün göynəyir!..

– Mən özüm də heç bu xırdaları az istəmirəm!

– Bəs, Ərşad, Gurşad necə, xan?

– Ərşad ayrı, Gurşad da ayrıdır!..

– Necə yəni Məmalik babası, Ərşad ayrı, Gurşad ayrıdır?

– Ərşad azğın gədədir!

– Bəs Gurşad nəvən necə?!

– O, baş tapılası Həlaku deyildir!

– Yox babası, əsla yox! Hər meyvənin bir təmi, bir dadı vardır! – deyə çalbığ özünə çəkən Ərşadı igidlikdə tərifləyib Gurşadı da başıdolu oğlan olmaqda nəzmə çəkib, qohumluğun necə bəhrə verdiyini tərif edir, Məmaliklə necə canbir qəlbdə olduğunu sübut üçün az qala qırışıq dərisindən çıxırdı. Lakin çalbığ nə qədər səy göstərib, yaxınlıq etsə də, Məmalik də bu oyunun necə oynanıldığını duyurdu. O, duyurdu ki, Həlaku necə də gözaltı onun imarətinə, imarətinin içinə, mətbəxdən gələn ləziz təamlarına, eninə-uzununa salınan bərli-bəzəkli süfrəsinə, Avropadan gətirilən gözqamaşdırıcı qab-qacağına müştəri gözü ilə baxır, heç bir şeyi nəzərindən qaçırmır, yedikcə də iştahası açılır... Çalbığ süfrəyə düzülən, fasiləsiz gətirilən təamlardan belə acgöz-acgöz yeyir, kəndli-kəsəkli bütün Məmalik mülkünü dirigözlü udmaq istəyirdi. Sanki qırışıqsifət Həlaku çox nataraz əjdahadır, nəfəsi cəhənnəm körüyündən də güclüdür! Sanki bu əjdaha hər şeyi udmaq, öz mədəsində həzm etmək istəyir...

Doğrudan da çalbığ necə iştaha ilə yeyib-içib, deyib-gülüb, özünü Məmalik qohumunun evində xahan göstərsə də, təvəllüd tapan oğlu varisi barəsində öz təlatümlü sevincini izhar etsə də, özünü canı od tutub yanan göstərsə də, yenə onun əsil iştahası ayrı idi! Onun acıxan iştahası özünün ən qədim dədə-baba düşməninin, bu düşmənin sonuncu qocasının ölümünü öz gözləri ilə görmək idi, məmaliklərin sonuncu qocasını öz dədə-baba sərdabasında dəfn etmək idi! Dönüb çaylı-çəmənli, meşəli-ormanlı, bağlı-bağatlı, əkənək-biçənəkli Məmalik mülkünü öz torpağına qarışdırmaq, nə varsa hamısını diri gözlü udmaq idi!.. Hamısını biryolluq Həlaku xanlığına bitişdirmək, yüz-yüz ilin ara sərhəddini biryolluq itirmək, daha qəvi xanlıq yaratmaq idi! Hələlik bu qədər! Sonra boy atan həlaku qardaşları arasında nə olacaq, nə olmayacaqdı, çalbığ özü də bilmirdi. Ancaq girəvəçi Həlakunun birinci vəzifəsi pilə kimi yumşaldıqda xaricilərsayağı üzə gülə-gülə öz işini-gücünü görmək idi, ölüncə cəhənnəminə-goruna arxayınca çıxıb getmək idi.

Həlaku xana elə gəlirdi ki, artıq vaxt çatıbdır, öz ürək arzusuna qovuşmaq üçün vədə yetibdir. Dəmhadəmdir, bu arzu elə də uzun çəkməyəcəkdir. Qoca Məmalik nə qədər çalıxıb-çapalasa, atılıb-düşsə, girəvəsi düşüncə onun güvəndiyi varisi də öz qızı Ərmağanın əli ilə aradan çıxarılacaqdır. Sonrasını da sonra düşünmək, yüz ölçüb bir biçmək olar... Ən amansız düşmən gülə-gülə Məmalik evinə girmişdi, çalmaq qəsdinə dolan ilan imarətinin içinə ötürülmüşdü.

– Biz cəsarət edib Məmalik xanı gələn həftəyə öz xanəmizə mehman dəvət etmək əzmində olsaq, – deyə Həlaku yanında əyləşən qohumunu dirsəyi ilə tərpətdi – büzürg xan biz bəndeyihəqirin təklifinə necə baxar?

– Düzü, Həlaku, bu tezlikdə heç yana tərpənmərəm, sizə də gələ bilmərəm!

– Niyə, nəyə görə, büzürg xan? Bax, xanımınızı da, mübarəkbadlığa gəldiyimiz oğlunuzu da, sizin bu mötəbər əşrəflərinizi də götürüb nə üçün bizim xanəmizə bir həftəliyə qonaq gələ bilməzsiniz?

– Çünki kiçik xanı bu tezlikdə tərpətmək olmaz!

– Şəxsən büzürg xan, özü bizə buyurub təşrif gətirsə necədir?

– Büzürg xan kiçik xanı bircə an gözdən qoymaq istəmir!

– Məhtaban xanım büzürg xanın vəliəhdinə baxa bilməzmi?

– Xeyr, gərək büzürg xan özü vəliəhdinə göz olsun!

– Bəs onda, həqiqətən haçan bizə buyura bilərsiniz Məmalik?

– Demək çətindir, Həlaku!

– Nə üçün? – Həlaku tərəfin əşrəfləri də çalbığın işarəsi ilə bu söhbətə müdaxilə edib, ağanın təklifinə rədd cavabı verildiyinə görə rəncidə olduqlarını bildirdilər.

– Gərək sizin əlaqəniz möhkəm olsun ki, iki xanlığın da arası o nisbətdə möhkəm olsun! – deyə səslər bir-birinə qarışdı.

– Bəli, gərək belə olsun ki, siz tərəfdən biz tərəfə, biz tərəfdən siz tərəfə qaçan, yaxud Təbrizdə başlanan Şeyxin şurişi zamanında Savalan dağına gündən-günə çəkilib qalxan, yolundan-rizindən azıb-təzən rəiyyət-rəncbər hər iki tərəfin güclü əli ilə biryolluq cilovlansın!..

– Mən daha öz tərəfimin hər cürə azıb-təzməyinə xitam vermək qərarına gəlmişəm, ağalar!

– Nə ilə, Məmalik? – deyə Həlaku sinəsində baş qaldıran kin-küdurətini gizlədib gülə-gülə soruşdu: – Yoxsa siz büzürg xan, elə güman edirsiniz ki, rəiyyətə, rəncbərə güzəştə getməklə, onlara ehsan etməklə gözləri doyacaqdır? Əsla!.. Sən büzürg xan tərəhhüm göstərib bu gün bu vergidə güzəştə gedəcəksən, sabah o səndən başqa vergidən əl çəkməyini tələb edəcəkdir, sabah o vergini də güzəştə gedəndə başqa vergidən xilas olmağını istəyəcəkdir. Ta o qədər ki, mənim əziz qohumum büzürg xan, öz xanlığından əl üzüb müflis düşəsən! Ta öz dədə-baba imarətini Tehran-Təbriz tacirinə satıb ucqar bir yanda özünə sövmiə-daxma tikəsən!

Həlaku xan, "büzürg xan, büzürg xan, büzürg baba" – deyə Məmaliki yumşaltmaq, əslində onun saqqızlığını oğurlamaq istəyirdi. Məmalik isə həlakularla olan qədim ədavəti unutmur, dədə-baba düşməninin yağlı dilinə inanmır, qohumluq bürüncəyində gələn düşmənlə sazişə girmir, ancaq onlara "durun buradan itilin, gedin!" də demirdi. Qohumluq cildində evinin içinə dürtülən düşməni qovmaq Məmalik üçün səngər səngərə duran düşmənlə atışmaqdan da çətin idi. Lakin o, birdən də üzə gəlib açılışmaq, Həlaku tərəfin hamısını buradan yerlidibli qovmaq istəsə də, yenə də tərəddüd göstərib müəyyən qərara gələ bilmədiyini duyurdu: – Necə olar? Yaxşı olar, yaman olar? Məhtaban nə deyər, nə deməz?".

Əlbəttə, Məhtaban hər iki xanlıq arasında əmin-amanlıq, sülhsaziş istəyirdi, bacardığı qədər də bu uğurda çalışırdı. Məhtaban əsla istəmirdi ki, köhnə ədavət bir də gürzə kimi baş qovzasın, təzədən qan sel kimi axsın! Bəlkə Məhtaban belə bir qanlı qovğada öz qoca ərini

itirməkdən qorxurdu? Bəli, Məhtaban həm də öz qoca ərini belə qoşunkeşlikdə itirməkdən çəkinirdi! O ərinin qohumsuz-qardaşsız olduğunu düşünürdü, arxasız, kimsəsiz olduğunun da dərdini çəkirdi. İndi Məmalikin arxası, söykənəcəyi, gözünün işığı kim idi? Yalnız qundaqda olan, acanda dodaqlarını büzən, anasının döşündə doyandan sonra göyümtül gözlərini döyə-döyə uyuyan tifil idi, körpə idi!..

İndi bu körpə tifildən biri deyil, bir neçəsi olsa kimə, necə havadar çıxa bilərdi? Deməк, Məmalik ağlına, şüuruna müraciət edincə köhnə düşmənçiliyi Həlakunun üzünə vurmamalı, heç cür ağartmamalı idi! Bir halda ki, Həlaku qohumluqdan söz salıb hər iki babanın birgə nəvələrindən danışırdı. Hələ çalbığ qundağa da kənd bağışlayır, özünü qohumunun qarşısında səxavət sahibi və fədakar göstərirdi.

– Xudaya, sən məni aydın şüurdan, ağıldan, mühakimədən məhrum etmə! – deyə Məmalik üzə açılışmasa, içəridə narahatçılıq keçirməyində də davam edirdi. – Xudaya, belə kələfsayağı dolaşıq vəziyyətdə mən oğlumun anası Məhəmməd qızı Məhtabandan məsəva kimlə sirdaşlıq edib, dərdləşə bilərəm? Sən özün mənə havadar ol, Xudaya! – Sanki Məmalik dizləri üstə düşüb, tək Tanrısının uzun ətəyindən sallaşırdı. – Havadar ol ki, Xudaya, evimizin içərisinə dürtülən düşmən durub buradan çox tez rədd olsun, bizi sakit buraxsın... İndi ya uzağı iki-üç günə yeyib-içəndən sonra bunlar sürüküb öz xarabalarına qayıtsınlar!.. – Məmaliki fikir götürürdü. – Bu çalbığ murdar öz əyan-əşrəfi ilə qayıdacaqdır, ancaq Ərmağan necə? Məhtaban deyib, təkid etdiyi kimi, ata qapısını heç öz qızının üzünə bağlamaqmı olar?!

Məmalik üçün indi hər bir addım daha müşkül görünürdü! O, bilmirdi Ərmağanla bu gün olmasa da sabahına necə rəftar eləsin? O, bilmirdi sabahına darvaza qapılarını deyil, öz xanlıq sərhəddini həlakuların üzünə bağlasınmı, dönüb uca hayqırtı ilə qızına da desinmi:

– “Sənin burada heç bir alıb-verəcəyin, heç bir haqqın-hüququn yoxdur!”.

Məmalikin hökmranlıq duyğuları belə qərar verməyi ona əmr etsə də, atalıq ürəyi “yox, yox” – deyə dayanıb dururdu. Ərmağanın öz balaca qardaşını sinəsinə basdığı zaman Məmalikin qulağına səmimi kimi gələn hıçqırtıları hələ də qocanı çaşdırırdı? “Bəlkə? Bəlkə Ərmağanın Qurana qəsəmi doğrudur, qız peşman olubdur? Mən də əbəs yerə şəkkə-şübhəyə düşürəm? Bəlkə qocalıq ağlımı çaşdırıb, məni dolaşdırıbdır?.. Bəlkə?.. Bəlkə?..”.

“Bəlkələr” həddən ziyadə çoxalır, getdikcə Məmalik xanın beynini doldurub, az qala bir xəşil tavasına döndərirdi! Lakin əslində Həlaku tərəf hər nə cildə desən girir, hansı sifətə desən düşür, hansı hiyləyə desən əl atır, hansı xəyanətə desən gedirdi... Ərmağan – xanın öz qızı Ərmağan necə?! Bəlkə Ərmağan da bu təzə varisə görə öz oğullarının xeyrinə xəyanətə gedəcəkdi?.. Bəlkə o, atasının kürəyinə zəhərli xəncər saplayıb, rəzalət bataqlığına düşəcəkdi? Ərmağan bilirdi ki, körpə olmasın, nə olsun, Məhtabandan olmasın, hansı fala baxan, ələk toxuyan qaraçı qızından olsun, Məmalik oğlunu sevir, uşağı işığı azalan gözlərinin nuru sayır. Bəs onda övlad öz atasının yurdunu kor qoymaq qəsdinə dolardımı?

Kim bilir, bəlkə Ərmağan Ərdaha mülkünün üstündə nəinki öz qoca atasının yurdunu kor qoyar, hətta qocanın iki gözünü də öz əli ilə çıxarıb, atasını çanaqlama kor edərdi!.. Bəlkə? Bəlkə?.. Bəlkə Ərmağan bunca alçağa enməz, zir-zibilli, üfunətli çamırlığa düşüb üzməz, özünü əbədi lənətlə damğalamazdı? Damğalar içində ömür sürmək, damğalı dünyadan getmək istəməzdi? Bir də axır alçaq xəyanəti bu dünyada heç kəs mədh etməmişdir?! Xəyanət gizli olsun, ya hər necə, uca səslə lənətlənmişdir! Xəyanət xan sarayında olsun, ya şah sarayında, min-min lənətlə damğalanmışdır. Açıq qatil bir cəzalansa, bir söyülüb bir nifrət edilsə, gizli qatil min cəzalanıb min söyülüb, min nifrət edilmişdir! Demək, xəyanətə getmək, gizli sui-qəsdə qədəm qoymaq ata qatili, qardaş qatili olmaq dəhşətdir!”.

Qonaqlarını rahatlayan, yan otaqda xanımını, körpəsini yuxuya verincə xudmani otağına çəkilən Məmalik artıq vücuduna qor dolan adam kimi eşələnir, hər necə etsə də, yata bilmirdi. Onun gözlərində cüzi çimir də qaçırdı. Məmalik düşünürdü, hey düşünürdü. Çapalayıb düşünürdü. “İndi qoca Məmalik nə etsin. İndi o öz yerindən durub tər köynək halında Məhtaban yatan otağa keçsinmi?.. Xanımının yorğanını astaca qaldırıb, bu gözəl xilqətə sığınsınmı? Əlini Məhtabanın tər vücudunda gəzdirib gərginləşən əsəbiliyini azacıq da olsa qovub körpə uşaq kimi uyumağa çalışsınmı?”.

Yox. Məmalik belə hərəkət edərdisə, öz mühakiməsində vurub heç yana çıxara bilməzdi! Axır qohumlar arasında qohumluqdan da artıq dədə-baba düşmənçiliyi var idi! Özü də gizli ədavət, həlledilməz, açılmaq bilməyən düyünlər var idi!.. Məmalik bu müşkül düyünləri açmaq üçün vurnuxurdu. O, günü sabah qızı Ərmağanla rəftarını

aydınlaşdırmaq, müəyyənləşdirmək istəyirdi. O, bilmirdi ki, doğma qızını da düşmən həlakulara qatıb-qarışdırıb acılasınmı?.. Öz xırda sevimli nəvələrini də qışqıra-qışqıra, sübhün gözü açılar-açılmaz başqalarına qatıb öz qapısından birkərəlik qovsunmu?!

Qocanın gözləri qaranlıq içində böyüyür, onun təsəvvüründə əzrailsifət Sərəncam xanım gəlincə, kaftarlaşmaqdan da artıq ifritələşib məlunlaşan xanımı nəzərindən qovub, Məhtabanın xəyalıyla əylənib, ovunmaq istəyirdi. Qoca Məmalik bir ildən artıq idi ki, hər necə kəşməkəşdə də olsa, yenə də ürəklə ömür-gün keçirirdi. O, Məhtabanla keçirdiyi vaxtının tək bircə gününü deyil, saat-saniyəsini belə yadından çıxara bilmirdi. Məhtabanla həmin aylı gecədən, ağ köpüklü göldən başlamış indiyə qədər olan əzablı, eyni zamanda zövq-səfa dəmlərini qoca unuda bilmirdi. O, öz məşuqəsindən ayrı düşən bir gənc kimi Məhtabanla cavanlaşır, zəhər dilli, zəhrimar xasiyyətli Sərəncamın xəstə, ya özünü xəstəliyə qoyduğu vaxtlarını deyil, həm də cavanlıq çağlarını yad etdikcə qocalırdı; Ərmağan xanım da bu damcı o damcıya bənzəyən sayağında öz anasına bənzəmişdi! Zahiri görünüşü cəhətindən qız nə qədər öz atasına oxşasa da, daxili cəhətdən bir o qədər anasının eyni, bəlkə də bir xeyli artıq idi!.. Ancaq, Məmalikin cavanlıq çağlarının öz qızında təcəssüm tapan cizgiləri necə? Bax bu cizgiləri, özünü, öz evindən qovmaqmı olardı?

Məmalik gah təlatümlü tərəddüddən çıxıb belə qərara gəlir, gah da dönüb oğul-uşaqlı böyük qızı ilə körpə oğlunun birləşən qara saçlarının arasından qalxan hıçqırtılarını təsəvvürünə gətirincə, dolaşığa düşüb qalırdı. Qocanın təsəvvüründə, xəyalında bir kiçicik nöqtə böyüyə-böyüyə dağa çevrilir, hətta qanadlarını ətrafa gərən nəhəng Savalan dağı kimi onun gözlərinin qabağında dayanıb dururdu...

Görünür, Məmalik ciddən düşünməli, qaranlıq gecəni sabaha çatdırınca müəyyən nəticəyə gəlməli, günü sabahdan öz qonaqlarını xoş sifətlə salamlayıb, necə istirahət etdiniz? – deyə soruşmalı, yaxud bu qonaqlara turş-təlx sifət göstərib bütün gecəni yatmadığından, yuxusuzluğundan, narahatlığından şikayətlənməli, birdən-birə olmasa da, yavaş-yavaş söhbəti açıb, söz güləşdirə-güləşdirə, dava-dalaş üçün zəmin hazırlamalı, Həlaku qohumunu incidib, acılayıb, onunla birbaşa atı daşlığa sürməli, gözü görmək istəmədiyi yalquzağı; birinci növbədə qart köpəyi buradan qovmalı, düşmən həlakuları biryolluq uzaqlaşdırmalı, onlar aralanınca, öz adamlarına əmr edib qonaqlarının kürəklərinə fişənglərdən dolu kimi yağdırmalı idi!

Belə olardısa, onda bəs Məmalikin sevdiyi xırda nəvələri – İldırım, Şümşad necə? Bunların da ardınca güllə yağdırıb, həlakulardır – deyə fərq qoymalımı? Lənət sənə kor şeytan! – deyə Məmalikin yaşaran gözlərində məhəbbət duyğuları ilə qəzəb qığılcımları bir-birinə qarışıb imtizac edirdi!

Bir gör açıq düşmənçilik nə qədər də asan, qohumluqla qarışan düşmənçilik nə qədər də çətin imiş?! Axır, İranın bir çox xanları qohumluq deyil, hər nəyə qarışan düşmənçilik olsa, yenə də məqamı gələndə xudpəsəndlik göstərir, amansız olurlar? Onlar nəinki qızlarını qapılarından qovurlar, yeri düşəndə doğma oğullarının da gözlərini çıxartdırıb, başlarını kəsdirdilər! Bəs onda Məmalik həmin xanların birisi, öz qəzəbli əcdadının qoca varisi deyilmi? Bəs onda bu qoca Məmalikin qabağını kəsən kimdi, nəçidi, nə karədi? Görünür, ən ümdəsi Məmalikin qabağını qılınc kimi kəsən gözəl Məhtabanın sülh sazişi naminə dönə-dönə etdiyi israr, təkiddi. Qoca öz hərəkətində kimi ötüb adlasa, sözünü sındırsa da, Məhəmməd qızı Məhtabanı ötüb adlaya bilmir, onun sözünü sındıra bilmirdi! İndi də qoca aylı gecədə, köpüklü göldə çiməndə Məhtabana tamaşa edib sevdiyi qız yığışıb Ərdahaya gedəndə onun qum üstündə qalan ləpirlərinə öz saqqalını dəlicəsinə sərib: “Mənim məbədgahım, mənim Məkkəm, Mədinəm, mənim qibləgahım” söylədiyi kimi, yenə də Məhəmməd qızını eynən sevirdi, onun yolunda hər nə cövr-cəfaya desən gedib təhəmmül edirdi...

Məhtaban Məhəmməd qızının tapşırıqları Məmalik xandan ötrü ən ali hakimin çıxardığı hökm idi, ən ali məclisin qəbul etdiyi qərar idi... Kaş! Kaş, Məhtaban da Məmalik deyən, əri istəyən kimi həlakulara qarşı düşməncəsinə duraydı! Onda hər ikisi birləşib, barışmaz düşməni öz imarətlərindən yaxşıca kürüyərdilər. Lakin Məhtaban da, Məmalikin özü də evlərinə dürtülən düşmənin alçaq qəsdini az-çox duysalar da, yenə şəkk-şübhəyə düşdüklərini gümanlarına gətirməmiş deyildilər. Məhtaban isə ardıcıl sülh sazişi istəyir, qan-qovğa istəmir, odlaq-yanğın istəmir, beş yaşından tutmuş gördüyü, eşitdiyi, yüz-yüz günahsız insanın əbəs ölümünü istəmirdi, Məhtaban indi də unutmadığı, xatırladığı min-min adamın yenə də dərbədər düşüb, dalı şələli didərgin dolanmağını istəmirdi. O, xan-xan davasına zidd idi, düşmən idi! İndi Məmalik necə etsin, necə tərpənsin? Bəlkə o, yerindən durub o biri otağa keçsin, bir də körpəsini bidar edib Məhtabanla yaxşı-yaxşı aydın danışıb məsləhətləşsin?!

19

Məmalik qulaq verincə, yatdığı otağın qapısı arxasında, enli dəhlizdə döşənən Təbriz fərşi üzərində asta hərəkət edən ayaq səsləri eşitdi: “Bu kim olsun belə? – deyə qoca qulaq verməyə başladı. – Ərmağan olmasın?! Ərmağan xanım Məhəmməd qızı ilə mənim otağımın arasında dolaşmasın?! Qulaq verib, qaranlıqda bizim nəfəslərimizi belə dinləməsin? Röyada ola bilən danışıqlarımızı eşidib bilmək istəməsin?! İlahi, sən özün şahidsən ki, Ərmağanın anası Sərəncam xanım da bax, belə idi! O, hey gendən mənə göz qoyur, danışıqlarıma da gizlicə qulaq verirdi. Guya aşkara gördükləri, eşitdikləri az idi, gizli qulaq verdikləri, gördükləri hesabda idi! Arada bir məna olsun, olmasın, ciddi söz-sov olsun, olmasın?!”.

Doğrudan da xan qızı Sərəncam xanımın peşəsi gizlindən qulaq asmaq, gizlindən güdmək idi! Elə bil ki, Sərəncamın canı güdməkdə, bütün zövqü də xəlvəti qulaq verib, xəlvəti eşitməkdə idi! Aşkar işdən Sərəncam xanımın zəhləsi gedərdi! Bir də Sərəncam göz açandan öz anasını gizlicə güdən, onu da öz ərinə xəlvəti qulaq verən, göz qoyan görmüşdü! Məmalik əzazil Sərəncamı xatırladıqca, Ərmağanın gəlişi ilə arvadının kabusu barigahda dolaşdıqca, Məmalikin təsəvvüründə illər uzunu canını xirtdəyinə yığan xan qızının pəstahları canlanır, kişinin əsəbləri yay kirişi kimi dartınırdı: “Bax, rəvayət edənlər deyərdilər ki, o Sərəncam xanımın anası məluna da hey Sərəncam xanımın atasını beləcə, mən sayaqda yay gününün üzülməz kölgəsi kimi təqib edirmiş!..”

Bəli, həqiqətən xan imarətlərində salon və saraylarında güdükçülük bir həyula kimi gəzər, iblis kölgə kimi hey süründükcə sürünərdi... Sərəncam xanım da ata evindən əri evinə böyük cehizlə birlikdə güdükçü həyulası gətirmişdi. Həmin güdükçü-həyula Məmalik xanın imarətində qanad açmağa, şəhpər yaymağa başlamışdı. Doğrudan da yataq otağından alt köynəyində sürüşüb çıxan, üstləri açılan uşaqlarının üstünü örtməyə macal tapmayan Ərmağan xanım öz anası Sərəncam sayağı elə həmin bu gecədən burada daha yamanca bir güdükçülüyə girişmişdi!.. Elə bil ki, nə vaxtdan ölən, sümükləri də sürməyə çevrilib sərəncam xanım öz yerində tablamayıb, qəbirdən dik qalxıb, qızını da dümsükləyib onunla gecə güdükçülüyünə qoşulmuşdu.

– Qız, gəlmişkən yatma, güd! Gör ki, sənin allahsız atan nə növi pəstahdadır!

– Sən lap arxayın ol, ana! – deyə sanki Ərmağan kürəyində gəzən öz qızını güdən anasının həyulasından özünü xilas edə bilmirdi... İki güdükçü bir can, bir qəlb kimi fərş döşənən dəhlizdə xısın-xısın danışa-danışa, bir-biri ilə itələşə-itələşə dolaşırdı. Bu güdükçülər qoca Məmalikin dilsiz düşüncələrini belə duymaq, hər necə olur-olsun qocanın ürəyində olanları alıb bilmək istəyirdilər:

– Qız, sən rəxt-xabıma günü gətirən, piş əz vəqt məni çərlədib, oğul varisi doğmadığıma, doğa bilmədiyimə görə hey danlayıb, nəzərindən salan bu bimürvət atayın danışıqlarını eşidirsənmi?

– Axır, atam heç nə danışmır, ana!

– Danışır qız, danışır. Sən... bir... qapıdan qulaq... ver... gör necə danışır?.. Onun bütün sirrini mən daim öz ürəyindən çalardım!

Ərmağan xanım anasının – həyulanın israr və təkidi ilə oğrun addımlarla atası yatan otağın qapısına yanaşıb, içəri qulaq verdi. Nə bir mışıltı, nə səs-səmir... sükut!..

– Qız, dön bu yana, günü qapısını güd!

Ərmağan dönüb, sağ qulağını Məhəmməd qızı Məhtabanın qapısına dayadı. Deyəsən körpə mışıltısını da eşitdi.

– Qız, qapını itələ!

– Nə üçün, ana?

– Gününün gədəsini boğ!

– Necə boğum, ana?

– Boğ, öz yanına qoy!

– Mənası?.. Necə yəni?

– Yəni sabah açılanda eşidən kəs bilsin ki, uşaq öz anasının altında qalıbdır!

– Deməzlərmi bəs niyə indiyə qədər uşaq öz anasının altında qalmayıb, ancaq həlakular mehman gələn gecə qalıb?

– Yəqinən deyən də tapılar ki, bəs biçarə Məhəmməd qızı gündüz hədsiz dərəcədə əlləşib-vuruşub, Həlaku qonaqlarına göstərdiyi xidmətlərinə görə yorulub, gecəni daş kimi düşübdür... Dayəsiz gəda qızı yuxulu-yuxulu çağasının yanına alıb əmizdirib, ölü yuxusuna gedincə, pəhləvan qızının qovuna bənzər ip-iri döşü körpəsinin ağzında qalıb, uşağı boğubdur!

– Bəs Sərəncam xanım ərz ola, onda baxan, görən kəslər barmaq izi olub-olmadığını seçməzlərmi?

– Qız, sən sözü az çərlət!.. – deyə Sərəncam xanımın ifritə həyulası qızının bunca tərəddüd göstərib, sözləri çək-çevir etdiyinə görə çəmkirirdi, – qız sən çağanın ağzına balış bas!

– Axır, hərçənd olsa, qardaşımdır?

– O tifil sənin balalarının düşmənidir! O, fədai Məhəmmədin, cəhənnəmi-mücahidin xətərnak nəvəsidir!

Anasının özü kimi, özündən də ötkəm həyulası qarşısında, dişi-dişinə sürtünən, istər-istəməz uçunmaya düşən Ərmağan öz tərəddüdünü gizlədə bilmir, qapı arxasında sərxoşsayağı ləngər vururdu:

– Atası ki... hər yana... dönsə özcə atamdır!

– Atamdır, özcə atamdır! – Həyulanın iri-iri dişləri quruyan çənəsinin dəhşətli mənzərəsində bütün eybəcərliyi ilə qıcanırdı. – O bicvələdüzzina, heç də sənin əpriyən atandan deyildir, qız!

Sanki Ərmağan daha güclü dəlil-sübut istəyirdi:

– Axı, mən yandığıma görə bir zaman desəm də, indi sən Sərəncam xanım hansı bir əsasa görə belə danışırsan?

– Çünki atan, hələ altmış yaşına yetişmədən heydən düşüb kirdarını itirib, kişiliyini qeyb etmişdi, – deyə Sərəncamın həyulası kişisinə şər-böhtan atıb, uğuna-uğuna istehza ilə gülürdü. – Yoxsa, yetmiş yaşında Məmalikdə Məhəmməd salavatullahın merac möcüzəsi baş vermişdir?

– Sən rəxt-xabına dürtülən günüyə görə məni bunca acıdıb, intiqama itələyirsən, yaxud tamam doğru deyirsən, ana?

Sanki Sərəncam xanımın çalxaq sümüklü həyulası qızının qulaqlarında çır-çır çığırırdı:

– Atam Ərşad xanın pak ruhuna and içirəm, qız!

Ərmağan xanlığının qapısına yan aldı:

– Əgər belə isə görünür onda həlakular evində dolaşan söz-söhbət, elə də mənim öz şəkk-şübhəm başdan-başa doğrudur!

– Doğrudan da doğrudur! – deyə həyulanın quru əli qızını dümsükləyirdi. – Mən sənə əmr edirəm, Ərmağan! Sən qapını aç, içəri gir, işini işlət!

– Əgər pəhləvan qızı oyaq olarsa? – Ərmağan asanlıqla qardaşının qətlinə iqdam etmək istəmir, piylənən dizləri titrəyirdi. O, nə qapını açıb içəri girə bilir, nə də geri çəkilib, İldırımla Şümşad yatan otağa

dönüb, öz yatağına girə bilirdi. – Əgər mücahid qızı yatmamış, balasına görə hərasan gözləri qapıya zillənmiş olarsa, necə?

– Deyərsən, ürəyim tablamadı, qardaşıma baş çəkməyə gəldim!

– Əgər mən körpəyə qəsd edəndə Məhəmməd qızı yaxamdan yapışarsa?

– Yaxanı Məhəmməd qızının əlindən cəld qurtarıb elə sürətlə qeybə çəkilərsən ki, nəinki Məhtaban, heç şeytan da baş açmaz!

– Məhtaban baş açıb, sabahına sirri qocasına açarsa?

– Onda atana deyərsən ki, əcinnələrin kölgəsi sənin Məhtabanını basıbdır. – Sərəncamın həyulası eynən eybəcərcəsinə istehza ilə gülürdü. – Əgər atan qoca deyilsə, onda kişilikdən zərrəcə də hiss-həvəs varsa, nə üçün gözəl xanımdan iraq düşüb, bu biri otaqda tək-tənha yatıbdır? – Sərəncamın həyulası qızının qulaqlarında xıx-xıx xıxıldayırdı. – Əgər o çağa, tifil quraşdırma, qondarma deyilsə, niyə sənin bişərəf atan Məmalik onu öz gözündən bir divar uzağa qoyubdur?

Özündən də artıq həyulanın bir an bel üzülmədiyini, dediklərində inadla dayanıb, təkidən israr etdiyini qızışan vücudunda duyan Ərmağan tərpəndi, nəhayət, bunca israrın müqabilində Məhtaban yatan otağın qapısını çiyni ilə itələdi.

– Qız, güc göstər, təkan ver!

– Qapı açılmaq istəmir, ana!

Sanki Sərəncam xanımın həyulası bütün sümüklərinin gücünü cəm edib, irəli cumdu, qızı Ərmağanla bir daha birləşdi. Onlar hər ikisi birdən qapıya hər necə təkan versələr də, qapını tərpədib aça bilmədilər. Çünki hər hansı ehtiyata qarşı Məhəmməd qızı Məhtaban arxadan qapını möhkəmcə bağlamışdı. Hər hansı qəvi pəhləvan gəlsə belə ta bu qapını döyməsə, Məhtabanı oyadıb yatağından qaldırmasa, çox çətin ki, bu qapını aça bilərdi!.. Ərmağan geri çəkildi, güdükçü həyulası ondan üzülmədi... Ancaq Ərmağanı öz uşaqları – İldırımla Şümşad yatan otağa ötürüncə geri çəkildi. Xofdan uçunmaya düşən Ərmağan tez, cəld paltarını soyunub, bircə-bircə atdı, yerinə girdi, yorğanına bürünsə də, gözlərini qapıya zillədi. Ərmağan öz uşaqlarının belə yorğun düşdüklərinə, necə yatıb, necə ucadan mışıldadıqlarına fikir vermədi.

Atası da, qızı da bütün gecəni çox narahat keçirdi. Sübhün gözü açılar-açılmaz bir-birindən xəbərsiz eyni dəqiqə içində rəxtxabdan qalxdılar, geyindilər, yuyundular. Hər ikisi bir-birini görmək istədi:

– “Görüm gecə güdübdürmü?”. “Görüm atam necə güddüyümü, duyubdurmu?”.

Ata-bala bir-birinin ovzaini müşahidə etmək sir-sifətindən ürəyinin gizli sirlərini oxumaq üçün can atırdı. Nəhayət, bütün gecəni bidar keçirən Məmalik qızı Ərmağanı otağına dəvət edib, qapını bağladı, onlar bir-birinin üzünə diqqətlə baxdılar.

– Mən bilmirəm... – qoca dünən fürsət tapıb yenə bilmədiklərini bu gün günəşin tülü edən zamanında qızına demək, pərdəni tərpədib, oradan-buradan da olsa yırtmaq istədi. – Mən bilmirəm orada, ədu evində öz atasını təhqir edəndən sonra Ərmağan xanım hansı üzlə həlakuları da götürüb atasının evinə gəlibdir?

– Dünən söylədim ki, məhz böyük xandan üzr istəyib, əfv olunmağımızı diləmək üçün gəlmişəm, – deyə Ərmağan atasının müqabilində ustalıqla məkrə keçib, anası Sərəncamın həyulasıyla necə birləşdiyini, dəhlizdə dayandığını, qapılara qulaq verdiyini gizləyib, özünü Mömünə xatun kimi göstərməyə başladı. – Bir xudam özü əcəb bilir ki, neçə vaxtdır ki, ata qəlbinə toxunduğumun necə əzab-əziyyətini çəkirəm! O, zamandan yuxum ərşə çəkilibdir!.. Deyirəm ilahi, mən necə nankor övladam ki, nurani atamın ilahi eşqinə dəxalət edib, onun qəlbinə toxunuram? Mən necə bəndəyəm ki, pirani atamın ayaqlarına səcdəyə düşməyə borclu olduğum halda, evimdə qəbahət göstərib, onun üzünə qabardım, öz naguvara sözlərimlə onun müqəddəs ruhunu incidib, azğınlıqla təhqir etdim? – Ərmağan qızaran gözlərində qaynayan “qanlı göz yaşlarını” silə-silə davam etdi. – İndi mən asi məxluq Allahın dərgahında dizləri üstə düşüb, Qurana and içib, kərratla tövbə-əstəxfər etməyə hazıram! Hazıram bəyan edim ki, mən sizin izdivaca da, qardaş təvəllüdünə də qəlbən-sidqən razıyam!

– İnanan daşa dönsün, Ərmağan xanım!

– Bir dəfə yox, min dəfə Qurana qəsəm qıla bilərəm, ata! – Onda buyur! – deyə Məmalik xan rəfdən meşin cildli Quranı götürüb, naxışlı örtüyünü qaldırdı, Avropadan gətirilən dəyirmi masanın üstünə qoydu:

– Onda birbaşa buyur, Ərmağan xanım, göz-gözə Allahın Quranına qəsəm qıl ki, atam Məmalikə dediklərimdə zərrəcə də olsa yalan və riyakarlıq yoxdur! Buyur Qurana qəsəm qıl ki, mən Ərmağan Məmalik xanın Pəhləvan Məhəmmədin qızı Məhtabanla izdivacına ürəkdən razıyam! Və bu izdivacın bəhrəsində atamın belindən gələn oğlunu və Allahın əmri, peyğəmbərin şəriəti ilə bağlanan əqdnaməni, yəni kəsilən kəbini doğru-düzgün sayıram! Pak-müqəddəs təvəllüdə cüzi də olsa, iştibah etmirəm!

Ərmağan xanım hər necə qalarsa da, onu dara qısnayan atasının qarşısında özünü cəmləşdirdi, daxili həyəcanını, üşütməsini gizlədib, əlini yuxarı qaldırıb Quranın üstündə saxladı, atasının dediklərini təkrar edib, əlini meşin cildli Quranın üstünə qoydu:

– Xudam göndərən bu Qurana əyani surətdə qəsəm qılıram, ata! – onun üzü qanla dolub, gözləri qan çanağına çevrildi.

– Bəs niyə sidq-dildən Qurana qəsəm qılan Ərmağan xanım belə təğyir tapıb, həyəcanla ovza alır? – Məmalik qızını amir xan nəzəri ilə süzdü. – Sidq ürəklə Qurana and iç, qız! Yoxsa səni divardan asılan qılıncla iki şaqqa edərəm!!.

– Sidq ürəklə böyük xanın qarşısında Qurana and içirəm!

– Bəs niyə onda sifətin qan rəngi alır?

– Çün Qurana dönə-dönə qəsəm qılandan sonra da atam məni şübhəli nəzərlə süzür, – deyə yenə Ərmağan içəridən qara qan dolan sifətini gizlətmək üçün, uşaq kimi ayaqlarını döyə-döyə zırın-zırın ağladı. Xofla rica arasında qalan Məmalik xan Məhtaban Məhəmməd qızını söhbət gedən otağa səslədi. Ərmağan öz təntənəli andını bir daha göz yaşları içində təkrar edib:

– Ata! – deyə boğuq səslə qışqırdı: – Sən məni Allahın divanına az çək!

– Əgər andında məkrdən zərrəcə iz-toz yoxsa, – deyə Məmalik də əlini yuxarıya qaldırdı, – onda Allah divanına çəkilməkdən bak etmə, özün də müqəddəs ruhla, təzədən Məhtaban Məhəmməd qızı ilə sidqən, qəlbən görüş!

– Mən Xuda qarşısında söylədiyim sayaq kərratla Qurana qəsəm qılıb, sidq dildən atamın cavan zövcəsi ilə ülfət bağlayıram. Bu izdivacdan doğulan qardaşımı da sidqən təbrik edirəm! Orada, həlakular evində söylədiklərimin, bica yerə atamı təhqir etdiklərimin əzab-əziyyətini çəkirəm! – Ərmağan özündən on beş yaş kiçik olan analığını qucaqlayıb göz yaşları tökə-tökə o üz bu üzündən öpdü. Məhtaban da ağladı. Məmalik xan o biri otağa keçib beşikdə uyuyan körpəni götürüb yuxulu-yuxulu gətirdi. Ərmağan yenə də qardaşını bağrına basıb:

– Uşaqlarımın aslan dayısı, – deyə çağanı oxşadı. – Xudaya, səd həzar şükür!..

Körpə gözlərini geniş açdı. Ərmağan atasının gözlərinə bənzəyən gözlərdən çəkinib, tezcə də uşağı anasına uzatdı:

– Mən ulu Tanrıdan atamın yurdculu körpə Məmalikə sağ-salamat boya-başa çatmaq, Məmalik imarətinin tüstüsünü Savalana ucaltmaqlıq diləyirəm!..

Ərmağan belə cəza–fəzə ilə meşin cildli Qurana dönə–dönə qəsəm qılandan sonra Məhəmməd qızı Məhtabanın dəruni dünyasında təzadlı çarpışmalar başladı. "Görünür Ərmağan xanım öz qoca atasını həlakular evində təhqir etməkdən peşman olubdur!.. Ərmağan tövbə edib öz bihədd günahını yumaq qərarına gəlibdir? Yoxsa ayrı cürə Ərmağan xanım hansı cəsarətlə Allah göndərən Qurana əl basıb, qəsəm qıla bilər, öz peşmançılığını bildirib, odlu göz yaşlarını sel kimi yanaqlarına axıda bilərdi? Əgər Ərmağan riyakarlıqla Quranı qəsəm qılıbsa, ürəyində bir, dilində başqa adam olubsa, deməli, onun cəzasını Allah özü verəcək, Qurana yalandan qəsəm qılan oğrular sayağında kömür kimi qaralacaq, bir cəhənnəmlik kimi torpağa gömülüb, qəbiristanlığın qırağında məluna qəbrini qabardacaqdır!..".

Məhtaban Məhəmməd qızı bismillahla başlanan əqdnamənin, qart–qalın kəbin kağızının sehrli tilsiminə düşüb, xan evində bunca ruhi əzab–əziyyətə məruz qaldığı halda, Ərmağan xanım hansı ağızla yalandan Qurana qəsəm qılıb, məkr yolunu tuta bilər, iblis olduğu halda, Allahın müqabilində mələk donunda gizlənə bilər? – deyən Məhtaban belə qənaətə gəldi ki, daha onların övladı deyəsən amandadır! – İndi hər bir vəchlə Məhtaban özünü iştibah girdabından çıxarmağa cəhd etməlidir! Demək, Ərmağan tərəfindən nə ana, nə də körpəsinə zaval toxuna bilməz! Əgər içəri açarı əlinə alan Ərmağan xanım körpəyə zaval toxundurmaq qəsdinə dolarsa, onda Allahın ecazı ilə əlləri quruyar, ayaqları şil–şikəst, gözləri kor, qulaqları da kar olar! Hələ dili də tutulub, nitqi də batar! Təbarək–təala görk üçün Ərmağan Həlakunu icmaya göstərib deyər ki: bəs yalandan mənim Quranıma qəsəm qılanın aqibəti bilin, belə olur!..".

Nə isə fikri dolanan, Quran haqqında olan rəvayətlərə inanan Məhtaban, Həlaku qohumlar burada olanda da, onlar Məmalik bərgahını tərk edib, öz evlərinə dönəndə də özünü inandırırdı ki, gərək onun körpəsinə heç bir zaval toxunmasın! Bir də belə məsum körpə ilə kimin nə ədavəti ola bilər?.. Daha o boyda Həlaku tərəf durub südəmər çağaya cinayət əli qaldırarmı? Quran qəsəmindən sonra əgər körpəyə qəsd edən, əl qaldıran olarsa, Allah–taala mütləq görər, qatili öz yerində daşa döndərər, göydən göndərdiyi Quranın kəramətini külli-aləmə göstərər!

Məhtabanın ürəyində inam yaranandan sonra da şəkk-şübhə baş qaldırırdı: niyə Məhtabanın ürəyi Ərmağana qızmaq istədiyi halda, qıza bilmir?.. Niyə Məmalik qızı Ərmağan öz qardaşını bu otaqdan o otağa keçirincə, Məhtabanın ürəyi oğlunun üstündə əsirdi?.. Bəlkə Məhtaban qəzanın qədərindən qaçmaq istəsə də, qaça bilmirdi?

Məhtaban hər necə özünü sakitləşdirmək istəsə də, aram tapa bilmir, Quran andına inanan ürəyi birdən inanmamağa, çalınıb-çapalamağa başlayırdı... Məhtabanın müztərib ürəyi eyni anda həm xatircəmlik içində fərəhlənir, həm də ağlayırdı... Niyə ürək güldüyü an içində də kədərlənir, fərəh içində qanlı göz yaşları axıdırdı? Ola bilməzdimi bu qədər üzüntülü ruhi əzabdansa, qızıl qəfəs içində çırpına-çırpına, vurnuxa-vurnuxa yaşamaqdansa, Məhtaban öz körpəsini qucağına götürüb buradan qaçaydı, yeddi ağac uzaqlaşaydı, dırmana-dırmana Savalan dağına qalxıb, arayıb-axtarıb, qiyamçıları tapaydı, onlara pənah gətirdiyini bildirib, bütün əhvalatı açıb söyləyəydi, körpəsini də onların amanına təslim edəydi? Onda qiyamçılardan birisi qalxıb, "İlanın ağına da lənət, qarasına da" deməzdimi? Söyləməzdimi, "İlandan olan ilan olar". "Qurd balasını nə qədər bəsləsən də qurd olar" sözləri onların dilində dolanmazdımı? Bəlkə xan balasına sədəmə toxunduran da tapılardı? Onda bəs adı dillərdə dastan olan pəhləvan fədainin babalıq haqqı? Savalan qiyamçıları bu adı-sanı nəzərə almazdılarmı? Bəlkə nəzərə almayan da olardı?.. Bəlkə onlar iki yana bölünüb tərəf-tərəfdə olardılar?.. Bəlkə də onların arasında çəkişmə düşər, Savalanda da gərəksiz nifaq başlardı?..

Görünür, biçarə Məhtaban hər necə çalışıb-çapalasa da, sarsıntılı ruhi əzab-əziyyətdən çıxa bilmirdi!.. Birdən də inamsızlıq hissləri Məhtabanın ürəyindən çəkilir, onun şübhə ilə dolu ürəyində inam duyğuları qalib gəlirdi. Məhtabanın tutulan sifəti açılıb ayazıyır, gözəlliyi cilvələnirdi. Qara gözlər qaynayır, ağ dişlər təbəssüm içində cərgələnir, yanaqlar allanır... Məhtaban bəxtəvər ana kimi körpəsini götürüb bağrına basır, döndərib atıb-tutur, sevirdi, oxşayırdı, özü də bilmirdi bu sözlər ona haradan gəlirdi?.. An ötüncə Məhtabanın söz çeşməsi quruyub kasadlaşır, körpəsini oxşamağa söz tapmırdı... Oğlunun yazıqlaşan üzünə yazıq-yazıq baxırdı Körpə sapsarı saralır, şaxtaya düşən xəzan yarpağı kimi solub-soluxşuyur, sanki hansı səmum küləyi isə çağanı çalıb uzaqlaşdırır, Məhtabanın qucağı quru qalırdı... Məhtaban qaralan gözləri ilə dəhşətli düşüncələr girdabına baxırdı: "Körpə yoxdur?".

Məhtaban qollarını tərpədincə, uyuyan körpə gözlərini açır, sanki dilsiz uşaq anasının iztirablarına şərik olub ağlayırdı. Körpə iniltili səslə, yanıxa-yanıxa naçar ağlayırdı. Məhtabanın ağ, mərmər sinəsi sanki qızmar şişlə çalın-çarpaz dağlanırdı. Elə bil ağ sinədə dağ-düyün qalırdı:

– "Xudaya, məni hey qaraltılı aləmlərə aparıb, dəli-divanəmi etmək istəiyrsən?".

Müztərib Məhtaban körpəsini beşiyə qoyunca, əllərini göy səmtinə qaldırır, dərgah qapısında durub yalvarır, dönüb səcdəyə düşür, Quran dərsi aldığı zaman öyrəndiyi ayələrdən oxuyur, canamaz açıb, namaz qılır, Tanrıya dəxil düşüb, onun damənindən tutub: "Qoy Ərmağanın Quran qəsəmi mənim beynimə batsın!" – deyə acizanə iltimas edirdi. Məhtaban iltimas edirdi ki, tək Tanrı onun tez-tez şəkk-şübhə ilə dolan ürəyinə özü nüfuz edib, şəkk-şübhə burulğanlarından çıxarsın, Məhtaban Məhəmməd qızı Ərmağan Məmalik qızına etibar edib inansın, sakitləşib adi insan halına dönsün, qoca ərinin istirahətini pozmasın, onun ehtiramını şükranə qəbul etsin arvadının üzüntülü iztirablarına nəzər yetirən, özü də dönüb iztirab girdablarına düşən qocaya aman versin:

– Nə oldu yenə də, Məhtaban, bunca çalpaşıqdasan? – deyə xan soruşunca Məhtaban cavab verdi:

– Düzü, xan, ürəyimə dolan iştibah heç də mənə göz açmağa imkan vermir!

– Yenə də nə iştibah, qız?

– Ancaq oğlumuzdan yana, xan!

– Gördünmü uşağın bacısı Ərmağan necə peşman olduğunu tövbə-əstəğfərlə bildirdi, Qurana qəsəm qıldı? Daha bundan sonra biz niyə ona cani kimi baxıb, gecmi-tezmi Həlaku gəlini Ərmağanın əli ilə oğlumuzun qətlə çatdırılacağını gümanımıza gətirək?

– Bilmirəm xan, özüm də baş tapmıram ki, niyə divanə olmuşam?.. Bir də xan, bilmirəm sən niyə asayişini pozurdun? Niyə sən rəiyyət qızı ilə, kimsəsiz-kimsəsiz, pənahsız-pərəstarsız qızla izdivaca girirdin?.. Bilmirəm nə üçün sən öz qoca taleyini mən biçarənin üstündə sınaqdan çıxarmaq həvəsinə düşürdün? Nədən ötrü sən böyük xan, özünə müqabil olan xanlar arasında rəva görülə bilən bir xanımla evlənmirdin ki, sənin övladının da dağ boyda arxası olaydı?!

Yenə də Məhtaban qanlı göz yaşlarını saxlaya bilmirdi. Onun gözləri əbədi qaynayan qızıl çeşməyə çevrilirdi. Məhtaban daha ağlama-

yanda da ağlayır, güləndə də, kiriyəndə də, danışanda da ağlayır, hətta yatıb yuxuya gedəndə də ağlayırdı. Xan yenə də dərin fikrə gedirdi:

"Bəlkə günü sabahdan Tehrandan həkim çağırım, Məhtabanın dərdini ona açım? Ya bəlkə Məhtabanı götürüb Avropaya aparım, orada pünhani müalicə etdirim? Onda əhvalatı duyan İran xanları gülüb-gülüb deməzlərmi, Məmalikin özü qoca çağında dəli-divanə olubdur ki, fədai qızı Məhtaban öz cununlaşan qocasını Avropa müalicəxanasına aparıbdır?! Yox, elə də, belə də işimiz müşkülraqdır!..".

Xanın ürəyi üşütmə içində olduğu halda Məhtabanı inandırmaq istəyirdi ki, buradan əkilən, xırda nəvələrinə qədər götürüb, əlləri ətəklərindən uzun gedən çalbığ Həlaku hər necə qurğuya iqdam edib, hər necə dürlü-düyünlü tələlər qurmaq əzmində olsa da, atasının müqabilində Qurana qəsəm qılan Ərmağan gərək öz qardaşına qəsd etmək fikrinə düşməsin:

– Sən yəqinmi edirsən, xan?

– Güman edirəm, Məhtaban!

– Niyə bəs güman?

– Çün özüm də şəkkdən-şübhədən tamam-kamal xilas ola bilmirəm!

– Bəs onda böyük xan, biz ikimiz də bu dünyada nəyə qail olub, nəyə inanaq?

– İstər-istəməz Qurana!..

– Böyük xan, niyə istər-istəməz? Söyləyin ki, mütləq Qurana! Söyləyin ki, gərək biz Qurana qəsəm qılan Ərmağana tamam-kamal öz ürəyimiz kimi inanaq! İnanaq ki, Ərmağan Məmalik qızından cumbulu Məmalikə zaval toxunmaz!

– Bəlkə elə bir savaş salım ki, Ərmağan Həlaku da buradan biryolluq rədd olub getsin, ata evinə bir daha qayıtmasın.

– Onda dədə-baba ədavətiniz ağ-aşkara güclənər, xanlıqlar arasında olmazın dava düşüb od-alov başlar!

– Sən nədən bilirsən ki, ata ilə qızının ixtilafına görə çalbığ Həlaku qoşunkeşliyə qurşanar?

– Mən gendən də olsa, sulu qəlyan çəkən o qoca qurda, çalbığ Həlakuya göy qoyurdum!

– O, qoca qurdda, çalbığ Həlakuda hansı qəsd olduğunu duyurdun?..

– Bir yırtıcılıq, amansız hiyləgərlik, məqamı çatınca dönüb-qayıtmaz yalquzaqlıq!

– Sən belə yırtıcı yalquzağı harada görmüsən, qız?
– Quzularımızı Savalanın ətəklərində otaranda görmüşəm, xan!
– O yalquzaqlar quzulara nə etdilər?
– Bir gün ikisi töküldü, hərəsi birini qapıb qaçdı?
– Qaldı neçəsi?
– Heç neçəsi! Məhəmməd pəhləvanın bir qoyunu var idi, iki də quzusu!..
– Deməli, Həlaku qurğusuyla, qızımız Ərmağan da bizim quzumuzu qəfildən qapa bilər?
– Ürəyim Ərmağanın əli ilə edilə biləcək xəyanət üçün bəri başdan şəhadət verir!
– Belə çıxır ki, sən də Ərmağanın Quran qəsəminə inana bilmirsən, şəkk gətirib, şübhə edirsən?
– Bəli, ürəyim belə şəhadət verir, xan!..
– Mənim də ürəyimdə əbədi arxayınlıqdan iz-əlamət yoxdur, Məhtaban! Yuxularım da göyə çəkilibdir, gözlərimə də çimir gəlmir, az qala özüm də divanə oluram!
– Mən istərdim ki, böyük xan, öz kiçik övladına sahib durub məni azad buraxaydı!
– Qız, xan divanə olsa, kəbinli arvadını haraya azad buraxa bilər?!
– Siz mənim talağımı həmin axunda geri oxutdurun, xan!
– Mən belə müfariqətə əsla tablamaram, Məhtaban! Mən qoca Məmalik qırılmaz zəncirdə saxlanası bir dəli-divanə olaram!
– Siz özünüzü ələ alarsınız, xan! Siz dediyiniz firəng dayəsini Tehrana qayıdan xarici xanımın vasitəsilə Firəngistandan Ərdahaya dəvət edib, övladınızı təlimləndirib böyüdə bilərsiniz!..
– Bəs sən, Məhtaban?
– Mən səfil-sərgərdan da olsa dolanaram, bacarsam, başqa-başqa yerlərdə zoğal dəyənəyindən yapışıb, daha möhkəm çırpa-çırpa, palaz-paltar yumaqla məşğul olaram, xan!..
– Deməzlərmi, divanə Məmalikin xanımı səfil-sərgərdan dolanır? Deməzlərmi Məhtaban yenə də zoğal dəyənəyini çırpa-çırpa palaz-paltar yuyur?
– Mən özümü də, üzümü də gizlərəm, xan! Heç yerdə, heç kəsə, heç nə bildirmərəm, xan!
– Birdən Həlaku casuslarından birisi bildi, Həlaku da İsrafilin surunu götürüb İrana çaldı?

– Belə sur çalınsa, mən dərhal özümü həlak edib, sizi İran şəmatətindən xilas edərəm, xan!

– İlahi ağ köpüklü göldən başlayan məhəbbətə mən yenə də qibləgahım kimi səcdə edirəm, – deyə qoca Məmalik Məhəmməd qızı Məhtabanın kobudluqdan çıxan, nə vaxtdan bəri zəifləyib, zərifləşən, artıq çoxdan daş-qaş içində parıldaşan barmaqlarından tutub, qar kimi ağaran dümağ saqqalından üzüyuxarı qaldırdı. – Qız, Məhtaban, mən səndə ömrüm uzunu axtardığım zəngin qəlb tapmışam! Bəlkə doğrudan da sən deyən sayaq da biz özümüzü divanəliyə qoyub, cəncəlli xanlığı tərk edək? – O, tezcə sözünü döndərdi : – Yox, yox, həlakulara görə tərk etməyək, – deyə qəzəbləndi. – Biz ara yolları bağlayaq, dərin-dərin xəndəklər açdıraq, köhnə səngərləri təmir etdirək!

– Demək, bu pərişan halımızda həlakulara müharibə elan edəsiniz, xan?

– Nə olsun, Məhtaban, qoy açıq müharibə olsun! Qoy açıq cəng-cidal olsun! Xan sərdabasında yatan Keyqubadın qəbrinə and içirəm ki, qaynayan qanımı vücudumda saxlamaqda acizəm!

– Nə üçün böyük xan bunca coşur?

– Çün, gözə görünməyən cəng-cidəl, gözə görünən cəng-cidaldan çox-çox əzablıdır!

– Başqalarının günahı nədi, xan?.. Rəiyyətin-rəncbərin təqsiri nədi? Siz xanlar irəli durub qabaq-qənşər ki, vuruşmayacaqsınız, atışmayacaqsınız!

– Mən bu dəfə birinci cərgəyə keçib, qabağa duracağam, qabaq-qənşər vuruşacağam, qız! İnan, eşqimə and içirəm! Bu qoca vaxtımda mən yağı düşmənim həlakulara qarşı səngərə girəcəyəm, odlu gülləni düşmənin başına Savalan dolusu kimi yağdıracağam!

– Oğlunuzla, yeznəniz Ərdahanla atışacaqsınız?

– Atışacağam, bəli, Ərdahan olmasın, Allah olsun atışacağam!

– Birdən sizin odlu fişənglərinizdən nəvələriniz yetim, qızınız da dul qaldı?

– Nəvələrim yetim, qızım dul?

– Belə olsa, ya sənin fişəngindən, ya başqa məmalikçilər gülləsindən belə bir xətər baş versə?..

– Qız, bəlkə səbirlə Allahın Quranına qayıdaq?.. Bəlkə Allah nazil edən Qurana inanaq? Sən deyən sayağı ağ-açıq ədavətə, qana-qiyamətə getməyək? Öz balamızı daxili cəngi-cidaldan qoruyub, başını

sağ-salamat saxlayaq? Qoy Quran qəsəmini pozan kəsi Əli zülfüqarı kəssin! – Məmalik xan tərəddüd içində sarsıldı. – İlahi, mənim beynim yenə də yerindən oynayır! – Başı qızışan, ağlını itirmək dərəcəsinə gələn xan hər iki əli ilə böyük bir müqaviməti qırıb, maneəni rədd edir kimi əl-qolunu oynatdı. Sonra da tez-cəld gedib körpə oğlunu beşikdən götürdü, onu tərpədib oyatdı, oyanan uşaq ağlamadan gözlərini döyə-döyə atasının gözlərinə zillədi.

– Mən də Qurana qəsəm qılıram, Məhəmməd qızı Məhtaban, mən də bunsuz yaşamayacağam!..

– Qoy, Quran öz hikmət və ecazı ilə səni də, körpəni də hifz etsin, bir tək mən Məhəmməd qızından masəvə!

– Yox, yox hər üçümüzü! – Məmalik qoca bir əli ilə körpəsini tutub, o biri əlini də Məhtabana gətirdi, sanki qoca ağ saçlı sinəsini süpər edib ana-balanı onların üstünə gələn dağ uçqunlarından qorumağa cəhd etdi...

## 21

Ərmağan xanım özünü kücürləyib, Allaha asi kəsilib hiyləgərcəsinə Qurana qəsəm qılsa da, heç bir vəchlə daxilən sakitləşə bilmirdi. O, iki daşqın, bulanlıq çayın arasında qaldığını görürdü. Ərmağan üçün öz niyyətini yerinə yetirmək, qoca Məmalikin oğul varisindən məhrum etmək xeyli müəmmalı görünürdü! Əgər Ərmağan öz atasını oğul varisindən məhrum edərdisə, Məmalik sicillisi yer üzündən silinər, mülkü də dədə-baba düşməni həlakular torpağına qarışardı! Belə olduqda həlakular sicillisi, yəni Ərmağanın öz Ərşad-Gurşadı və İldırım-Şümşadı vahid xanlığa varis olardılar...

Əgər Ərmağan atasını Məhtaban doğan oğul varisindən məhrum etməzdisə, onda fədai qızından doğulan ögey varis yavaş-yavaş qalxar, atasının əmlak-əmvalına sahib durar, bəlkə də ögey anadan olan qardaş nə ögey bacısını, nə də onun Ərşad-Gurşadını və İldırım-Şümşadını öz dövrəsinə qoyardı?.. O nə ögey bacısına, nə də ögey bacısının oğlanlarına ürək qızdırar, onlara məmaliklərin dədə-baba düşməni həlakular kimi baxardı!.. Hələ bəlkə üstəlik anası Məhəmməd qızı Məhtaban xanımın fitvası ilə əzəlkilərdən artıq düşmənçiliyə başlayıb, həlakuların üstünə qanlı-qovğalı qoşun da çəkərdi. Onda üstü qaysaqlanan dərin yara açılar, köhnə ədavət təzələnər, qanlı qovğadan

Ərmağanın oğlanlarından – birincisi Ərşad, ikincisi Gurşad, üçüncüsü İldırım, dördüncüsü Şümşad qanlarına qəltan edilərdilər?!

Belə mülahizəyə gəlincə, öz qoca atasının oğul varisini qətlə çatdırmaq çətin, çatdırmamaq da çətin idi! Qardaşını dinc buraxmaq çətin, buraxmamaq daha çətin idi!

İndi belə təlatümlü dənizdə qol-qanad çalan Ərmağan öz Quran qəsəminə əməl etsinmi?.. Yaxud girəvəsinə salıb südəmər tifili birbaş qətlə çatdırsınmı? Qoca Məmalikin gözünü Məhəmməd qızı Məhtaban doğan varisdən üzsünmü?..

Ərmağan üçün indiyə qədər xeyli asan görünən iş xeyli çətin görünürdü! Elə də çətin, belə də çətin! Quran andını pozmaq çətin, pozmamaq, xətərnak törəməni sabahına, gələcəyinə başlı-başına buraxmaq daha çətin idi!

“Əgər Quran andını pozaramsa, onda Quran mənə çox tezcə qənim olmazmı?” – deyə ziddiyyətlə dolu vəziyyət içində çapalayan, lehmli burulğanlar içində boğulan Ərmağan tutulub-qaralır, bilmirdi nə etsin və necə etsin? – Əgər Quran andını pozaramsa, dilim tutulub, nitqim batmazmı? – deyə Ərmağan çırpınırdı, – özüm də yanıb-yanıb külə-kəsəyə dönmərəmmi? Onda qoca hər iki övladından – birisi qırx yaşlı qızından, biri də yeni doğulan oğlundan binəsib olmazmı?.. Onda qocanın özünün də bağrı çatlamazmı? Onda dədə-baba düşmənimiz çalbığ Həlaku, onun doğma oğlu – mənim ərim Ərdahan bu mülkü də o mülkə qatıb, toy-nağaranın gurultusunu Savalana qaldırmazlarmı?”.

Ərmağanın dəruni aləmində sual-suala bağlanıb, düyünlənə-düyünlənə gəlir, Ərmağan bilmirdi nə etsin? Bilmirdi irəliyə dursun, geriyə çəkilsin?.. Bilmirdi yana yayınsın, qabağa ötsün? O, bilmirdi beyninə dolan dolaşıqdan, boynuna yıxılan yükdən necə qurtarsın?

Ərmağan xanım qoca Həlakunun qafiləsindən qopub, atası evində qalandan bəri hey gecəli-gündüzlü beləcə düyünlü ziddiyyətlər içində çalışıb-vurnuxub düşünür, özünü də, üzünü də gizləyə-gizləyə düşünürdü! O, birdən balaca qardaşını əlinə götürüb sevir, üstündən neçə ay ötən uşağı atıb-tuturdu! Birdən də Ərmağan öz əlinə iynə götürüb balaca Məmalikə yaraşıqlı paltar da tikirdi! Bəzən də o kin-küdurətini unutmuş kimi, Məhtabana ılıq sudan tökdürüb sevə-sevə qardaşını çimizdirir, uşağın ət tutan yançalarına şappıldada-şappıldada vururdu. O, atasının müqabilində qara qıvrım saçlı, göyümtül gözlü, gülüncə

ovurdları çalalanan, şahmayı balıq kimi pəhmayılaşıb partlayan, əldə çətin duran, "huv-huvla" qanadlanan, səs-küy salıb, qışqırıq qoparan qardaşını qıdıqlayır, uşağa şaqqa çəkdirib güldürür, qolları üstə dolayısına uzandırıb dırnağından təpəsinə qədər öpüb-öpüb, qaytarıb ağ mələfənin üstünə sərir, az qala onu fədai qızı Məhtabana etibar etmirdi...

Ərmağan uşağı Məhtabanın əlindən almaq, dilindən atasına iltizam verib, öhdəsinə götürmək, – Ya orada böyüsün, ya burada! – deyə aparıb öz oğlanlarına qatmaq, pərvəriş verib saxlamaq istəyirdi. Belə vaxtlarda Məhtaban da, qoca Məmalik də keçirdikləri iztirablardan, düşdükləri şübhələrdən yana utanır, bilmirdilər ki, başlarını harada gizlədib, Quran qəsəminə əməl edən Ərmağanın həyəcan keçirən gözlərindən necə gizlənsinlər? Onlar dönüb öz şəkk-şübhələrinin xəcalətini çəkir, az qala "Mömünə Xatunun" üzünə baxa bilmir, qaçıb hansı küncdə-bucaqda isə gizlənmək, çağıranda da uşaq kimi səsini içinə salıb, cınqır belə çıxarmaq istəmirdilər... Birdən bu etibarın üstündən bir neçə gün ötüncə, Ərmağanın belə hüdudsuz canfəşanlığı onların hər ikisini yenə dərin şübhələrə salırdı. Yenə də gah belə, yenə də gah elə!..

"Əgər Ərmağan xanımın hərəkətləri riyadırsa, bəs ehtiraslı səmimiyyətləri nədir? Əgər onun hərəkətləri səmimidirsə, bu necə ehtiraslı riyakarlıqdır ki, dürüstünü təyin edə bilmirik?" – deyə ər də, arvad da naçar qalırdı. İşə girişən Ərmağan isə qızışıb şiddətlənir, az qala körpəni yemək istəyirdi. O, körpədən üzülmür, onu ardı-arası kəsmək bilməyən öpməkdən doya bilmirdi.

Bəzən Ərmağan öz hisslərində uzaqlara gedir, uşağı öz oğlanları kimi, oğlanlarının körpəliyində olduğu kimi, bəlkə daha da artıq sevib, öpüb istəyirdi. Ərmağan qaynar körpəni dırnaqlarına qədər, qara saçlarının qıvırcıqlarına qədər dəlicəsinə öpür-öpürdü. Pişik balasını istədiyindən yeyən kimi, az qala o da qardaşını gəmirib yemək istəyirdi! Ərmağanın hədsiz öpüşündən uşağın bədənində göylük, göyümtüllük qalırdı. Bu hiss o hissə qarışırdı. İşin içindən xəbərdar olan kəs deyərdi:

– "Deyəsən, Ərmağan körpə qardaşının qəsdinə dolmaqdan qayıdacaq, dönəcəkdir?". Bir də başqa bilən kəs deyərdi:

– "Deyəsən, yox, Ərmağan dünyadan dönsə də, körpə qardaşının qəsdinə dolmaqdan qayıtmayacaq, dönməyəcəkdir?!".

Qurana qəsəm qılıb uşağın atasını, anasını inandırmağa cəhd edən Ərmağan görünür, uşağı da inandıra-inandıra qətlə çatdırmaq qərarına gəlirdi. Uşağı oynatmaq, öpə-öpə qızışmaq, onu qətlə çatdırmaq üçün

öz-özünü qızışdırmaq demək deyildimi?! Nifrət-məhəbbət bir yerə toplana bilərdimi? Burada qətl hissi ilə qeyri-qətl hissi bir-birinə qarışmırdımı? Doğmalıqla ögeylik duyğuları çırpışıb-çırpışmırdımı?..

Qoca ata ilə cavan ana Ərmağanın hərəkətlərinə göz qoyur, əcaib, əsrarlı aləmin qarşısında donub qalırdılar: "Ərmağan xanım qardaşını sevirmi, sevmirmi?!" Baxanda, fikir verəndə Ərmağan balaca Məmaliki sevir, onu qucağına alıb əndəruna düşür, buradan da biruna çıxarıb hərləyir, güllükdə gəzdirir, qaytarıb gətirir. Uşağın dərdinə, oduna qalır, uşaq dodaqlarını büzdükcə, Ərmağan öz əli ilə Məhtabanın sinəsini açıb körpəni Məhəmməd qızının döşləri arasına salır, onun necə ovurdları şişə-şişə əmdiyinə tamaşa edir, uşaq doyub dönüncə, onu tərpədib anasının döşündə güldürürdü. Yaşlı bacı ilə körpə qardaş istər-istəməz bir-birinə isnişib-alışırdı. Onların bir-birini tanıyan, bir-birinə zillənən gözləri birdən elə mehribanlıqla süzüb zillənirdi ki, arada olan ögeylik silinib zayıl olub gedirdi. Səmimiyyət – qeyri-səmimiyyət! Sevgi və nifrət!..

Ərmağanın gözlərinə alışan körpə birdən qızartı gəzən gözlərdən vahimələnib çəkinir, üzünü döndərib zar-zar ağlayırdı. Birdən də həmin Ərmağanın məhəbbət içində gizlənən nifrət dolu gözləri dilsiz-ağızsız körpəyə hansı ecazlasa nüfuz edir, Ərmağan özü də duymadan qardaşına can atırdı... Az qala birdən də körpə hamısını duyurdu, alırdı, qızğın məhəbbətin içində ərimək istəyən, ancaq əriyib itə bilməyən zəhərli hissləri sezirdi. Körpənin gözləri bu vaxt Ərmağana elə naçar, elə yazıq-yazıq zillənirdi ki, Ərmağan xanım təpədən-dırnağa sarsılırdı. Onun ürpəşən cod tükləri qalxıb biz-biz olurdu...

Ərmağan dincəlmək bəhanəsi ilə ona ayrılan otağa çəkilir, əllərini ovuşdurub, ətli barmaqlarını sıxıb-sındırır, cəld həlakular evinə dönmək, yır-yığış etmək, düşmən yuvasını tərk edib, uşaqlıqda oynayıb, əyləndiyi ata evinə dönmək istəyirdi. Ərmağan ata cehizindən əl çəkmək, dörd oğlunun dördünü də orada qoymaq istəyirdi. Lakin Çalbığ Həlakunun tələbedici, amir, hiyləgər gözləri dinmədən, dodaq tərpətmədən Ərmağana əmr edir, gəlinini çaşdırırdı. Sanki qarı düşmən orada yox, burada Ərmağanın boynunun kökündə dayanır, istər-istəməz zəhərli ilan mələk donunda gəzirdi. Bu ilan qoca Məmalikin də, cavan Məhtabanın da ürəyinə asta-asta ustalıqla girirdi.

Bəli, ev sahiblərinin qılığına girən ilan Məmalikin sərvətlə dolu imarətində gəzib dolanır, gizlənmir, gündən-günə, həftədən-həftəyə,

aydan-aya özünə etibar qazanır, dərindən-dərinə yol alırdı. Birdən qoca ata da, cavan ana da körpəni tamam unudur, onu bacısının himayəsinə buraxıb öz iş-gücləri ilə məşğul olurdular. Qoca xan cavan oğlana çevrilib yenə də Məhtabana aylı gecədə, köpüklü göldə çimdiyi zaman cövlana qalxan atəşin eşqini elan edirdi! Açılmaz düyünlər, çalkeçir cəhətlər bir-birinə qarışır, kələf kimi dolaşırdı!.. Sanki Məmalikin böyük barigahının özü belə sehrlə, düyünlə dolurdu! "Bu məqamda daha necə olsun?".

Ərmağan yorulmuşdu! Ya o, qardaşına qarşı sui-qəsd niyyətindən birdəfəlik əl çəkməli, yaxud bu sui-qəsdi dayanmadan yerinə yetirməlidir! Ərmağan çalışdığı müddət ərzində bir neçə dəfə ata evindən Həlaku evinə yol edə-edə gedib-gəlmişdi. Çalbığ Həlaku oğlu Ərdahana göz basmış, dediklərində inadla dayanmış, xoş rəftar yağlı sözlərdən başqa ya beləsinə, ya eləsinə Ərmağana işarəli, bədxah bir söz çaldırmamışdı. Çalbığ Həlaku bilmişdi ki, Ərmağanın işinə cüzi müdaxilə etmək, onun çarpışan hisslərini məmaliklər tərəfindən qaytarıb, həlakular əleyhinə çevirmək deməkdir.

– Ata, sən Ərmağanın get-gəlindən baş açmırsan?

– Açıram baş, Ərdahan!

– Ərmağan öz qəsdini uzada-uzada bizi aldatmasın?

– Ta məqamınacan gözləmək vacibdir, Ərdahan!

– Birdən biz deyən olmadı, onda necə xan?

– Ərmağanın vurnuxmağı heç də bica deyildir, Ərdahan!

– Səncə, aqibəti necə olacaqdır?

– Səbir, səbir, Ərdahan! Bu işdə ancaq səbir gərəkdir! Ərmağan nəyi isə qət edib qurtarmaqdadır!

– Daha bu oyun gərək elə də uzana-uzana uzanmasın, xan!

– Səbir, səbir, Ərdahan! Təkrar edirəm: "Dovşanı araba ilə!".

Bu söhbət atası ilə oğlunun arasında pünhan gedir, ər arvaddan, arvad da ərindən özünü gizləyir, heç kəs heç nə büruzə vermirdi. Sanki şahə qalxan düşmənçilik dalğaları yatmışdı, təlatüm dayanmışdı, ləpələr isə gülürdü. Əslində dalğa da, təlatüm də içəri, düşmənçilik dənizinin aşağı axarlarına, sualtı burulğanlarına keçmişdi... Çalbığ Həlaku gözləyirdi, gəlini Ərmağanın duruş gətirmədən etdiyi gediş-gəlişinin nəticəsini gözləyirdi. Çalbığ duyurdu ki, gəlini Ərmağanın səbir kasası aşıb-daşmışdır, daha tökülməlidir!.. Ərmağan isə özünün son dönüşündə vurub bir yana çıxarmalı idi! Gediş-gəliş, iki xanlıq arasını ərişarğac etmək, zınqırovlu faytonu toza batırmaq dövrü qurtarmışdı.

Ərmağan gözləsə də, balaca Məmalik bir yerdə durub gözləmir, böyüyür, bəlkə də atası Məmalikdən də artıq, babası Pəhləvan Məhəmmədin böyüdüyü inkişaf sürəti ilə böyüyürdü. Artıq uşaq səkkizi ötüb, doqquz ayına girirdi. İndi necə olsun?.. Gərək Ərmağan ya bu yanlıq etsin, ya o yanlıq! Ya qatillik etsin, ya adillik göstərsin! Ya Ərmağan öz qardaşını qətlə çatdırıb, bu fidanı kökündən, rişəsindən qoparıb açan çiçəyi amansızcasına əzib-əzişdirib bir qırağa atsın, yaxud daha bu çiçəkləyən fidanı özbaşına buraxıb ona toxunmasın, bir çırtma belə uşağa vurmasın, ona heç bir sədəmə toxundurmasın!..

Ərmağan son dönüşündə əzəlkilərinə nisbətən atası evində daha artıq əyləşib-əylənməli oldu. Bax, bu dəfə! Əgər bu dəfə də Ərmağan buradan qayıdıb, Həlaku torpağına gedərdisə, bəlkə bir il deyil, iki-üç ildən sonra belə buraya dönməzdi. O, özünü də, qatil qəsdini də özündən gizləyəcəkdi, bəlkə də dönüb öz qatillik qəsdinə nifrət edəcəkdi! Yenə peşmançılıq hisslərinə qapıldığı, Quran qəsəmindən qorxduğu vaxtlarda olduğu kimi, çaharidəh məsumu ziyarət etmək barəsində əri Ərdahanla olan söhbətinə dönəcəkdi:

– Qız, sən söyləyən çaharidəh məsumu ziyarəti biz xanların yox, ancaq rəncbərin-rəiyyətin, qara camaatın işidir. Xan belə icbari mükəlləfiyyətdən azaddır!

– Niyə, Ərdaha? Məgər xan olan kəs Məhəmməd ümməti deyilmi? Məgər xan olan kəs din-islamdan bu qədər iraqdır?

– Yox, qız, xan ehsan verməklə çaharidəh məsumu öz qapısında qazana bilər! Daha xan piyada zəvvar olub, at üstündə nehrə kimi çalxana-çalxana, sərin bulaqlı Savalandan isti Ərəbistanın otsuz-susuz qumlu səhralarına ləhliyə-ləhliyə gedə bilməz!

– Bəlkə deyirəm, ilkini böyrümüzdən başlayaq, yaxına, İmam Rza ziyarətinə, Xorasana, Məşhədə gedək, Ərdahan!

– Məşədi Ərdahan, Məşədi Ərmağan olaq!

– Məşədi Ərdahan, Məşədi Ərmağan olanda nə olar?

– Onda gərək Həlaku hökmdarlığını bir yana, şallağı, şəmşiri də başqa bir yana tolazlayıb, uzun zikr təsbehini əlimizə götürüb, sabahdan axşamacan o üz-bu üzə salavat çevirək?

– Salavat çevirəndə nə olar, Ərdahan?

– O olar ki, qoca Həlaku hirslənəndə, ya bir məsələni qət edəndə üsür təsbehini götürüb dünya müşkülatına baxar! Biz isə sağ ikən qocanı təqlid edə bilmərik! Gər biz dindarlığa qurşansaq, onda çalbığ qoca şaqqa çəkib çox ucadan bizə gülər! Mənə deyər ki, boyuna xam

ip tutum, ay Məşədi Ərdahan! Səngərdə yatmaq əvəzinə, yan-yörədən torpaq qoparıb, xanlığa qatıb-qarışdırmaq müqabilində xülyaya uyub, behişti bu dünyada satın almaq iştiyaqına düşübsünüz!

– Axır ziyarət həvəsində olmaqlığı bu üzüstə yozmaq nə üçündür, Ərdahan?

– Onunçün ki, xan olan kəs cəng-cidalda at bağrı çatlatmalıdır! Məşhəd, Kərbəla, Məkkə yolunu at belində mürgüləyə-mürgüləyə gəzib dolanmamalıdır!

– Demək belə çıxır ki islamlıq – rəiyyət-rəncbər üçündür?

– Bəli mütləqa! Çün büzürg olan Xuda öz ağır yükünü onların boynuna yıxıbdır!

– Bəlkə o dünyada yenə də onlar əzab-əziyyətdə, xanlar isə kef-damaqda olacaqlar, əzizim Ərdahan?

– Daha naşı xan öz dəstinə xarici, rezin kəmərini götürüb, zığa-zımrığa bulana-bulana behişt gülüstanını sulamayacaq ki?

– Bəlkə xan olan kəs bu behişti bu dünyada gördüyündən adil Allahın izni ilə o dünyada cəhənnəmi oldu, onda bəs necə?

– Necə o dünyada xan olan kəs cəhənnəmi oldu, Ərmağan xanım? Bəs xanın şühədayi-Kərbəla üçün saxladığı saysız-hesabsız təziyələr? Bəs xanın hər məhərrəmdə, aşurada, ümumən qırx günlük təziyədarlığı?

– Onda belə çıxır ki, başına döyən də, ağköynək olub başını yaran da, özünü qanına qəltan edən də rəiyyət-rəncbər olur!

– Bəs sən nə güman edirsən, xanım? Heç eşidibsənmi, şahənşahlardan tək bircəciyi olsun bircə dəfə ağköynək olub, dəstə başında tullanıb qırxılan başını yarıbdır?

– Bəlkə də şah başını qırxdırıb, ağköynək olub, dəstə başında başını yarmayıbdır!..

– Daha onda xan niyə dəstəbaşı olub, dəstə başında tullana-tullana gedib “Heydər-Səftər” – deyib başını yarsın. Ərmağan xanım?”

– Yəni belə çıxır ki, xan da gərək şah kimi hərəkət etsin?

– Əlbəttə, əlbəttə! Baxanda biz İranda şahıq, Qacar isə Tehranda şahənşah!.. Nə üçün böyük şah rəva görməyəni kiçik şah özünə rəva görsün?

– İndi Həlaku oğlu Ərdahanı biz necə başa düşək?

– Həlaku oğlu Ərdahanı siz elə başa düşün ki, gərək hər bir xan qılınc-qalxan gücünə qalxıb şahənşah dərəcəsinə çatsın, çün şahənşah olmaq bizim hamımızın iştiyaqındadır!

– Necə, nə minval ilə şahənşah olmaq dərəcəsinə çatmaq ola bilər, Ərdahan xan?

– Böyüyə-böyüyə! Mal-mülkünü artıra-artıra gedib şahənşah olmasında, gərək vəzir-cəng iştiyaqında olasan!

Ərmağan xanım əri Ərdahanla olan son söhbətini xatırlayınca, xanlığın nə olduğunu, onun qanlı çaydan necə keçdiyini daha dərindən görürdü. Ərmağanda xan idi, xan qızı idi, xan kimi hərəkət etməli idi! Ərmağan xanım dörd xanzadə anası idi! Ona indi ürəyiyumşaqlıq yox, ürəyidaşlıq gərək idi! Yoxsa ürəyiyumşaq xan cır-cındalı rəiyyətə, rəncbərə qarışar, onda da başına daş düşərdi! Xan olan kəsdən gərək rəiyyət-rəncbər, qulluqçu-qaravaş qorxsun, tir-tir titrəyib tük salsın, zağ-zağ əssin... "Bəlkə mənim atam xanlıqdan çıxıb rəiyyətə, rəncbərə qovuşubdur? – Özünü zamanın eniş-yoxuşuna salan Ərmağan xanım, öz əslinə, kökünə dönmək istəyirdi. – Bəlkə də rəiyyət-rəncbərlə qan qovuşdurmaq bizim yetmiş yaşlı qocanın beynini qatışdırıbdır?".

Ərmağan xanım son vaxtlar bir-birindən daha təzadlı saatlar keçirəndən sonra qəti qərara gəldi ki, qəsəm qıldığı Quran onun ürəyini partladıb, bağrını çatlatsa da, lap dirigözlü cəhənnəm kürəsinə düşüb dönə-dönə yansa da, bu kürədə onun sür-sümüyü kösövə, kömürə dönsə də heç bir ögey qardaş Məmalik barigahında olmamalıdır! Məhəmməd qızı Məhtabanın doğduğu dəcəlxata sözsüz-sovsuz barigahdan rədd edilməli, izi-tozu da yer üzündən silinməlidir!

Yüz bir oyundan, hiylə-məkrdən sonra Ərmağan xanım qardaşının qətlinə qətnamə yazıb, qol çəkdi. Cücənin başı üzərində xəlvəti hərlənən çalağan kimi Ərmağan da öz Məmalik qardaşının başı üzərində hərlənməyə, yer altında gizlənən, çalacağı canlının üstündən gözünü çəkməyən əfi ilan kimi uşağı gözdən qoymamağa başladı. Qardaş qatili olmağını qət edən Ərmağan xanımın gözləri də əfi ilan gözlərinə dönürdü. O, aynada özünü görəndən sonra ilan gözlərini atasından da, Məhtabandan da, hətta ağlayıb, inləyib zarıyan uşaqdan da gizləyirdi. Çalbığ Həlakunun qarasifətli Ərmağan gəlini daha özünü gözə verməkdən çəkinir, bacardıqca gizlənirdi.

Ərmağan üçün işi uzada-uzada uzatmaq, gözləyə-gözləyə fürsəti fövtə vermək olmazdı! Ərmağan xanım hər hansı Quran qəsəmini hər necə cəsarətlə olsa pozub, öz hakim bayrağını Məmalik mülkündə nəsb etməli idi! Qoy ürəyiyumşaq adam cəhənnəmə getsin, qoy

cəhənnəm oduna düşsün, cəhənnəm kürələrində yansın, qardaşı olmasın, gözünün işığı olsun, Ərmağan bu göyümtül gözlü uşağa əl qaldırmalı, bir cüt işığı söndürməli idi! Məhəmməd qızı Məhtabandan olan uşaq, vaxtsız banlayan beçə, qətlə çatdırılmalı idi!

Ərmağan qətiyyətlə qardaşını dinməz-söyləməz beşikdən yuxulu halında yavaşca götürüb, öz yataq otağına çəkildi. Balaca Məmalik bütün çarpışmalardan bixəbər mışıl-mışıl yatırdı... Əgər balaca Məmalik oyansaydı, dursaydı, bacısının qorxunc gözlərindən qorxacaqdı, ağlayıb, qışqırıb anasını, qoca atasını öz harayına çağıracaqdı! Bu dəfə Ərmağan Həlakunun sui-qəsdi pozulsa, həmişəlik pozulacaqdı! Ərmağan öz əzəlki cildində, sir-sifətində deyildi. Ərmağanın sifəti də, cildi də cəllad sifəti, cəllad cildi idi! O, öz lalə libasını geyinmişdi ki, üstünə çilənən qan bilinməsin, qan quruyunca ləkələr görünməsin! “Ax, zəhər şüşəsi, sən niyə sındın? Sən niyə dağıldın?.. Sən niyə bica yerə töküldün?.. Ax, tək bircə damcı da olsa, qalaydın, qalaydın!..” Bəlkə indi Ərmağan bu halında hər üç adamı cəld zəhərlər, cani arvad nəfəsini dərər, qan örtən gözlərini varisi olduğu ata əmval-əmlakına gəzdirərdi!.. Bəli, Ərmağan Həlaku öz qəsdini yerinə yetirər, qocanı da, arvadını da uşağını da yer üzündən göz qırpımında götürərdi!

Onda kimdi dirini qoyub, ölüyə havadar çıxan! Ölüblər, ölsünlər!.. Qoca xan biqeyrətlik, bişərəflik yükü altında əzildiyindən, özünə süni varis düzəldib rüsvayi-cahan olduğundan, durub arvadını da, zinadan əmələ gələn oğlunu da, özünü də, amansızcasına zəhərləyibdir. Qəzəbə dolan xan şəmadət yükü altında əzilmək istəmədiyindən öz-özündən amansız intiqam alıbdır!.. Kimdir İranda Ərmağan Həlakunu məhkəməyə çəkən? O hansı məhkəmə, hansı hakimdir ki, bu məmləkətdə gurul-gurul rüşvət almaya, külli miqdarda qazanc götürüb, bigünah qanun üstünü basdırmaya?!. Qoca qocalmışdı, öləcək idi, daha qurdla qiyamətə getməyəcəkdi ki?!. Vaxtında ölüm şərbətini içmək şərtdən deyilmi?! Vaxtında ölməmək, öz gözlərini döyə-döyə qalmaq, bədbəxtliyə, rüsvayçılığa, şərəfsizliyə düşmək deyildimi?

İndi Ərmağanın qolları üstündə bixəbər yatan körpə kimə oxşayır? Bunda qoca atasından nişan vardırmı? – Ərmağan mirqəzəb zəhmi ilə öz qurbanlığına baxırdı. – Bəli, vardır, özü də az-azacıq yox, çox-çox vardır! Xarici xanım deyən kimi, burnu, dodağı, qaşı, sir-sifəti qoca Məmalikin özüdür!.. Ərmağanın öz uşaqlığıdır! Axır Ərmağan da sir-sifətdən anası Sərəncama deyil, xanın özünə, bütün cizgiləri ilə onun

cavanlıq çağlarına oxşayırdı... Necə, necə olsun?.. İndi Ərmağan özünə, öz uşaqlığına əl qaldırsınmı? Öz-özünü öldürsünmü?.. Quran, bəs Quran? Quran Ərmağanı yandırıb qaraltmazmı? Onun əllərini, qollarını şil-şikəst etməzmi?..

Ərmağan qan çanağına dönən gözlərini gəzdirib, əsim-əsim əsən, tir-tir titrəyən əli ilə yaxasında gizlətdiyi nazik iynəni çəkib çıxartdı, birdən qardaşının yumşaq əmgəyinə yeritdi! Uşaq beynində səslənən xırçıltıya gözlərini açıb qatilinin üzünə baxdı. Qatil qardaşının ağzını da, üzünü də, gözlərini də sol əli ilə qapayıb, sağ əli ilə iynəni dərinlərə işlətdi. Sonra da o, qurbanlığını beşiyinə qaytarıb, dişi canavar addımı ilə səssiz-səmirsiz otağından çıxdı. Ərmağan Həlaku ardınca qapını örtüb, əndərun güllüyünə düşdü. Özünü az-az toxtadınca, pirani gülçünü hüzuruna çağırıb, Sərəncamın güllüyünü suvartmağa başladı:

– Əcəb də etdin, qız! – deyə sanki Sərəncamın səsi sağ ikən inşa etdirdiyi birmərtəbəli tağbənddən çıxırdı. – Əcəbdən də əcəb etdin! – Həyula səslənir, həmin gecə qaranlıq dəhlizdə güdükçü olduğundan da artıq qızının qulağına məlun, məşum səsi ilə doldururdu. – Mənim rəxt-xabıma soxulan Məhəmməd qızına belə bir cəza gərəkdi! – Yox, yox, Sərəncam xanımın əcaib həyulası qızının qulağından üzülmək istəmirdi. – Qoy əncüménçi Məhəmmədin nəvəsinə qalan əmvali-əmlak sənin bətnindən doğulan xan balalarına – Ərşadla, Gurşada, İldırımla Şümşada qalsın!.. Qoca atan yetmişində sərsəmləyibdir!.. Qoy qoca aşiqə belə bir zərbə dəysin, ağır əmud onun belini qırsın!..

Ərmağan xanım anası həyulanı – kabusu görməmək, onun amir və aramsız səsini eşitməmək üçün xaricdən gətirilən rezin borunu pirani bağbanın əlindən alıb, güllüyü sulamaqla Sərəncamın xıxıltısı altında zəbanə çəkən cəhənnəm kürələrini söndürməyə çalışdı.

## 22

Ərmağan Həlaku, öz cinayətkar əməliyyatını başa çatdırıb, tələsik addımlarla güllüyə düşər-düşməz, başqa otaqlarda səliqə-sahman yaradan Məhtabanın ürəyi iynələnən kimi sancdı. Məhtaban səndələyincə, divara söykəndi, xan imarəti onun gözündə zülmət zindana çevrildi. “Xudaya, bu nə haldır məndə?” – deyə gözləri qaraldı. Məhtaban divardan tuta-tuta yeriyib oğlunu yatırtdığı otağın qapısını ehmallıca açdı. İçəriyə qulaq verdi. Səs-səmir yox idi. O, istədi beşiyin örtüyünü qaldırsın, ancaq nə isə qaldırmadı, daha düzü, titrəyən əli gəlmədi.

Məhtaban bilmədi bu hal uşağı ayıltmağa qıymamaqdandırmı, yaxud onun öz mübhəm xofundan? Məhtaban ömründə görmədiyi ən ağır hal keçirincə, qayıdıb güc-bəla çarpayısına sərildi. Onun soyuyan sifəti ilin bütün fəsillərində Savalan dağının zirvələrində üst-üstə qalaqlanan qardan da betər ağarıb göyərdi. Sonra da tədriclə saraldı. Məhtaban bihuş halında əllərini yana sərib, ağır-ağır nəfəsini dərdi...

Hələ də səs-sədanın çıxmadığını görən Ərmağan xanım, güllüyü sulamaqdan qayıtdı, cəld çamadanını götürdü, özünü anasının yuyunduğu əndərun hamamın güzgülü gözünə saldı. O, güzgü qabağında durub diqqətlə üst-başına baxdı. Ona elə gəldi ki, qardaşının əmgəyindən onun üstünə qan çilənibdir. Lalə libasında iz buraxılıbdır. Əslində, bu cəlladın nə əlində, nə də üstündə qan izi yox idi. Onun qan tutan gözlərinə öz üst-başı qana bulaşan kimi görünürdü. Qardaş qatili dişi cəllad cəld soyunub, əynində olan bütün pal-paltarını bir qırağa atdı. Özü də xaricdən gətirilən süzgəci açıb, hərlənə-hərlənə çimməyə başladı.

Qatil qadın qanlı əlləri ilə, qan çilənən kimi görünən kötül ayaqlarını, piy bürüyən budlarını, üzüyuxarı qalxıb, qabaran cod saçlarını tez-tez, dönə-dönə yuyub, sabunlamağa, qaynar suda yancaqlarını döyəcləyib, yay girişi kimi dartınıb, bir-birindən aralanmaq istəyən əsəblərini ovundurub sakitləşdirməyə, bacardıqca özünü ələ alıb toxtatmağa çalışdı. Guya ki, bu cəlladın heç bir cinayətdən, qətldən xəbəri yoxdur, nə vaxtdandır ki, hamamdadır, çimməkdə, yuyulmaqda, Quran qəsəməni yerinə yetirməkdə, qurşandığı namazını qılmaq üçün qüsl edib paklanmaqdadır! Ərmağan Həlaku əndərun hamamda xeyli yuyunandan, dönə-dönə sabunlanıb salavatlanandan sonra mərmər otağa çıxdı qətfə ilə qurulandı, güzgüdə gözlərinə baxdı. Onun gözləri dopdolu qara qan çanağı idi ki, durmuşdu. O gözlərini soyuq su ilə xeyli yudu, təkrar güzgüyə baxdı, qanı çəkilməyən qan çanağı yuyulmaqla da təmizlənmədi. Deməli, qardaş qanının izi üryan bacısının bədənindən də getməmişdir!

Vahimə, xof Ərmağana güc gəldi. O, qətfə ilə vücudunu örtüb, buradaca, xalça üzərində dizləri üstə düşdü, tək tanrısına yalvarmağa, quran qəsəmini xaincəsinə pozduğuna görə xudasının ətəklərindən tutub yalvarmağa başladı.

– Xudaya, bu qətl vacib, zəruri idi, – deyə hər bir ehtiyata qarşı Avropadan zəhər gətirən, zəhər şüşəsini bilmədən əlindən salıb sın-

dıran, xadimə Xədicənin Ərşad Həlaku tərəfindən təpiklənib öldürülməsinə səbəb olan xanım yalvarmağa başladı: – Xudaya, səfil-sərgərdan Məhəmməd qızı Məhtaban, ruhu məndən üzülməyən mərhumə anamın rəxt-xabına sehrkarlıqla dürtülmüşdü. Xudaya, o, yetmiş yaşlı qocanı əməlbaz xanların şəmadətində qoymuşdu. Xudaya, sən özün bilirsən ki, necə də mən çalbığ Həlakunun üzünə çıxa bilmirdim... Çıxanda da elə bilirdim ki, qayınatam Həlakunun çal bığları codlaşanda, atamın ünvanına "bişərəf", "biqeyrət" – deyə söyüş üstündən söyüş yağdırır. Xudaya, o uşağın mənim atama nə qədər müşahibəti olsa da, yenə mənim o uşağın yetmiş yaşlı qocadan olmasına dərin iştibahım var idi!.. Özün də bilirsən bu uşaq şahənşah üzünə ağ olan fədai, əncüménçi qızının xəyanətindən vücuda gəlmişdir!.. Xudaya, mən sənin Quranına qəsəm qılmasaydım, tərəddüd keçirə-keçirə girəvəni əlimə keçirə bilməz, el şəmadətindən xilas olmaq üçün öz qəsdimi yerinə yetirə bilməz, məmaliklər sicillisini bişərəflik bataqlığından dartıb çıxara bilməzdim! Zinadan olan yaşayıb böyüyər, məmalik sicillisini əldə dəstəvuz edib, qəsbkarlıq göstərər, bütün əmval-əmlaka qeyrişəri sahib durub, min cürə fisqi-ficur törədər, iki xanlıq arasında bir də təzədən qanlı ədavət başlardı! Xudaya, sən özün də qətlə çatdırmalı nalayiq fərdin qətlini vacib və əlzəm sayırsan. Sənin neçə-neçə qazin şəri ehkamla ölüm fitvası veribdir və verir. Nə qədər sənin müctəhidin asilərin ölümünə qol qoyubdur və qoyur... Mən qocanın gözlərini öz qəsdimdən yayındırıb, Məhəmməd qızının qılığına girməsəydim, fitnə-fəsada səbəbkar olacaq zina gövhərini öz vaxtında yer üzündən götürə bilməzdim...

Ərmağan Həlaku dərgah qarşısında öz qatilliyinə bəraət verib dümağ paltarını geyindi, dümağ yaylığını başına örtdü, dümağ başmaqlarını ayaqlarna aldı, dönüb əynindən çıxardığı qan rəngli pal-paltarını bircə-bircə götürüb, hovuza tulladı. Ərmağan qayıdıb diqqətlə hovuza baxdı. Sanki hovuz qanla ləbaləb dolmuşdu, yaxud hər hansı bir qəssab pal-paltarını çıxarıb, hovuza atmışdı. Ərmağan xanım yavaşca hovuzu açıb, suyunu axıtdı, yenidən hovuzun aşağı gözünü tutub üstdən su buraxdı yenə də hovuz həmin-həmin qanla doldu:

– Bu Quran xofu Allah qəzəbidirmi?! – deyə Ərmağan Allaha da acıqlanıb qeyzlə özünə sığal-tumar verdi, göydəki Allahın da gözləri qabağında ona da kələk gəlib, mələk cildində əndəruna çıxdı. İçəridə güzgülü hamamın hovuzunda qoyduğu əlbisəsini yumağı, hər nə varsa

hamısını tərtəmiz sıxıb-sərməyi, qurudub ütüləməyi Sərəncam xanımın qoca qulluqçusuna tapşırdı. Ancaq ağ donlu mələk qan çanağına dönən gözlərini gizləyə bilmədi. Baxan kəs güman edərdi ki, bəs Ərmağan xanım qapalı hamamda çimdiyinə görə öz gözlərini isti buxarda ütüb bu kökə salıbdır?! Bəzi kəs də şübhəyə düşərdi ki, nə isə bir hadisə olub, gec-tez üstü açılacaqdır! Müəyyən kəsin də ürəyinə dammamış olmazdı ki, bəs Ərmağan xanımın bunca həlakularla məmaliklər arasını ərşi-arğac gedib-gəlməkliyi əbəsdən deyildir!..

23

Sübhün gözü açılmadan kəndlərə çıxan, yenə də rəncbər-rəiyyətlə rəhmdilliklə rəftar edən, əlillərə ehsan paylayan Məmalik xan da ürəyinin Məhtabanın ürəyi kimi birdən eyni an içində sancdığını hiss edincə, atının belinə qalxıb üstünün süvariləri ilə dinməz-söyləməz geri döndü, göydəki gün əyilər-əyilməz, özünü bərigahına yetirdi. Xan atından düşüb birbaş Məhtabanın otağına qalxdı, onun ölü düşdüyünü görüb, heyrət etdi:

– Sənə nə bəla üz veribdir, qız?

– Daha axırımdır, xan!

– Bəs körpən? Bizim balaca Məmalikimiz?

– O, səssiz-səmirsiz yatıbdır!

– Çoxdanmı?

– Xeyli olar!

Nə isə qocaya əyan olmuş kimi həyəcanlı səslə xəbər aldı:

– Bəs niyə körpəmizin yuxusu uzun çəksin?

– Düzü, beşiyinə yanaşdım, tərpətmək istədim, tərpədə bilmədim!

– Nə üçün?

– Əlim gəlmədi, xan!

– Qıymadın, ya necə?

– Heç özüm də sustalmağımın səbəbini dərk etmirəm, xan!

Qoca ər, gənc xanımının çarpayısının qırağında həm məlul, həm də cəsarətsiz əyləşdi:

– Mənim də ürəyim Daşbulaq obasında sıxılıb əzilmişdir, Məhtaban!

Məhtaban da durdu, əzik-üzük olan libasında çarpayı üstündə əyləşdi:

– Sən də Savalan qarı kimi ağarıbsan, xan!

– Bir bədbəxtlik olmasınmı, Xudaya?

– Sanki onlar ikisi də baş verən bədbəxtliyi görürdülər. Ancaq görməkdən, müəyyən etməkdən çəkinirdilər:

– Götür, körpəmizi qaldır beşikdən, Məhtaban!

– Sən özün dur, götür uşağı, qaldır, xan!

– Mənim tozlu saqqalımdan vahiməyə düşüb qorxmazmı?

– Xan, oğlunuz sizə alışıbdır, – deyə Məhtaban çarpayıdan yerə düşüncə, hıçqırıb otaq dolusu ağladı, onun iniltili səsi imarəti götürdü... Xan çarpayının qırağından qalxdı, beşiyin örtüyünü atıb balaca Məmaliki qucağına qaldırdı. Uşaq buzdan da soyuq idi. Onun dodaqlarının qanı qaçmışdı. Yanaqları çovğuna düşən bahar gülü kimi solmuşdu, əl-ayağı da uzanmışdı.

– Oğlum, körpəm! – deyə qoca xan vahiməli səslə qışqırdı:

– Xudaya, mən nə qədər də bədbəxtəm! – Onun qışqırıqlar içində itən gözləri genişləndi, dönüb oğlunun meyitini Məhtabana uzatdı.

– Sal döşünə, qız, sal döşünə, Məhtaban, qoy körpən sonuncu dəfə ana südü əmsin! – Qoca xan doğrudan da şivən qopardı.

– Xudaya, sən bizim basaratımızı Quran qəsəmi ilə gör necə bağladın? Düşmən də göz görə düşmənçiliyini etdi!.. Xudaya, gör sənin Quranın necə bizi aldadıb, tiryək kimi yuxuya apardı!..

– Məhtaban, sal döşünə balanı! Bəlkə oğlun ecazla əmdi, bəlkə külli-aləmi yaradan Allahın mən zülmkar xana yox, sən fəqirə rəhmi gəldi?..

Məhtaban oğlunu alıb döşlərinə gətirincə uşağın ağ papağını başından qaldırdı, qıvrım saçlarının arasını axtarıb gəzdi. Arada az-azacıq, güclə seçilən qan izini, quruyub-qurumayan damlacıqları gördü:

– Xudaya, bu dəhşət nədən ola?.. Bəlkə daraq dişindən bədbəxtin başında qalan yara izləridir?.. Nə ola, Xudaya? Xudaya, nə uzun, əzablı yuxudur?.. Xudaya, nə vaxt mənim qorxulu yuxularımın axırı olacaqdır? Xudaya, mən Məhəmməd qızı Məhtaban, haçanacan əzab çəkəcəyəm?

Məhtaban buz parçasına dönən oğlunu qaytarıb, qoca xanın qolları üstünə qoydu, ər-arvad baş-başa verib hönkür-hönkür ağlaşdılar.

Əndərun hamamında yuyunandan sonra özünü cəmləşdirən Ərmağan Həlaku tezcə köhnə məmurları tor-top edib, öz fərmanını elan etdi və onun icazəsi olmadan heç kəsin əndəruna buraxılmamasını tapşırdı.

İşin nə yerdə olduğunu duyan Ərmağan Həlakuya xidmət etməyə tələsən əyan-əşrəf elə bu andan hökmranlığı əlinə götürən xanım Həlakunun qarşısında quyruq buladılar, onun bir sözünü iki etməməyə and içdilər. Bir azdan əyan-əşrəf bihuş olan xanla xanımını itələyə-itələyə kənar otağa keçirib, kiçicik cənazədən araladılar. Təbir cayizsə, qoca ilə arvadını xan evində həbs etdilər...

Ərmağanın sərəncamına görə, toran düşüb qaranlıq qovuşanda məqtulu qəbiristanlığa aparıb quyladılar. Heç kəs, heç cür səs-səmir çıxarmadı. Özünü Ərmağana müqərrəb sayan baş əşrəf bir qıraqda dayanıb, izafi dil tərpədən şəxsi ölüm cəzası ilə təhdid etdi. Baş əşrəfin başına toplanan xidmətkarlar daha günü keçən xana etina etmədən, dörd oğul anası Ərmağana xidmət etməyə caiz bildilər. Özü də baş verən qəzanı tək Tanrının iradəsinə isnad etdilər. Üstəlik qətlə çatdırılan tifilin ünvanına da çox şəbədə dedilər, dilsiz-ağızsız uşağın üstünə ağlasığmaz iftira-böhtan yağdırdılar:

– Əcəb də oldu ki, daima başımızı aşağı edə biləcək bicdən ərdahalılara xan olmadı! – deyən mübaşirlər, məmurlar, hap-haplayan qart köpəklər, hürüşüb-hürüşdülər, ac qurdlar kimi ağız-ağıza ulaşdılar. Elə bu andan taqətdən düşən qoca xanı da, Məhtabanı da qaralayıb közdən saldılar, Pəhləvan Məhəmmədin fədailiyini də, məşrutəçiliyini də, əncüMənçiliyini də yamanlayıb, onun xatirəsini də nallıdaban başmaqlarının altına alıb, Ərmağan Həlakunun müqabilində atıla-düşə tapdadılar, onlar qoca xanın öz başını itirdiyini dönə-dönə deyib, çiyinləri ata-ata gülüşdülər, qarınlarını tuta-tuta atlanıb-düşdülər. Nəhayət Ərmağanın göz ağartması qarşısında güclə kiriyib, əl-əl üstündə dayandılar, yeni xanın hər bir sözünə iki dəfə “Bə çeşm!” deyib, bütün əmr-sərəncamını, verəcəyi hər növ fərmanı sözsüz-sovsuz yerinə yetirəcəklərinə, təntənə-təmtəraqla Qurana qəsəm qılıb, Ərmağan Həlakunun qarşısında keçəpapaq, uzunbirçək başlarını əydilər...

24

Lakin bu səs-səmir heç də içəridə qalmadı. Savalana qalxan qiyamçılardan Ərdahanın həm təzə, həm də köhnə əşrəf və mübaşirlərinə xəbər yetişdi ki, bəs əgərləri siz Pəhləvan Məhəmmədin qızı Məhtabanın başından bircə tük əskik etsəniz, öz keçəpapaq, uzunbirçək başınızı cidada bilin!.. Baş əşrəfin tapşırığına görə bu xəbəri Ərmağandan gizlədilər, tülkü kimi qorxduqlarını yeni hökmdara bildirmədilər...

– İndi nə olsun, ağalar? – deyə Ərmağan başına toplaşan əşrəfəyanın fikrini bilmək istədi. Onlar qoca xanla, onun xanımı Məhtabanla necə rəftar etməyi Ərmağanın öz öhdəsinə buraxıb, onun heç bir sərəncamına zidd çıxmayacaqlarını bir ağızdan izhar etdilər.

Ərmağan xan əri Ərdahana sifariş göndərdi ki, bəs durmayın, yas bəhanəsi ilə də olsa gəlin!.. Ancaq o tərəfdən heç bir adam gəlmədi, cavab da qayıtmadı. Çün çalbığ Həlaku heç bir kəsi, o cümlədən Ərdahanı da Məmalik mülkünə buraxmadı:

– Ta məqamınacan bizim heç bir işdən xəbərimiz yoxdur, baba! – deyə Həlaku öz qara-qırışıq əlini çal bığının gah bu tayında, gah da o biri tayında gəzdirdi, – bizim kiçicik bir tifilin qətlinə heç bir dəxalətimiz yoxdur!

– Bəlkə ağa, öz müsəlləh süvarilərimizi də götürüb gedək, Məmalik mülkünü tezcə işğal edək? – Ərdahan arvadına bel bağlaya bilmədiyinə görə, atasına işarə etdi, döşünün atdığını gizləyə bilmədi. – Bəlkə heç qoymayaq bu isti qismət soyuya, xan!

– Əsla, qəta, Ərdahan! – çalbığ Həlaku şəhadət barmağını cilov gəmirib, baş aparan Ərdahanın üstünə bərk-bərk silkələdi. – İşğalsız da Məmalik mülkü Həlaku xanlığına qarışıb qurtarıbdır, gədə!

– Bəlkə xan, sənin gəlinin Ərmağan dönüklük etdi, onda necə?

– Dörd oğlunun boynunu burada fərmanda qoyan Ərmağan orada heç bir dönüklük iqtidarında ola bilməz, oğlan!

Gah özünə gələn, gah da özünü itirən Məmalik oğlu öldürülənin beşinci axşamı qızını yanına çağırdı. Ərmağan atasının cibindən düşən aylı gecə dəsmalını götürüb, gözlərini silə-silə qocanın yanına gəldi:

– Daha ağlamaq nə üçün, Ərmağan xanım? – qoca qotazlı mütəkkələrdə güc-bəla dirsəkləndi. – Siz həlakular ki, öz məqsəd, məramınıza çatdınız!

– Mən Məmalik qızı Ərmağan ancaq atamın halına ağlayıram!

– Mənim daha nə halım, Ərmağan xanım?.. Artıq hər şey sizin əlinizdədir, siz həlakularındır!

Məmalik bir az da mütəkkələrdə qalxıb gözlərini güclə genişləndirdi.

– Sən qardaş qatilisən!

– Sübut? Sübut?..

– Bunu mən özüm də əcəb bilirdim!

– Bəs onda niyə varisinə göz olub, düşmənindən qorumurdun?

– Sənin Quran qəsəmini bunca amansız pozub, qardaş qatili olacağına da çətin inanırdım!

– Niyə də çətin inanırdın?.. Madam ki, dünya görmüş qoca şübhə etmişdi, niyə düşməninə uduzurdu? Niyə girəvəsini marıqda duran, girəvə gözləyən dədə-baba düşməni Həlaku tərəfə verirdi?

– Mən binəva hər necə çapalasam da, öz atalıq hisslərimə əsir düşürdüm, son mülayim rəftarına görə öz doğma qızıma, qardaşını əlindən qoymayan, onun nazı ilə oynayan övladıma, sir-sifətdə özümə bənzəyən balama Quran qəsəmindən sonra hər necə şəkk-şübhə etsəm də, inanmağa başlamışdım...

– Məgər Məmalik, düşmən ocağına ərə verdiyi qızı Ərmağandan doğulan dörd oğulun dördünün də Həlaku sicillisinə mənsub olduğunu dərk etmirdimi?

– Dərk edirdim, hamısını da əcəb bilirdim!.. Ancaq görünür, get-gedə qocalıq mənim beynimi kütləşdirib basaratımı da bağlayıbdır!

– Bəlkə Məmalikin basaratını ərş-əlada bərqərar olan ulu Tanrı özü doğru-dürüstünə bağlayıbdır?

– Ulu Tanrı belə qətlə kömək edərdisə, mən asi kəsilib ona, "Yoxsan, yoxsan, yoxsan!" – deyərdim!..

– Qoca xan qızışmasın, aqibəti betər olar! – Ərmağan atasına yaxın əyləşdi. – Gərək sirr qalmasın ki, sənin qızın cəsur oğul qətiyyəti ilə sənin xan şərəfini əğyar şəmadətindən xilas edibdir!

– Nə əğyar, qız? Hansı əğyar şəmadətindən, Ərmağan Həlaku?

– Guya ki, əfəl qocanın hər iki qulağına birdən girvənkə-girvənkə pambıq tıxanıbdır?

– Nə pambıq, necə girvənkə-girvənkə?

– O girvənkə-girvənkə pambıq ki, Məmalik xan, külli-İran ancaq bir səndən danışırdı. – Ərmağan əlinə qılınc götürən cəllad görkəmi alıb, onun özünü öldürmək əzmində olduğunu nümayiş etdirdi. –

Gərək sən qoca gec də olsa qulaqlarından tıxacları çıxarıb, əlinin içi kimi əcəb biləsən ki, hamı hey oturub-durub bir ağızdan, özləri də gizlətmədən, utanmadan, çəkinmədən heç kəsdən bak etmədən, gur-gurrah səslə deyirdilər ki, yetmiş yaşlı, əpriyib, əfəlliyən xan vərəsə vücuda gətirməyə qüdrətsizdir, qadir deyildir. Mənsə bu batman ağırlığında zəhərli sözləri əzəl başdan, o zaman yanıma gəldiyin gündən sənə demişdim!.. Lakin sən qoca xan öz doğma qızını dinləməyib

yerindən dingildədin, at belinə qalxıb süvarilərini də götürüb toz içində tozlana-tozlana itdin!

– Onda da, indi də sidqi-dil ilə Qurana qəsəm qılıram ki, bu batman ağırlığında zəhərli sözlər başdan-başa yalandır, qara böhtandır! – Qoca qımzanıb döşəkcədə bardaş qurdu. – Məndə, Məhtabanın eşqi ilə gənclik iqtidarı, cavanlıq atəşi nümayan idi!

– Nümayan idi? – deyə girəvəni əlinə keçirən, xanlıq ixtiyaratını öz dəstəsində toplayan Ərmağan atasını qılıncdan qabaq tənəli sözləri ilə məhv etmək istəyirdi. – İndi bəs necə, xan həzrətləri?.. İndi bəlkə səni təzədən bir ev küncündə un çuvalına tay olan çirkin bir xan qızıyla, ya dul, doğar bir qəşəng xanımla bir də evləndirək?.. Görən onda sən deyən Allahın izni ilə səndən hansı övlad-vərəsə vücuda gəlir?.. Əgər belə bir möcüzə baş verərsə, onda mən öz caniliyimi, əli qanlı qatil olduğumu icma qarşısında etiraf edib, öz əlimlə boğazıma kəndir keçirib Allah divanında asılaram! Qoy vahid Allahın cəzası daha təxirə düşüb, axirət dünyasına qalmasın! Qoy dünya üzündə hər kəsin müqabilində aşkar olsun, külli-İran bu qəziyyəni eşidib-bilsin!.. Bilməyən, gözləri ilə görməyən kəs də eşidib anlasın ki, qardaş qatili Ərmağan Məmalik qızı Quranın hökmü ilə külli-kainatı yaradan Allah divanına necə cəsarətlə getdi. Necə öz ləl-cavahiratlı boğazını samanları görünən kəndirdən keçirdi!

– Sən necə, nə təhər söyləsən də, mənim belimi qırıbsan, qız! – deyə taqətdən düşən xan zarıyan səslə asta-asta danışır, bəzən də az qala qızının necə amansız qatil olduğunu unudur, birdən də atalıq giley-güzarına keçirdi. – Sən, Ərmağan mənim belimə ağır əmud endirdin, namərd bala! İndi sənin atan öz gözünün qabağında tərpənə bilmir!.. Budur, bax, gör sənin öz gözünün qabağında mənim əl-ayağım necə də tir-tir titrəyir! Budur, zəifləyən, sarsıyan vücudumda iflic – ölüm əlaməti görünür!

– Nə üçün, əziz, möhtərəm xan öz qoca canına bunca cövr-cəfa verib özünə əbəsdən qəsd edir? – deyə istehzalı, iynəli sözlərindən əl çəkib tərksilah olmaq istəməyən Ərmağan, ağına-bozuna baxmadan Məmaliki qılınclayırdı, – nə üçün qoca bu qədər iniltili iztirablar keçirir?

– Çün, mənim son sevincimi namərdlik və hiyləgərliklə əlimdən aldın, məni varisdən məhrum qıldın!.. Sən mənim girəvəmi dədə-baba düşmənimizin əlinə keçirdin, Ərmağan Həlaku!

Ərmağanın gözləri yenə də qoşa qan çanağı kimi közərdi:

– Bəs necə! – deyə o, ayağa atılıb çalbığ Həlaku ədasıyla atasını təhdid etdi, əgər çox cəza-fəza göstərərsə, aqibətinin heçə-puça gedəcəyini söylədi. – Bəs necə, Məmalik ağa?.. Mənim xan qızı anam Sərəncamın yatağı sənin üçün küçələrdən gətirilən səfil-sərgərdan bir qızla boş-boşuna da olsa əylənmək üçün əyyaşlıq məvası deyildi!!.

Sənin anan, mənim də xanımım Sərəncam özünün bitib-tükənməz əfi ilan zəhəri ilə mənim ömrümü-günümü çürütmüşdü! – Məmalik acıdan-acı günlərinə görə qanlı ah çəkdi. Hətta sənin anan məni tiryəkə də məcbur etmişdi!

– İndi sən tiryəksiz-hoqqasız, ayıq başınla dur, keç o tərəfə! – deyə Ərmağan sapsarı saralan, gücsüzlükləşib heydən, hərəkətdən düşən, yaraşıqlı ağ saqqalı yana əyilən qocanı başmağın burnu ilə tərpətdi. – Qalx, qoca! Qalx, məxmər döşəkcədən, qotazlı mütəkkələrdən! Yapış titrəyən əllərinlə o cadugərin, sehrkarın qolundan, çıxar ləçəri əndərundan, aparıb birundan keçir, xan darvazasından bayıra tulla!

– O, nə cadugər, nə sehrkar... nə də ləçərdir! – deyə gücsüzləşən xan məxmər döşəkcədən durmaq, nə vaxtdan bəri hiyləgər, xatakar düşmənə dönən qızıyla döş-döşə dayanmaq istəsə də büdrəyib, məxmər mütəkkələrdə bənd aldı.

– Sən belə saxtakar, süni bəraətinlə, öz qırıq-quruq çərən-pərənlərinlə, izafi inilti, sızıltılarınla, qalxıb-yıxılmağınla mənim qətiyyətlə dolan qeyrətli ürəyimi heç də pilə kimi yumşalda bilməzsən! – Ərmağan güclənən səslə qocanın yıxılısına qışqırdı.

– Çün, mən bilirəm ki, sən bütün vücudunla sehrlənmisən, cadulanmısan, qoca! Sənin indi mütəkkələrdə yaşaran gözlərinə elə gəlibdir, şirin röya kimi elə görünübdür!

– Heç... ola bilməz!.. – Qoca hər iki titrək əli ilə rədd edirdi. – Əsla, ola bilməz, Həlaku!

– Əgər sən miskin qoca belə sehrlənib, əfsunlanıb, cadulanmasaydın, – deyə Ərmağan öz qurğuşun ağırlığı ilə atasının başının üstünü alıb dişləri qıcana-qıcana yırğalandı. – Sən daha bunca özünə əldən qoyub, bu rəzalətdən o rəzalətə, bu gölməçədən o gölməçəyə, bu bataqdan o batağa, bu üfunətdən o üfunətə düşməzdin! Sən azan-təzən gedə-güdədən, Savalan ətəyinin ney çalan, cır-cında içində itən çoban-çoluğundan özünə əmval-əmlak varisi, böyük Ərdaha xanlığına vəliəhd düzəltməzdin!.

Ərmağanın bunca amansızlığı atasını təpəsindən dırnağına sarsıtdı, o avazımış halında sərilə qaldı... Ərmağan isə atasına hücum edib, onu bişərəflikdə müttəhim edir, qoca vaxtında oyanan eşqini təhqir edirdi. Qocanın əsəbləri yay kirişi kimi dartılır, fikri-xəyalı dəyişib dolanırdı: – "Bu nə haldır? – deyə gözləri süzülən qoca dərin burulğana düşən sayağında boğulurdu. – Bu nə faciəli röyadır, Allah?".

Məmalik, gözləri ilə görsə belə, çox çətin inanırdı ki, qız da atasına qarşı belə amansız olar, bir həramı kimi onun girəvəsini kəsə bilər. Qoca çox çətin inanırdı ki, ana ayrı olsa da, öz ata bir qardaşını, məsum, günahsız uşağı, bütün bu çarpışmalardan bixəbər körpəni ata bir bacısı məkr, hiylə yolları ilə oynada-oynada, güldürə-güldürə, öpə-öpə qətlə çatdıra bilər!..

Ən ümdəsi, sir-sifəti avazıyan, ağ saqqalı əzilib pəjmürdələşən qoca, öz gec oyanan eşqi ilə Məhəmməd qızı Məhtabanı özünə zövcə etməklə, pak bir qızı, gözəl bir xilqəti istər-istəməz bədbəxt etməkdə özünü günahkar sayırdı. İndi qoca başının üstünü alan, xanlıq ixtiyaratını əlinə keçirən qızının qarşısında nə edə bilərdi? Əgər o, Məhtabandan əl çəkərdisə, bəlkə də bu zalım qız azacıq da olsa, rəhmə gəlib, ələ keçirdiyi xanlıq ixtiyaratını atasına qaytarmasa da bir küncdə, guşədə, bir otaqçada atasının azalan ömrünü başa vurmağına aman verər? Əgər ixtiyaratı əlindən gedən qoca Məmalik, Məhəmməd qızı Məhtabanı indiyə qədər ikiəlli tutduğu kimi, ömrünün axırına, nəfəsinin sonuna qədər tutarsa, qeyri-mütəqabil də olsa çarpışma davam edəcək, Ərmağan atasının ölüsündən də əl çəkməyəcəkdir, qoca yenə də dardan asılı qalacaqdı. O, Məhtabanı tutsunmu, buraxsınmı? Öz taleyini bundan belə də yasa batan ana ilə bağlasınmı, oğlu ölən ana ilə birləşib, həlakulara qarşı dursunmu?

– "Xudaya, Xudaya!" – deyə cismən taqətdən düşsə də, ruhi əzab keçirən xan belə bir ağır zamanında da o tərəfə keçə bilmədi, bu tərəfdə dayandı. O, oğlunun ölümündən də, Əhdaha xanlığının dədə-baba düşməni həlakulara qalmadığından da artıq Məhəmməd qızı ilə öz taleyini yenə də axırıncı dəfə bağladı. Aylı gecədə, ağ köpüklü göldə çimən Məhtabanın gözəlliyi qoca xanı kişiliyə səslədi. O gücsüz də olsa, müqavimət göstərmək, Məhtabana ər olmaq, olan-qalan gücü ilə onu çəkib çirkablıqdan çıxarmaq, yenə də Məhtabanı ay

nuruna qərq etmək istədi. Məmalik bacarmasa belə, buna cəhd etdi, tərəddüd göstərmədən Məhtabanın tayında durdu, Sərəncam qızına təslim düşməkdənsə, Məhəmməd qızı ilə zindana düşməyi, onunla birlikdə çürüməyi özü üçün üstün tutdu. Qoca üçün bu ayaqda hər nə vardısa hamısı getdi, ancaq bir tək Məhtaban qaldı. Son nəfəsində də olsa belə, Məhtabanı atmaq, öz eşqinə xain çıxmaq qoca xana ardan da artıq ar gəldi!

Qoca məxmər mütəkkələrdə dirsəkləndi, ağ saçı ağ saqqalına qarışan məcnuni başını dikəltdi, güc-bəla özünü cəmləşdirib dədə-baba düşməni həlakular müvəkkili Ərmağanın qarşısında qaynayan göz yaşlarını qurutmağa, az qala ağlayan gözlərini oyub-oyub çıxarmağa cəhd etdi:

– Məhəmməd qızı Məhtaban müqəddəsdir, özü də daim əndərunda olmuşdur! – deyə qocanın kinli gözlərində düşmənə qarşı qığılcım zərrələri parladı. – Sən bircə anlığa düşmən deyil, mənim qızım olsaydın, bilərdin, yox imanınla yəqin edərdin ki, Məhəmməd qızı biruna çıxmayıbdır, əndərundan başqa birunda olan kəslə göz-gözə dayanmayıbdır!

Ərmağan başının üstünü aldığı qocanın olan-qalan şaxını sındırmaq, öz cəlladlığına bəraət verib Sərəncamın günüsünü ləkələyib, kömürdən də artıq qaraltmaq əzmində oldu:

– Sən öz imarətini tərk edib, Ərdaha kəndlərinə gedəndə, cır-cındalı əşxas qarşısında öz hatəmtal səxavətini, öz beyinsiz, başsız əfsanəvi islahatlarını göstərmək üçün yollananda, bir az da o yana Savalan ətəyi meşə-tala obalarına varıb, eşqin topuğuna vurub səni dana kimi dingildədəndə bu sehrkar sənin əndərun istehkamını birun üzünə aça bilməzdimi?

Mirqəzəbdən də artıq mirqəzəbləşən, ürəyində olan övladlıq duyğu məhəbbətindən əz əsər qalmayan, atasının üstündə öz üstünlüyünü hakim əda ilə göstərən Ərmağan ixtiyaratı əlindən oynayıb gedən, getdikcə gücsüzləşən, məxmər mütəkkələr sərilib, dilim döşəkcədə məzlumlaşan qocanı dönə-dönə istehzaya qoyub şəhadətə yox, çeçələ barmağına dolamaqdan bihədd zövq aldığı üçün mövru pişik siçanla oynayan sayağında o da ağ tükləri qabarıb-qalxan ikinci qurbanlığıyla – atasıyla oynayırdı:

– Atəşin xanım Məhəmməd qızı Məhtaban öz yanına bir qollu-qanadlı, yekəpər gədə, eşqində suzan olan, çiyinləri çürcənəkli bir Sava-

lan çoban-çoluğunu buraxa bilməzdimi? Özü sübhün alaqaranlığında onu xan qızı Sərəncam xanımın zərli-zibalı rəxt-xabından qaldırıb, xan imarətindən əlaltı qaçıra bilməzdimi?

Ərmağan xanım açılıb üryanlaşan, itilənib qatilləşən zəhmi ilə anasının yatağına dürtülən Məhəmməd qızı Məhtabanı amansız günü rəhmsizliyi ilə qılınclamağında davam edir, əl saxlayıb, azacıq da olsa durmurdu. Bəlkə də bundan belə daha dura da bilmir, şəmadət fişəngini şiləyirdi?

– Bunu isə İranda hamı, hər qeyrətli ağa dil-boğaz qoymadan deyir, gözü olan kəs də görür, qulağı olan kəs də eşidir!

– Külli-İranda heç bir düşmən bunca qara-qura quraşdırıb, mənim ünvanıma bunca rəhmsiz böhtan yağdıra bilməzdi.

– Əgər indinin özündə də mən ətrafda əl-əl üstə müntəzir dayanan əyan-əşrəfə əmr edib... – Ərmağan nallı başmaqlarını döşəməyə döyür, sanki Sərəncam həyulanın itiləməsi ilə qocanı qılıncdan keçirirdi. – Əgər mən qeyrətli-şərəfli Ərmağan xanım, tək bircə gündə yüz-yüz şahidi gətirib, sən qocanı sürtülən, susuz üzünə dirətsəm, onlar da dli-boğaza qoymadan sənin üzünə durub, düm-düzünü desələr, necədir, ağayi biqeyrət?

– Mən onda axırıncı kərə Xudaya üz tutub, iltimas edərəm ki, olan-qalan gücümü cəm edib, hər iki əlimlə bir qılınc tutub, yalançı dilləri dibindən kəsə bilim!..

– Əgər bu sözləri sənin qanını qeyb edən üzünə, quruyan gözlərinin içinə, balacalaşan bəbəyinin ortasına şahənşah Qacar özü desə, necə?

– Şahənşah Qacarın bu İran viranələrində daha ayrı dərdi-çoru yoxdurmu?

– Əgər sən özün belə düşkün çağında öz başını ağlasığmaz dərəcəsində itirmisənsə, – deyə Ərmağan xanım usanıb-yorulmaz rişxənd və istehzalı əda ilə gücünü göstərmək mənasında yır-yır yırğalandı. Dişi cəllad qana susamışkən qan içmək, çimdiyi əndərun hamamın hovuzunu yenə də qanla doldurmaq istədi. Hələ burada da dayanıb, durmamaq – irəliyə ötmək, Məmalik tərəfdarlarına divan tutmaq, gözünə şübhəli dəyən şəxslərə əl qatmaq istədi. – Əgər sən qoca müsünn çağında, şərafətli xanlar sərdabasına təşrif aparmaq, orada təziyədarlıqla əzanlar altında, yasinlər avazıyla dəfn olunmaq istəyirsənsə, daha əbəs inadına nə ad vermək olar? Əgər sən özün-özünü ömrünün bu dövründə rüsvayi-cahan edib, dilə-dişə salıbsansa, daha biçarə Qacar müdam qulaqlarını barmaqları ilə tıxayıb, lal-kar ola bilməz ki!..

– Bu başdan-başa uydurmadır, qondarmadır, Həlaku! – deyə əli yerdən-göydən üzülən qocanın miskinləşən gözlərində yenə də kin göründü. – Bu bizim ata-baba düşmənimiz həlakuların külli-İranda yaydıqları şayiədir, ərdahalılar deyən sayağında başdan-başa şər-şəbədədir!

– Sən təpədən-dırnağa sehrlənib, çürümüsən, qoca! – deyə Ərmağan əlini-əlinə vura-vura şaqqa çəkib, qah-qahla güldü. – Gör, sən cavan cadugər əlində necə də qıfılbəndə düşüb, dəstigir olmusan, biçarə Məmalik!.. Yoxsa yetmişində kişi nədi, özünü bunca bərri-biyabanda ah-nalə qoparan Məcnun kökünə saldı nədi?

– Mən yoxdan-yox Xuda qarşısında təkrarən izhar edirəm, – deyə qoca xan titrəyən başını qaldırıb, pak eşqini müdafiədən üzülmək istəmədi. – O, qız heç zaman sehrkar olmayıbdır, deyildir! O, Pəhləvan Məhəmmədin qeyrətli qızıdır! Bir zaman Ərdaha elinin Rüstəm Zalı sayılan basılmaz mərdin alicənab övladıdır.

– Sənin özün yaşda qayınatan, Rüstəm Zal adlandırdığı o qarnı açıq gəda yoluq bir rəiyyət idi, həqir bir bəndə idi!

– O igid idi! – xan yarıcan da olsa, döşəkcənin üstündə dikəldi, – o bizim düşmənə qalan Ərdaha elinin namidar pəhləvanı idi!

– O, əncüмənçi, ixtilalçı, məşrutəçi idi! – deyə Ərmağan Həlaku düşməninin döşünə yeridi. – Sən bax, bu kor gözlərini aç, gör ki, bütün inadınla son nəfəsində də öz miskin taleyini hansı əncüмənçi, ixtilalçı, məşrutəçi dələduzlarla bağlayırsan!

– Əncüмənçi, ixtilalçı, məşrutəçilər qeyrətli adamlardır! – Ömrünün son saatında, Ərdaha torpağı oyanıb əlindən çıxdığı zamanında belə qənaətə gələn Məmalik öz Həlaku düşməni ilə sinəbəsinə durdu. – Onlar sizin kimi namərd, kəmfürsət deyillər. Onlar məkrə gedib, yalandan Qurana qəsəm qılan həlakulardan min qismət nəcib şəxslərdir, şərəfli qəhrəmanlardır!

Ərmağan qocanı yoxlayıb:

– Bəs sən özün, – deyə yırğalana-yırğalana Məmaliki də yırğalayıb, onun ağaran saç-saqqalını gülə-gülə dəlicəsinə qarışdırdı, sən özün qaradağlı Səttar üstünə, mücahidçilər, əncüмənçilər, məşrutəçilər üzərinə yürüş edən şahənşah ləşkərinə tərəfdar durub “cahad, cahad!” – deyə car çəkənlərdən deyildinmi? Mən hələ sənin islamı cahada çağıran avazını eşidirəm!

– İndi anlayıram ki, o mənim necə bağışlanmaz qələtimdir!

Ərmağan qan içində qaynayan gözlərini gülə-gülə qıydı:

– İndi bəs əncümən olsa, necə? İndi Təbrizdə başqa bir qərargah düzəlsə, necə?

– Taqətim olsa, tərəddüdsüz... – nəfəsi təngişən qoca titrəyən əlləri ilə saç-saqqalını düzəldə-düzəldə davam etdi.

– Bəli, tamam tərəddüdsüz düşmənə qalan əmval-əmlakımdan əl çəkib, Təbrizə yollanıb baş qaldıran millət mücahidlərinə qoşulardım!

– Görünür, sən qurdla qiyamətə getmək iştiyaqındasan! – deyə Ərmağan yenə də şaqqaşaqla güldü, – başımızı aşağı edən, tikan olub gözümüzə batan qoca!..

– Sən ata haqq-hüququna təcavüz edən, dədə düşmənimizin xatakar casususan! – xan az-az dirçələn səslə bar-bar bağırıb öz qatil qızını gözətlənmədən səksəndirdi.

Ancaq Ərmağan qətiyyətlə nallı başmaqlarını döşəmədə bərkidib, oynağa qalxıb dəliləşən qanlı gözləri ilə güldü:

– Sən də şəxsən ixtilaçılara, qiyamçılara, üsyançılara, əncüməncilərə, məşrutəçilərə, mücahidlərə qoşulmaq əzmində olan dönüksən!

– Görünür, sən mənim yeganə oğlumu əlimdən almaqla, – deyə qoca qızının gözlərindən "ata qatili" fərmanını da oxuyunca, bar-bar bağırdı.

– İndi də mənim üstümə düşüb, həlakular xeyrinə məni də həlak etmək əzmindəsən!..

– Xofa düşüb, titrətmə tutma, xan! – deyə Ərmağan məkrlə öz daxilini gizləməyə cəhd edib, nifrət bəslədiyi qocanı döşəkcədən qırağa itələdi.

– Bu gün-sabah axirət aləminə köçəsi qocaya çox çətin ki, mən əl qaldıram...

– Qardaşına əl qaldıran bişübhə atasına da əlini qaldırmaqdan çəkinməyəcəkdir!

Sərəncamın – gordan qayıdan çalxaq sümüklü həyulanın diksindirici dürtməsi ilə Ərmağan öz deyiklərini sübuta çatdırmaq, qocanın beyninə yeridib, burada nəqşləndirmək məqsədi ilə qarayaxalıq göstərib, qara-qışqırıq qopardı.

– O zina mənim qardaşım deyildir, Məmalik! O, sənin süni varisin idi, qıraqdantutma cövhər idi, daha bunu çək-çövürə dəyməz, bibeyin qoca!..

– Sən bu böhtanı saqqız kimi az çeynə, qatil qız! – deyə öz övladından dözülməz dil yarası yeyən, ciyəri parçalanmağa başlayan qoca bütün girəvələri qaçırdığı, bütün fürsəti fövtə verib, qılıncının qəbzəsini buraxdığı üçün gömgöy göynədi. Məmalikin sümükləri yanıb-

yanıb cız-cız cızıldadı. – Sən sinəsinə oğul dağı çəkilən atanın alnına bişərəflik damğasını zorla, güclə vurub dönə-dönə isbat edib, barı onu qeyrətli xanlar sərdabasına sənin ulu əcdadının məqbərəsinə bihörmət göndərmə, kəmfürsət, namərd övlad!

– Əgər bu damğa çox-çoxdan, səfil-sərgərdan yetimçəni darta-darta xan barigahına gətirdiyi gündən biqeyrət atamın alnının düz ortasında, bax, bu görünən yerində damğalanıbsa? – Ərmağan ruh kimi dayanan, hansı ecazla isə ayaq üstə duran, son nəfəsində Məhtabandan əl üzməyib, onu dolu kimi dalbadal yağdırılan iftira atəşlərindən qoruyan, aylı gecənin ağ köpüklü gölünə qanlı qara ləkələr düşməyə qoymayan, gözlərini yumana qədər sinəsini Məhəmməd qızına sipər edən qoca dayandıqca, Ərmağanın heybətli sir-sifəti cəhənnəm kürəsi kimi közərirdi. O, aman-iman bilmədən hələ də inad göstərib Məhtabanı qorqanan qocanın üstünə düşürdü. – Əgər karlaşan atanın tutulan qulaqlarının dibindən uzaqda da yox, öz imarətinin birununda bunca ünvanına bayquşsayağı biintəha, sərəvdə gəzirsə? Əgər el-oba, Ərdaha, cümlə-cahan, ta sənin Firəngistan dostlarına qədər çox-çoxdan sənə məktub göndərməkdən imtina edib, üz göndəriblərsə?.. Əgər bütün şərəfli şəxslər qocanın qulaqlarının dibini zəfəranlanmış hesab edirlərsə?

– Sən dəhşətdən də dəhşətsən, Ərmağan!

– Şərəfini xilas etmək naminə mən sənə, – Ərmağan məkrlə səsini bir az endirdi, guya inildəyən sərkərdəyə rəhmdillik göstərdi, – öz qoca atama qeyrətli bir övlad kimi axırıncı dəfə qəti əmr edirəm: keçsin o biri otağa, Məhtaban ləçərin, xarabalar bayquşunun qolundan yapışıb, bayıra atsın! – Ərmağan gözlərinə ölüm kölgəsi çökən atasını yaxalayıb silkələdi, darta-darta gətirib, Məhəmməd qızı Məhtaban qapandığı otağa itələdi. Özü də qapını yarıaçıq qoyub, yanovunda dayandı. Məmalik sınıq qədəmlə Məhtabana yanaşdı:

– Taleyimiz çox yamanca zəbun oldu, – deyə ayaq üstə titrəyib bütün vücudu ilə səndələyincə, sir-sifəti gül kimi solan Məhtabana söykəndi. – İndi mənim... nə qolumda... gücüm... nə dizimdə taqətim... nə də əlimdə... ixtiyaratım vardır...

## 26

Məhtaban Məhəmməd qızı hər necə düşmən mühasirəsinə düşüb, öldürülən körpəsinin kədərinə batsa da, ona söykənən qocaya dayaq durdu. O, ümidi üzülən, amansız övladının əlində dəstigir olub, həlakulara əsir düşən xanı atmaq istəmədi.

– Mən ayaq üstə sənə söykəli keçinirəm, qız, – Məmalik şikayətləndi. – Sən mənim cənazəmi haraya sürüyə bilərsən?

– Düz Savalana! – Məhəmməd qızının səsi cəngə gedən cəngavər səsi kimi cingildədi. – Savalan dağına!.. Əgər xan keçinərsə, mən onu Savalanın ən uca bir təlində[1], axar-baxarında dəfn edərəm! Qoy Savalan qartalları həlakular həlak edən fələkzadənin məzarına salama ensinlər!

– Sən tilsim qızı, tilsim biçarə qocanı yenəmi əfsunlamaq istəyirsən? – deyə qeyz-qəzəbə dolan Ərmağan Məhtabanın qolundan tutub, çöl tərəfə çəkdi. – Dur itil bu barigahdan, ləçər bihəya!

– Əlini məndən çək, Ərmağan Həlaku!

– Nə səbəbə gərək mən əlimi səndən çəkəm, Məhtaban Məmalik?

– Çün mən matəmdən çıxmayan, məsum körpənin yasını saxlayan anayam!

– Sənin məsum adlandırdığın körpənin... – Ərmağan bir ana kimi an içində sarsılsa da, cinayətkar ruhu ilə davam etdi: – əslində sənin, sən Məhəmməd qızının bic doğduğu oğlanın, əldən düşən, yenə də sənin sehrinlə tək sənə söykənən bu biçarə qocaya nə dəxli?

– Qurana qəsəm qılıram! – oğlunun ölümündən artıq Ərmağanın bunca inadkarlıq göstərdiyini görən Məhtaban yanıb-yaxılmaqla, bədbəxt balasının məzarda belə ləkələnməsinə qarşı üsyankar ana səsini qaldırıb, sonuncu kərə Allahın ehkamına and içdi: – O məsum körpə mənə söykənən, indi ixtiyaratı əlindən alınan bu qocanın doğma balası idi!

– Sən bizim gözlərimizə bir də təzədən kül üfürməkmi istəyirsən?

– Mən külli-aləm qarşısında həqiqəti elan etmək istəyirəm!

– Yoxsa sən bu sürtük çaylaq daşına dönən ismətsiz üzünə salıb, – Ərmağan sarayda, mühasirə içində belə təslim olmayan Məhtabanın üstünə hiddətindən xırıldayan səsini qaldırdı. – Yoxsa sən biqeyrət, binamus üzünə salıb qoca xanın şəri-halalı olduğu İran qarşısında dan qanun və şəriət qələminə verib, azman elli Məmalik mülkünə, Ərdaha elinə vərəsəmi durmaq istəyirsən?

– Nə indi, nə də əzəl Məmalik mülkü mənim gözümdə çürük qozca da olmayıbdır, xanım Ərmağan!

– Bəs onda hansı iştiyaqa görə buraya dürtülmüşdün?! Xanı özüylə Savalana dartan, bağ başında dəfn edən sehrkar?!

---

[1] T ə l – hündür, axar-baxarlı yer

– Məni ancaq Quran qəsəmi dolaşdırmışdı, – deyə sanki Məhtaban onu xan sarayında bəstələyən zəncirə əl atıb, tökmə dəmir halqalarını bir-bir qırmağa girişirdi. – Daha mən Həlaku xanım kimi Quranı ayaqlarımın altına atıb tapdaya bilməmişdim!..

– Sən mənim indi-indi durulan qanımı qaraltma, cadugər! – deyə başdan-ayağa yalan danışan, yalan danışa-danışa da özünü inandırıb doğrultmağa cidd-cəhd edən Ərmağan xırıldamaqdan da artıq boğula-boğula davam etdi. – Sən məni öz bihəya üzünlə daha dəli-divanə etmə, fədai balası!

– Əgər Quran qəsəmi qılmaqsız da səndə zərrəcə vicdan, bir iynə ulduzunca insaf-mürüvvət vardırsa, – deyə Məhtaban, oğlunun qatilini məhşərə çəkib, onun qanlı ləkələrlə dolan ürəyini əzib-əzişdirdi, həqiqət silləsini Ərmağanın üzünə dalbadal ilişdirdi. – Gərək indi-indi qanada qalxan, sən Allahsız bacısının əlləri üstündə qağazlanıb quğuldayan qardaşına qatil olduğun üçün gərək tövbə edib peşman olasan, tüstülənib yanasan, ya tüstün təpəndən çıxa!

– Sən məni bu qoca sayağında cadulaya bilməzsən, Məhəmməd qızı! – Ərmağan Həlaku üstünə çökən, getdikcə artan xofu, vahiməni özündən qovur kimi, sanki damar-dumarı qaralan əlləri ilə onu boğazlayıb boğan həyulaları, dəhşətə dönən Sərəncamın kabusunu iki əli ilə rədd etməyə, fikrindən-xəyalından silməyə çalışırdı. – Əgər mənim bir bici qətlə çatdırmaqda günahım varsa, elə mən bu dünyada da öz günahımın cəzasını çəkərəm!..

– Bu dünyanı bilmərəm! – Məhtaban gözlərini, qabağında boğulmağa başlayan qatilə qarğıdı, – ancaq o dünyada cəhənnəm olmasa da, gərək Xuda özü bir tək sənin üçün yaratsın!

Məngənə arasına alınıb, ruhi əzablar içində sıxılan Ərmağan boğulduqca, daha artıq cəllada çevrilirdi. O, fəqir, məhzun Məhtabanın belə üzə durmağına, cəsarətlə çarpışmağına, məntiqlə vuruşmağına çətin inanırdı. Ərmağan boğulduğuna görə gözlərinə güclü qan gəlir, didələrini tez-tez silirdi... O, atasının ayaq üstə tablamayıb, fərşə döşəndiyini də görmürdü. Nəhayət, təkətəklikdə, pəhləvan qızı ilə cəng-cidaldan dönməyən, sür-sümüklü Sərəncamın – həyulanın təkidi ilə onun günüsünü tapdayıb, öz başından rədd etmək istəyən Ərmağan var qüvvəsini toplayıb, təkrarən Məhəmməd qızı Məhtabanın qolundan tutdu, onu Məmalik barigahından qovub, izini-tozunu itirmək istədi. Məhəmməd qızı Məhtaban öz atasının meydan titrədən məğrur nərəsini çəkdi.

– Mən özüm, heç bir kəssiz, heç bir müqavimətsiz mənim bədbəxt balama məzar qazan cəhənnəm məvasını tamamən tərk edəcəyəm!

– Gər səndə zərrəcə qeyrət qalıbsa, nəinki cəhənnəm məvasını gərək biryolluq tərk edəsən, gərək bu uzun boğazını Sərəncam xanımın ata malı daş-qaşından təmizləyəsən, müqabilində möhkəm kəndirə keçirib Savalanın uca bir palıdının yoğun qanadında üzüaşağı asasan!..

– Yox, daha heç yox! – Məhəmməd qızının bütün vücudu rəşəyə gəldi. – Daha mən heç də bu ədalətsiz dünyanı boş-boşuna tərk etməyəcəyəm!

– Yoxsa indi də külli-İranı dolanıb, fərş üstünə döşənən miskin Məmaliki şərəfsizlikdə rüsvay edəcəksən?

– Mən qətlə çatdırdığın tifilimin qanını tələb edəcəyəm!

– Kimdən? – Ərmağan hər necə ağır vəziyyət keçirsə də, xanlıq iştiyaqı ilə şövqə gəlmək, öz boğulmağını ötüb keçmək, keçirdiyi ağır vəziyyətdən özünü xilas etmək, nə vaxtdan qazdığı, dibi görünməyən dərin quyuya düşmək istəmirdi. – Kimdən, kimdən tələb edəcəksən?

– Başsız qalan məmləkətin şahından, Qacarından!.. Şahənşahın özündən!.. Onun özündən əmgəyi iynələnən oğlumun qanını istəyəcəyəm!.. Görək şahənşah özü külli-İran qarşısında Ərmağan Həlakunu öz yox olan ədalət məhkəməsinə necə çəkəcək?! – Məhtaban sanki otaqda deyil, uca təl üstə qalxmışdı. – Əgər külli-İranda belə adil məhkəmə varsa, qoy şərəflə şərəfsizliyi, qeyrətlə qeyrətsizliyi, namusla namussuzluğu külli-aləm qarşısında aydın etsin!.. Qoy şahənşah özü oğul yası içində matəmə batan ananı şəri ərinin evindən qovan, artıq günahsız qan tutduğuna görə boğulan Ərmağanı dünya, aləm qarşısında rüsvayi-cahan etsin! – Məhtabanın şəhadət barmağı titrəmədən hisli keçəyə çevrilən Ərmağanın üstünə uzanırdı.

– Mən yamaqlı boğçaya büküb yadigar saxladığım, atam Məhəmmədin qırağı zəncirəli, qırmızı pəhləvan köynəyini geyəcəyəm!.. Mən İranı addım-addım, qarış-qarış gəzib, dolanıb, necə aldandığımı, necə bismillahla başlanan əqdnamə ilə buxovlanıb acizlik göstərdiyimi, hamısını yerbəyer, cabəca, hər nə varsa, hamısını örtüb-pərdələmədən nağıl edəcəyəm! – Birdən, özü də gözləmədən Məhtabanın qəzəbli gözlərində analığın məhzun-müztərib göz yaşları gəzindi. – Mən külli-İrana haray salıb, beşiyi məzara çevrilən bigünah tifilimin qanını iddia edəcəyəm!.. Mən məsum körpəmin qanını külli-İrandan iddia

edəcəyəm! Mən gözlərimdən getməyən, mənim indi qupquru quruyan döşlərimdən özünə ilıq süd istəyən oğlum üçün o qədər şuriş salacağam ki, tain ki, zülmət zindanxanaların dəmir qapıları taybatay açılsın! Ta əli taziyanəli zindançıların qulaq pərdələri yırtılsın!

Məhtaban əl atıb küncdəki sandıqçanı hirslə çəkdi, bismillahla başlanan, göz yaşlarının izləri getməyən kəbin kağızını çıxarıb tikə-tikə cırdı, otaq dolusu səpələdi. Qırıntıların çoxu halı özündə olmayan, fərşə sərilən qoca xanın əyilən saqqalına səpələndi. Məhtaban dönüb əynində hər nə libas vardısa, hamısını bircə-bircə çıxarıb, keçə kimi qaralan Ərmağanın başına çırpdı, özünü unudan kimi lüt-üryan qaldı. Kömürdən də qat-qat betərləşib qaralan Ərmağan Həlaku hər necə boğulsa iblis xırıltısıyla xırıldadı:

– Məmalik xan, özünə gəl!.. Qırışıq torbalar içində sönməyə başlayan gözlərini aç, gör ki, bismillahla başlanan əqdnaməni cırıq-cırıq edib sənin saqqalına səpələyən özünü ana bülbül edib üryanlaşdıran xanımın necədir?

Məhtaban Məhəmməd qızı boğazından boğulan, istehza içində dişləri ağaran Ərmağan Həlakunu heç cür saya salmadan bir zaman soyunub sandıqda saxladığı cır-cındasını bircə-bircə götürüb geyindi. Ərmağan isə xırıltı içində hayqırdı:

– İndi, qoca... sən ilahi, məcnuni eşqinə bax!.. Gör... hansı cındırlı pirə tapınmısan!.. – Ərmağan fərşə sərilən qocanın qolundan qapıb qaldırmaq istədi.

– Qız, əh-va-lım... pəri-şan-dır... – qoca zarıdı. – Mən bivəfa cahandan əli-mi üzü-rəmm!..

– Yoxsa bu cadu sənin ürəyini çalıb özüylə Savalana aparmaq istəyir? – Ərmağan Həlaku xofdan-xofa düşüb, üşütmə üstündən üşütmə keçirirdi. – İndi mən, rütbə-mənsəb gözləyən müsəlləh məmurlara əmr edib sən sehrkarın – fədai qızının dilini kəsdirərəm!..

– Daha növbə mənimdir! – Məhtaban irəli durdu, boğulmağını gizləməyə cəhd edən Ərmağanı analığın qadir zəhmi, pəhləvan cəsarəti ilə yaxaladı. – İntiqam növbəsi daha Məhtaban Məhəmməd qızınındır!..

– Bəlkə sən... bu qiyafənlə... Savalana... çəkilən çoban-çoluq aşnana, sehrkarlara, cadugərlərə... qovuşmaq əzmindəsən, cındırlı pir?!

– Orada nə sənin kimi sehrkar, nə də qardaş qatili cəllad vardır! – Məhtaban öz kör-köhnə paltarından səngərə girmiş kimi atəş açmağa

başladı. – Oraya, Savalana çəkilənlər mənim kimi məhkumlar və məzlumlardır!

Ərmağan boğula-boğula, dili dolaşa-dolaşa gülür, acı, qəzəbli dillə söylənirdi:

– Orada acından köpük qusanlar, yalavaclıqdan sitildəyənlər içində azadlığa çıxarsan!..

– Görünür, mənim yolum bir tək orayadır, xanım Həlaku!

– Əlbəttə, əzəldən orayadı! – Ərmağan boğulub güldü, gülüb boğuldu:

– Çün, itqursağı yağ götürməz, yetimçə!..

– Ədəb gözlə, canı boğazına çıxan, Ərdaha mülkü üstündə qardaşını qətl edib, bihədd günahına görə boğulan Ərmağan Həlaku!.. – Məhtaban qəzəblə hayqırınca, Ərmağan qarala-boğula kükrədi: – Sənin yolun Savalana yox... Zülmət zin-dana-dır!..

Ərmağan hər necə ağır vəziyyətdə olsa da, qanrılıb döndü... Korkobud geyiminə girən Məhtaban isə cəld dönüb qədimdən qalan divarları tutan xan silahlarını gözdən keçirdi, sonuncu silah sayılan beşaçılanı, fişəng dolu kəməri götürdü. O, düşmən girinə keçməsin deyə çevikcə başqa yandan darısqal pilləkəni düşüb, əndəruna çıxdı, darvazanı bağlı, əli silahlı məmurları marıqda görüncə, biruna qayıtdı. Üzünə bismillahla bağlanan barını üzüyuxarı dırmanıb o biri tərəfə aşdı...

Müti olan müsəllah məmurlara Məhtabanı dəstigir edib zülmət zindana salmaq barədə fərman verən Ərmağan Həlaku boğula-boğula geri döndü. Məhəmməd qızı Məhtabanı görmədi. Ərmağan yerə sərilən qocanı yaxaladı:

– Sən özünü mərizliyə qoyub məşuqəni qaçırmaqla günahını mənim divanımın qarşısında qanınla yuyacaqsan!

Ərmağan Həlaku qocanı qaldırıb, boğula-boğula da olsa, bərk-bərk silkələyib bütün güc və zəhmlə divara çırpdı. Başı əzilən, beyni oynayan ağ saqqalı al qanına bulaşan, ürək telləri qırılan qoca qızının qədəmlərinə düşdü.

– Sənə, sənə nə oldu? – deyə qan çanağına dönən gözləri dəhşətlə oynayan Ərmağan boğuq səslə soruşa-soruşa qocanın qolundan tutub qaldırmaq istəyincə, isti meyiti üstünə hücuma keçən gördü. Ərmağan səndələyib yıxıldı. Atanın titrəyən isti əlləri hansı ecazlasa qalxıb, qatil qızının boğazına kilidləndi. Ərmağanın qan çanağına dönən gözləri hərlənib kəlləsinə çıxdı. O, nəşə çevrilən qocanın əlindən öz bo-

ğazını güclə çıxardı... Duruş gətirməyən Ərmağan dönüb sərsərisayağı qaçdı.

– Qoy hamısı həlakulara... qalsın! – deyə Ərmağanın mühib və dəli-divanə səsi xan barigahını başına aldı. – Qoy indi hər nə varsa... Hammısı... dədə-baba düşmənlərimizə qalsın!..

Daş divarı cəsarətlə aşan Məhəmməd qızı Məhtaban əlində odlu silah komalarına yetişdi, özünün dediyi kimi, cəld yamaqlı boğçanı açıb pəhləvan atasının qıraqları zəncirəli qırmızı köynəyini üstdən geyindi. Dayanmadan Ərdaha obasından çıxıb, üzüaşağı qıjıltılı çaya sallandı... Ay işığında qıvrıla-qıvrıla üzdüyü ağ köpüklü gölün yanından ötdü, qəbiristanlıq tərəfə yol aldı... Bədirlənən ay işığında saqqız ağacları ilə əhatə olunan xan sərdabasını gəzib dolandı, təzə uşaq məzarından iz-əsər tapmadı... Məhtaban, xan sərdabasından dönüb, qəbiristanlığın yoxsul qisminə yönəldi, uçuq-sökük qəbirlərin arasında, kiçicik uşaq məzarını tapdı... Məhtaban, iki il əvvəl qonum-qonşunun palaz-paltarını qıjıltılı çayda yuduğu zaman arada bir yorulunca zoğal dəyənəyinə söykənən kimi, əlinə aldığı odlu silahına söykəndi... Təzə torpaq qoxusu verən xırdaca məzarın üzərinə əyildi... Bu dəfə o, intiqam naminə bismillahla başlanan Qurana qəsəm qılmadı, əmgəyi iynələnən oğlunun qıvrım saçları arasından gözlərinə dəyən qan laxtalarına and içdi..

And içdi ki, daha dayanmadan Savalana qalxıb, ixtilalçılara qarışsın, fədai Məhəmmədin dağ-döş yolunu tutub, Təbrizə varsın, Xiyabani qiyamına qoşulsun!..

*Göy göl, İstisu,*
*iyul-avqust, 1962*

# KƏSİLMƏYƏN KİŞNƏRTİ

*Ürəyim, nəfəsim, alim-şair*
*oğlum Şamoya*

I

Qədim zamanda Göyən düzəninin aşağı ətəyində bir Göylər kəndi var idi. Bu kənd yerdən qaynaya-qaynaya çıxan bulağın ətrafında cəm olan iyirmi-iyirmi beş evdən ibarət idi. Göylər kəndinin qoyun sürüləri Göyən çöllərini bürümüşdü. Özü də bunlar əslən qoyunçuluqla məşğul olan ağqoyunlu tayfalarından olduqlarına görə, bəzən bunlara Göylər deyil, ağqoyunlular da deyirdilər. Ağqoyunluların çoxlu oğlan uşaqları, az-az qızları olardı. Ancaq nədənsə göylərli Göyalının bir-birinin ardınca südəcər-südəcər yeddi qızı olmuşdu. Necə deyərlər, kişini qız külfəti basıb-bürümüşdü. Göylərli Göyalının qızları nə ac, nə də yalavac idilər. Göyalının özünə görə varı-karı, qoyun-quzusu var idi. Göyalını darıxdıran bu idi ki, niyə yeddi bacının bircə tək qardaşı da yoxdur. Axı bu qızlar qanadlandıqca onun-bunun evinə uçacaq, axırda bir yurdda bir Göyalı, bir də onun qarısı Qaratel qalacaqdı. Bəs bunlardan sonra buranın yurdçulu kim olacaq, kim bu ocağın tüstüsünü Ziyarət dağına doğru ucaldacaqdır?.. Özü də, tərs kimi, Göyalı özü də yeddi bacının bir tək qardaşı olmuşdu, bu ocağın kişi nəsli kəsilmişdi.

– Arvad, bu qızlara bir qardaş gərəkdir!

– Gərək qardaşı göydəki Allah verə, Göyalı!

– Sən istəsən, ocağa-pirə nəzir-niyaz apararsan, Allahın da rəhmi gələr!

– Görünür Allah özü belə məsləhət bilib, bizə yeddi qız qismət edibdir, Göyalı.

– Allah çox nainsaf iş görübdür, xalaqızı!

– Sən asi düşmə, Göyalı.

– Yəni Allahdan oğul payı diləmək asi düşməkdir, Qaratel?

– Bəs Allaha "nainsaf" demək asi düşmək deyilmi?

– Mən səni, Qaratel, başqa yana da yox, Ziyarət dağına aparacağam!

– O daş-qayadan nə istəyəcəyəm, Göyalı?

– Bax, burada sən də asi düşmə, Qaratel. Əgər o dağda kəramət olmasaydı, daha niyə Ziyarət dağı deyirdilər?!

– Düzdür, adı Ziyarət dağıdır, ancaq başqa ağqoyunlular oymağından demirəm, bizim Göylərdən oraya gedən, orada bir yüyürək asan, oğul-uşaq diləyən nə eşitmişəm, nə də görmüşəm.

– Eşitməmisən, görməmisən, çünki Göylərdə hamının işi düz gətiribdir!

– Necə düz gətirib, Göyalı?

– Bizim bu Göylərdə hər ocağın azı-azı beş oğlu, iki qızı olubdur. Hələ mən on oğlan, iki qızdan danışmıram.

– Nə olar, ay Göyalı xalaoğlu, bizə başdan-başa qız payı qismət olanda?

– Eşitməmisəm qız yükü, duz yüküdür, Qaratel!

– Eşitmişəm, Göyalı, indi əlacımız nədir?

– Əlacımız Ziyarət dağına yollanmaq, uca dağdan üzü yuxarı əl qaldırıb, ulu Tanrıya yalvarmaq, qızlara qardaş, yuvamıza da yurdcul diləməkdir!

– Nə olar, deyirsən gedərik, Göyalı. Ancaq gərək heç zaman Allaha asi düşməyəsən, özün də tərtəmiz yuyunub təmizlənəsən, tövbə-əstəğfar edəsən.

– Tövbə-əstəğfar edirəm, Qaratel. Paklanaram, Allah dərgahında düz durub onun verdiyi qız qismətinə şükür edərəm. Yalvarıb-yaxarıb ondan oğul payı da dilərəm!

– Mən də səninlə birlikdə sənə oğul payı dilərəm, Göyalı!

– Bəyəm sən özün, Qaratel, oğul payına möhtac deyilsən?

– Düzü, Göyalı, mən Allahın qız qismətinə qaneyəm.

– Ziyarətin heç bir ziyanı yoxdur, Qaratel. Gedərik, dağ dünyasında yatan övliyaları ziyarət edərik. Diz üstə düşüb daşları öpərik, sonra da Ziyarət dağının kəlləsinə qalxıb ulu Tanrının özünə yalvararıq!

– Gərək onda sidq-dil ilə ulu Tanrıya tapınasan, özün də şəkk-şübhəsiz inanasan, Göyalı!

– Sən oğulsuz olduğuma görə yandığımdan üsyan edib asi düşməyimə baxma. Bu dildədir, ürəkdən tək Tanrıya da, onun peyğəmbərlərinə də, imamlarına da, imam övliyalarına da inanıram. Hələ özün bilirsən ki, Məhəmməd nəslinin qabağında necə də acizəm.

– Odur ki, ildən-ilə var-yoxunun çox yarısını seyidlər yığıb-yığışdırıb aparırlar.

– Nə olar, qoy seyidlər hamısını aparsınlar, təki bizim bir oğlumuz olsun: qızlara qardaş, bu ata-baba yurduma da yurdcul!

Göyalı təkidlə deyəndən, Qaratel də eşidəndən sonra onlar qərara gəldilər ki, nəzir-niyaz götürüb Ziyarət dağına yollansınlar. Orada daş məqbərəli övliyaları ziyarət etsinlər. Ziyarət dağının uca zirvəsinə qalxıb tək Tanrıya dəxil düşsünlər.

Ziyarət dağı Göylərdən gözlə baxanda yaxında görünsə də, uzaqda idi. Düzdür, buradan baxan adama elə gəlirdi ki, Göylər obasının uzanan tüstüləri Ziyarət dağına ucalır. Əslində belə deyildi, belə görünürdü.

Ər-arvadın yır-yığış etdiklərini duyan, əməli-başlı yuyunub qüsl etdiklərini bilən qızların böyüyü soruşdu:

– Haraya belə, ata?

Göyalı dinməsə də Qaratel dilləndi:

– Ziyarət dağına, qızım!

– Onda bizi də aparın, – deyə böyük qız təkid edincə xırdaca qızlar da öz ata-analarının yaxalarından asıldılar.

– Bizi də!

– Bizi də!

Qaratel toplanıb gələn yeddi qızın yeddisinin də şəvə saçlarını sığalladı. Göyalı da böyük qızlarını öpdü, xırda qızlarını da bircə-bircə qucağına qaldırıb öpə-öpə yenə qoydu:

– Ora uzaqdır, qızlar!

– Biz dəvəyə minərik.

– O dağa dəvə çıxmaz.

– Onda atla aparın.

– Biz Ziyarət dağına piyada yollanıb, siz qızlara qardaş diləmək istəyirik.

– Elədə biz də, biz də qardaş istəyirik! – deyə böyük qızlar atılıb-düşüncə, xırdaca qızlar özlərini qabağa verirdilər.

– Qoyun o dağa gedib bizə qardaş gətirsinlər!

– Neçəsini, qızlar?

– Hərəmizə bir qardaş.

Göyalı cavab verdi:

– Hamınıza təkcə bircə qardaş da olsa, Tanrımıza şükür edərik! – deyə Göyalı kövrəlincə qızların gözləri yaşara-yaşara hərləndi. Qaratel göz yaşlarını düyünlü barmaqları ilə sildi. Göyalı udqundu, o da özünü müqəssir saydı. Göyalı özünü müqəssir saydı ki, bəlkə Allahın qisməti belə imiş? Bəlkə Allah bilən yaxşı imiş? Daha Allaha yalvar-

yapış edib onu üzə salmaq, ona artıq başağrısı vermək heç də yaxşı deyildir?! Ancaq daha geriyə dönmək olmazdı, qızlar özləri də onları qayıtmağa qoymazdılar.

– Biz razıyıq, bizi qoyub gedin, – deyə yenə də böyük qız ağbirçək ədası ilə dilləndi. – Hərəmizə bir qardaş da olmasa, hamımıza bircə qardaş da olsa, Ziyarət dağından diləyin!..

II

Göyalı da, Qaratel də ürəkdən inandılar ki, onlardan da artıq qızların diləyi hasil olacaqdır. Mütləq Ziyarət dağına getmək gərəkdir.

Belə olanda onlar bir yaz səhəri başqa bir kəsə bildirmədən bacardıqları qədər nəzir-niyaz götürdülər. Ziyarət dağına yola düşdülər. Az getdilər, çox getdilər, yol boyu qabaqlarına çıxan kəndlərdə rastlarına çıxan kora, şilə, fağıra, yoxsula, sahibsiz kəslərə götürdükləri nəzirdən payladılar ki, diləkləri tez hasil olsun. Kəndbəkənd beləcə edib, yol gedəndən sonra axır ki, Ziyarət dağına çatdılar, dağa qalxdılar, daş məqbərələri aradılar, axtardılar, tapa bilmədilər. Demə, zamanın selsuyu bu daşları hey yumuş, ildırımlar buraya düşüb Ziyarət dağını tir-tir titrətmiş, iri-iri daşları parçalamışdır. Burada hər şey dəyişmişdir, nağıl edilən sayaqda heç nə öz yerində qalmamışdır.

Ancaq Göyalı ilə Qaratel gördülər ki, buraya başqa gələnlər də vardır. Onlar bu naməlum daşları da ziyarət edir. Odur ki, ərlə arvadın gözündə Ziyarət dağının bütün daşları türbələrə çevrildi. Onlar daşların dövrəsinə dolana-dolana öpdülər, hərləndilər, nağılda eşitdikləri övliyalardan yeddi qıza bir qardaş dilədilər. Bir azdan əldən düşüb yoruldular. Axı o cür ki onlar daşların dövrəsinə dolanıb öpürdülər, uçurumlardan qorxa-qorxa keçirdilər, nəinki bir neçə gün gərək idi ki, hətta bir deyil, bir neçə il gərəkdir ki, onlar öz ziyarətlərini başa çatdıraydılar. Ancaq onlar sidq dil ilə ziyarət etdiklərini hesaba alıb inandılar ki, Ziyarət dağının daşı altında yatıb qalan övliyalar onları bağışlar. Axı övliyalardan da uca olan ulu Tanrı vardır. Onlar Ziyarət dağının bax o göy bulud içində gizlənən uca zirvəsinə qalxsalar, buradan ulu Tanrıya tapınıb yalvarsalar, ulu Tanrı Göyalı ilə Qaratelin çatdırıb ziyarət etmədikləri övliyaları qəzəbdən çəkindirər.

Ziyarət dağına varan, əl-ayağı, diz-topuğu daş qayadan sivrilən bu adamlara Tanrı rəhm edər, diləkləri hasil olar. Buna görə də Göyalı ilə

Qaratel nəzir-niyazın bir yarısını dağın qurd-quşuna təslim edib, Ziyarət dağının başı göy buludlu zirvəsinə doğru dırmanmağa başladılar. Onlar aşağılara baxmırdılar, gözlərinin qaralmağından qorxurdular və yenə də qorxa-qorxa dırmanırdılar. Nəhayət, başı buludda gizlənən dağın ən uca yerində birtəhər qərar tutdular. Burada bir-birindən tuta-tuta dizi üstə düşdülər, öz diləklərini Allaha çatdırdılar. Bir-birinə baxa-baxa şəhadət barmaqlarını qaldırıb artıq yox, yeddi qıza bircə qardaş dilədilər. Beləcə quruya-quruya, diz üstə xeyli yalvardılar, ayaq üstə qalxıb yenə də yalvardılar. Bəsdi deyincə yalvarandan sonra nəfəslərini dərindən dərib, göy buludun içində, Allaha yaxın yerdə yüngülləşdiklərini duydular. Ehtiramla dalı-dalı dağdan düşdülər.

Ziyarət dağının ətəyində ər arvadını, arvad da ərini inamla süzdü. Onlar nəzir-niyazın, şükür-sənnanın qəbul olunduğuna ürəkdən inandılar. Göylərə döndülər. Qızlar yorğun düşən ata-ananı sevinclə qarşıladılar. Böyük qızlar az-çox başa düşdükləri üçün başqa söz demədilər. Ancaq xırdaca qızlar ata-ananın dara qoydular:

– Bəs niyə bizə qardaş gətirmədiniz?

– Gələcəkdir, sizə qardaq gələcəkdir, – deyə Göyalı öz xırdaca qızlarını qucağına alıb, onları bircə-bircə oxşadı.

## III

Aylar ötdü, il dolanıb başa çata-çatmaz Qaratel bir oğlan doğdu. Göyalının evinə görünməzin şadlıq gəldi. Atanın, ananın, qızların sevinci yerə-göyə sığmadı. Bu xəbər bir tək Göylər obasında olan qohum-qardaşı deyil, yaxın-uzaq Göyən obalarını, ağqoyunluları şad etdi. Göyalı yeddilər üstündə tapılan oğlan üçün qurban üstündən qurban kəsdi. Yenə fağır-füqəraya payladı. Hər kəsə Ziyarət dağının möcüzəsindən, oradan dilənən diləyin eşidildiyindən danışdı. Ağqoyunluların gözündə Ziyarət dağı bir daha ucaldı, böyüdü, müqədziyarətgahlardan birinə çevrildi. Söz gəzdi, söhbət getdi... Kimi dedi: Ziyarət dağında daima ocaq yanır, dumanlı-buludlu qaranlıq gecələri işıqlandırır; kimi dedi: Ziyarət dağının ətəklərindən çıxan çeşmələr şəfa qaynaqlarıdır, bütün dərdlərə dərmandır, sidq-dillə ziyarətə gedənlər naümid qayıtmır. Belə olandan sonra Ziyarət dağına doğru axın artdı, dilək diləyənlərin sayı çoxalıb hesaba gəlmədi.

Göyalı da, Qaratel də öz qiblələrini Ziyarət dağına çevirdilər.

– Min şükür sənə, xudaya, bizi naümid qaytarmadın, – deyə Göyalı Qaratelə baxdı. Onlar ikilikdə öz əllərini Ziyarət dağına doğru qaldırdılar: – Çox şükür sənə ki, qışlara qardaş, bizə də yurdçu verdin. İnnən belə mənim borcum sənə səcdə etmək, dizləri üstə düşüb müqabilində durmaqdır.

Bəli, müəyyən məsləhət-məşvərətdən sonra Göyalının təklifi qəbul olundu. Onun sözü yerə salınmadı. Uşağın adı Şükran qoyuldu.

– Xudaya, sənə min-min, min şükür ki, bizim ürəyimizi açdın, qızları qardaşsız, bizi yurdculsuz qoymadın. Mən onun adını Şükran qoyuram!

Göyalı gündə beş də deyil, on kərə ulu Tanrısına raz-niyaz etdi. Qoyun sürüsünün yarısı qurbanlığa getsə də, onun ovqatı təlx olmadı. Vaxta ki onun iltiması qəbul olunubdur. Göyalı oğlu Şükran da ulu Tanrının pənahındadır, qoyun kəsmək nədir ki! Vaxta ki Göyalının arzu çırağı yanıbdır, hər necə güclü tufan olsa, sönməyəcəkdir! Belə bir etiqad-inamla Göyalının çiçəyi çırtlayır, Qaratelin dən düşən saçı öz-özünə qaralır, cavanlaşır, bir növ qızlaşır, az qala öz böyük qızlarından seçilmirdi. Nabələd adam deyə bilməzdi ki, bu, qızların anasıdır, ha bu qızlar kimin balasıdır!

Bu şad hadisənin üstündən az ötməmiş körpə qızlar birdən-birə boy atdılar, iri qızlar birdən-birə iriləşdilər, qızlar bulağından bircəbircə su içdilər. Özləri də daha toy-bayram içində olan sayaqda geyindilər-kecindilər. Yeddi qızın bir qardaşı qızların əlində əl-əl gəzdi. Göylər kəndində hamı Şükranı əl üstündə gəzdirdi. Xırdaca qızlarsa Şükranın dövrəsindən əl çəkmədilər.

– Ana, Şükran yatdımı?

– Yatdı, qızlar.

– Yox yaxşı, – deyə qızlar bu həndəvərdən aralandılar, uzaqda da olsa, heç bir kəsdən heç bir cıqqırtı çıxmadı. Göyalı ailəsində görünməzin mehribançılıq başladı. Heç kəs heç kəsə güldən ağır bir söz demədi. Ləzzətli meyvələrdən Şükrana yedirtdilər, bahalı qumaşlardan geydirdilər. Gözəl oğlanın üstünü gözmuncuğuları ilə doldurdular. Şükranın ayaqlarının altında üzərlik yandırıb, onu bədnəzərdən qorudular. İnsafən oğlan özü də misilsiz-müqabilsiz oğlan olmağa, öz hərəkəti, ağlı, kamalı ilə hamının diqqətini özünə cəlb etməyə başladı.

Şükran boy atıb qalxar-qalxmaz Göylər obasının uşaqlarına qarışıb oynamaqda, ya da qabağına düşən atın belinə qalxıb yallama at

çapmaqda birinci və baş çıxdı. Şükrana baxanlar dedilər ki, bu oğlan Ziyarət dağının üstündə dayanan ulu Tanrının kəramətinin gələn vaxtına düşübdür. Ulu Tanrı bu uşaqdan öz kəramətini zərrəcə də əsirgəməyibdir. Baxanda bu oğlan qaşdan qara, gözdən köşək, kirpiklərdən sıx, alından enli idi. Bədəni, duruşu, vücudu mütənasib idi. Bu oğlan nə uzundu, nə də gödək. Elə bil ki, bu oğlanın bütün əzası qüdrətin fırçasıyla işlənmişdi. Hamı Şükrana heyran idi. O, mədrəsədə oxumaqda, bilik kəsb etməkdə birinci idi. Elə bil ki, qədimlərdən gələn ağqoyunlulara Allah-taala özü belə bir başbilən, sabah düşmənlərlə döşləşə bilən bir igid oğlan göndərmişdi. Görən deyirdi, bu qismət nəinki bir tək Bəyalı oğlu Göyalıya, bütün ağqoyunlulara bəsdir. Ağqoyunlular fəxr edə bilərdilər ki, onların elindən, Göylər oymağında belə bir oğlan əmələ gəlibdir. Deyirdilər görün hələ sabahına bu necə bir oğlan olacaqdır. Göyalı elə bilirdi ki, ulu Tanrı onun başına elə bir şahanə tac qoyubdur ki, daş-qaşının şöləsi aləmə işıq salır.

Əzizlənən Şükran özünü itirib ucuzlanmırdı. Göyalı öyünürdü, oğlu Şükrana görə qanadlanırdı, ailə yeddilər üstündə tapılan qardaşla fəxr edirdi, Ziyarət dağını unutmurdu. Hər il toplanıb Ziyarət dağına gedirdilər, övliyaların izi tapılmayan daş məqbərələrini ziyarət edirdilər. Hətta adi qara, çopur daşları da belə öpürdülər. Onlar gətirdikləri qurbanlıqlardan axışıb oraya gələn fağır-füqəraya bəsdi deyincə pay paylayır, açdıqları süfrələrə Ziyarət dağının ildən-ilə çoxalan zəvvarlarından çağırırdılar.

– Yeyin-için, qardaşlar, bacılar, – deyə Göyalı da, Qaratel də öz qonaqlarına hörmət edib xoş sifət göstərirdilər. Onlar da yeyirdilər, içirdilər, Şükranı verən qüdrətə şükür edirdilər. Şükran da boy atır, daha on yeddi yaşına çatırdı.

Bəs Göyalı öz sevimli oğlu Şükran üçün daha nə edə bilərdi? Nə edə bilərdi ki, atanın ürəyincə olsun, öz-özündən razı qalsın? Ağ papaqlı, ağ şal çuxalı, qırmızı məstili, qızıl toqqalı, bığ yeri təzəcə tərləyən Şükran üçün məxsusi bir at gərək idi, elə bir at ki, nəinki Göyən obalarında, ağqoyunlu tayfalarında, hətta Arazın o tayı Qaradağda, bu biri tayı Qarabağda əldə çıraq gəzilsə belə tapılmasın, bu bərabərlikdə bir at olmasın. Bu at yelqanadlı olsun, küləkləri yarıb içindən çıxsın, özünü də Şükranı da sağ-salamat çıxarsın. Əgər yağı düşmən Şükranın üstünə düşsə, bu at onu mühasirədən çıxarsın, oxlardan, nizələrdən xilas etsin, Şükrana heç bir zaval toxunmasın.

Şükran belə bir yelqanadlı ata minə bilərdimi? Heç şübhəsiz uşaqlıqdan Göyən düzənində tay-tuş içində at minməkdə el təlimi keçən, mühüm sınaqlardan çıxıb bu yerlərin birinci minicilərindən sayılan Şükran nəinki belə bir atı minə bilərdi, hətta o öz atını təlimləndirərdi, öz ağlı, zəkası ilə, öz çeviklik və cəsarəti ilə bu atı elə öyrədə bilərdi ki, ağqoyunluların hamısı heyran qalardı. Bəlkə heç belə bir at nağıllarda, əfsanələrdə də olmazdı. Bəlkə bu at Zümrüd quşuna, ya od-alovda yanmayan Səməndərə oxşardı? Dönüb onların hər ikisinə meydan oxuyardı?

Göyalı öz oğlunu özündən yuxarıya qaldırmaq, evindən köçürdüyü və köçürmədiyi qızlarını sevindirmək, öz oğul-qız nəvələrinə qürur, fərəh bəxş etmək, xüsusən ona belə misilsiz oğul doğan Qaratelin artıq gümüşlənən saçlarını öz titrək barmaqları ilə tumarlamaq istəyirdi.

– Bir olsun, pir olsun, Qaratel!

– Bəli, Göyalı, bizim biri Allah pir edincə öz amanında saxlasın!

– Heç şübhəsiz, Allah verdiyini öz amanında saxlayacaqdır!

– Son zaman qorxmağa başlamışam, Göyalı!

– Nədən ötrü, nə üçün, Qaratel?

– Bizim Şükranın dilə-dişə düşməyindən yana! Həm də pis-pis ağızlardan çəkinirəm, Göyalı!

– Allah amanında olana heç bir zaval toxuna bilməz, Qaratel!.. Mən ancaq bizim Şükranı verən, yeddi qıza bircə qardaş göndərən, özü də qızlarımızın bəxtini uğurluğa açan, bizə otuzdan artıq oğlan, qız nəvəsi bəxş edən ulu Tanrıma şükür edirəm! Bunlar hamısı Şükranın ayağının uğurlu olmağındandır, Göyəli qızı!

– Bəli, Göyalı oğlu, Göyalı qızlar da, onların uşaqları da, kürəkənlərimiz də Şükranın ayağını uğurlu sayıb, onu öz canlarından əziz tuturlar.

– Hələ Göylər camaatı, hələ Göyən obaları, hələ ağqoyunlular eli!

– Şükür, min-min şükür o Ziyarət dağına, o dağın övliya-ənbiyalarına, Ziyarət dağının yuxarı ulduzlu kəhkəşanında dayanan bu dünyamızı yoxdan yaradan, hikmətlə dolandıran ulu Tanrıya ki, bizə belə fəhmli-fərasətli, gözəl-göyçək oğlan qismət edibdir!

– Əlbəttə, əlbəttə, Göyalı, min-min şükür! Biz bəndələr ona nə qədər də borcluyuq!

Bu şükürlü söhbətdən sonra Göyalı ürəyini açıb öz gümüş saçlı Qaratelinə bildirdi ki, bəs onun ürəyindən necə də bir arzu keçir. Elə

bir arzu keçir ki, o, Şükranı ucaltsın, Şükran bu arzu içində nəinki ucalsın, hətta qanad açıb istədiyi səmtə uça bilsin.

– Necə istədiyi səmtə uça bilsin, Göyalı?

– Elə istədiyi səmtə uça bilsin ki, daha bu dünyada heç kəs elə uça bilməsin.

– Yəni sən Şükrana doğrucul qanad almaq istəyirsən?

– Bəli, mən Şükrana elə qanad – elə bir at almaq istəyirəm ki, Şükran onun belinə qonanda qanad aça bilsin, bu at onun altında şəhpərə çevrilsin, bu şəhpər onu küləklərdən keçirsin, bu şəhpərlə o göydə havalanan qartallardan belə ötsün!

– Demək, sən Şükranı daha artıq gözə gətirmək istəyirsən, Göyalı?

– Yox, yox, Qaratel! Allahın bizə bəxş etdiyi Şükran üçün səxavətli olmaq, Allah payının müqabilində şükürlü olmaq istəyirəm!

– Yəni özünü, öz qoyun sürünü dağıtmaq, var-yoxunu da səpələmək istəyirsən?

– Bəli, Qaratel! – deyə Göyalı öz ürəyini açıb dedi. – Qızların uğurla ərə gedib, yeddi qızından evimizdə tək bircəciyi qalıbdır. O da bu gün-sabah öz bacıları kimi qanad açıb uçacaq, yurd-yuvasına düşəcəkdir. Qoy biz qocalmayaq, qoy bizim ürəyimiz açıldıqca açılsın. Bunu da bizə kim verə bilər? Ancaq Şükran! Şükranın misilsiz, müqabilsiz şəhpəri!

Qaratel hər necə razı olub-olmasa da, Göyalı sözündən dönmədi. Göyən obalarını gəzdi, dolandı, xəbər aldı, soraqlaşdı, uzaq ellərə varıb, uzaq-uzaq yerdən öz qalan qoyun sürüsünün çox yarısının qiymətinə ulduz kimi par-par parıldayan bir at aldı. Ona yaraşan qızıllı-gümüşlü yəhər-cilov da düzəltdirdi.

– Oğlum Şükrana bəxşişdir!

– Nə münasibətlə, ata?

– Bu gün oğlumuzun on səkkiz yaşı tamam olur! Mən Şükranı verən ulu Tanrımıza şükür edirəm! Sən mənim ürəyimsən, dirəyimsən, sən mənim Ziyarət dağında dərgah qapısında qəbul olunan iltimasımsan. Sən ulu Tanrımızın öz övladısan.

Şükran öz gözəl-göyçək başını atası Göyalının müqabilində ehtiramla əydi. Sonra da oğlan qayıdıb gendən baxan, ata ilə oğlunun söhbətini dinləyən anası Qaratelin Ziyarət dağının qarı kimi ağaran saçlarından minnətdarlıqla öpdü.

– Mən də ulu Tanrımıza şükür edirəm ki, mənim belə təmiz ürəkli mötəbər atam, anam vardır!

## IV

Doğrudan da Bəyalı oğlu Göyalının arayıb-axtarıb, neçə-neçə yüz qoyun verib, böyük məmnuniyyətlə aldığı ulduzlu atın misli-müqabili heç yanda yox idi. Bu at bir tamaşa idi. Baxan elə bilirdi bu at parlaq bir ulduzdur, göydən yerə düşüb... Bu atın adını Ulduz qoyub qulağına çağırdılar. Baxanda Ulduz boydan uca, ayaqlardan xırdaca, biləklərindən nazik, ancaq beldən mis kimi tökmə və möhkəm idi. Ulduzun ortası qarınlı deyil, incə idi. Yalmanı sıx, göyəm idi. Ulduzun yalı qınından sivrilən qəhrəman qılıncını andırırdı. Baxanda Ulduzun gözləri yanır, od-alov içində şölələnirdi. Ulduzun qaçarağına ox süzdürən olsa belə, çatmazdı. Ömründə Ulduzu öz qaçarağının tozu tutmazdı. Baxa bilməzdi Ulduz göylə uçur, ya yerdən uça-uça uçarağa qalxır. Ulduzun belinə gümüşlü-qızıllı yəhər qoyan Şükran atın belində ay kimi yaraşıqlı, ulduz kimi tamaşalı görünürdü. Elə bil ki, bu oğlan olmazın əfsanəvi süvari, misilsiz minici idi. Ulduz qanada qalxanda oğlanın ağ qoyunun yunundan toxunan ağ çuxası da ağ-ağ qanad açırdı. Şükranın qınından sivirib çıxardığı göy zağlı ləzgi xəncəri Ulduzun üstündə şimşək kimi oynayırdı. Şükran gündən-günə Ulduza yeni-yeni təlim keçir, ona sehrli əməllər öyrədirdi. Əvvəldən də az-çox təlim görən, uzaq Ərdəhan elində təlimlənən, indi də Göyəndə ayrıca məşq keçib təlim alan Ulduz Şükranın dilini, Şükran da Ulduzun dilini əzbərdən bilirdi. Şükran desəydi: "Ulduz, yat", Ulduz dərhal yatardı. Desəydi: "Ulduz, bu dağ-daşı bir göz qırpımında öt", Ulduz ötərdi. Şükran Ulduzun belində olsun-olmasın, Ulduz alışıb isinişdiyi minicisindən hər hansı bir əmr aldımı, dərhal yerinə yetirirdi.

Şükran da Ulduzun alovlanan gözlərindən öpür, ona kişmiş yedirir, baş-gözünü sığallayır, lazım gəlincə öz minici libasını sadəcə mehtər libası ilə əvəz edib, onu dırnaqlarından təpəsinə qədər üfürə-üfürə tumarlayırdı. Şükran həmişə Ulduzu çeşmənin gözündə suvarırdı. Ulduz göydə sayrışan ulduzun ən parlağı kimi parlayır, parıldayırdı. Baxan deyərdi Şükranı kəhkəşanlar aləmində səltənət quran ulu Tanrı elə bu Ulduzu da veribdir Şükrana. Ulduza da Şükran kimi misilsiz-müqabilsiz süvari qismət olubdur. Baxanda bunlar bir-birinin məftunu, aludəsi, vurğunu idi. Şükranın hayqırtısı Ulduzun kişnərtisinə, Ulduzun da kişnərtisi Şükranın hayqırtısına qarışıb, Göyən düzənlərini

doldurur, Ziyarət dağına səs-səda salır, fasiləsiz əks-sədaları ilə bütün bu aləmi dilə gətirib dilləndirirdi...

Ağqoyunluların at örüşlərində Ulduzla Şükranın qabağına çöp salan görünmürdü. Şükran da, Ulduz da hər hansı paxıllıqdan yuxarılarda, əl və ün çatmaz zirvələrdə dururdular. Heç bir ağqoyunlu minicisi Şükranla Ulduza qibtə edə bilmirdi. Uzun cıdır yarışında Ulduzun çaparağına nəinki heç bir adlı-sanlı at çata bilmir, hətta onun tozuna belə yetişən görünmürdü. Demək olar ki, bütün Ağqoyun miniciləri ötüşmək bəhanəsilə Göyən cıdırına toplanırdı. Amma, əslində Şükranın Ulduzun belində necə oyun çıxarıb, olmazın məharət göstərdiyinə tamaşa edirdilər. El-oba, ağqoyunlu miniciləri qüdrətdən yaranan bu qoşa xilqətə əhsən deməkdən, xeyir-dua verib amin söyləməkdən yorulmaq bilmirdilər. Hər necə bərk-boş, dağ-daş, çınqıllı uçurum olursa olsun, Şükran öz Ulduzunun belinə qondumu, üzünü hansı bir səmtə yönəltdimi, heç bir qorxusu yox idi. Ulduz heyrətamiz ustadlıqla, görünməzin cəsarət və çevikliklə bu çətin sınaqlardan qələbə ilə çıxacaqdı, öz minicisini ata-tuta sıldırımlardan, daş qayalıqlardan çıxaracaqdı, alqışlayanların müqabilində öz minicisi ilə birlikdə şux qulaqlı başını əyəcəkdi, öz güclü kişnərtisinə aləmə səs salıb, hamını matməəttəl edəcəkdi.

– Əhsən, əhsən belə Ulduza!

– Əhsən, əhsən belə süvariyə, ağqoyunluların birinci minicisinə!

– Şükür, şükür, Ziyarət dağına!

– Çox şükür, Şükranı da, Ulduzu da öz amanında saxlayan ulu Tanrıya ki, biz ağqoyunlulara belə bir tamaşa, belə bir zövq-səfa bəxş etmişdir!

Toplanan adamlar tərifdən qalmırdılar:

– Baxanda hər ikisi şimşəkdir, – deyirdilər. – Şükran da, Ulduz da od-alovdur, ildırımdır!

Belə vaxtda, Şükran öz ulduzunu çaparaq oynatdığı vaxt oğlan yerdə öz-özünə oynayan bir uşaq gördü. Şükran tezcə atını saxladı, enib Ulduzun ayaqları altına düşən uşağı tozun-torpağın içindən götürüb qucağına qaldırdı, qanad açan Ulduzun üstündə gəzdirdi, sonra da ata-tuta qaytarıb öz doğma anasına verdi:

– Al uşağı, qız! Bir də gözdən qoyma! Yoxsa bilməzlər, uşağın at ayaqları altına düşər.

– Bəs Şükranın Ulduzunun ayaqlarının altına düşməyən uşağa nə ad vermək olar?

– Şükrandan da artıq bir oğlan!

– Əgər bu uşaq qızsa, kimə bənzədək?

– Onu mən deyə bilmərəm!

Sevgili qıza işarə olunduğunu alınca Şükran qıpqırmızı qızardı. Tezcə Ulduzu tərpədib aralandı. Sonra Sevgilinin gözlərinin qabağında Ulduzu hərləyib Göyən düzənində hey çapır-çapırdı.

– Ay qız Sevgili, nə vaxtacan sevginiz gizli qalacaqdır?

– Nə sevgisi, gəlinbacı?

– Adam sevgisi! Siz elə bilirsiniz ki, bu Göylər oymağında adamların gözləri görmür? Göylər adamı çörəyi qulağının dibinə yeyir?!

– Görünür, gəlinbacı, sevgi güclü olsa, vaxt yetişsə, vədə çatışsa, hamı da bilər!

– Axı, daha nəyi gözləyirsiniz? Daha bu yay ötüb payızına gəlincə toyunuzu çaldıraq, ağqoyunluların ağçuxalılarını Göylərin Göyən düzəninə gətirək, qoy davullar dov-dov vursun. Qoy ağsaçlı, ağsaqqallı ozanlarımız saz çalsınlar, qoy ozanlar oxusunlar, qoy sonra da qız-gəlinlərimiz, ərgən oğlanlarımız lap qocalarımıza qədər yallı tutsunlar! Qoy Göyalı oğlu Şükranla Elşad qızı Sevgilinin xeyir işində göydəki mələklər də Göyən tamaşasına çıxsınlar. Qoy ulu Tanrımız özü də dayandığı kəhkəşanlı təlin üstündən, Ziyarət dağının baş qülləsindən bizə baxsın. Göylər bizə əhsən, afərin desin. Axı ulu Tanrı özü Şükranı yeddilər üstündə nəzir-niyazdan sonra veribdir. Axı Şükran əvvəlcə ata-anasının, bacılarınınsa da, getdikcə bizim hamımızın, Göylər oymağının, göyənlilərin, ağqoyunlu elinin ağçuxalı, Ulduz atlı oğlanı olubdur. Heç bir el çadırda bizim ağçuxalıların qabağına çöp sala bilməz. Bax, sənin Şükranın belə oğlandır. Allahın kəráminə şükür eləmək, toyu da tezləşdirmək gərəkdir, Sevgili!

– Arada nişan olmamış nə toy, ay gəlinbacı?

– Biz sizin nişanınızı da, toyunuzu da bir yerə qatarıq!

– Bəlkə sən söyləyənlərdən Şükran heç bir şey bilmir?!

– Bəs sən necə?

– Mənmi, gəlinbacı?

– Bəli sən, Sevgili Elşad qızı!

– Mən də... heç nə... bilmirəm, gəlinbacı...

– Bəlkə sən bilmirsən... ancaq Şükran bilir?

– Şükranın bildiyi nədən bilinir?

– Ulduz üstündə qanad açmağından, Göyən düzənlərini gəzə-dolana sənə tamaşa etmək üçün çeşməyə gəlməyindən!

– Belə olsaydı, Şükranın dili açılmazdımı? Şükranın ürəyi açılmamışdırmı?

– Hər hal dil iqrar üçündür!

– Düzdür, dil iqrar üçündür, ancaq sevgi üçün ürək gərəkdir. Sevgiliyə söz demək üçün, onu ürəklə ovsunlamaq Şükranın yolunu kəbəmizə-çeşməmizə salmaq üçün Sevgili gərəkdir, Elşad qızı Sevgili!

– Atam Elşad eşitsə, məni tikə-tikə doğramazsa, gəlinbacı?

– Atan Elşad Elbəy oğlu bilməmiş olmaz! Köhnə ovçunun gözündən heç nə yayınmaz!

– Yox, nə ovçu atam, nə qoyunçu anam, nə xırda bacılarım, nə də böyük qardaşlarım bir şey bilirlər!

– Demək, bircə siz ikiniz hər şeyi bilirsiniz?

– Düzü, hələlik bircə mən ağılsız, ağlı başından oynayan kamalsız bilirəm, ya bilmirəm!

– Sevginin əsil əlaməti öz ağlını, kamalını itirməkdir, bir könüldən min könülə sevdiyinə vurulmaqdır! Ağlını, kamalını itirib-itirib el içində dəli-divanə olmaqdır!

– Bəli, aşiq-məşuq belə olmalıdır. Eşq atəşinə düşüb yanmalıdır. Şükransız yaylağa getməyib, aranda, Göyəndə yana-yana qalmalıdır!

– Sən tamamən, gəlinbacı, mənim sirrimi açdın!

– Eşqin açılan sirrinə ulu Tanrı heç nə deməz, Elşad qızı!

Belə bir vaxtda ağsaçlı Qaratel saralmağa başlayırdı:

– Çox yamanca qorxuram, Göyalı!

– Nə üçün, Qaratel, ürəyin açılmaqdansa sıxılmağa başlayır? – deyə Göyalı göynəyirdi. – Mən səndən, Göyəm qızı, heç cür baş açmıram!

– Yenə də əvvəllərdə, Ulduzu almaq istəyən zamanlarda qorxduğum kimi, ondan da artıq qorxuya, vahiməyə düşürəm, Göyalı! – deyə Qaratel hər iki əlini qoynuna qoyurdu. Göyalı hiddətlənirdi.

– Yenə də deyirəm, ağzını uğura aç, ana!

– Mən də ağzımı uğura açmaq istəsəm də, uğursuz qaraltı ürəyimə damır, Göyalı! – Arvad titrətmə tutunca qoynuna qoyduğu əllərini qoynunda ovuşdururdu. – Elə bil ki, çox yamanca bir müsibət baş verəcəkdir... Elə bil ki, hansı bir sıldırımdansa Ulduz uçacaqdır... Elə bil

ki, Şükran əlimizdən çıxıb gedəcək, günümüz qaralacaq, günəşimiz sönəcək, başımızı ucaldan daş-qaşlı tacımız torpağa gömüləcəkdir!

Bəyalı oğlu ilə Göyəm qızının söhbəti qızışırdı:

– Sən uğursuz-uğursuz az söylən, ana!

– Mən ürəyimi, ürəyimə daman uğursuz qara-qara damcıları səndən gizlətmək istəmirəm, Göyalı!

– İndi əmrin nədir, Qaratel? İndi fərmanın nədir, Göyəm qızı!

– Təvəqqem Şükranı Ulduzdan düşürməkdir, Göyalı! Onu dildən-dişdən qurtarmaq, gömgöy göyərən gözlərdən uzaqlaşdırmaqdır!

– Demək, Şükranın şəhpərini sındırmaqdır?

– Yox, Şükranı tək daha heç yana buraxmayıb, özcə yanımızda sağ-salamat saxlamaqdır!

– Bəlkə sən, Qaratel, Şükranın əlinə bir toppuzbaş çomaq verəsən, başına da bütöv bir qoyun dərisindən bir yastı-yapalaq papaq qoyasan, çiyinlərinə də bir tüksüz yapıncı, ya palaz cecimdən cürcənək salasan, çarıqlı-patavalı toz-torpaqda çapalayan bir çoban-çoluq edəsən?!

– Mən Şükranı eləcə bir çoban-çoluq cərgəsində sağ-salamat görmək istəyirəm, Göyalı!

– Onda mən torpağa gömülləm, Göyəm qızı! Mən Şükrana alışmışam, onun üstündə əsirəm!

– Bəs qalanları? Bəs sənin başqa-başqa övladların? Bəs sənin son ildə cer-cehizlə köçürdüyün sevimli qız, sonbeşiyin?

– Mən qızlarımın hamısını çox sevirəm, bir-birindən artıq sevirəm, ata məhəbbətilə istəyirəm! Şükran isə mənim ulu Tanrımdır!

– Dedim ki, Göyalı oğlu, Şükrandan yana qara daman ürəyim qorxudadır! Ulduzun belində Şükrana heç bir zaval toxuna bilməz, xanım!

– Elə Ulduza görə qorxuram. Axıracan ata etibar etmək olarmı?!

– Elə də arvada.

– Bəs sən necə, Göyalı?

– Mən qara saçları üstümüzdəki Ziyarət dağının qarı kimi ağaran Qaratelimə həmişə etibar eləmişəm, – deyə Göyalı ömür yoldaşının ağaran saçlarını sağ əlilə sığalladı. – Bizim aramızda paklıq olmasaydı, heç o ucalıqda Ziyarət dağına dırmana bilərdikmi? Ulu Tanrımıza qovuşub Şükranı diləyə bilərdikmi? Şükrana bu tamaşada misilsiz bir yelqanadlı at ala bilərdikmi?

– Yox, heç yox, Bəyalı oğlu Göyalı!

– Daha onda niyə öz etiqadını itirirsən, Göyəm qızı?

Qaratel titrəyən əlini tir-tir titrəyən, danışdıqca çırpınan ürəyinin üstünə gətirdi:

– Düzü, ürəyimə hey qara damcıdır, damır!

– Şeytana lənət de, Göyəm qızı!

– Min-min lənət şeytana, şərə!..

– Tanrıya da min-min şükür de, Göyəm qızı!

– Bəli, bəli, Göyalı oğlu! Ulu Tanrımıza, Ziyarət dağımızın övliya-ənbiyalarına min-min şükür!

Belə söz-söhbətdən sonra Bəyalı oğlu Göyalı ömür yoldaşı Göyəm qızı Qarateli toxtatmağa, arxayınlaşdırmağa cəhd edir, ancaq Göyəm qızı hər necə toxtamaq, Şükrandan arxayınlaşmaq istəsə də, arxayınlaşıb toxtaya bilmir, onun ürəyinə qara damcı damır, damırdı...

## V

Gümüş saçlı Qaratel belə sevinc içində ola-ola hansı ecazkar ana ürəyi ilə öz sabahının qara günlərini görüb belə qorxuya düşürdü? O öz övladının başı üstündə qovlanacaq qəza qılıncını necə gördü? Ana ürəyinin kövrəkliyi, həssaslığı iləmi?

Bəlkə belədir: xilqətdən ata ürəyi sərtdir, daşdır? Axı ata ürəyi ana ürəyi qədər yumşaq, kövrək olmasa da, daş da deyildir! Ata ürəyi də öz övladını atəşin bir hərarətlə sevir, istəyir, övladının üstündə tir-tir əsir... Ancaq ata ürəyi öz iztirablarını gizlətməyə cəhd edir, çox zaman dost-düşmənini göz qabağına gətirir, öz ürəyini gizlətməyi də bacarır. İndi bəs burada Bəyalı oğlu Göyalının ürəyi necədir? O arxayındırmı? Ana ürəyinin iztirablarına qarşı biganədirmi? Göyalının ürəyi də içəridə titrəməyə, Şükranın üstündə əsməyə başlayır. Ancaq belə baxanda burada nə var idi? Hər şey öz yerində, öz qaydasında, öz axarında deyildirmi? Belə anlaşılmaz qaraltı qarşısında Şükranı Ulduzun belindən düşürüb, onun şəhpərini sındırıb bir qırağa atmaq olardımı? Şükranı Ulduzdan ayırıb Ulduzu dəyər-dəyməzinə satmaq, Göyən düzənliklərindən ilin yay aylarında yaylağa qalxan zaman ala yaylaqlardan, güllü-çiçəkli çəmənlərdən, qaynar gözlü, buzlu bulaqlardan məhrum edib, bu aralardan ilim-ilim itirmək olardımı? Belə olsaydı, onda Şükranın şəhpəri sınmaz, qanadları qırılmazdımı? Bir də bəzən belə olurmu, insan durduğu yerdə, elə ciddi səbəb olmadan öz-özünə qaralsın, qaraltılı-qorxulu şübhələrə düşsün? Bəlkə burada gümüş

saçlı Qaratel öz aşıb-daşan xoşbəxtliyinin, Şükrana görə özünün hədsiz sevincinin içindən bir bədbəxtliyin çıxa biləcəyindən vahiməyə düşür? Üzdən baxanda nə deyib, nə etmək olardı? Kim Qaratelin, Göyalının yerində olsaydı, günün, güzəranın bu yerində nə edə bilərdi? Bu halda, Ulduzun belində qanada qalxan tək oğlunun qanadlarını necə qırardı? Onu əfsanəvi Ulduzun belindən düşürüb piyada edərdi, Göyən düzənində qoyun sürülərinin qaldırdığı yay tozlarının içinə tullardı?

Qaratel öz oğlunu Ulduzun belindən salmağa cəhd etsə də, Bəyalı oğlu Göyalı nə Ulduzun, nə də Şükranını şəstinə qıyır və qıya bilirdi:

– Axı niyə, nədən ötrü belə bir oğlun qol-qanadını qıraq, – deyirdi. – Onda görən, eşidən mənə nə deyər?

"Ulduzun belinə bu çöllərin, dağların qartallarından da artıq qartalcasına qonan, qartaldan da artıq qanad açan Şükranı bəlkə də ağqoyunlularda yüzdən də artıq qız sevibdir? Bəlkə də Şükran yüz gözəlin içindən tək birisini seçibdir? İndi də o öz sevgisini sınaqdan çıxarır ki, iyirmi yaşına dolunca öz eşqini on yeddi yaşlı qıza elan etsin, ata-anasına da bildirib elçi göndərsin?" – deyə düşünən Göyalı öz şirin xəyalına davam edir, qayıtmaq, başqa bir qaraltıya yol vermək istəyirdi. "Belə olsun ki, biz də həmin qızı elçiləyək, nişanlayaq! Belə olanda Şükran daha da artıq qanadlansın, aranlarımızda, dağlarımızda daha da artıq qanad aça-aça uçsun; Ulduz da göydə sayrışan ulduzlardan güclü sayrışsın, göz qamaşdırsın. Biz də Şükranın toyuna hazırlaşaq. Ağqoyunlu gözəli ilə onun toyunu edək. Ağqoyunluların yüz-yüz atlıları Şükranın toy cıdırına çıxsınlar, birincilik uğrunda çapışsınlar, zurna-balabanın, toy-nağaranın səsi aləmi doldursun, onlar qırmızı yaylıq nəməri uğrunda qoşsunlar, qalib çıxan atının boynuna qiymətli qırmızı yaylıq bağlasın! Mən də gümüş saçlı Qaratelin əlindən tutum. Şükranın toyunda bəsdi deyincə oynayıb, oxqay deyim, sonra ağqoyunlular adətincə Şükran da sevgilisinin əlindən tutsun (deyək bu qızın adı Sevgili olsun), onlar oynasınlar, oynasınlar, onlara baxan ağqoyunlular arvadlı-kişili, qızlı-oğlanlı yallı tutub cərgələnsinlər, cərgələnə-cərgələnə Göyən düzənlərini doldursunlar. Onlar Göyən düzənlərinin payızında, bizim dildə deyilən son baharında qışqırıq qopara-qopara, hay-haray sala-sala, hey qatarlana-qatarlana yallı getsinlər. Onda qoy Bəyalı oğlu Göyalı da şərbətdən sərxoş olsun. Şükranın toyunda elə nəşələnsin ki, elə zövq-səfa aləminə varsın ki, daha düşməni tar-mar

edən, qoşunbaşı sərkərdədən də yuxarıya qalxsın. Qoy onda ağqoyunlular elinin, Göylər oymağının sakini, on ildən bəriyə babalaşan Göyalı oğlu bu dünyadan doyunca kam alsın... Bu dəfə bu çeşmə, o dəfə o çeşmə üstündə süfrə açsın, köz üstünü kabab şişləri doldursun. Birdən də bütün cəmdəklər iri-iri payalara keçirilsin, tonqal közlərində hərlənə-hərlənə qızardılsın. Bəlkə də haradansa, şəriət qadağan edən şərab küpləri də gizli gətirilsin. Bizdən xəbərsiz gizlin-gizlin içilsin, sonra da: "Ulu Tanrı, sən özün günahımızdan keç!" – deyə al şərab ağaşkar nuş edilsin, oğlanlar içsinlər, qızlar, gəlinlər şərbət adı ilə şərabın dadına baxsınlar, al dodaqlarını büzsünlər. Bu zaman qışqırışma qalxsın, sözlər çarpışsın.

– Biz içək şirin şərbəti!

– Biz içməyək dədə-baba içməyən şərabı!

– Bu üzüm suyudur, üzüm suyu, qızlar!

Ağsaqqallar araya düşsün:

– Yeyin üzümü, ömrümüzdə içməyin üzüm suyunu, balalar!

– Bəs Şükranın sağlığına nə deyək, balalar?

– Bəs Sevgili ilə Şükrana nə xeyir-dua verək?..

– Hər ikisinə xoşbəxtlik diləyək, balalar! Onların ikisinə də uzun ömür, xoşbəxtlik arzu edək!

– Qoy Bəyalı oğlu Göyalının yeddi qızı, bir oğlu olduğu halda, Şükranla Sevgilinin yeddi oğlu, bircə qızı olsun!

– Qoy onlar oğlan yeddilərinin üstündə bircə qız tapmaq, yeddi oğlana bircə bacı diləmək üçün nəzir-niyazla Ziyarət dağına yollansınlar. Ziyarət dağının daş altında yatan övliyalarını ziyarət edib, bu dağın kəlləsinə qalxsınlar. Oradan: "Ulu Tanrı, sən bizim yeddi qardaşa bircə bacı ver" – deyib dilək diləsinlər. "Bu da yeddilərin üstündə bircə bacı olsun. Bəs bu bircə qızın adı nə olacaqdır?" – deyə gözəl arzular içində xəyala gedən ata ürəyindən keçirirdi.

Öz ömür-gün sirdaşı Qarateldən aralandı, öz bədbin qaralanmağını qovub nikbinlik ruhu ilə fərəhlənən, Şükran üçün gözəl sabah, günlü gün, parlaq günəş diləyən ata bu ad üstündə udquna-udquna qalırdı: "Qoy onda bu ad...". Göyalı bu qız nəvəsinin adını gələcəyə saxlayırdı. Axı bu qız yeddi qardaş üstündə tapılacaq qız idi. Bu qıza elə ad yaraşdırmaq, qoymaq gərək idi ki, ağqoyunlu oymaqlarında olmasın... Yəqin ki, onda Göyalının yaşı yaxınlaşacaq, ya da yüzü aşacaqdır? Bəs Qaratelin yaşı neçə olacaqdır? Bəyalı oğlu Göyalıdan on yaş kiçik olan

Göyəm qızı Qaratelin yaşı da doxsanı haqlayacaqdır. Onda ulu baba, ulu nənə Şükranın və Sevgilinin yeddi oğul üstündə tapılan tək qızını sevəcəklər, bu qızı oxşayacaqlar, öpəcəklər, bu qızı dağ çiçəklərini andıran libaslarla tez-tez bəzəyəcəklər, düzəyəcəklər. Məgər yox idimi Qaratellə Göyalının qız nəvələri?.. Var idi!.. Onların qız, oğlan nəvələri bəsdi deyincə var idi. Ancaq hələ ki, Şükrana toy olunmamışdı, bu cavanın övladı da yox idi.

Şükran on doqquz yaşının içindədir. Ulduzun belindən düşmək istəmir. Görünür, Göyalının öz oğluna arzu etdiyi həmin Sevgilini Şükran axtarır, çox bərk axtarır!.. Hardadır Ağqoyunlu gözəli Sevgili?.. Yox, Şükran axtarır, çox bərk axtarır!.. Əgər Şükran Sevgilini tapsaydı, yəqin ki, anasına andırar, bacılarının, yeznələrinin birisinə söz çatdırıb, deyərdi: bəs mənim qocalarıma yetirin ki, axtardığım gözəli tapmışam. Demək, hələ Şükran həmin Sevgili qızı axtarır, axtarır... Bu qız yaxındadır, ya uzaqdadır?.. Bəlkə, bu yaxınlıqda olsa bu qız, daha Şükran niyə uzaqlara varsın, dərə-təpəyə düşsün, Ulduzun üstündə süzsün? Bu Sevgilidir, ya başqa bir oymaqdan olan Sevgili?! Belə olanda o necə də Ulduzsuz Sevgilini axtara bilər? Axı Ağqoyunlu oymaqları Aran elində beş deyil, on da deyil, çox-çoxdur! Demək, bütün Ağqoyunlu oymaqlarını axtarıb Sevgili adlı sevimli qızı tapmaq üçün Şükrana belə bir atqanad gərək idi!.. Yəni Ulduz gərəkdən də artıq gərək idi!..

Belə xoş xəyal içində düşünməkdən üzülmək istəməyən Bəyalı oğlu Göyalı Göyəm qızı Qaratelin gümüş telini tumarlayıb, çoxdan nənələşən gözəlin qırışan alnından öpdü:

– Deyirəm gərək ağqoyunlu gözəli Sevgilinin toyunu edək, Qaratel!

– Hansı ağqoyunlu gözəli? Necə Sevgili, kişi?

– Şükranın axtardığı ağqoyunlu gözəli Sevgili!

– Yəni Şükran tapmışmı Sevgili deyilən dünya gözəlini?

– Şükran, görünür uzaqlarda axtarır, neçə-neçə Sevgili adında qızdan birisini axtarır, Qaratel. O tapacaqdır, bizim Göyənin – Göylərin ağbirçəyi!

– İlahi, qoy Şükran belə bir gözəli – Sevgilini yaxında, yaxın zamanda tapsın! Qoy biz qocalar toyda qoşa süzək. Sən özün Şükrana yeddi oğul, bir qız ver!

– Qaratel xanım, sən lap ürəyimdən xəbər verirsən! Mən də özözümə belə arzu eləmişəm. Yeddi oğul, bircə qız!

– Belə olanda, hazırlaşaq, kişi! Yenə də Ziyarət dağına gedək, Göyalı. Daha tələsməyək, tez dönməyək! Tamam bir həftə Ziyarət dağında qalaq, çatdırıb ziyarət edə bilmədiyimiz övliya-ənbiyaların hamısını bircə-bircə ziyarət edək. Yenə də həmin başı göy buludlu zirvənin özünə qalxaq, əlimizi dərgaha qaldıraq, deyək: "Ulu Tanrı, sən özün qov, uzaqlaşdır bizdən bu qara-qara qaraltını, sakit et bizim tir-tir titrəyən ürəklərimizi! Özün verdiyin Şükranın başından tək bircə tük də əskik etmə! Onu zavaldan qoru, onu Ulduzun belində salamat saxla. Özün də onu tezcə bir zamanda Bəyalı oğlu Göyalı deyən Sevgili yetir! Qoy biz axıracan muradımıza çataq... İlahi, sən bizi naşükür sayma, biz indi bütün oğlan, qız nəvələrimizi özümüzə oğul, qız bilib sənə şükür edirik. Deyirik min də yox, milyon kərə şükür olsun bizim ulu Tanrımıza ki, uca Ziyarət dağından bizim səsimizi eşitdi, iltimasımızı qəbul etdi, yeddi qıza bir qardaş qismət göndərdi!

Göyalı ilə Qaratel yenə də Ziyarət dağına hazırlaşır, bir-birinə ürək-dirək verir, Ulduzun belinə qalxan, düz-dünyanın qanadlana-qanadlana dolanıb qayıdan Şükranın boyunu sevir, həm Şükranı, həm də onun Ulduzunu doyunca oxşayıb öpürdülər:

– Ulu Tanrı, çox-çox şükür! Ziyarət dağı, çox-çox şükür, övliya-ənbiya, sizə çox-çox şükür!.. Min-min minnət!

## VI

Göz qoyub baxanda Şükranla onun Ulduzu arasında elə bir ülfət, elə bir görünməzin dostluq başlamışdı ki, daha çox çətin ki, bunları bir-birindən ayırmaq olardı. Görünürdü Şükran Ulduzsuz, Ulduz da Şükransız nəfəs ala bilmir, onlar bir-birindən ayrı dura bilmirlər. İnsanla insan arasında ülfət, dostluq, bir-birinə bağlılıq, sədaqət, səmimiyyət – əsil insani keyfiyyətlərdəndir. Ancaq insanla at arasında olan ülfət-dostluq da dünya üzündə yox deyildi. Ancaq bu dostluq ki, Şükranla Ulduz arasında başlamışdı, misli-bərabər nəinki Göyəndə, Qaraqoyunlu oymaqlarında, bəlkə də bütün mahalda, yaxud bütün dünyada yox idi. Sanki bu dostluq insanla Ulduz adlanan at arasında deyil, çox nəcib, əsil insanla insan arasında idi. Sanki bunlar bir-birinin dilini tamam-kamal bilir, bir-biri ilə əməlli-başla dillənib danışırdılar. Birdən də ərklə bir-birindən küsür, üstündən az ötüncə barışırdılar. Bu vaxt hər ikisinin gözləri gülür, sevincləri öz yerinə qayıdıb kefləri

durulurdu. Elə bil ki, bunların hərəsi itirdiyi dünyanı bir də təzədən tapırdı. Elə bil bunlar ikisi bir can, bir qəlb idi. Birisi bikefdirmi, o birisi də bikefləyirdi; birisinin kefi kökəldimi, o birisinin də kefi kökəlirdi. Şükran nəşələnib nəğmə oxuyunca Ulduz şuxlaşır, öz qəribə kişnərtisi ilə düzü-dünyanı doldururdu. Bəli, Şükranla Ulduz bir-birini ifrat dərəcədə sevir, bir-birinə nəzakət göstərib hörmət edir, bir-birinin xidmətində dururdu. Bir də elə bil ki, birisinin ürəyindən keçəni o birisi bilirdi. Onlar bir-birinin ürəyini sındırmaqdan çəkinirdilər, qorxurdular. Bu iki xilqətin arasında elə bir ülfət yaranmışdı ki, müqayisə mümkün deyildi. Ulduz Şükranı öz qızılı-gümüşü yəhərinin içində daha mənalı görürdü. O, Şükranı qanadları üstündə uçurunca, nəinki ayrı-ayrı adamlar, hətta oymaqlar, obalar, ellər, tayfalar, bir də elə bil ki, bütün çöllər, dərələr, təpələr, çaylar, çeşmələr tamaşaya çıxıb heyran-heyran baxırdılar. Göyalı ilə Qaratel bu oğlanın qüdrəti və sehrilə sevinirdilər.

Doğrudur, Ulduz öz qabaqkı yerində, Ərdəhan elində azmı-çoxmu məşq görüb, təlimlənmişdi. Ancaq Şükranın misilsiz saf ürəyi, sevgisi, məhəbbəti Ulduzu ecazkar dərəcəyə gətirib çatdırmışdı, yetirib yetişdirmişdi. Ürəklə olan ürək istəyən kimi olur. Şükranın böyük insan ürəyi Ulduzu da böyük ürək sahibi etmişdi və getdikcə bu ürəklərin hər birisi böyüyür, getdikcə bunların bir-birinə olan məhəbbəti güclənir, aşıb-daşır, bunlar bir-birinə qulluq göstərib xidmət etməkdən yorulmurdular, bir-birinə olan xidmətlərindən son dərəcədə zövq alırdılar, nəşələnirdilər, bir-birinin gözündən öpürdülər. Şükran Ulduza xidmət etməyi başqa bir kəsə tapşırmır, Ulduzu yedirib-içirməyi heç kəsə arxayın olmurdu. İlin isti aylarında Ulduzu yumaq, at ipəklə-qumaşla qurulamaq ilin soyuq aylarında Ulduzu üfürə-üfürə tumarlamaq Şükranın öhdəsində idi.

– Oğlum, bəlkə mən də sənə kömək edim?

– Nə barədə, ata?

– Sənin Ulduzunu yayda yumaq, qışda tumarlamaq, bir də yedirib-içirmək barədə!

– Sənin öz işin azdımı, ata?

– İndi mənə kömək edən çoxdur, Şükran, – deyə Göyalı öyünürdü, – nəslimiz böyükdür, mənim ulu Tanrım verən oğlum! Sənin uğurlu ayağına görə mənim nəvələrim – sənin bacı uşaqların törəyiblər, boy

atıb yekə oğlan olublar. Hələ yeznələrinin nəcabətinə gəlincə, heç kəs Ağqoyunlu elində bizimlə bəhsəbəhsə girişə bilməz!

– Yenə də Bəyalı oğlu Göyalının işi çoxdur!

– Bəyalı oğlu Göyalının ürəyi, dirəyi, nəfəsi, canı-ciyəri bir adam üstündə cəm olunubdur.

– Bəs başqaları necə, babası?

– Başqaları da mənim can-ciyərimdir!

– Ancaq...

– Ancaq Şükranı necə sevdiyimi özüm də anlaya bilmirəm, – deyə ata acizləşirdi. – Bilmirəm niyə mən Şükranla belə bir tilsimlə bağlanmışam? Şükrandan bir balaca nigaran olanda, Şükran gözümdən iraq düşəndə nəfəsim çatışmır.

– Ağqoyunlularda məsəl var deyərlər: "Qorxan gözə çöp batar", ata!

– Xüsusən anan Qaratel çox yamanca qorxur, oğul!

– Nədən qorxur bizim Göyəm qızı?

– Səndən yana çox yamanca qorxur, Şükran!.. Hətta deyir ki, qoy bizim Şükran Ulduzun belindən düşsün, ürəyim arxayınlaşsın, özüm də sakitləşim!

– Ulduzsuz yaşamaq mənə mümkün deyildir, ata!

– Mən bunu bilirəm, Şükran. Ancaq ana ürəyinin hikməti də böyükdür... Bəlkə sən doğrudan da Ulduzdan əl çəkəsən?

– Yəni piyadələnəm?

– Piyadələnməyinə qıymıram, səni qanadlı qartalın belindən alıb yerə salmaq istəmirəm.

– Bəs onda necə olsun, dədə?

– Gərək sərvaxt olasan, oğlum, gərək ayıq olasan, Şükran! Elə ayıq-sayıq olasan ki, sənə heç bir zaval toxunmaya!

– Ulduz olan yerdə mənə necə zaval toxuna bilər, dədə? Ulduz mənim varlığımdır. Mən qanada öyrənmişəm, ata! Ulduzsuz mən tozda-torpaqda sürünnəm, vallah!

– Bəlkə sənin üçün bədnəzərə gəlməyən başqa bir at tapaq, Şükran?

– Bəs Ulduz?

– Ulduzu uzaqlaşdıraq!

– Ulduz uzaqlaşmaz, dədə! Uzaqlaşsa, tablamaz, Ulduzun ürəyi partlar, Ulduz Şükransız yaşamaz! Ata, mən varamsa, Ulduz da vardır, mən yoxamsa, Ulduz da yoxdur!

– Atın ömrü insan ömründən qat-qat qısa olur, Şükran!

– Mən Ulduzun qocalığına da hörmət edəcəyəm, ata!

– Bəs sonra, Şükran?

– Özüm də bilmirəm, dədə! Bilmirəm Ulduz qocalandan, işdən düşəndən sonra necə yaşayacağam?

– İnsan da atla bu qədər bağlanarmı, Şükran!

– Özüm də bu sirdən agah ola bilmirəm, ata!

Belə söhbətdən sonra Şükran öz Ulduzuna yaxınlaşınca onun ağladığını görürdü. Demək, Ulduz ata ilə oğlun danışığını duymuşdur. Bu vaxt Şükran cibindən Ağqoyunlu qızlarının naxış-naxış işləyib hörmətmi, ya sevgimi əlaməti olaraq ona bağışladıqları dəsmallardan birisini çıxarıb Ulduzun gilə-gilə yaş gələn gözlərini silir, onun yanlara yatan qulaqlarını dartışdırır. Yox, yox, Ulduzun kefi durulur, ağlayan gözlər alov içində yanır, qulaqları dimdik dikəlib şux-şux oynayır. Ulduz dodaqlarını gətirib Şükranın qıvrım-qıvrım tük bürüyən o üz-bu üzündən öpür. Şükran da dönüb Ulduzun o göz-bu gözündən, o üz-bu üzündən öpür. Onlar tay-tuş uşaqlar kimi oynaşırlar. Gendən göz qoyan Göyalı görür ki, Ulduzla Şükran necə bir-birinə bağlanıblar. Öz tək oğlunu öz canından qat-qat artıq istəyən, əziz tutan Göyalı dönüb oğlunun Ulduzunu da bərk-bərk istəyirdi. Göyalının nəzərində Ulduz atdan da artıq tək oğlu Şükran üçün ikinci bir qardaşa çevrilirdi. O özünü toxtadınca belə bir qənaətə gəlirdi ki, Şükran nə dərəcədə Ulduzu sevirsə, Ulduz da o dərəcədə Şükranı sevir, onlar bir-birinə ayrılmaz dərəcədə alışıblar, isinişiblər. Belə olanda Göyalı da Ulduzu oxşayırdı, sevirdi. Oğlu Şükranı bu Ulduzsuz təsəvvürünə gətirə bilmirdi. Odur ki, həmin qaraltıları qovmaq üçün dönüb, yenə də Ziyarət dağına dəxil düşür, bu dağın daş altında yatan övliya-ənbiyalarına minnətdarlıq göstərir, kəhkəşanlı ulduzlar dünyasında səltənət salan ulu Tanrıya təkrar-təkrar şükür edirdi. Şükür edirdi ki, necə də o öz dərgah qapısını açıb olmazın səxavət göstərdi, necə də Şükranı gözəl-göyçək, qoçaq-çevik bir oğlan yaratdı. Necə də Şükrana bütün dünyada misli-bərabəri tapılmayan bir qanadlı Ulduz qismət etdi.

## VII

Ulduz doğrudan da Ulduz idi. O, göylərin ulduzlarından da artıq yerin – bu gözəl aləmin Ulduzu idi, onun qaçarağından ağ-ağ şölələr saçılırdı. Elə bil ki, Şükran atdan da artıq Ulduzu minib uçurdu. Axı ta

qədimlərdən bəriyə "su – aydınlıq, at – muraddır" deyiblər. Əgər yuxuda su görmüsənsə, aydınlıq olacaq, at görmüsənsə, muradına çatacaqsan. İndi Şükran həqiqətən murada çatmışdı. Ona belə ecazkar qanad, qanaddan da artıq vəfalı dost qismət olmuşdu. Özü də bu vəfalı dostluğun nəcib və gözəldən gözəl rəmzi olaraq ulduzlu oğlanlar əmələ gəlməyə, cavan Şükranın çoxlu-çoxlu şagirdləri yaranmağa başlamışdı. Baxanda bütün Göyən oymaqlarında yeniyetmə cavanlar Şükranı təqlid edir, Ağqoyunlu elində ulduzların sayı çoxalır, az qala bu ulduzların sayı yüzdən yuxarıya qalxırdı. Bu hal Ağqoyunlu elinə olmazın fərəh gətirir, olmazın dərəcədə bu elin qürurunu artırır, başqa-başqa ellər içində ağqoyunluların başını uca edirdi. Bu ulduz atlılar hər yerdə xeyir işə kömək edir, şəri-şeytanı dəmir nallarla tapdayıb keçirdilər. Bu yeniyetmələr yolda yorulanlara kömək əlini uzadır, Şükran sayağı at belinə qaldırıb mənzilə çatdırırdılar. Ancaq bütün ulduzların içində yenə də həmin-həmin Şükranın Ulduzu birinci idi, baş idi, necə ki, özü də Ağqoyunluda birinci idi, baş idi!

Xoşbəxtliyin belə süd kimi ağ-çağ çağında birdən-birə qara milçək çıxmağa, süd içindən çıxan qara milçək kimi ürək bulandırmağa başladı. Ürək bulandıran ölü milçəyi qırağa atarlar, ya da ölü milçək düşən süd qabını bir kənara boşaldıb özünü də yaxşı-yaxşı qumla sürtə-sürtə yuyub, yaxalayıb, salavatlayıb bir qırağa qoyarlar; bir azdan da bu qara milçəyin ağ süd içinə necə düşüb-düşmədiyini də unudarlar. Ancaq burada peyda olan elə də adəti qara milçək deyildi, çox yekə, çox da qara bir mozalan idi. Bu mozalan başqa yana da yox, Ulduzun canına ariz olmağa başlamışdı... Ağqoyunlu elinin qoyun sürüləri Ziyarət dağının yan-yörəsindən keçib, yuxarılara, alayaylaqlara yol aldığı zamanda, hələ elin dalı Göyəndən üzülmədiyi bir vaxtda, yaz yaya yaxınlaşdığı günlərdə, qızmarlaşdığı dəmlərdə bu mozalan da qızırdı, qızışırdı, ara-ara Ulduzun üstünə düşürdü. Mozalan Ulduzu dişləyirdi, oradan-buradan çalırdı, Ulduzun qanını sorub-sümürürdü. Əvvəlcə Şükran bu qara mozalanı görə bilmədi, nə qədər göz qoyub, göz gəzdirdisə də, bu qara mozalanı tapa bilmədi. Şükran Ulduzun yaralarını yudu, onun canını qandan təmizlədi, qayıdıb yaralı Ulduzun gözlərindən öpdü, qıdıqlayıb tərpətdi. Ulduzun könlünü aldı, birtəhər köhlənin kefini açdı.

– Sənə nə olub, igid Ulduz?

Ulduz öz asta-azacıq kişnərtisi ilə şikayətləndi: "Bir qara mozalan üstümə düşübdür".

– Qara mozalan nədi ki, onu saya-hesaba alasan?

"Qara mozalan hər nə olub-olmasa da mənə göz verib işıq vermir", – deyən Ulduzun qaşqabağı tökülürdü. Sanki Ulduzun gözündə işıqlı dünya zülmətə çevrildi. Ulduz birdən qaraldı, qaralınca Şükran da qaraldı. Şükran istədi qara mozalan barədə öz ata-anasına desin, əhvalatı açıb bildirsin, ancaq onların narahatçılığını artırmaq, son günlərdə özünü bildirən həyəcanlarını coşdurmaq istəmədi. Bir də başqa eşidib-bilənlər nə deyərdilər? Deməzdilərmi bu boyda qartal qanadlı Şükran niyə bir qara mozalandan yana vahiməyə düşübdür? Doğrudan da Şükran özü söyləyən sayaqda, bir qara mozalan nədi ki, ondan da ürküb çəkinəsən? Mozalan nə əqrəb, nə də gürzədir ki, ondan qorunasan, ehtiyat eləyəsən? Mozalan mozalandı, qurtardı getdi! Ancaq mozalan qurtarıb getmirdi, Ulduzdan üzülüb əl çəkmirdi. Haradansa, necəsə Şükranın gözündən gizlicə Ulduzun qıç-paçasına girir, Ulduzu özündən çıxarıb hirsləndirir, ovqatını təlx edib qanını qaraldır, daha doğrusu, bir qara zəli kimi Ulduzun qanını sümürür, sümürə bilmədiyi qanını da axıdırdı. Şükran Ulduzun bədəninə göz gəzdirincə həmin qara mozalanın qara izini götürdü. Yenə də Şükran eyni səbir ilə Ulduzun yaralarını yuyub təmizləyir, yanlara əyilən qulaqlarını dartışdırıb köhləni şuxlaşdırırdı. – Bax belə! – Sonra da Şükran kefini açdığı Ulduzun belinə qalxıb, çapır, çapırdı. Şükran Ulduzu güclü küləklərdən keçirirdi. Özü də bu qara mozalanı güclü küləyə verib haralardasa itirib başına daş saldığını gümanına gətirib, geriyə qayıdırdı. Ancaq yenə də qara mozalanın haradasa gizlənib, öz qara niyyətindən qalmadığı görünürdü.

– Niyə belə olmusan, oğlum? – deyə bir gün Şükranın atası Göyalı, anası Qaratel soruşanda Şükran gülümsədi:

– Elə bir şey yoxdur, – dedi. Deyilən kimi Şükran öz qocalarını narahat edib, həm də yan-yörəni özünə güldürmək istəmədi. Axı olsa-olsa milçək könül bulandırır... Lap olsun milçəyin böyüyü, bu qara mozalan, nə olsun? Mozalan dana-dunanın üstünə düşüncə mozalağa salıb qaçırdır, quyruqlarını bellərinə qaldırıb təzən danalara oğul-uşağı da güldürər. Belə baxanda bu mozalan nədi ki, yeri-göyü tutan Ulduza nə edə bilsin?! Hələ bir halda ki, bir neçə gündən sonra yuxarılara, ala yaylaqlara qalxınca orada ara-ara yağan qar tozanaqlarına

düşüncə, mozalan da donub rədd olacaq, çıxıb cəhənnəminə, goruna gedəcəkdir!

Şükranın öz fikrinə də hər necə qaraltı gəlsə də, o yenə də ana-atasına heç nə demir, yaylaq üçün onları tələsdirmirdi.

Adətən əzəlcə ağqoyunlular öz sürülərini yaylağa qaldırar, dalınca da köç-külfət at-dəvə ilə, sürülər toz qaldıra bilməyən yollarla düşərgədən düşərgəyə düşə-düşə odun-ocaq olan çeşməli yerlərdə gecələyə-gecələyə gedərdilər. Baxanda buna da elə çox qalmamışdı. Uzaqbaşı on gün qalmışdı, ya da heç qalmamışdı. Nə isə Ulduzun tutqunlaşdığını görən Şükran da tutqunlaşırdı. Bu tutqunlaşmaq Şükranın atası Göyalının, anası Qaratelin gözlərindən də yayınmırdı:

– Doğrudan da, sənə nə olubdur, Şükran? – deyə ata da, ana da şübhəyə düşüb qaralırdı. – Bəlkə də gözü götürməyən, sənə paxıllıq edib söz atan, dəyib-dolaşan vardır?

– Mən ağqoyunlu elindən yerdən-göyəcən razıyam!

– Əlbəttə, ağqoyunlu eli bizim Şükranımızı öz doğma balalarından da baş tutur!

– Onda bəs niyə daha narahat olursunuz, mənim əziz ata-anam?

– Gözümüzə bir cür dəyirsən, oğul!

– Nə cür dəyirəm, mənim əzizlərim?

– Son günlərdə gözümüzə çox tutqun görünürsən, Şükran!

– Məndə heç nə yoxdur, əziz ata-ana!

– Bəs bu tutqunluğun sirri nədir, Şükran?

Daha Şükran sirri açmaq qərarına gəldi:

– Sirri Ulduzdadır!

– Bəlkə Ulduzda vəfasızlıq görünür?

– Xeyr, Ulduz həmişə vəfalıdır!

– Bəs nə olubdur?

– Ulduza bir qara mozalan ariz olubdur! Qəfildən Ulduzu dişləyir, qanını sorub qanını qaraldır!

– Onda öldürmək mozalanı!

– Mozalan gözə görünmür!

– Necə, mozalan gözə görünmür?

– Mozalan tilsimə dönübdür?

– Bəlkə o iblisdir, mozalan cildinə giribdir?

– Heç cür baş aça bilmirəm, əziz ata-ana!

– Deyəsən elə qara iblisdir ki, var. Onda yenə də biz ata-ana, sən də Ulduzu da götürüb pay-piyada Ziyarət dağına gedək. Orada dua edək, ulu Tanrıya yalvaraq-yaxaraq, iltimas edək ki, qara mozalan cildinə girən qara iblisi Ulduzdan uzaqlaşdırsın!

– Mən inanmıram ki, iblis ola, elə mozalandır. Bir mozalana görə xofa düşüb Ziyarət dağına getməyinə, ulu Tanrını narahat etməyinə dəyərmi?

– İnan, oğul. Məgər qara şər-şeytan olmur? Olur. Qara mozalan cildinə girən qara şeytana qarğımaq, məlunun xata-balasını özümüzdən uzaqlaşdırmaq üçün gərək Ziyarət dağına gedək!

– Onda heç bir ağqoyunlu bu barədə heç nə bilməsin, əziz ata-ana!

– Biləndə nə olar, Şükran?

– Ağqoyunlular bizə gülməzlərmi? Deməklərmi bir görün Bəyalı uşağı necə də bir mozalanı dağ boyda şişirdirlər?!

Bu sirr Şükranla Göyalıdan və Qarateldən o yana getmədi. Hətta yeddi bacıdan, bacıların uşaqlarından, ərlərindən də heç kəs heç nə eşitmədi, bilmədi. Ürəkləri səksəkədə olan ata-ana yenə də nəzir-niyazla gecə ikən Göylər obasından çıxıb alışdıqları, yaxşı tanıdıqları Ziyarət dağına yollandılar. Az gedib, çox gedib buraya çatdılar. Ziyarət dağının övliya-ənbiya məqbərələrini də, məqbərə olmayan qara daşlarını da ziyarət etdilər, yalvara-yalvara öpdülər, qara mozalana bəddua edib, şər-şeytana qarğıdılar, yenə də sürünə-sürünə, dırmana-dırmana həmin yerə qalxdılar. Qara mozalanın – qara şeytanın şərindən xilas olmaq üçün ulu Tanrıya yalvardılar, qara mozalan cildinə girən qara şeytanın Ulduzun canından əl çəkməyini, uzaqlaşıb rədd olmağını dilədilər. Elə bu halda Ziyarət dağının üstündə göy guruldadı, ildırım şaqqıldadı, güclü gurşad düşdü. Onlar vahimə içində qalıb ulu Tanrıya izafi baş ağrısı verdiklərini güman edib çəkilib, daş kahada gizləndilər. Onlar belə güman etdilər, gümandan da artıq yəqin etdilər ki, Ziyarət dağının üstündə kəhkəşanlı ulduzların arasında səltənət quran ulu Tanrının işi-gücü başdan aşıbdır. Daha onu xırım-xırda iltimaslarla məşğul etmək olmaz! Özü də Şükran deyən kimi, bir qara mozalanı böyüdə-böyüdə böyük bir şər-şeytana çevirmək olmaz. Ancaq onlar yenə də kaha içində ümidlərini itirmədilər. Dedilər ki, ulu Tanrı hər necə bizə acıqlanıb, qəzəblənsə də, Şükrana qıymaz, onun Ulduzuna da heç bir sədəmə toxundurmaz. Ulduza ariz olan qara mozalan da üzülüb öz cəhənnəminə – goruna gedər.

## VIII

Görünür bu dünyada xeyir iş, xoşbəxtlik olunca şər də qıraqda durmur, öz gücünü göstərir.

Göyalı ilə Qaratel Ziyarət dağının göy gurultusunda necə vahiməyə düşüb, necə güclü gürşaddan gizlənə-gizlənə hər necə yaxşıyamı-yamanamı yozsalar da, görünür, bu mozalan da Ulduzun canına qəsdən ariz olmuşdu. Görünür qara mozalanın göz qamaşdıran Ulduza qəsd etməyi heç də qərəzsiz deyildi. Mozalanın qərəzi ancaq Ulduza deyildi, həm də ən ümdəsi Ulduzdan da artıq Şükrana idi. Elə bil ki, harada, hansı uzaq-yaxında gizlənən, üzə çıxa bilməyən qara şərpaxıllıq bu qara mozalanı öz şeytan bətnindən doğurub vücuda gətirmişdi. Ulduzun və Ulduzla canbir qəlb olan Şükranın üstünə göndərmişdi. Buna görə də mozalan öz qara işindən qalmırdı, öz bildiklərini Ulduza edirdi. Özü də dönüb Ulduzun öz bədənində, ya da başqa bir ağlagəlməyən yerində gizlənirdi. Elə ustalıqla gizlənirdi ki, nəinki bir tək Şükran, bir çox adam öz iki gözünü dörd etsə də, yenə də mozalanı girinə keçirə bilməzdi, qan sorub, qan axıtdığı yerdə onu tutub yox edə bilməzdi. Mozalan elə bicliklə hərəkət edirdi ki, elə bil ki, adəti mozalan deyildi, şər-şeytan idi, bunların cəmi-cümləsi idi! Özü də uçurub-dağıtmaqdan, yıxıb-yaxmaqdan nəşələnən bir düşmən idi. Girəvəçi mozalan hirslənən, qəzəblənən Ulduzun gözündə birdən də böyüyürdü. Mozalanın kinli gözləri şişirdi, dombalanırdı, qarnı da şişib-şişib zəhər tuluğuna çevrilirdi. Elə bil ki, bir neçə gürzənin zəhəri mozalanda toplanmışdı. Mozalan hər dəfə Ulduzun girəvəsini alıb onu sancınca, Ulduz çırpınırdı, gömgöy göynəyib yanıb-yaxılırdı ki, qanad alıb düzü-dünya boyu uçduğu Şükranı da öz qanadları üzərində uçurduğu, külli-aləmə səs saldığı zamanda yenə də mozalan onun ovqatını təlx edib, qanını zəhərləyirdi. Ancaq Şükran nə qədər göz qoyub baxsa da, mozalan Şükranın şahin gözlərinə görünmürdü. Hansı sehrləsə mozalan özünü sağ-salamat saxlayır, Ulduza bildiklərini edir, ondan heç bir fənalığını əsirgəmirdi. Qara mozalan öz qara cildinə girib birdən zəhərli ilana, birdən də qara bir əjdahaya çevrilirdi. İndi nə etmək olardı? Necə Ulduz bu mozalandan öz canını xilas edə bilər, öz əvvəlki nəşəsini qaytarıb, öz vəziyyətini düzəldə bilər, yenə də öz kişnərtisi ilə Göyən düzənlərini doldura bilərdi? Necə Ulduz yenə də ağqoyunluların gözündə parlaya bilər, Göyalı ilə Qaratelin, bunların oğul-uşağının – bütünlüklə Göylər obasının tütək çalan çobanlara

qədər hər kəsi güldürə bilərdi? Necə Ulduz öz parlaqlığı ilə görən-eşidən kəslərin ürəklərini aça bilərdi? Bir halda ki, bu qara mozalan, elə bil ki, qara bir məşum kölgə, dəhşətli bir kabus idi və öz dəhşətilə də Ulduzun başının üstünü almışdı, girəvəsini kəsmişdi, onu baş qaldırıb göz açmağa qoymurdu. Qara mozalan nəinki Ulduzun, Ulduzdan da artıq Şükranın ovqatını təlx edib qanını qaraldırdı, özü də Şükrandan ötüb Göyalını vahiməyə salırdı ki, gümüş saçlı Qaratelin ürəyinə hey qara damcılar damızdırırdı. Elə belə fikirləşəndə qara mozalan göz qabağında idi. Ancaq əslində heç də göz qabağında deyildi. Aydın idi ki, Ulduzu çalan, Ulduzun damarlarından yapışıb onun qanını axıdan, canına öz zəhərini yeridən heç bir ilan-əqrəb deyildi, qaraca bir mozalan idi. Əgər bu qaraca mozalan adicə mozalansa, canına şər-şeytanın qaraca nəfəsi dolmayıbsa, niyə bəs çəkilib getmir, niyə rədd olub uzaqlaşmır? Demək, qara mozalanın işi, qəsdi bu növrağı pozmaq idi, bu xanimanı dağıtmaq idi, bu müqəddəs nəşəyə zəhər qatmaq idi. Göyalı nəslinin çörəyini zəhərlə yoğurmaq idi, bəxtəvər ailəni ağlatmaq idi, ağqoyunluları qara yasa batırmaq idi. Şükranı doğan gümüşsaçlı, xoşbəxt Qarateli bədbəxt etmək idi. Bəs ayrı cür isə onda niyə bir küləkdə qayaların birinə çırpılmasın, yaxud Ulduzun qaça-qaça qopardığı toz-tozanağın içində itib-batıb qalmasın?! Hey, hər yandan sağ-salamat çıxsın, diribaşlıq göstərib yaxa qurtarsın, alçaq qəsdini yerinə yetirməyincə, Ulduzun ürəyinə sağalmaz dağ çəkməyincə bir yanda qopub qalmasın?! Qara mozalan bu növrağı hey pozmaqdan, Göyalı ailəsinin sinəsinə dağ çəkib düyün qoymaqdan zövq alsın?! Baxanda bir qara dombagöz nə idi ki, Şükranın, ya Ulduzun ayaqları altına düşüb məhv olmasın? Amma nə edəsən ki, qar mozalan nə əl verir, nə də bunlardan hər birisinin ayaqları altına düşürdü. Getdikcə mozalan həyasızlaşır, sırtıqlaşır, öz zəhmlənən qara sir-sifətilə Göyalı külfətinin gününü göy əsgiyə düyürdü. O, Ulduzun şəhpərini qırıb Şükranın şöhrətini yox etmək istəyirdi. Şükranın köşək gözlərini söndürmək, Göyalının yurdculunu yoxa çıxarıb, onun ocağını keçirmək istəyirdi. Qara məqsədindən üzülməyən, qara qəsdinin yolunda yorulmaq bilməyən qara mozalan getdikcə daha da qatilləşirdi. Ulduzun qanını gündən-günə tez-tez sormaqdan, zəhərləməkdən başqa bicliyə, hiyləyə də keçirdi.

Mozalan çalışırdı ki, qəzəbə dolan Şükran öz Ulduzunu bir sütuna möhkəm-möhkəm bağlasın, öz əlinə qamçı da yox, bir zoğal dəyənək götürsün, o ki var Ulduzu döysün, əzib-əzişdirsin, qol-qanadını qırıb

xurd-xəşil etsin; axır ki, bu qol-qanadlı Ulduzu bir qulağı sallaq əfələ çevirsin. Kinlənən Ulduz da bir gün girəvəsinə salsın, bir yolla Şükranı həlak etsin!

Mozalan hər necə araya girib Ulduzun qanını qaraltdığı kimi Şükranın da qanını qaraltsa da, yenə də Şükran Ulduzdan dönmür, qardaş qardaşından dönməyən, onun ağır xəstəsini becərən kimi, Şükran da kefi pozulan, hirslənən, əsəbiləşən, nəticədə xəstələnən Ulduzu becərirdi. Belə vaxtlarda mozalan xəbis-xəbis susur, gizlənirdi. Şükran isə onu öz dili ilə dindirə-dindirə kefini açırdı: Ulduzla oynayırdı, bir qədərdən ona ağrı-acısını unutdururdu. Elə bu zamanda Şükran mozalanı rədd olub gedən zənn edib, fışqırıq çala-çala qızıllı-gümüşlü yəhərlə Ulduzu yəhərləyib yüyənləyirdi, onun belinə qalxırdı. Ulduz da qanad açıb, uçub-uçurdu. Ulduzun belə uçduğunu, Şükranın isə öz Ulduzunun üstündə qol-qanad açdığını görən Göyalı da, Qaratel də özlərinə qayıdıb sevinirdilər. Ata ilə ananın sevinci yerə-göyə sığmırdı.

– Görürsənmi oğlunu, Qaratel?

– Görürəm, Göyalı!

– İndi necə bəs, Qaratel? Deyəsən mozalan atdan əl çəkibdir.

– Görmürsən at necə dincdir.

– Deyirəm, Göyalı, mozalan yoxkən tez tərpənək, tezcə keçək yuxarılara, buzlu yaylaqlara, Göyənin kürə kimi qızaran qızmarından qurtaraq!

– Tərpənək, Qaratel, tərpənək!

– İlahi, sən lap məni öldür, – deyə Qaratel duaya döndü: – Amma bir tək bizim Şükranımızın müsibətini bizə göstərmə! Bu mozalanı ya öldür, ya Ulduzdan uzaq elə!

– Qız, uğursuz qız, barı, gizlə bu uğursuz sözlərini! Etiqadını möhkəm elə!

– Məni qınama, Göyalı!

– Gizlə bu uğursuzluğu, Qaratel! Axı, burada nə var ki! Sən hansı haqla gözümün işığı Şükran barəsində nigarançılıq çəkirsən?

Qaratel gözlərində qaynaşan göz yaşlarını silməyə başladı. Bilmirəm, Göyalı, niyə ürəyim belə səksəkədədir. Deyirəm, ulu Tanrı öz verdiyi oğlu amanında saxlar. Bəs niyə o, ürəyimizə qara damcılar dammağa qoyur? Niyə bəs biz burulğanlardan boğuluruq?!

– Sən özün özünü burulğanlarda boğursan, Qaratel!

– Bəs onda sən niyə boğulursan, Göyalı?

– Ulu Tanrı özü bilir ki, sən özün məni burulğanlara salıb boğursan, Qaratel!

– Mən hər necə bir burulğanda boğulsam da, sən boğulma, Göyalı! Mən boğulum ki, Şükranın yaman gününü, müsibətini görməyim, Göyalı!

– Sən ulu Tanrımızın qabağında öz inamını itirmə, Qaratel!

– Düzü, mən ürəyimə daman qara damcılardan yana öz inam-etiqadımı itirirəm!..

– Qız, bunca asi düşmə, qız!

– Axı, niyə mən bunca iztirab çəkim, Göyalı?

– Məgər, Göyəm qızı, bizim Şükranın varlığı sənin üçün başdan-başa iztirabdır?

– Şükran mənim şükürümdür, Göyalı!

– Onda bəs elə lap indicə diz çök, ulu Tanrıya şükür et!

– Hey ona şükür edirəm, amma arxayınlaşa bilmirəm. Ürəyimə daman qara damcılar məni qorxudur, Göyalı! Qaralan ürəyim bu qara damcılardan yana hey tir-tir titrəyir. Şükran üçün qorxuya, vahiməyə düşürəm!

– Yenə də ulu Tanrı qarşısında etiqadsızlıq, inamsızlıq, Qaratel? Axı qız, Ziyarət dağının ulu Tanrısının pənahından olana nə zaval?

– Sən də hey bu sözləri vürd eləmə, Göyalı!

– Bəs necə, özün də elə dillə deyirsən?

– Düzü, sən, Qaratel, mənim arxayın ürəyimi qara şübhələrlə doldurmusan, – deyə Göyalı bilmirdi nə etsin, ürəyini dolduran qara damcılardan necə qurtarsın. – Sənin uğursuz sözlərin, bilirsənmi necə də mənim inam aləmimə zəlzələ salıbdır, Göyəm qızı!

– Sən bil ki, Göyalı, uğursuzluq dildən ürəyə axmayıbdır, ürəkdən dilə gəlibdir!

– İlahi, ilahi, Göyən düzəninin bir qara mozalanı nədir ki, biz belə vahiməyə düşmüşük? Belə uğursuz iztirab burulğanları içində boğuluruq?

– Mənim qaralan ürəyim deyir ki, biz boğulacağıq, Göyalı! Ala yaylağa köçmək də məni rahat eləməz. Gəl lap tezcə, lap indicə sən Şükranı Ulduzdan arala!

– Mən gündən-günə qanad açan Şükranın qanadını necə qırım, Göyəm qızı?

– Kişi, sən bu sözləri əzbərləmə, mən deyənə əməl et!

– Bəlkə özün oğluna deyəsən, özün öz təklifinə əməl edəsən?!

– Əməl edərəm, Göyalı! Sinəmi açıb Şükrana yalvararam, deyərəm: oğul, Ulduzdan uzaq düş! Deyərəm ki, sən Ulduzun belinə qalxan gündən mənim ürəyim qorxudadır!

– Bəs sənin yerə-göyə sığmayan sevinclərin necə, Göyəm qızı?

– Sevinclərim həmişə üzdən olubdur, Göyalı!

– Bəs niyə elə gülmüsən, elə şaqqıldayıb, şadlanmısan?

– Ürəyimi unutduğum vaxtlarda gülmüşəm, şaqqıldayıb şadlanmışam, Göyalı!

– Deməк, sən ürəyinin ayıq vaxtında gülməmisən, ürəksiz şadlanmısan?

– Əzəldən ürəyim titrətmə içində olubdur, titrəyə-titrəyə də qan axıdıbdır!

– Görünür Şükranı ulu Tanrıdan diləyəndə də, ondan alanda da!

– Şükran bizə səadət gətirdiyindən artıq fəlakət gətirməsin barı!

– Ulu Tanrı, sən özün bizi Şükranın müsibətindən, fəlakətdən xilas et!

– Hər necə olsa da, Göyalı, mən Ulduzu Şükrandan, Şükranı da Ulduzdan aralayacağam! – deyə Qaratel qərarını verdi.

Göyalı gömgöy göyərdi.

– Demək, sən qorxduğun qəzadan qaçacaqsan, arvad!

– Bəli, qaçacağam, kişi!

– Ulu Tanrımızın pənahına şübhə edəcəksən?

– Bəli, mən şübhədəyəm, Göyalı, şübhədən də xilas ola bilmirəm, Göyalı!

– Sən gavurlaşırsan, Qaratel!

– Doğrudan da, Göyalı, mən etiqadımı itirib gavurlaşıram. Ancaq sən müsəlmanlaş, Məkkə ziyarətinə get, Məkkə daşını bəsdi deyincə öp!

– Mən, Qaratel, Şükran üçün Məkkə ziyarətinə getmək barədə ulu Tanrıya and içirəm. Təki Şükrana heç bir zaval toxunmasın. Mən Məkkə ziyarətgahında da dəvə kimi ayaqyalın olub, Məkkəyi-mükərrəmənin dövrəsinə dolanacağam, oradan bizim dünyamızın böyük qibləgahından üz tutub ulu Tanrımıza yalvaracam, deyəcəyəm ki, ey bizi yoxdan yaradan ulu Tanrı, sən həm Ziyarət dağının üstündəsən, həm də Məkkə məbədinin. Sən hər yerdə hər zaman varsan. Sən bizə bəxş etdiyin Şükranı öz pənahında saxla! Sən qara-qara damcılara bizim ürəyimizdən çıxart. Qoy biz Şükrana toy edək. Ona gözəl-göyçək

bir Sevgili qız alaq, onun toyunda ellikcə oynayaq. Sən Şükranı xoşbəxt elə, sən bizdən sonra Şükranı bizim yurdumuzda yurdcu elə. Qoy həmişə bizim Göyəndən – Göylər oymağından Ziyarət dağına doğru bizim ocağımızın tüstüsü uzansın!.. – Bəyalı oğlu Göyalı öz gələcək Məkkə ziyarətindən, orada necə ulu Tanrıya yalvarıb-yapışmağından xeyli danışdı. Ancaq ağ saçlı Qaratel heç bir vəchlə ovunmadı, ovuna da bilmədi. O öz ağ saçlı başını tuta-tuta ürəyində başlayan tərəddüd içində ağlayıb, ağlayıb:

– İlahi, sən bizə qəzadan qaçmağa aman ver! – dedi.

## IX

Göyalı ilə Qaratel yenə də qaraltı içində qaldılar, basaratları bağlanan kimi tərpənmədilər, danışa-danışa durdular. Onlar ulu Tanrıya inanmaq-inanmamaq təzadı içində dolaşırdılar. Nə əl-ayaq eləyib tezcə yaylağa qalxa bildilər, nə də aranda əyləşib arxayınlaşa bildilər. Ziyarət dağı onlardan ötrü dar ağacına döndü. Onlar bu dar ağacından asıla-asıla durdular. Ziyarət dağında ulu Tanrıdan diləyib aldıqları Şükranı onun amanında, pənahında saysalar da, yenə də şübhədən xilas ola bilmədilər, qara mozalanın gətirdiyi qaraltılardan qurtara bilmədilər.

Nə isə, kələfin ucunu itirib vurnuxdular, vurnuxdular, bütün söz-söhbətlərinə baxmayaraq, üzə açılışıb Şükrana ciddi bir söz deyə bilmədilər. Onlar Şükranın ürəyinə qara qorxu salmaqdan qorxdular, gözlədilər, gözlədilər görək nə olur, bu qaraltı aldadıcıdır, ya necə? Gözlədilər görək ürəklərimizə daman qaraltıların əsli vardır, ya necə? “Axı biz Ziyarət dağına ziyarətə getmişik, biz orada övliya-ənbiya məqbərələrini, qabağımıza çıxan qara daşları öpmüşük, kəlləyə qalxıb ulu Tanrıya dəxil düşüb Şükranı almışıq. Yeddi qızın gözlərini güldürmüşük. Ağqoyunlu elinə bir səvari – Ulduz belində qanad açan ecazkar bir oğlan vermişik. Bəlkə bu mozalan lap adəti mozalandır, aranlarda olan qamışlıqla da qaynaşan, dana-dunanı dingildədən çox qaraca, heyvərəcə mozalanın birisidir? Biz Şükranı artıq istədiyimizdən, onun üstündə tir-tir əsdiyimizdən belə olur? Bəlkə bu gizli xof vahiməni açıb qızlarımıza, yeznələrimizə deyək?.. Bəlkə onlar öz oğul-uşaqları ilə birlikdə bizim ürəyimizə qaraltı salan qara mozalanı bu həndəvərdən qovsunlar? Ulduza da, Şükrana da rahatçılıq versinlər? Biz də ürəkdə qaralmayaq, arxayınlaşaq, arxayın-arxayın yığışı-

lıb yuxarılara, ala yaylaqlara qalxaq?! Orada ala göllərin üstündə – dədə-baba yurdumuzda alaçıq-çadır quraq? Burada düzəni-dağı gözdən keçirə-keçirə yenə də Şükranın Ulduzun belində necə uçmağına, necə dağlardan aşmağına tamaşa edək? Şükranı aran elində, Göyəndə deyil, qar yağınca uzaqlarda, yaylaqda saxlayaq? Özümüz də Ulduza çiçəkli dağ yoncası yedirək? Ulduzu ağ göllərdə çimizdirək? Ulduzu par-par parıldadaq? Heç zaman çimizdirək? Ulduzu par-par parıldadaq? Heç zaman qoymayaq Ulduzun üstünə nəinki bir qara mozalan, heç bir qara milçək də qonsun!"

Dedilər, yox, bu qaraltı gərək qovulsun, bizim fikrimizdə qaraltı gəzməsin, dolanmasın, ürəyimizə heç bir qara damcı dammasın, biz tərəddüdə düşməyək, tövbə edək, sarsıyan inam-etiqadımızı qaytaraq, yaylaqdan qayıdan baş yenə də Ziyarət dağına yollanaq, yenə də qurban kəsək, nəzir verək, yenə də ikilikdə həmin qülləyə qalxaq, ulu Tanrımız qarşısında diz çökək, tərəddüd göstərdiyimizə, xüsusən Qaratelin şəkk-şübhəsinə, inam-etiqadını bunca süstləşdiyinə, Məkkə ziyarətinin kara gəlməyəcəyi inamsızlığına görə hey tövbə edək. Guya bu qara əjdaha öz güclü nəfəsilə neçə adamı desən öz kamına çəkib dirigözlü uda bilər!

Hər birisi ayrı-ayrı düşünən, əslən birlikdə düşünüb ümumən eyni məfhum üstündə vahimə keçirən Göyalı ilə Göyəm qızı Qaratel bir az əvvəlki iztirablarından sonra titrəyə-titrəyə, qorxa-qorxa Allah dərgahında durmağa başladılar. Onlar indilik buradan uzaqlaşmaq, düşündükləri kimi yaylağa varmaq, sonra Aran elinə enincə Göyalının Məkkə səfərinə hazırlaşmaqla, hələlik Ziyarət dağına yollanmaq, düşündükləri kimi özlərini ulu Tanrının ixtiyarına vermək, bu qaraltılardan biryolluq qurtarmaq istədilər.

Onlar Göyalının Məkkə ziyarətinə qədər etiqadsızlıq, inamsızlıq göstərdiklərinə görə ulu Tanrı qarşısında öz günahlarını yuyub təmizlənmək, paklanmaq istədilər.

Onlar dinməz-söyləməz durdular, bir-birinə sığındılar, ürəklərinə daman qara damcıların həmin-həmin damdıqlarını duysalar da, dinmədilər, özlərini özlərindən gizlədilər!..

Lakin qara mozalan öz qara işindən qalmadı. O daha amansızca-amansızca gözlərini şişirdə-şişirdə Ulduzu dişlədi, zəhərlədi, qanını qaraltdı, ona əzrail kəsildi. Ulduzun gözünün işığını aldı, onu Şükranın bağladığı yaşıl yoncalıqda, çopur qara daşın qabağında öz ip-imlığının dolaşığına saldı. Ulduzu tər basdı. Qara qayanın daldasından göz

qoyan Şükran kəmfürsət mozalanı yaxşıca-yaxşıca görmək, onun girəvəsini əlinə keçirib qəfildən tutmaq, vurub əzmək, təpikləri altına alıb tapdamaq, yox etmək, Ulduzu da dolaşıqdan qurtarıb qırağa qaçırmaq, tərini soyutmaq, onu tumarlamaq, belinə qızıllı-gümüşlü yəhərini qoyub, qızıllı-gümüşlü yüyəni ilə cilovlamaq, kefini açmaq, atılıb belinə minmək, ürəkləri qaralan ata-ananı da qaraltıdan qurtarmaq, onları sevindirmək, güldürmək, ürəklərini açmaq istədi. Şükran istədi ki, ürəkləri qaralan Göyalı ilə Qaratel görsünlər ki, daha mozalan yoxdur, Şükran yenə də ağçuxalı cavanların el-gün içindədir, bir tək ağçuxalı Şükran deyil, yüz ağçuxalı Şükran vardır, o da başçıdır.

İndi Şükran bu qara qayanın daldasında gizlənməklə, böyürdən başını çıxarıb baxmaqla Ulduzu dəliləşdirən, Ulduzluqdan çıxaran, qəzəbləndirən, cinləndirən qara mozalanı qəflətən tutub rədd edərdisə, necə də xata-balanı sovuşdurar, necə də Ulduzun o göz-bu gözündən öpər, necə onu da, özünü də fəlakətdən, müsibətdən xilas edərdi!

Lakin mozalan da mozalan görkəmində qalmırdı. O, Ulduzun gözündə ilan, əjdaha görkəmi alırdı. Şükranasa görünmürdü, gizlənirdi, uçub itirdi. Əgər o, Şükranın nəzərində də eləcə dəyişib şişib-şişib böyüsəydi, o öz göy zağlı xəncərini gümüş qınından çıxarar, həmin ilan-əjdahanı doğrayıb parçalayardı. Ancaq bu qaraltı öz fitnəkarlığı ilə Şükrana görünmürdü.

Ancaq oğlan qəti fikirdə idi. Mozalan hər necə şəklə düşsə də, hansı sirrə görə gözlərinə necə bir qaraltı çöksə də, bu dəfə əl çəkdi yox idi. Şükranın canı boğazına yığılmışdı. Daha təhəmmül etmək, səbir göstərmək mümkün deyildi.

Baxanda burada iki tərəf var idi. Gürələşən, şeytanlaşan, mozalanlaşan qapqara tərəf. O tərəf ki, Göyalı ilə Qaratelin ürəyinə dəhşətli qaraltılar gətirirdi. O tərəf ki, işıqlı gözlərə zülmət çökdürürdü. O tərəf ki, çürüdür tökür, çürüdüb tökdüyünə görə də öz qara qanadları ilə, qara sir-sifəti ilə qaradan qəhqəhə çəkirdi: "Mən uçurdum, mən dağıtdım, mən məhv etdim" deyirdi. Öz qara-qura şeytanlarını başına toplayıb qara-qara çalğı çaldırıb, qara-qara oyun çıxarır, qara-qara qıvxırıq qoparırdı. Öz qara qıvxırığı ilə insan nəşəsini də qaraldırdı. Ağçuxalı Şükran bu uğursuz, dəhşətli qaralığa qarşı çıxmağı, bu qaraltını tutub boğmaq qəsdini qarşısına qoydu. Özü də ancaq indicə, bax, buradaca! Onlar indicə, bax, buradaca qarşı-qarşıya durmalıydılar. Ancaq qarşı-qarşıya! İki tərəf qarşı-qarşıya: xeyir-şər!

## X

Ancaq bu qaralıq elə bir qara hiyləgər cilddə gizlənmişdi ki, Şükran görə bilmirdi. Onun gözlərinə qaranlıq çökdüyündən, heç nəyi görməyi, seçməyi bacarmırdı. Hər necə olsa da, daha Şükran üçün döndü yox idi. Hər necə qaralıq çəksə də, o görürdü ki, Ulduz çox yamanca dolaşıqdadır. O yıxılmaq, boğulmaq, ölmək təhlükəsindədir. O, gözə görünməyən qara qüvvənin əlində əsirdi. Yox, buradan dönmək, qara daşın daldasından çəkilmək olmazdı!..

Şükran sağ əli ilə gözlərini bərk-bərk sildi, sanki qara pərdələr az-azacıq da olsa çəkildi, Şükranın gözləri ayazıdı, nə isə atası Göyalı, anası Qaratel, yeddi bacı, yeddi bacının balaları göz qabağına gəldi. Sanki onlar hamısı birdən səsləndi, birdən qışqırışdı: "Özünü bəladan qoru! – dedilər. – Şükran, özünü şeytan işinə qurban vermə, Şükran, bizi ağlar qoyma!.."

Ancaq Şükran çəkilmədi, çəkilə bilmədi, qaçmadı, qaça bilmədi. Bəlkə də qəza Şükranın qədəmlərini qurutduğuna görə qaça bilmədi?!

Gözəl-göyçək Şükranın köşək gözlərinə həmincə mozalan çalındı, canlı cəzana gələn Ulduz da qara mozalanı gördü. O da Şükran kimi istədi onu öz girəvəsinə salıb dəmir nallı təpiyi ilə qara qayaya yamasın. Qara mozalan bir qara hiyləgərliklə həm Ulduza, həm Şükrana göründü. Ulduz öz təpiyi ilə qara mozalanı qara qayaya yamamaq istəyincə, Şükran da qara qayadan qara mozalanı tutmaq üçün qabağa çıxınca, mozalan çovudu, Şükranı görməyən, onun qara qayanın dalında pusquda durduğunu bilməyən Ulduzun dəmir nallı təpiyi Şükranın alnından tutdu. Şükran sarsıya-sarsıya qırağa qaçıb al-qan içində səndələdi, son dəfə gözlərini geniş açıb Ulduza baxdı və göy yoncalıqda sərili qaldı. Çovuyub qaçan mozalan dərhal gəldi, Şükranın alnından axan qırmızı qanından zorbalaşınca sordu. Qara mozalan qara qəsdinin təntənəsini edib, Ziyarət dağına doğru qanad açdı. Ulduz dolaşıqda dayanmadı, durmadı, var gücü ilə onu dolaşığa salan ip-imlığı qırdı, bir günahkar kimi gəldi, ağlaya-ağlaya öz başını Şükranın ayaqlarına salladı.

## XI

Şükranın ölüm xəbəri ildırım itiliyilə hər yana, Göyən oymaqlarının hər yerinə yayıldı. Eşidən, bilən dizinə döydü. Hamı yanıb-yaxıldı. Yaylağa qalxmayıb Göylər oymağında qalanlar çox tezcə Göyalı ilə

Qaratelin görünməzin müsibətinə şərik oldular. Onlar Göyalı külfətinə qarışdılar, uşaqlı-böyüklü qara daşın dibinə tərəf axışdılar. Yelqanadlı, ağçuxalı, gümüş xəncərli, qırmızı məsli Şükranı yerdə sərili gördülər. Şükranın papağı kənara düşmüş, ancaq onun şəvə saçları səliqəsini pozmamışdı. Şükranın anası Qaratel oğlunun bir kənara düşən təpəsi güləbətinli ağ papağını götürüb bağrına basdı, sonra da papağı oğlunun sinəsinə atıb öz qırışıq üzündə sağ-islahat qoymadı. Ağqoyunluların adətincə ərgən igid öləndə anası üzünü öz dırnaqlarıyla didişdirməli idi. Ancaq Qaratel üzünü didişdirməklə qalmadı. O, sifətini sivirib sinəsinə tökdü. Haraya yetirən bacının heç biri bədbəxt anadan geriyə qalmadı. Bir an içində onlar öz gözəlliklərini tək qardaşlarına qurban verdilər. Göyalının oğlan, qız nəvələri, ucaboylu-ucaboylu yeznələri də bir-birinə qarışdı. Göyalı özü bir an içində büküldü, kişinin beli doqqalandı. Kəmfürsət qocalıq öz qılıncını çəkib kişinin boynuna qoydu. Şükranın ölümü xoşbəxt ailəni birdən-birə bədbəxtliyə düçar edib, yetimləşdirdi. Başqaları da yetimləşən külfətə qoşuldu. Elə bil ki, hamının bir tək oğlu, ya qardaşı qəflətən öldürülmüşdü. Bu hadisə bir tək Göyalı ailəsi üçün deyil, bütünlüklə Göyən obaları, Ağqoyunlu eli üçün bir müsibət kimi səslənməyə başladı. Ağqoyunluların aranı, dağı az müddət ərzində bir-birinə dəydi. Ayağı yer tutan yola düşdü. At-dəvə belinə qalxan daşlanıb Göylər kəndinə gəlməyə başladı.

Qara daşın dibindən götürülən, Göyalının eyvanında qoyulan Şükranın cənazəsi dövrələndi, dam-daş əhatə olundu. Adamlar çoxaldıqca dalğa-dalğa genişləndi, baş-başa verən, çeşmə üstündə ucalan qollu-qanadlı çinarların altı adamlarla doldu. Başbilən Ağqoyunlu ağsaqqalları uşaq kimi ağlaşdılar. Öz ömürlərində çox toy və yas görən kişilər belə tablamayıb, hönkürüb hönkürüşdülər. Hər tərəfdən dəstələnib gələn qara geyimli ağıçı arvadların ağıları sümükləri sızıldatdı. Ağıçılar hələ də üzünə qara yaylıq çəkilməyən Şükranı bir qəhrəman igid kimi oxşadılar. Onlar nəinki indiyə qədər el içində yaranan ağıları yaraşdırdılar, özləri də Şükranı oxşayan ağılardan qoşdular, ağladılar. Axı, heç kəs Şükranın öz Ulduzunun belindən belə yarımçıq yerə salınmasına qıymırdı. Yaxın da, uzaq da Şükrana ürəkdən göynəyirdi, ürəkdən sızlayıb, ürəkdən ağlayırdı.

Qara don geyən dözülməz böyük səhvə – xətaya yol verən Ulduz günahkar, qatil sayılırdı. Arada bu at barəsində cürbəcür danışıq gedirdi: görünür, Şükran ata acıqlanıb, onu acıtmışdır, – deyirdilər. – Bəlkə də

Şükran atı döyüb, onda kin-küdurət doğurmuşdur. Yaxud, Şükran etibar etdiyi atın dövrəsinə dolanan zaman ehtiyatsızlıq edibdir? – Hönkürtülər sakitləşincə ağıçılar nəfəslərini dərincə Şükranın ölümü haqqında belə və buna bənzər çox söz-söhbət gedirdi. Ancaq heç kəs mozalanın hiyləgərliyindən, qaradan qara şeytan, şər əməlindən danışmırdı...

Bir az qışqırandan, hönkürüb hıçqırandan sonra səsi kallaşan, boğazı tutulan Göyalı da, özünün ağ gümüş saçlarını al-qana boyayan Qaratel də Göyalıdan beşbetər hala düşmüşdü, daha başqa bir söz deyə bilmirdi. Ümumən qəzanın qədərindən qaça bilməyən, Şükranı bədbəxtlikdən sovuşdura bilməyən Göyalı ilə Qaratel küskünləşmişdilər. Onlar birinci növbədə çox güvəndikləri ulu Tanrıdan üz döndərmişdilər. Onlar Ziyarət dağından da, bu dağın övliya-ənbiyalarından da əl üzmüşdülər. Elə bil ki, hər nə varsa, yox imiş. Elə bil ki, bunlar ər-arvad pay-piyada, sidq ürəklə Ziyarət dağına yollanmamışdılar, qara daşları öpməmişdilər, Ziyarət dağının kəlləsinə dırmanıb ulu Tanrıdan yeddi bacıya bir qardaş da diləməmişdilər, Şükranın təvəllüdündə təntənə etməmişdilər, Şükranın Ulduzun belində qanad açmağını seyr edib sevinməmişdilər, öyünməmişdilər. Guya bunların heç birisi yox imiş. Bu arada olsa-olsa yuxu, röya var imiş. Şükran özü də röya imiş?! Əgər röya deyilmişsə, bəs hanı Şükran? Hanı Şükranın Ulduzu? Hanı onun ağqoyunlular elində əmələ gələn Ulduz atlı ağçuxalı yaşıdları? Gümüş xəncərli igidləri? Hanı Göyalının xəyalən oğlunun toy dəbdəbəsi üçün arzuladığı Ağqoyunlu gözəli Sevgili? Bəlkə bunlar da yox imişlər? Yox, Şükran da, onun ağçuxalı yaşıdları da, ağ ulduzlu atlıları da, Ağqoyunlu göylərli gözəli Sevgili də xəyaldan artıq hərəkətdədilər. "İgid ölər – adı qalar, öküz ölər – gönü".

...Budur, Ağqoyunlu gözəlləri içindən Göylərin özündən – çinarlar tərəfindən bir qız da qara geyimində gəldi. Həmin qara geyimli qızın adı Sevgilidir. Göyalı dürüst bilməyən, ancaq arzusunda oğlu üçün istəyən Sevgilidir. Budur, həmin Sevgili heç bir kəslə hesablaşmadan borana düşən sevgisini hamıya bildirmək üçün Şükranın üstünə gəlmişdir. Özü də Şükranın başı üzərində durmuşdu. Kimin nə həddi var ki, bu qızı qırağa çəksin? Sevgilinin ata-anasının nə ixtiyarı vardı bu halında qıza acıqlansın, biz bilməmişik desin?! Biz bilməyə-bilməyə Sevgili qız nə üçün matəm günü üzə çıxsan? – deyə şikayətlənsinlər.

Deməyəsən Şükran Ağqoyunlunun Göylər gözəli Sevgili adlı qıza öz eşqini duydurmuşdu. Oğlanla qızın alışıb-yanan gözləri bir-birlərinə sataşmışdı. Onlar dillərilə danışmasalar da, gözləri ilə danışmışlar. Qızlar bulağından su içən, on yeddi yaşına yenicə yetişən gözəl Sevgili Şükransız yaylağa qalxmaq istəməmişdir. Sevgili öz sevdiyi oğlanın Ulduzun belinə qalxmağını, ala yaylağa yollanmağını gözləmişdir. Sevgili elə də uzaqdan deyildi: Göylər oymağının özündəndir, çeşmənin o tərəfində, qollu-qanadlı çinarın dibində dayanan komadandır. Şükran hər dəfə Ulduzu çeşməyə gətirəndə bu qızı görmüşdür. Qarğı çəpərin daldasında dayanan Sevgili də gözlə-qaşla danışmışdır. Kim bilir, bəlkə də Şükran da qıza görə Ulduzun belində qanad açmışdır, bu qızın eşqilə minicilikdə möcüzə göstərmişdir, hər kəsi heyran etmişdir! Şükran öz ata-anasına bir söz deməsə də, bacılarına bir işarə edib bir söz çıldırmasa da, belə idi, belə olduğu da indicə açılırdı. Elə dilsiz, ürəkdən gələn ürəklə danışan cavanların müsibəti aləmi yandırmırdımı? Hamı bu müqəddəs eşqin nakamlığına görə ağlamırdımı?

– Hanı Şükran?

– Hanı Ulduz?

– Ulduz niyə etibarsız çıxdı?

– Niyə Ulduz qatil oldu?

Bu sorğular Ziyarət dağında əks-səda doğururdu. Acı taleyin düyünlü olmasına, belə bir dəhşətli döngəyə düşməyinə hamı acıyırdı, göynəyirdi, dizinə döyüb, başına vururdu.

– Hanı ulu Tanrımızın ədaləti?

– Niyə ulu Tanrımız öz verdiyini öz amanında saxlamadı?!

Əlbəttə, qan içən fitnəkar mozalan öz qara qəsdini yerinə yetirincə aradan çıxmışdı. Düzü, adam olan mozalanın bu boyda faciə törətdiyini dərk edə bilmirdi. Belə olduqda müqəssir Ulduz idi, müqəssir Şükranın öz acı taleyi idi. Guya Şükran taleyinin nəsibi bu imiş. Ulu Tanrının ədalətsizliyi, Ziyarət dağının övliya-ənbiyalarının diqqətsizliyi Şükrana qarşı biganəliyi idi. Bu fəlakəti hərə bir yana yozub, hərə bir cür mühakimə edirdi. Hərə bir cür qəza-qədərə inanırdı. "Adamın alnında nə yazılıbsa, o da olacaqdır" – iddiasında olanlar da az deyildi. Ancaq bu müsibəti hər yana yozsalar da, heç kəs belə vaxtsız-vədəsiz ölümlə razılaşa bilmirdi. Hamı Şükranın ölümünü fəlakət sayırdı, müsibət, faciə, haqsızlıq, ədalətsizlik bilirdi. Göyalı nə qədər keyisə də, bilmirdi niyə ürəklərinə bunca qara damcılar dama-dama

onlar ayıq-sayıq olmağa çağırılan zamanda belə qəzanın qədərindən qaça bilmədilər?.. Niyə Bəyalı oğlu Göyalı Göyəm qızı Qaratelin ağıllı-şüurlu təklifinin ziddinə çıxdı? Niyə o, doğma ananın sözünü uğursuzluğa yozdu? Niyə o, əzəldən dinc durduğu yerdə Ziyarət dağına yollandı, ulu Tanrıdan yeddi qıza bir qardaş, özünə də bir aqibətsiz yurdcul dilədi? Niyə, niyə, niyə?.. Bəlkə Göyalı günahkardır? Əgər Göyalı günahkarsa, niyə intiqamı onun özündən deyil, bigünah Şükrandan alınsın? Bəlkə bu müsibət havalanan ağqoyunluları bir yerə yığıb ağlatmaq üçündür?

Hərə bir cür bilir, əslində heç kəs heç nəyi təfərrüatına qədər bilmirdi, bu oğlanın taleyinin belə sönük çıxmağından heç kəs düz-əməlli baş aça bilmirdi. Duruxub dayanan adamların təsəvvüründə Şükranın qara kirpikləri cərgələnir, onun köşək gözləri sorğular içində gəzirdi. Tabutda uzanan Şükran adamların təsəvvüründə bir də, bir də tabutdan durub Ulduzun belinə qalxır, təsadüfi əcəldən uzaqlaşır, uçduqca uçur, onun cingiltili cavan səs-sədası, Ulduzun nal səsləri Ziyarət dağından geriyə qayıdırdı. Min-min ağqoyunlunu dinləməyə məcbur edirdi:

– Allahü-əkbər... Allah bilən...

Qaratel bu ağır müsibətdən sonra qupquru qurumuşdu. Ananın quruyan gözləri döyükə-döyükə durmuşdu. Görəsən ananın aqibəti necə olacaqdı? Barı, başqa bir müsibət olmasın! Elə bil ki, ana aradan çıxmaq, bu müsibətdən uzaqlaşmaq, gözlərinin qabağında qara tabutda uzanan oğlunu haralardasa axtarmaq, Ziyarət dağına qalxıb, "Şükran, Şükran!" – deyə çağırmaq istəyirdi.

## XII

Yuxarı dağlardan yük-yük buz gətirdilər, Şükranın dəfni Ağqoyunlu adətinin ziddinə olaraq üçüncü günə saxlanıldı. Nə Göyalı ailəsi, nə də Ağqoyunlu eli bu gözəl-göyçəklikdə oğlanı tezcə torpağa tapşırmaq istəyirdi.

Alnından axan qana baxmayaraq, sanki Şükran həyata dönmək üçün yuxuya getmişdi. Baxan adama elə gəlirdi ki, Şükran ayılacaq, ayağa duran kimi gözlərini silə-silə Ulduzu soruşacaq, əhvalatı eşidincə Ulduzun əfv olunmasını diləyəcəkdir: "Hər nə olubsa, keçibdir" – deyə bu ağır cinayətin üstündən ötəcəkdir... Axı, adətə görə ağqoyunlularda doğruçu dostlar bir-birinin yolunda başlarından keçmişdilər.

Dost dostu düşmən girinə verməmək üçün ölümə getmişdir. Şükranla Ulduz da belə dostlardan deyildilərmi? Heç bir kəs təfsilatı bilməsə də, Şükran bilməmiş olmazdı və doğrudan da bilmişdi, necə də qara mozalan bu aranı qarışdırdı, necə də o öz qəsdinə çatmaq üçün Ulduzu acıda-acıda özündən çıxardı, Şükranın özünü də belə qəzəbləndirdi. Axı mozalan qəsdən çovurdu, öz qəsdinə görə Ulduzun dəmir nallı təpiyini Şükrana tuş elədi. Özü də Ulduzun bu hərəkəti çox yamanca bir müsibət gətirdi. Elə bil ki, qəflətən ox kamanından çıxdı, qardaşın oxu qardaşın ürəyindən keçdi.

Ancaq baxanda Ulduz yox idi. O, gözə dəymirdi, görünmürdü. Bəlkə öz böyük cinayətini duyan Ulduz aradan çıxıb başqa bir yana qaçmışdı? Bəlkə Ulduz hələlik Göyən dərələrinin dərinlərində gizlənmişdi? Yox, Ulduz nə qaçmışdı, nə heç bir yanda gizlənmişdi, Ulduz matəm içində sarsılıb dəyişmiş, öz Ulduzluğunu qeyb edib qara don geymişdi. Nəinki Ulduzu tanıyan, hətta onu tanımayan-bilən diqqətlə baxsa, çətin ki, onu tanıyardı. Ulduz hara, qulaqları sallanan, ortası ortasından keçən, ürəyin yandığı halda çeşmədən bir qurtum su içməyən, kömür kimi qaralan bu qarqara at hara?! Görən deyərdi bəs görəsən kimin əl çəkib Göyən düzənlərinə buraxdığı hər əfəl yabıdır ki, milçəklənə-milçəklənə gəlib bu araya çıxıbdır? Qovsan da bu qara at getmir, uşaqlar daşa bassalar da, bu qara at qaçmır. Elə bil ki, bu qara at dilə gəlib deyir: daha daşlayın məni, daşqalaq eləyin məni, qurtarın canımı. Diqqətlə baxan, zəndlə yoxlayan olsa idi, yenə də Ulduzdan heç bir Ulduz qaldığını görə bilməzdi. Şükransız Ulduzun hər bir dəqiqəsi acı ilcən keçmişdi. Bu vəziyyətdə belə yenə də Ulduz özünə bəraət axtarmırdı. O özünü günahkar, müqəssir bilirdi. Ulduz duyurdu ki, onun ağ günü Şükranla getmişdir.

Belə olduğu halda yenə də Ulduz barədə söz-söhbət kəsilmək bilmirdi. Güman ki, o atı Göyalının yeznələrindən birisi tələf edibdir, deyirdilər. Maraqlanırdılar, görəsən o atı nə ilə öldürüblər? Gərək belə bir xəyanətkar qatili ağqoyunluların gözləri qabağında oxa tutaydılar, bir an içində onun canından üst-üstə yüz ox keçirəydilər. Sən gör bu necə nankor atmış ki, onu kişmişlə bəsləyən, üfürə-üfürə tumarlayan adama dönük çıxmışdır. Yox, gərək bu qatil atın divanı Ağqoyunlu elinin gözləri qabağında tutulsun. Bacardıqca tez olsun, Şükran torpağa təslim edilməmiş bu at gəbərdilsin, obanın it-pişiyinə, dərənin qarğa-quzğununa qismət edilsin. Başqaları da başqa cür yozurdular. Onlar da

deyirdilər ki, Göyalı özü günahkardır ki, gəzib-dolanıb, arayıb-axtarıb, nəhayət, bu uğursuz atı qanı qiymətinə uzaq-uzaq eldən alıb gətiribdir. Görünür bu atın nəsli-nəcabəti belə imiş. Mazarat at nəslindən imiş, sahibini öldürən, yaxşılıq itirən nəsil! Yoxsa o qaçıraqda atı hər nə qiymətə də olsa, heç başdan elərdilərmi? Gərək biz elə Şükranın qanını bu atı başından eləyən adamın elindən alaq ki, bizim sevincimizi, gözümüzün işığını, elimizin yaraşığını, yeddi bacının bir qardaşını, Ziyarət dağının, ulu Tanrının verdiyi oğlanı əlimizdən aldı, yüzdən yuxarı ağçuxalı, doğruçu Ulduz atlı oğlanı öncülsüz, başçısız qoydu. Bizim haylı-küylü səsimiz yatdı, durna qatarı kimi cərgələnən yallımız qırıq-qırıq olub, bir-birindən qopdu, toy-mağarımız susdu. Yox, Ulduz deyilən atı satan mazarat günahkardır. O mazarat bilə-bilə ev yıxandır. Gərək hər necə olsa, onu tapıb yaxalayaq, qanımızı ondan alaq. Onların başdan elədiyi Ulduz heç Şükranın çölə atılan dırnağına da dəyməzdi. Sən hiyləgər, xatakar at, dur öz minicini dəmir nallı təpiyində həlak elə! “Yox, bu Ulduzu sağ-sağ oda qalasan da azdır. Gərək bu Ulduzu daşqalaq eləyəsən! Ya da bu Ulduzu yüz arşın dərinlikdə elə bir xəndəyin altında qoyasan, özünü də sağ-sağ qoyasan ki, bəlkə az-az da olsa ürəyin soyuya.

Matəm mərasiminə gələnlərin içində Ulduzu belə təhdid edənlər, atəşə tutanlar, onu cinayətkar, qatil sayanlar az deyildi. Bir Bəyalı oğlu Göyalıdan, bir də Göyəm qızı Qarateldən savayı heç kəs heç nə bilmirdi. Bilmirdilər ki, burada şər-şeytanın üfürüb, doldurub, qara qəsd üçün göndərdikləri qara mozalanın necə qara qəsdi olubdur! Lakin göz qabağında olanı bu idi ki, oğlanı at vurubdur. Özü də bu at qorxusundan qaçıb aradan çıxıbdır. Bəlkə də öz əvvəlki elinə, ilxısının içinə giribdir. Gedib öz doğulduğu mazarat ilxısının içinə ki, orada gizlənsin, kənar kəsə tutduruq verməsin. Bütünlükdə bu ilxı dağlarda, dərələrdə törəsin, artsın, çölün-çəmənin ruzisindən bəsdir deyincə yesin, bu mazarat atlar kökəlsinlər, şişsinlər, heç bir düz-əməlli insan oğlunu da bellərinə mindirməsinlər, heç kəsə qulluq edib xidmətində durmaq istəməsinlər. Desinlər: biz yaşayaq özümüz üçün, yaşamayaq insanlara xidmət üçün. Siz görün Şükran nəyə görə isə bu ata acıqlanıb, ya acıqlanmayıb, vurub, ya vurmayıb, at da dönüb hər nəvazişini unudub belə namərdliklə, görünməzin kəmfürsətliklə allahsız-tanrısız bir xəta işlədibdir. Yox, bu düşmənləşən atın cəzası böyükdür. Gərək yerin təkində də olsa, bu qatil at tapıla, onun cəzası verilə, özü də at satan

Ərdəhan elinə sifariş göndərilə ki, siz bizim qanlımızsınız, sizdən kim harada əlimizə düşsə, biz Şükranın qanının hər bir qətrəsinə qədər sizin hər bir adamınızın canından alacağıq. Lap dəstə bağlayıb yüz-yüz Ağqoyunlu ox atanlarıyla üstünüzə gələcəyik. Sizin ev-eşiyinizi oda-alova verəcəyik, sizdən qırdığımızı qıracağıq, qırmadığımızı əsir edib, yesir gətirəcəyik. Şükranın qəbrinin dövrəsinə dolandıracağıq, Ziyarət dağının ətəyində qurbanlıq kimi bircə-bircə kəsib, çölün vəhşilərinə qismət edəcəyik!

Şükranın qəfil ölümü üçün yanıb-yaxılan ağqoyunlular Ulduzun kölgəsini qılınclayır, bu növlə Ulduzu satan adamın özünü də, elini də hədələyir, onların hamısını vayqanlı tuturdular, "elin qanını eldən alarlar" – deyə dururdular. Sanki atı qəsdən uzağa satan, elindən uzaqlaşdıran həmin adam bu işi görmüşdü, bilə-bilə ağqoyunlulara qəsd etmişdi. Həmin adam qəsd etmişdi ki, ağqoyunlularda Şükran kimi gözqamaşdıran oğlan olmasın, ağqoyunluların ağçuxalıları piyadalaşsın, onlar sınıq düşsünlər və biz də bir gün köç-külfətlə yer-yurdumuzdan tərpənək, qumsallıqdan qurtaraq, qədim Göyən torpağını ağqoyunluların ucsuz-bucaqsız otlağını əlimizə keçirək!..

– Yox, burada qəsd vardır, özü də qara qəsd! – deyə ağqoyunluların qabağından yeməyən ağzıötkəmləri qabağa qaçırdılar. Sonra da onlar buzda saxlanan bədbəxt Şükranın üstünə qayıdırdılar. Görünür onlar Ulduzu satan tərəfin adamlarına daha da dərin nifrət oyatmaq üçün belə edirdilər. Ancaq başqa yandan da ağqoyunluların qalan adamları, arvad-kişiləri, qarı-qocaları, qız-gəlinləri at-dəvə üstündə hey uzaqlardan tökülüb gəlirdilər, axın-axın özlərini matəm yerinə yetirirdilər. Xəbər çatan yerdən, Arazın o tayı Qaradağdan, bu tayı Qarabağdan ağsaqqallar, ağbirçəklər də at-dəvə belində gəlirdilər. Onlar ağqoyunlulara başsağlığı vermək üçün gəlirdilər. Hər bir gələn də müvafiq bildiyi ağqoyunlunu danışdırır, hadisənin necə olduğunu aydınlaşdırır; onlar uğursuz ata necə divan tutulduğunu və ya tutulacağını öyrənib bilmək istəyirdilər... Ancaq nə bilən, nə də tanıyan var idi ki, Ulduz gizlənməyibdir, heç yana qaçıb uzaqlaşmayıbdır. Ulduz öz ulduzluğunu qeyb edib, qara yasa batıb, rəngini-ruhunu itirib qara kömür geyiminə giribdir. Özü də heç bir divandan aman istəmək qəsdində deyildir. Əksinə, Şükransız Ulduz üçün nəinki yaşamaq çətindir, bəlkə də qeyri-mümkündür. Axı Ulduz heç kəsdən də az kədərli deyildir. O öz gözlərindən gilə-gilə qanlı yaş axıtmaqdadır.

Göyalı ilə Qaratelin tək oğlu, yeddi bacının bir qardaşı göyalılar, ağqoyunlular bir ağçuxalı qəhrəmanı itirmişdilərsə, Ulduz öz misilsiz minicisini itirmişdir, öz açılan şəhpərini itirmişdir. Axı Ulduz Şükrana qanad verdiyi kimi, Şükran da Ulduzun üstündə öz ağ qanadlarını aça-aça Ulduza qanad vermişdi... Ulduz öz igidini itirmişdi, öldürmüşdü. Özü öz qol-qanadını sındırmışdı. Qara mozalan hər necə qara qəsd üçün çalışsa da, yenə də Ulduz özünü günahkar sayırdı, özü də heç kəsdən özünə əfv olunmaq diləmirdi. Əksinə, Ulduz özünə divan istəyirdi, divan tutulmaq istəyirdi, bəlkə də ağqoyunluların ürəyindən keçən kimi yüz-yüz oxun birdən öz canından, ciyərindən keçirilməyini istəyirdi.

## XIII

Axı Şükranın ölümü heç də adi ölüm deyildi. Bu müsibət idi, faciə idi, qəhrəman ölümü idi. Şükranın qəhrəmanlığı yol kəsənlikdən, baş kəsənlikdən, basqın etməkdən, qan tökməkdən ibarət deyildi. Şükranın qəhrəmanlığı tamam xeyirxah, nəcib insan qəhrəmanlığı idi. Şükran at ötüşlərində, cıdır çapışlarında ardınca ağçuxalılar, ulduz atlılar dəstələri gətirməkdə, toy-nağaranı gücləndirməkdə, Göyən yallılarını genişləndirməkdə birinci idi, başbilən idi, başçı idi! Şükran öz hərəkəti, öz rəftarı, öz cəsarəti və çevikliyi ilə adamları yaxşılığa, bir-birini sevməyə səsləyən insanpərvər idi, insan idi. Şükranda yaxşılıqdan istənilən qədər tapmaq mümkün olduğu halda, onun pisliyindən, pis əməllərindən heç bir, cüzi də olsa, tapmaq mümkün deyildi, çünki Şükran pis olmamışdı, heç kəsə də pislik etməmişdi. O vaxt at ötüşlərində möcüzələr göstərən Şükrana el-oba mərhəba deyirdi, Sevgili də gəlinbacısı ilə Şükranla toy etməkdən danışırdı, sevinirdi, yerə-göyə sığmırdı.

Bəs indi? İndi ulu Tanrı gör nə edibdir? Qara libasa qərq olan Sevgili indi nə deyirdi? Sevgilinin qonşusu həmin gəlinbacı – oğlunu Şükranın özü qucağına alan, Ulduzun belinə qaldırılıb gəzdirilən Gülnaz nə deyirdi? O, Şükranın matəminə heyifsilənə-heyifsilənə gəlməmişdimi? Bəli, heyifsilənməkdən artıq yana-yana gəlmişdi. Gülnaz oxu daşa dəyən Sevgilinin nə çəkdiyini bilirdi. Sevgili tək bircə kəlmə də olsa Şükranla kəsməmişdi. İndi tabutda uzanan, yanlarına buz yığılan Şükranı nə dindirmək, nə də ona Sevgili barəsində bir işarə etmək

olardı! Misilsiz şuxluq və cəsarət, çevikliklə Ulduzun belində oynayan oğlana indi nə söyləmək olardı? Sevgili ürəyindən keçirirdi: "Mən qara saçlarımı ağ hörəcəyəm! – deyə and içirdi. – Heç bir yana getməyəcəyəm, heç bir oğlanın üzünə baxmayacağam. Mən səni sevmişdim, Şükran! Yenə, torpaqda da səni sevəcəyəm. Sən öz sevgini qurd ağızlı torpağa apardığın kimi, mən də öz sevgimi elə bu torpağa aparacağam!"

Hər kəs Ulduzu qarğısa da Sevgili Elşad qızı Ulduzu qarğımırdı. Qarğıya bilmirdi. O, anlaşılmaz müəmma içində idi. Nədən ki, Sevgili Ulduzsuz Şükranı, Şükransız da Ulduzu təsəvvürünə gətirə bilmirdi. Sevgili öz kədərli hisslərilə baş verən hansı bir qara qəsdi isə göz yaşları arasından görürdü. Qara mozalanı göz qabağına gətirə bilməsə də, böyük bir müsibət baş verdiyini, qara nəfəsin onların açılmayan sevgisini necə qaraltdığını duyurdu.

XIV

Bəli, xeyirxah bir qəhrəman, nəcib bir insan ölmüşdür. Bu insanlar nəinki Şükranı sevirdi, onun Ulduzunu – atını da sevirdilər. Ən böyük müsibətə düçar olan Ulduz da heç bir insandan az olmayaraq qəhrəman süvarisini sevirdi. İndi də söz səhvinə – xətasına, keçilməz – bağışlanmaz günahına görə özünə yer tapa bilmirdi, tapmırdı.

Qaralıb qara geydiyinə, qara rəng aldığına görə başqaları onu tanımasa da, o özünü tanıyırdı. Şükransız keçən dəqiqələrinin necə də ölümdən də əzablı olduğunu o özü əcəbcə bilirdi. Kim Ulduzu hər necə dilbilməz, ağlı işləməz bir heyvan saysa da, Ulduz özünə görə dil də bilirdi, özünə görə ağlı da kəsirdi. İndi o, Şükransız özünü dolandıra bilmir, saxlaya bilmirdi. İnsan kimi, bəlkə insandan da artıq kədərlənirdi. Yemirdi, içmirdi, kənar-kəsmə gəzirdi, gözlərindən qanlı yaş tökməyində davam edirdi. Şükranın taleyi elə oldu, Sevgilinin də taleyi belə. Bəs Ulduzun taleyi necə? Onunla onun taleyi ilə, Şükransız keçən dəqiqələri ilə maraqlanan, bu atın halına yanan var idimi? Xeyr, yox idi! Ulduz at idi, özü də necə bir at! Qatil at! Onun nə taleyi! Ələ keçincə onu öldürmək, uğursuz Ulduzu dərinlərdə basdırmaq, üstəlik, bu Ulduzu ağqoyunlulara tərəf ötürən, başına sovuşduran adamlara divan tutmaq gərəkdi. Bu qədər! Daha başqa qədəri yox idi.

İndi diqqət Şükranın acı taleyindən də artıq onu dəfn etmək üzərinə gəlirdi. Yolçunu bunca gözlətmək yox, yola salmaq gərək idi.

Qəribə görünsə də, elə bir məqam gəlmişdi ki, hamı, hər kəs darıxırdı. Uzaq da, yaxın da dəfn mərasimi üçün tələsirdi. Hətta, özündə olmayan ana heç nə bilməsə də, onun ağlı indi heç nə kəsməsə də, oğlunun dəfni üçün içəridən darıxmaya bilmirdi, istər-istəməz oğlanın yola salınmasını istəyirdi. Öz Şükranını öz canından min qat artıq istəyən Göyalı özü də oğlunun dəfni üçün darıxmağa başlayırdı. Demək, heç nəyə, heç bir kəsə baxmadan qəti qərar, qəti icra olmalıydı. Sanki adamların titrəyən ürəklərində bir sümükləşmə gedirdi. Şükranı son yoluna salmaq gərək idi. Getməli qonağın getməyi! Nə amansız qanun, nə zülmkar hökm! Bu amansız qanun, bu zülmkar hökm dönmədən icra olunmalıdır! Şükran kəfənə tutulmuşdumu? Xeyr, heç kəs onu kəfənə tutmamışdı. Ağqoyunluların qədim alətinə görə qəhrəmanlar öz libaslarında qalırdılar. Onlar öləndən, döyüşlərdə həlak olandan sonra soyundurulmurdular. Bu qəhrəmanlar başqaları sayaqda lütlənib çılpaqlaşdırılmırdılar. Öz geyimində qalan qəhrəmanın silahları da öz yanına qoyulurdu. Bəs Şükranın silahı? Şükranın silahı ox, kaman, bir də gümüş qınlı xəncər idi. O, ox atmamışdı, hətta heç ceyrana, cüyürə də qıymamışdı. Şükranın oxu tərpənməmişdi, öz yerində idi. Ancaq Şükranın gümüş qınlı xəncəri at ötüşlərində çıxarılırdı, günəşə doğru qaldırılınca par-par parıldayırdı. İndi bəs necə olsun?! Şükran öz geyim-kecimində qoyulan tabuta bu əsləhələrdən hansı qoyulsun? Xəncərlə ox-kamanmı? Ya ancaq xəncər?

Dedilər ki, bəs Şükranın üzü qara yaylıqla örtülməsin, çünki ağ papağı sinəsinə qoyulan Şükran sanki yuxuya getmişdi. Bu barədə söhbət gedincə, mübahisə başlayınca lal-dinməz oda yanan, qızaran gözlərini hürüt-hürüt döyən Göyalı ayağa qalxdı:

– Camaat! – dedi. – Ox-kamanı qoymayın, mənə gərəkdir. Şükranın oxu ilə Şükranı qətlə çatdıran qatili öldürəcəyəm!

Hamı ağlaşdı... Ata qəzəbinin nə olduğunu, nə üçün olduğunu bilən ağqoyunlulara da qəzəbli xitab dalğa-dalğa yayılmağa başlayınca, uzaqlarda duran qonaqlar da ağlaşdılar. Heç kəs Şükranın atası Göyalını qınamadı. Ona belə deyil, elə deyil demədi. Qanlı yox idi, gözə görünmürdü. Bəlkə qohum-qardaşdan kimsə qatil atın tərkini qılmışdı?! Yox, belə deyildi, hələ ki, belə olmamışdı! Ani sükutdan sonra səs qayıtdı:

– Yaxşı, yaxşı, onu qoymarıq, sən öz əlinlə oğlunun intiqamını alarsan!

Göyalının qəzəbnak səsi titrədi:

– Həm də, camaat, mən Ziyarət dağına da dırmanacağam!

– Oraya nə üçün, Göyalı?

– Oxu oradan yuxarıya tuşlayacağam!

– Asi düşmə, Göyalı!

– Mən asi düşürəm, el! – deyə intiqam alovuyla yanıb kösövə dönən Göyalı üzüyuxarı dartınmağa, əyilən qəddini düzəltməyə çalışdı. – Mən Şükranı verən ulu Tanrıya iyirmi il şükür edib borcdan çıxmışam. İndi Şükranı alan Tanrıya deyəcəyəm: mən asiyəm, məni cəhənnəmə göndər, mən səni tanımıram!

– Ürəyin yanır, Göyalı!

– Ürəyim hər necə yandı-yanmadı, Ziyarət dağının kəlləsinə qalxmaqdan da qabaq o qatil Ulduzu, bax, Şükranın bu oxuyla oxlayacağam!

– Ulduzu oxla, Göyalı! – deyə kişini Allah səbrinə səslədilər. – Ancaq ulu Tanrıya qarşı asi düşmə! Qoy Şükranın yeri yumşaq olsun, cənnət olsun!

– Şükranın yeri yumşaq olacaq, cənnətdə olacaqdır, – deyə Bəyalı oğlu yanıqlı səsini titrəyə-titrəyə qaldırdı. – Bax, bu qara geyən bizim göyənlimiz Elşad qızı Sevgilidir. Bizdən heç kəs indiyə qədər bilməyibdir bu bədbəxt balalarımızın arasında nə vardır! İndi ellikcə bildik ki, bizim bədbəxt... – Göyalı udqundu. O, bircə gecənin içində ağ liflər düşən qızın saçlarını tumarladı: – Bax, oğul toyu, ay el, belə olarmış! İndi görün məni asiliyə gətirən Allah necə də ədalətsizdir!

Kişini sakitləşdirməyə çalışsalar da o, sakitləşə bilmirdi, tüstüsü təpəsindən çıxırdı, açılışmışkən dayana bilmirdi:

– Hamıdan da əvvəl günah məndədir! – deyirdi. – Bax, bu dili tutulan Göyəm qızı Qaratel, bizim üzümüzə hürüt-hürüt baxan bu Göyəm qızı məni çox ayıltdı. Mən ayılmadım. Mən dolaşığa düşüb qəzadan qaça bilmədim. Öz vaxtında Şükranı qətlə çatdıran o kəmfürsət atı oğlumdan uzaqlaşdıra bilmədim, çünki Allah özü qəsdən mənim basaratımı bağladı.

– Şükürlü ol, kişi, səbirli ol, Göyalı!

– Şükürlü, səbirli olacağam, ay elə! – deyə Göyalı tabutda uzanan Şükranın şəvə saçlarını tumarlaya-tumarlaya yanan dodaqları ilə oğlunun soyuq-soyuq alnından öpdü, öpdü. Birdən qəddi əyilən ata elə hönkür-hönkür ağladı ki, bütün ürəklər zoğ-zoğ zoqquldadı.

## XV

Şükranın dəfnində Göyən düzənində insan dəryası təlatümə gəldi. İndiyə qədər görünməyən insan dalğası Göyən düzənində dalğalandı. Axı eşidən də Göyənə gəlmişdi, necə deyər, eşitməyən də; bilən də gəlmişdi, bilməyən də; yaxın da gəlmişdi, uzaq da. Ağqoyunlulardan başqa qaraqoyunlular da gəlmişdi, həkərəlilər də, bərgüşadlılar da, əl-yanlılar da, müsəlmanlar da, zarıslılar da, ovşarlar da, mərzli-mərcan-lılar da Arazın bu tayı qarabağlılar da, o tayı qaradağlılar da axın-axın Göyənə gəlmişdilər. Bilməyənlər bilənlərə, eşitməyənlər eşidənlərə qoşulub gəlmişdilər. Hər yanda, hər yerdə insan axını başlayınca, bu axından qalmaq qeyri-mümkün olmuşdu. Göyən düzəni öz ömründə görmədiyi min-min adamla dolmuşdu. Hamı bu müsibətə, faciəyə, bu ağır dərdə şərik olmağa gəlmişdi. Şükranın dəfni Göyəndə görün-məyən insan toplanışına səbəb olmuşdu. Elə bir toplanış ki, nə ucu görünürdü, nə də intəhası. Adət üzrə arvadlar ayrıca toplanmışdılar , kişilər də ayrı. Ağçuxalı igidlər qara çuxalar geymişdilər. Onlar Ulduz atlarının belinə qara-qara örtüklər örtmüşdülər. Onlar piyadalanmışdı-lar. Atlarını yedəklərinə almışdılar. Məğrur başlarını döşlərinə salla-mışdılar. İnsan axınının ardınca gəlməyə başlamışdılar. Bəs Şükranın Ulduzu? Qatil sayılan Ulduz harada qalmışdı? Bəlkə Ulduz öldürül-mək qorxusundan yana qaçıb Göyənin dərin dərəsində gizlənmişdi? Xeyr, Ulduz nə qorxmuşdu, nə qaçmışdı, nə də bir yanda gizlənmişdi. İndi Ulduz heç kimdən, heç nədən qorxmurdu. Ulduz çox yamanca kədərlənmişdi. O, Şükranın ən yaxın dostlarından da artıq kədərlən-mişdi. Onlardan da artıq göz yaşı tökməyə başlamışdı. Ancaq Ulduz bütün bu axının ardınca başını sallaya-sallaya, yenə də gözlərindən qanlı yaşlar tökə-tökə gəlməyə başlamışdı. Heç kəs də bilmirdi niyə bu qara at bu dəfn mərasiminə qoşulmuşdu? Görən də deyirdi: nə çox-dur Göyən düzən-dərələrində özbaşına buraxılan, əldən düşəndən sonra çölə ötürülən boş-bekara at! Bu atları nə cavanlardan, nə də oğru-əyridən qorğanan vardır. Belə atlar işdən düşüb, kardan çıxınca səllimi buraxılırdılar. Bu atlardan da ölən ölür, itən itir, batan batırdı. Əgər tək-tükü də qışın çovğunundan sağ çıxırdısa, baharın bolluğuna çatırdısa, istəyən kasıb-kusubun gərəyinə gələ bilirdi. Bəs Şükranın Ulduzu necə? Ulduz özbaşına buraxılsa belə, onun üzünə baxan ola-caqdımı? Ulduzun necə bir Ulduz olduğunu bilincə, ona dəyib-dolaşan

olmasa belə, bir kəsin gərəyinə gələcəkdimi? Görünür nə belə bir ata ürəyi yanan, nə də bir gərəyə gəldiyini güman edən tapıla biləcəkdi! Axı kim uğursuz ata, hətta özbaşına buraxılsa belə, sahib olardı? Kim Şükranı qətlə çatdıran atı tanıyıb-bilincə öz qapısına qoyardı? Heç kim, heç kəs! Əgər belə atı tanıyan-bilən olsaydı, onda mütləq daşa basardı, əlinə düşən odundan, yarmaçadan, qara tikan gör-kötüyündən görünüb atın başına çırpardı! Üstəlik də obanın itlərinə tutduruq verib bu həndəvərdən uzaqlaşdırardı. Əgər bu qara atın həmin qatil at olduğunu bilən olsaydı, çox yəqin ki, qəzəblənərdi, bu dəfn mərasimindən əvvəlmi, sonramı birbaşa bu uğursuz atın üstünə dönərdi, bəlkə də elin əli ilə bu at daşqalaq olardı. Göyən düzəni də ən böyük daşqalaq altında qalardı.

– Bu nədi, balam? – deyə üstündən əsrlər ötsə belə soruşan tapılardı. – Bu nə boyda daşqalağıdır!

– At daşqalağıdır, – deyə soruşan adama cavab verən də olardı.

– Necə at daşqalağı, balam? Heç atı da daşqalaq edən olarmı? – təəccüblə söylənərdilər. – Olsa-olsa günahkar insanı namənşir iş tutan arvadı daşqalaq edərlər!

Bilənlər məlumat verərdilər:

– Bir el də yox, bütün ellər bu atı daşqalaq ediblər!

– Haçan, nə zaman?

– Rəvayətə görə sahibini dəfn edən gün!

– Belə bir atın sahibi kim imiş, nə iş-peşənin sahibi imiş?

– Dünyalara dəyən biriminci minici oğlan imiş!

– Yəqin ki, bu at həmən igid oğlanı öldürübdür!

– Rəvayətə görə bu at çox yamanca xəyanətə gedib onu bəsləyən sahibini məhv edib, Sevgili adlı gözaltısına qara libas geydirib, toyunu da yasa döndəribdir!

– Onda nəinki bu atı belə daş-qaya ilə qalaqlamaq lazımmış, lap Ziyarət dağının o iri-iri qayalarından, sallarından, sıldırımlarından birtəhər gətirib bu atın üstünə yıxmaq lazımmış ki, nəinki buradan ötən, Göyənin harasından keçən görəydi, lap uzaq-uzaq yanlardan baxanda belə bu hərami bilinəydi. Yoxsa sən atı saxla, at da dönüb ömrünün çiçəkləyən çağında səni torpağa göndərsin!

– Görünür bütün dünyada at daşqalağı ancaq Göyəndə əmələ gəlibdir!

– Haradan bilirsiniz belə at daşqalağı ancaq Göyəndə əmələ gəlibdir?

– Bu qalağın tamaşasına gələnlər söyləyirlər. Tarix kitablarını vərəqləyənlər sübut edirlər ki, belə at daşqalağı ancaq Göyəndədir!

Bu sözləri sanki duyan, hər kəsdən də qabaq özünü günahkar sayan, hər kəsdən də artıq qara yasa batan Ulduz titrəyirdi, ağlayırdı. Onda niyə Ulduz dinmirdi, susurdu, kişnəmirdi? Heyrətamiz tərəfi də bu idi ki, Ulduz qara yasa batandan sonra susurdu.

Şükranın susan, nitqi tutulan anasının susduğunu, ilk haray-həşirdən sonra səsinin çıxmadığını duyub alan Ulduz da susurdu. Demək, Ulduza da ağır zərbə dəymişdir. Bəli, burada hər kəsə dəyən zərbədən qat-qat artıq zərbə Ulduza dəymişdi. Burada zərbə alanların hər birisini ayrı-ayrı tanımaq, bilmək mümkün olsa da, qara don geyən, qara yasa batan Ulduz tanınmaz, bilinməz olmuşdu. Ən dəhşətlisi də bu idi ki, heç bir kəs Şükranın qətlində günahkar sayılmadığı bu rəhmsiz, amansız qətli törədən qara mozalan gözə görünmədiyi, bilinmədiyi halda hər kəs və hamı tərəfindən Ulduz günahkar sayılırdı, qara don geyən Ulduz göz qabağında görünə-görünə heç kəsə də görünmürdü. Bəlkə Ulduz axın-axın Ziyarət dağına doğru axan, Şükranı əl üstündə aparan izdihamın qəzəbindən qorxurdu? Bu qədər adamdan, yüz minə çatan insandan böyüyündün kiçiyinə qədər heç bir kəsin ürəyində Ulduza qarşı rəhm yox idi. Hamıda, hər kəsdə Ulduza qarşı hədsiz nifrət var idi.

Qara at da asta-asta, yavaş-yavaş qara örtülü ulduz atların arxasınca gəlirdi. Üzü örtülməyən, üstünə qara yaylıq salınmayan Şükran sınaqdan çıxan sərkərdələr kimi əldən-ələ aparılırdı. Hər kəs Şükranın tabutundan yapışmağı, onun cənazəsindən tutmağı özünə borc bilirdi. “Belə də qəşəng oğlana qıyılarmı?” – Sanki Şükranı Ziyarət dağına doğru aparmaqla ulu Tanrıdan cavab istəyirdilər. Bu izdihamın qətiyyəti qarşısında inanan da, inanmayan da ulu Tanrını çağırmaq, demək istəyirdi ki, çıx qənşərə kəhkəşanlı səltənətindən, en Ziyarət dağının kəlləsinə, cavab ver bizə, niyə öz verdiyin Şükranı öz amanında saxlamamısan? Niyə sən Ulduzun qol-qılçasını dərhal qırmamısan? Atı dərhal çərlədib gəbərtməmisən? Qatili qarğa-quzğuna qismət eləməmisən? Əgər bütün xoşbəxtlik, ya bədbəxtlik sənin iradənləsə, niyə yelqanadlı, ağçuxalı gözəl cavana qıymısan, bunca adamları yaxıb-yandırmağa, abi-leysan kimi ağlatmağa razı olmusan?!

Qara torpaq öz qara ağzını açmışdı. Heç kəs Şükranı torpağın qara ağzına atmaq istəməsə də, yenə də qəti qərara əməl olundu, Şükranın

tabutu yerə qoyuldu. Daha bu tabut buradan başqa yana götürülməyəcəkdi. Bu hökm əzəli idi. Bu məzar tərpənməyəcək, bu türbə sökülməyəcəkdi. Ziyarət dağının tuş qabağında başdaşları o yan-bu yana əyilən, yıxılan köhnə qəbiristanda Şükran üçün xüsusi yer ayrılmışdı. Şükrana qanad verən, şöhrət gətirən at necə? Bu at da qalacaqdımı? Nə dərəcədə günahkar sayılsın-sayılmasın, at da unudulmayacaqdı. Ancaq necə, nə təhər? Bir divan olsaydı, günahkar aydın edilərdi. Ancaq hər necə divan olsa, kim Ulduza bəraət verə bilər, kim Ulduzun xətasından keçə bilər, kim onu sevib oxşaya bilər, kim Ulduzu qara donundan çıxarıb öz əvvəlki ulduzluğuna qaytara bilərdi? Olsa-olsa bircə Şükran! Şükran isə ağzını açan qara torpağa təslim olacaqdı. Dostun biri gedəcək, biri qalacaqdı. Özü də qatil kimi qalacaqdı...

Bir azdan Şükran öz qohum-əqrəbasının, bacı-qardaşının, uzağın, yaxının hönkürtüləri, bir də qara libaslı Sevgili qızın hıçqırtıları içində, "yaranan torpağa gedəcəkdir" məfhumilə məzara gedəcəkdi!

Belə də oldu, Şükran məzara qoyuldu. Tələm-tələsik bel-kürək götürüldü... Şükranın üstü torpaqlandı, torpaqla qalaqlandı. Üstünə daş da qoyuldu, qara tikan da. Bir də, bir də onun üstü örtüldü, örtüldü. Çox bərkcə-bərkcə örtüldü. Hər kəs bir də bir-birinə qarışdı, qara örtülü ulduzlar da səs-səsə verib kişnəşdi. Yalnız Şükranın bir qıraqda dayanan Ulduzu susdu, qaradinməzcə durdu.

## XVI

Axşamüstü yeddi bacanağın yeddisi də Göyalının qapısında ocaqlama qurub baş-başa verdi. Onlar öz ömür yoldaşlarının tək qardaşını boy atıb qalxan, tez-tez "Şükran dayının canı haqqı" – deyib and içən uşaqlarının sevdiyi, qürrələndiyi misilsiz adamı itirmişdilər. Xüsusən Göyalının oğlan nəvələrinin dilindən Şükran dayı düşmürdü. Demək, Şükranın ölümü bütün elə-obaya təsir edib hönkür-hönkür ağlatdığından da artıq bu irili-xırdalı Göyalı ailəsini ağlatmışdı. Ağlatmışdı da az idi, bünövrədən sarsıtmışdı. Elə bil ki, Göyalı ailəsi yer zəlzələsinin mərkəzinə düşmüşdü. Burada hamı yara almışdı, hamı sınıq-sınıq, şil-şikəst olmuşdu. Göyalının sarsıntısı dəhşətli, Qaratelin sarsıntısı olmazın dərəcədə fəlakətli idi. Qaratelin gümüş saçları pırtdaşmışdı. Öz qanından, oğlu Şükranın qanından onun qar kimi ağ saçlarında uzun müddətdə izi itməyən talalar qalmışdı. Baxanda Qaratelin gözləri

genişlənmişdi. Bu gözlərdə başaçılmaz vahimə yaranmışdı. Qaratel danışmırdı, danışa bilmirdi, heç bir işə qarışmırdı, qarışa bilmirdi. Ancaq Qaratelin gözləri də, işarələri də Şükranı həlak edən Ulduzu çox tezcə tapmağı, çox tezcə onu oxa tutub tələf etməyi israr edirdi. Bu at tapılsa belə, onu saxlamaq çətin, saxlamamaq da çətindi. Belə bir vəziyyətdə istər-istəməz dost dönüb düşmən olmuşdu. Ən dəhşətlisi də öz dostunun düşmən olması deyildimi? Ən ağırı da öz dostunla düşmən düşmək deyilmi?

Qara mozalan öz qara niyyətini çox yamanca qaralıqla yerinə yetirmişdi. Bu qara Mozalan hər iki dostun – Ulduzun da, Şükranın da qanını içmişdi. Qara mozalan öz qara mozalanlarına qarışıb haradasa kefə başlamışdı. Dönə-dönə dönüb baxan, diqqət yetirən olsaydı, görərdi, yəqin edərdi, bütün şəkk-şübhədən, hər hansı bir iştibahdan çıxardı, necə də qara paxıllıq, qara iblislik, qara şərəşürlük, qara qatillik öz qaradan qara işini görmüşdü, elə bil ki, qara şeytan geniş Göyən düzənində ürəyindən xəbər verən belə bir uçqunu açmaqla öz kinli ürəyini güldürmüşdü. Öz qara qəhqəhəsilə Göyən düzənini dönə-dönə doldurmuşdu. Bu şər-şeytan çox yamanca qələbə çalmışdı. Azdan çox törəmişdi. Bir damcı zəhər bir sərkərdəni yerə sərmişdi. Belə idi!..

Burada insanın "olacağa çarə yoxdur" deyən acizliyi üryanlığıyla üzə çıxırdı. "Qəzanın qədəri" də öz işini görmüşdü. Ulu Tanrı bu faciənin qabağını ala bilmədiyinə görə gizlənmişdi. Nə isə, bu qara mozalan fəsadı belə bir hərc-mərclik yaratmışdı, fikirlərdə, zehinlərdə yamanca dolaşıqlıq doğurmuşdu.

Bu qabaran-qalxan qəbri unutmaqmı olar?! Bəlkə bir zaman Şükranın məqbərəsini görmək, ağçuxalı oğlanı ziyarət etmək üçün "Ağ oğlan" günbəzinin ziyarətinə gələnlər, heç də az olmayacaqdır. Yəqin ki, Şükran yatan yer getdikcə müqəddəs türbəyə çevriləcəkdi. "Dayının torpağına and içirəm" – deyiləcəkdi. Göyalı törəməsində bu and ən müqəddəs and sayılacaqdı. Bəlkə də bu yer bir ziyarətgaha çevriləcəkdi? Şükran yatan torpağı unutmaqmı olardı?

Ziyarət dağının ətəklərində ucalan "Ağ oğlan"ı – Şükranı adamlar bəlkə peyğəmbərləşdirəcəkdilər? Demək çətindi! Bəlkə Şükranı imamlaşdıracaqdılar? Söyləmək müşküldü! Ancaq Şükranın məqbərəsi "Ağ oğlan" günbəzi qalacaqdı. Elin əli ilə Şükranın üstündə tikiləcək şüş qübbəli günbəz "Ağ oğlan" adıyla ucalacaqdı. Bütün köçərilər, ağqoyunlular, qaraqoyunlular, qarabağlılar, qaradağlılar, Göyəndə

ucalan Ziyarət dağının yanından qalxanlar "Ağ oğlan"ın böyründən heç də saymazyana keçməyəcəkdilər. "Ağ oğlana"a üz tutan, ürəyindən arzu keçirən az olmayacaqdı, çox-çox olacaqdı! Hamı "Ağ oğlan"dan dilək diləyəcəkdi. Yox, hər necə olsa, hər kim olsa, "Ağ oğlan"ın yanından saymazyana ötüb sovuşmayacaqdı.

Yenə də dönək həmin mətləbə, deyək Ulduz günahkar deyildir, ona necə bəraət vermək, necə onu cərgələrə çıxarmaq, hansı möcüzə ilə onun qara donunu əynindən sivirmək, onu öz ağçaq ulduz donuna geyindirmək olar? Demək, belə qəsdə düşən olsa, Ulduzu özünə döndərmək, əzəlki halına qaytarmaq mümkün olmazdı! İş dolaşıq, tale dolaşıq, faciə dolaşıq, zəhər-zəqqum! İndi belə bir nəticə durunca Şükranı ulu Tanrıdan diləyinə dəyərmişmi? Şükran olsaymış yaxşı imiş, yaxud olmasaymış? Gözləri genişlənən ana bilmirdi necə olsaymış yaxşı imiş? Ancaq qəm dəryasına qərq olan ata da aydın bilmirdi. Bu cəhəti bacılar da bilmirdi. Bacı uşaqları da başa düşmürdü. Göyalının həyatında baş-başa verən bacanaqlar da başlarına vurub bir yana çıxara bilmirdilər. Ancaq onlar bilirdilər ki, belə bir qəti, üzüdönməz bədbəxtlik baş verəndən sonra səbəbini yüz yana yozsan, nəticə budur ki, olan olubdur, Şükran əldən gedibdir, onu öz Ulduzu öldürübdür. Vaxtaki Şükran ölübdür, öldürülübdür, ağqoyunlular adətincə, aran torpağının qaydasınca onun yasını saxlamaq, üçünü, yeddisini, qırxını, sonra da kədərli aylardan ibarət ilini keçirmək gərəkdi.

Ana özünü itirmişdi. Ata özünü itirəcək dərəcəsində təlatümdə, həyəcanda idi. Bacılar da bilmirdilər nə etsinlər. Yasa gələnlər də yavaş-yavaş çəkilib getməli, sonra da istəyən kəslər üçünə, yeddisinə, qırxına, sonra da ilinə gəlməli idilər. Demək, baş-başa verən yeddi bacanağın – bu qardaşlaşan kişilərin öhdəsinə bütün bu mərasimləri keçirmək ağırlığı düşmüşdü. Vaxtilə iyirmi il əvvəl Göyalı qızlarına qardaş, özünə yurdçu diləmişdi. İndi onun həyətində yeddi bacanaq – yeddi qardaş baş-başa vermişdi. Demək, əslində yeddi qıza yeddi qardaş, sirdaş var imiş. İndi də vardır. Ancaq bir tək Şükran yox idi. İndi Şükranı kim əvəz edə bilərdi? Kim elə bir Ulduz tapıb Şükran kimi qanad çala bilər, ürəklərə yol aça bilərdi? Müəmma, müəmma, dolaşıq dolaşıq üstündən, düyün düyün üstündən...

Şükranın yeri Göyəndə görünəcəkdi. Elin əli ilə "Ağ oğlan" günbəzi qaldırılacaqdı. "İgid ölər adı qalar..." Qara ağzını açan torpağa nə qədər "ağzın yumulsun!" deyə qarğıyanlar olsa da, yenə də hirsi so-

yuyan insanların nəzərində bu torpaq müqəddəs türbəyə çevriləcəkdi. Bir növ ocaqlaşacaqdı. Qoy burada yatan ənbiya-övliya olmasın, abid olmasın, zahid olmasın, şeyx olmasın, belə bir növcavan qəhrəman olsun!

Baş-başa verib düşünən bacanaqlar öz yerlərindən tərpənincə bir-birilə himləşdilər, qayıdıb Göyalının bir qədər gözdən iraq olan çal-çəpərlərindən yeddi yabanın qulağında, yeddi vələ quru qaratikan götürdülər, qaranlıq qovuşar-qovuşmaz Şükranın məzarına çatdılar. Bacanaqlar öz uşaqlarının dayıları, qardaşdan da artıq bir qardaş itkisi üçün səssiz-səmirsiz ağlaşdılar, gətirdiklərini üst-üstə qalaqlayıb bir ocaq qaladılar, bu ocağı papaqlarıyla yelləyib tonqala döndərdilər, alovlarını da göyə qaldırdılar. Alovlar Ziyarət dağının sinəsinə qədər öz dilini uzatdı. Bu işıqda da bacanaqların göz yaşları axdı, axdı; alov qalxınca bacılar da, bacı uşaqları da gəldilər. Yaxın-uzaq qohumlar da gəldilər. Bunlardan sonra qara libaslı Sevgili də, qonşu gəlin Gülnazla gəldi. Onlar işıqda Şükran üçün bir də, bir də ağlaşdılar. Axır ki, kiri-dilər, yavaş-yavaş çəkildilər, bircə-bircə göylər oynamağına qayıtdı-lar. Sevgili Gülnazla döndü. Bu qız nə isə indicə gözə dəyməkdən, ba-cılardan başqa bir söz eşitməkdən çəkinirdi...

Tonqal sönər-sönməz qaranlıqdan qara at çıxdı, bulana-bulana gəldi. O, baş tərəfdə közərən ocaq səmtində deyil, aşağıdan Şükranın ayaqları altında dayandı, öz başını həmin-həmin Şükranın ayaqlarına salladı, yenə də gözlərindən qanlı yaş tökə-tökə ağladı.

## XVII

Üstündən on gün ötdü. Qara at qapıya gəldi, Göyalının adamlar seyrəkləşən həyətinə girdi. Müqəssir oldu-olmadı, Ulduz divana gəl-mişdi. Ulduzu görən ailə ağladı. Getdikcə gözləri genişlənən Qarate-lin qəzəblə dolan gözləri yandı. Onun göz yaşları kirpiklərində qurudu. Ulduz özü ilə buraya başaçılmaz təzad gətirdi. Kimdə Ulduza qarşı kin, kimdə də gizli tərəhhüm doğdu. Kimi Ulduza Şükranın qa-nadları kimi, kimi də qəddar qatili kimi baxırdı. Götürüb baxanda hər iki tərəf öz-özlüyündə düz idi. Qara mozalanın qara hərəkətindən xə-bərdar olmayan, qara daşın qabağında Ulduzu didə-didə qanını necə axıtdığını, necə hirsləndirib gözlərini qaraltdığını bilməyənlər Ulduzu yolundan azan, cızığından çıxan nankor bilirdilər. Bu nankoru da

Şükranı qətlə çatdırmaqda ən ağır cəzaya, ən qəzəbli divanə layiq görürdülər. Heç bir başqa səbəb arayıb-axtarmadan bu atın məhvini, özü də Göylər kəndinin ortasında oxa tutulmağını, Göylər obasının itlərinə yedirdilməsini düzgün hesab edirdilər. Deyirdilər ki, qoy belə dönük çıxan Ulduza bundan da yaman divan tutulsun. Yoxsa ayrı cür heç kəsin ürəyi soyumayacaqdır...

Qapıya gələn qara ata hər kəs belə bir kinlə, nifrətlə baxıb udqunurdu. Bu ata tərəhhüm edənlər, bu qətli təsadüfi xata sayanlar, mozalanamı, milçəyəmi görə nallı təpiyə yol verilməyin nəticəsində belə bir bədbəxtlik baş verdiyini gümana gətirənlər öz fikirlərini gizləyirdilər. Gizlənənlər isə özlərini büruzə verir, hər kəs bu ata şəxsən divan tutmaq üçün özünü qabağa verməyə cəhd edirdi. Ələlxüsus da Göyalının yeznələri. Yeddi bacanağın yeddisi də bu atdan intiqam almaq üçün özlərini yeyib-tökürdülər. Lakin onlar unutmamışdılar ki, Göyalı necə də Şükranın ox, kamanını qəbrə qoymamağı təklif etdi, Şükranın ox, kamanı ilə bu atdan intiqam alacağını el qabağında elan etdi. Göyalının ürəyi az-çox soyusun deyə, bu atı oxa tutmaq, obanın içində də olmasa, bir qıraqda gəbərtmək, Göyən dərələrinin qurd-quşuna yem eləmək gərək idi. Bu gərək işi də ürəyi intiqam alovları içində yanan ata görməliydi. Onda bəlkə Göyalı az-az özünə gələ bildi? Əgər bu divanı oğlunu itirən bədbəxt ata oğlunun qatilinə tutsaydı, ümumin nəzərində insaflı, ədalətli iş olardı. Yoxsa döşünə döyən yeznənin heç birisinin burada yeri yox idi. Ümumin nəzərində yerinə düşərdi ki, Göyalı bu ata bir ox atdığı halda Qaratel də bir ox ataydı, ata-ana bəsdi deyincə bu qatil atı oxlayaydı. Onda bəlkə atanın da, ananın da ürəyi az-az soyuyaydı, nitqi tutulan ana az-az da olsa özünə gələrdi. Onda bəlkə ana həyatda sağ-salamat qalan qızlarını da, nəvələrini də nəzərə alardı, az-az toxtardı, dəli-divanə olmaq qorxusundan da sovuşardı. Yoxsa ayrı cür ananı geri qaytarmaq mümkün olmazdı.

Qaratel hal-huyla özündən çıxardı, Göyən düzənlərini ötüb alışdığı, kömək umduğu, indi də hiddətlə gözdən keçirdiyi Ziyarət dağına tərəf uzanan cığırla səs-səda sala-sala gedərdi. Onun müdhiş səsi Göyən düzənlərini, dərə-təpələrini doldurardı. Belə olanda nə onu tutmaq, nə də saxlamaq mümkün olardı. Axı Qaratel üçün ölümdən dəhşətli olan bir dəli-divanəlik onun genişlənən, hədə-hədəqəsindən çıxan gözlərindən oxunurdu. Bu ruhi gərginlik ağsaçlı Qarateldə öz

aman-imansızlığını göstərirdi. Qaratel oğlu Şükrandan sonra, Şükranı qara torpağa tapşırandan, üstünü torpaqlayıb, bu torpağı da tikanlayıb daşlayandan, üstünü bərk-bərk bərkidəndən sonra daha şiddətli dərəcədə ruhi gərginlik keçirə-keçirə dəhşətə gəlmişdi.

Axı bir də, elə bil ki, qəbirqazanlar Şükrana hörmət olaraq başqalarından daha dərin qəbir qazımışdılar. Bu qəbirin üstünü torpaqlayanlar Şükrana hörmət etdiklərinə görə yan-yörədə bir ovuc da torpaq qoymamışdılar, hamısını qəbrin üstünə töküb qalaqlamışdılar. Şükrana hörmət olaraq Ziyarət dağının ətəklərində gizlənən, goreşən kaftarlardan qorumaq üçün oğlanın üstünü təzə-təzə, özü də iti-iti qaratikanla örtüb, bu tikanların da üstünü daş-qaya ilə doldurmuşdular. Ancaq nitqi batan ana bütün bunlara zidd idi. Anaya elə gəlirdi ki, Şükran bunca ağır yükün altında qoyulan gümüş qınlı, iti ağızlı xəncərlə, o göy zağlı soyuq silahla teylənmişdi. Onu teyləyən bax, bəmin bu uğursuz atdı ki, öz Ulduz cildini dəyişib, qara geyinib qapıya gəlibdir. Qoy bu qara at qapıya gəlməsin, yıxılıb ölsün, yenə də ananın ürəyi soyumaq bilməyəcəkdi. Bu qara atdan bir cür deyil, min cür intiqam alınsa da, yenə də Şükranın anasının ürəyi taxmamayacaqdı. Tezmi-gecmi bu ana baş alıb gedəcəkdi. Hara gedəcəkdi, necə gedəcəkdi, gələcək özü göstərəcəkdi. Ancaq indilikdə qədəmləri qoruyan ana bilmirdi. Elə bil ki, ana məhz bu uğursuz atın divanını gözləyirdi.

Qaratel qara ata baxa-baxa daha artıq hiddətləndi, qəzəbləndi, gözləri daha artıq genişləndi, oğlunun bütün fəlakət, müsibətlərini, onun üstünün necə ağır yüklə yüklənməyini titrəyə-titrəyə, ürəyi əsə-əsə, döyünə-döyünə göz qabağından keçirə-keçirə özünü də müqəssir bilməyə başladı. Dəhşət içində, ruhi gərginliklər girdabında çarpışan ananın ağlı ötəri də olsa ayazımağa başladı:

– Mənim ana ürəyimin birinci borcu hər kəsdən, hamıdan qabaq öz oğlumu qəzanın-qədərindən qorğanmaqdı, – deyən Qaratel müztərib ürəyində danışmağa girişdi. – Mənəm birinci günahkar! Ancaq mən özüm! Axı niyə mən Göyalının sözünə baxıb Ziyarət dağına gedirdim? Niyə mən qız qismətinə qane ola-ola acgöz Göyalının sözünə qoşulurdum? Niyə yox Tanrıdan dilək diləyirdim? Niyə mən kömür kimi qaralan Ulduzu tezcə bu aradan rədd etmirdim? Niyə mən Şükranı qucağıma almırdım, körpəmi qorğanıb saxlamırdım? Axı Şükran hamıdan da artıq mənə, öz anası Qaratel Göyəm qızına aciz idi! Axı Şükran həmişə mənim müqabilimdə körpə kimi gülümsəyirdi. Onun

ovurdları çalalanırdı, bir sözümü iki eləmirdi. Niyə mən Göyəm qızı cəld tərpənib cəsarət göstərmədim? Mənəm müqəssir! Mənəm günahkar! Mənəm divana çəkilməli müttəhim! Qoy mənə divan tutsunlar! Qoy mənim ürəyimi oxlasınlar! Qoy məni Şükranın yanında dəfn olunmaq şərəfindən də məhrum etsinlər... Bəs bu qara at? Bəs bu qara əzrayıl? Yox, qoy bu qara əzrayıl mənim dəliləşən, divanələşən gözlərimə görünməsin!

Birdən ağlı dolaşan ana ayağa qalxdı. Nitqsiz olduğundan lalsayağı qarqışqırıq qopartdı. Qaratel titrəyən əllə qara atı göstərdi, nitqi açılmasa da, işarə ilə bildirdi ki, sən Bəyalı oğlu Göyalı, ləngimə! Əgər bacarmırsansa qoy mən özüm oğlumun ox-kamanı ilə bu qara əzrayılı gəbərdim. Qoy bu qara uğursuz çölün qurd-quşuna, canavarlarına, pələnglərinə, vəhşilərinə qismət olsun! Özü də başqa yanda yox, Ziyarət dağının ətəyində!

Əli ilə danışan, qırıq-qırıq, heybətli-heybətli səs çıxaran ana bütün bunların hamısını Göyalıya çatdırdı. Yenə də ağlaşma qopdu. Göylər obasının adamları daşlana-daşlana gəldi. Onlar söz tapıb Göyalı ailəsinə heç bir söz deyə bilmədi. Qara atı qapıda dayanan görüncə bu ata-anaya heç bir toxtaqlıq verə bilmədilər, onlar da ağlaşanlara qoşulub ağlaşdılar. Qara at da başını tərpədə-tərpədə onlara qoşulub ağladı, adamlar kirişəndən sonra da qaralan Ulduz öz ağlamağından qalmadı.

## XVIII

Qara şeytanın qara qurğusu qara mozalan qara qəsd üçün öz qara rəngini Ulduza yaxıb bu dünya üzündə uğursuzluğun qara kabusuna döndərmişdi. Ulduz öz Şükranının, igid qəhrəmanını; ağ çuxalı, ağ papaqlı, gümüş xəncərli, qırmızı çəkməli səvarisinə dəmir nallı təpik çalmaqla öz taleyinə də təpik çalmışdı. Şükran ölmüşdü. O torpaq altındadır. Ulduz da ölmüşdür, ancaq torpaq üstündədir. Belə bir fəlakət olandan sonra, əlbəttə, torpaq altında, gözlərdən iraqda olmaq qat-qat yaxşıdır. Sürünə-sürünə, sürüklənə-sürüklənə, gözdən düşə-düşə, nifrətlə süzülə-süzülə, lənətlə damğalana-damğalana bu qara at kimi yas içində qalmaqdansa, ölüm yaxşıdı! Deməli, qapıya gələn qara at üçün tale ölüm yolu açmışdı. Elə bil qara ölüm onu səsləyirdi: gəl-gəl qara at! Gəl mən səni düşdüyün qara gündən xilas edim! Gəl, gəl qara kabusluğunu ortadan götürüm! Axı sənin qalmağın əzab-əziyyət, iş-

gəncədir! Sənin ulduzun Ziyarət dağının başı üstündə batıbdır. Dayanma, durma, gəl qaranlığa qovuş! Gəl, bu dünyanın heçliyini, puçluğunu bildirən bu şit-şitəngə işıqda əlləşmə, çapalama! Sən qaranlığa qovuşub işıqdan uzaq ol! Daha heç kəs burada səni daş-qaya ilə vurmayacaq! Bu qaranlıqda heç kim burada səni hədələməyəcək! Heç kəs səni uğursuzluq timsalı sayıb qəzəb və nifrətlə süzməyəcəkdir. Sən qaranlıqda öz azadlığını tapacaqsan!

Qara mozalanın şeytan-şər zərbələrini axıra qədər tutdurmaq, öz qara qəsdlərini axıra qədər yerinə yetirmək, qara don geydirdikləri Ulduzu axıracan aparıb axırına daş atmaq istəyirdilər. Gah mozalan cildində Ulduzu çalmaqla, gah qaranlığı işıqdan, ölümü yaşamaqdan üstün tutmaqla həmin qara mozalan qara atı qaranlığa çəkirdi. Qara at həmin tərəfə çəkilirdi. Şükransız belə işıqlı dünyadansa ona qaranlıq, ölüm yaxşı gəlirdi. Belə yaşamaqdansa yaşamamaq yaxşı deyilmi? Zəhərlənəndən sonra yaşamaq kimə, nəyə gərəkdir?

Demək, mozalan öz şeytan qurğusu ilə kimini çox, kimini az da olsa zəhərləmişdi. Göyalı ailəsinin içində mozalanın fitnə-fəsadı nəticəsində zəhərlənməyən, ürəyi tir-tir titrəməyən tək bircə nəfər də olsa yox idi! Bəs Ulduz? Bu dünya üzündə ən ağır cəzanı Ulduz özünə verməmişdimi? Bundan belə gözlənilən cəza bu cəzanın müqabilində nə idi? Ölüm! Öldürülmək! Nəfəsi varkən Ulduz Şükranı axtarırdı! O öldürdüyü süvarisini axtarırdı. Ancaq Ulduz bir də, bir də duyurdu, bilirdi ki, Şükran orada qara qayanın qabağında, onun nallı təpiyi ilə qətlə çatdırılıbdır. Bu təpikdən çevikliklə çovuyan mozalan Şükranı onun dəmir nallı təpiyinə tuş edibdir. Ziyarət dağına gedən cığırın yanında Şükran qara torpağa gömülübdür. Üstü də qara tikanla tikanlanıb, ağ-qara, boz göy rəngli daşlarla daşlanıbdır.

Elə buna görə də Ulduz öz-özünə divan-məhkəmə qurub özünə ölüm hökmü oxuyubdur. İndi qaralaşan, kömürləşən Ulduz son divana gəlibdir. Gəlibdir ki, ona divan tutulsun, oxlansın ölüb qurtarsın. Axı ölüm, ölüm intizarından asandır. Demək, ləngiməyinə dəyməzdi!

Göyalı haçan Şükranın oxu ilə matəm geyimli Ulduzu oxlayacaqdı, özü bilirdi. Axı o biri tərəfinə gəlincə Göyalı üçün Şükranın Ulduzunu oxlamaq çətin, oğlunun qatilini özbaşına buraxmaq daha çətin idi. Bu Ulduz hər necə qara geyinsə də, istər-istəməz göz dağına çevrilmişdi. Göz dağını göz qabağından götürmək gərək idi! Bunların hamısını düşünən, qəddi əyilib-bükülən Göyalı əllərini də, dizlərini də

yerə dayayıb ayağa durdu, qara qəzil çatını götürdü, heç bir müqavimət göstərməyən qara atın boyun-boğazında kürməklədi. Həmişə başına qızıl-gümüşlü cilov vurulan, belinə qızıl-gümüşlü yəhər qoyulan Ulduz acı taleyin hökmü ilə aşağı endirildi, aşağı düşürüldü, sonra da bu qəzil çatı ilə dar ağacına qaldırılan kimi durdu. Bəlkə çatı boğucu idi? Yox, Göyalının titrək əlləri bu çatını gen bağlamışdı. Ancaq bu çatı Ulduza dar ağacından asılmağı andırırdı. Deməк, bu ölüm çatısı idi. Canı boğazına yığılanlar belə qara çatı ilə öz-özlərinə qəsd edə bilərdilər. “Boğazına çatı salma!” – demək işi ölüm qədər ağırlaşdırmaq deməkdir. Qara qəzil çatı qara atın boğazına salınandan sonra qara atın ölümünə birinci hökm verən Qaratel birdən üzünü eyvanın divarına döndərdi. Hər necə olsa da, Şükranın sevimli Ulduzu divana aparılırdı.

Göyalı qara atın qara çatısından tutdu, onu çöl-çəpəri sökülən həyətdən çıxartdı, o biri çiyninə aldığı ox-kamanı düzəltdi, Göylər obasından aralandı, Ziyarət dağına doğru uzanan hamincə ziyarətə getdiyi cığırla yol aldı. Bəli, bu həmin cığır idi ki, bu cığırla Qaratellə birlikdə ulu Tanrıdan oğul diləmək üçün Ziyarət dağına yollanmışdı. Bu həmin cığır idi ki, Şükranın tabutunu köhnə qəbiristana gətirmişdilər. Gözə gələn bir dairədə dəfn etmişdilər. Bu həmin cığır idi ki, yenə də matəm geyimli Ulduz ağlaya-ağlaya gəlmişdi. Bu həmin cığır idi ki, yenə matəm deyimli Ulduz Şükranın başı üstündə qalanan tonqalın işığı azalınca özünü buraya yetirmişdi. Yenə də qara qayanın qabağında olan sayaqda öz başını öldürdüyü dostunun ayaqlarına sallamışdı, bütün gecəni ağlamışdı, üfüq sökülər-sökülməz buradan qopub xəlvətə çəkilmişdi. Ulduz gözə dəyməkdən qorxmamışdı. Utanmışdı, qəribə görünsə də at utanmışdı! Üstündən on gün ötüncə daha yas saxlamağı bacara bilmədiyinə görə divana gəlmişdi. İndi də həmin cığırla axırıncı divana gedirdi.

Göyalı qədəmləri sınıq kimi yeriyir, qara at da sınıq-sınıq addımlayırdı. Adamlar da onların dalınca sınıq-sınıq cığıra düzülmüşdülər. Onlar divan yerinə varmaq, bu qara ata tutulacaq divana tamaşa etmək istəyirdilər. Göz qoyanda yeddi bacının yeddisi də bu cığıra düzülmüşdü. Yeddi yeznənin yeddisi də bu cığırı tutmuşdu. Göyalının ayağı yer tutan oğlan-qız nəvələri də öz ata-analarının böyürləri həmin-həmin sınıq addımlarla irəliləyirdilər. Cığırın dalı hələ də sınıq-sınıq çözələnirdi. Bircə üzünü qara divara döndərən Qarateldən savayı ayağı yer tutan kim var idisə, hamısı eynən beləcə gəlirdi. Bunlar Şükranı öldürən

qara atın divanını görmək üçün gəlirdilər. Belə divan ağqoyunluların tarixində olmamışdı. At adam öldürmüşdüsə, dərhal yerindəcə öldürülmüşdü. Axı Ulduz ayrı idi, ayrı bir aləm idi. İndi "ayrı aləm"in divanı da ayrı aləm idi. Burada el qarşısında görk divanı var idi, qan-intiqam var idi! Əvəzə əvəz, qisasa qisas, ölümə ölüm var idi! Bu divan olmazın-görünməzin, eşidilməzin divan idi. Qara donlu Ulduz belə bir divana gedirdi. Ulduz heç cür yox, böyük kədərlə Göyalının sınıq addımlarının ardınca divana gedirdi. Ulduz heç yana dartınmırdı. Bu divan Ulduzun xilası idi. Ulduz xilas olmağa, gözlərdən iraq olmağa, Şükran işıqlı dünyada olmadığı zamanda, o da işıqlı dünyadan üzülməyə gedirdi...

Lakin birdən qəbiristana dönən cığır ayrıcında qara at öz əzəlki Ulduz çevikliyi ilə qara çatını başından çıxardı, qəbiristana döndü. Adamlar cığır uzunu durdular, durdular. Ulduz diklənib Şükranın qəbrinə çatdı. Düz yeddi dəfə bu qəbirin dövrəsinə dolandı, dönüb gəldi, başını çatıya salmadı, Ziyarət dağına gedən cığıra, ancaq cığırda dayanan adamların qabağına düşdü. Heç kəs Ulduza toxunmadı. Onlar gördülər ki, necə də Ulduz divana gedir. Ulduz getdi, getdi, kölgələr sallanan, dik-dik daşların kölgələri uzanan uçurumlu dərələrə qaranlıq çökən bir yerdə dayandı, döndü, adamlar da axın-axın gələ-gələ toplandılar, durdular. Göyalı kamanı düzəldib oxları hazırlayınca Ulduz üzü bəriyə oturdu, qabaq əllərini yuxarıya qaldırdı, sinəsini açdı, birdən adamlar için-için hıçqırdılar. Göyalının oxu əlindən düşdü. Kaman yerə diyirləndi. Göyalı diz üstə büküldü, büküldü. O, Ziyarət dağının qarşısında qəzanın-qədəri müqabilində bükülə-bükülə yumağa döndü. Elə bil ki, adamların üstünə su ələndi.

## XIX

Qara-qara buludlar şüş-şüş dağları qaplayırdı. Yuxarı dağlardan – Sarı babadan, Sağsağanlıdan, Kirsdən üzüaşağı Araz çayına doğru uzanan qara bulud salları Ziyarət dağını da örtür, Göyən düzənlərini zülmətə bürüyürdü. Divan gözləyən, ancaq divan tutulmayan Ulduzun özü öz ayaqları ilə divana gedirdi. Qara ölüm şıltağa başlayıb əzab-əziyyət içində Ulduzu hər necə girinc etməkdən zövq alsa da, bu faciədə şər-şeytanın hər necə nəşələnib əyləndiyini görsə də, Ulduz "daha bəsdir!" demək qərarında qəti idi. Axı ölüm gözləyən Ulduz

niyə Şükranın atası Göyalı tərəfindən oxlanmadı? Niyə Ulduz o qədər top-top dayanan adamların müqabilində oxlanmaq gözlədiyi halda, bir kəs tərəfindən oxlanmadı? Məgər Ulduz öz sinəsini dalbadal atıla bilən oxlar üçün görməmişdimi? Bu oxlar onun iztirab dənizinin dalğalarına son qoymayacaqdımı? İndi qara don geyən Ulduz üçün həmin cığırla geriyə dönmək, Göyən düzənlərinə qayıtmaq, ara-ara Göylər obasında görünmək mümkün deyildi. Bir də Şükranın məzarının dövrəsində gözdağı kimi dolana-dolana qalmaq, bu məzarın keşiyini çəkmək, ölü durmaq özü də Ulduz üçün bəs deyildimi? Üstü torpaqlanan, tikanlanan, daşlanan Şükran dərindən-dərin sükut aləmində idi. Haçan bu qəbir üzərində "Ağ oğlan" adı ilə şöhrət tapa biləcək bir uca qüllə qalxacaqdı? Bu hələ qabaqda idi. Ağqoyunluların qədim adətincə bir il ərzində qəbiri tərpətmək, ölən adamın ruhunu narahat etmək olmazdı. Bir ildən sonra çox yəqin ki, Şükranı dəfn edən el-oba yenə də axın-axın gələcək, onun ildönümündə igidi yad edəcəkdi, elə bu zamanlar da köhnələn qəbir tərpədiləcəkdi. Şükranın türbəsi üzərində ağ-ağ yonulan daşlardan "Ağ oğlan" adlı günbəz ucalmağa başlayacaqdı.

Ulduzun tab-təvanı tükənmişdi. O, heç bir kəsi gözləmədən öz-özünü divana çəkməli idi. Bu yoldan qayıtmaq, özünü ölümdən də artıq bir əzaba salmaq idi. Qara buludlar gəlirdi. Qara qanadları sallanan qara buludlar bir-birinə dəyə-dəyə, çırpıla-çırpıla yağışı, kürdaşı, dolunu, alaçalpov qarı bir-birinə qatıb qarışdırmırdılarmı? Bu, tufan idi, bu qiyamət yay mövsümünün yetişdiyinə baxmadan, bir də hiddətlə geriyə dönməklə qaralan Ulduzu aparmağa gəlməmişdilərmi?

Bax, budur Ulduzun başının üstündə dayanan dağlar bir-birinə dəyir, buludlar bir-biri ilə toqquşur, ildırımlar, şimşəklər tez-tez çaxnaşır, az-azacıq işıq görünməmiş yenə qatı qaranlıq qovuşub, hökmran olmağa başlayır. Qaradonlu Ulduz üçün bir cığırda dayanmaq donmaq idi, ölümün açılan qara ağzına çatmadan yubanmaq idi. Yox, Ulduz dayana bilməz, qala bilməzdi. O, yenə də həmin-həmin heç bir tərəddüd göstərmədən qalmaq da istəmirdi. Ulduz addım-addım getməli, Ziyarət dağına yetişən cığırla üzüyuxarıya qalxmalı idi. Ulduz belə də etdi. O, darısqal cığırla daş-qayaya dəyə-dəyə qızışdı, gedə-gedə tüstüləndi, yandı-alovlandı, axır ki, Ziyarət dağına çatdı. Burada olan daşların, qayaların hamısı bir-birinə qarışmışdı. Ulduz burnunu daşlara söykəyə-söykəyə, əl-ayaq çala-çala daşların, qayaların ara-bərəsi ilə gedə-gedə dəmir nallarından qığılcımlar çıxara-çıxara, özü də döngə-

lərdə əyilə-bükülə cığırla dimdik dikləndi. Bu cığır Ziyarət dağının qülləsinə aparan, dilək qülləsinə qalxan, ulu Tanrıdan dilək dilənən həmin dayanacaq idi. İyirmi il əvvəl günün günortaçağı Göyalı ilə Qaratel həmin bu cığırla bu qülləyə qalxmışdılar.

Dağları qaplayan qara buludlar hönkürüşürdülərmi? Onlar ağlaşırdılarmı? Yaxud qara mozalanın şər-şeytanları öz istədiklərinə nail olduqlarına görə öz qara qələbələrinin təntənəsini nümayiş etdirirlər?

Buludlar, bulud bürüyən dağlar, üstlərinə sel-su ələnən, dolu ilə dolan, qarla örtülən dağlar indi hansı yandadırlar? Bu uğultulu təlatümləri ulu Tanrı öz iradəsi ilə əmələ gətiribmi? Ya bunlar öz başlarınadır? Əgər özbaşınalıqsa necə, nə təhər özbaşınalıqdır? Əgər özbaşınalıq deyilsə, ulu Tanrının iradəsilədirsə, bəs niyə belə hərc-mərclikdir?!

Qaralan Ulduz bütün bunları bildi, bilmədi, baş açdı, açmadı, vəziyyət belə idi, başaçılmaz müəmma idi!..

Qara at iyirmi il əvvəl Göyalı ilə Qaratelin qalxdıqları qülləyə can atdı, öz əl-ayaqları ilə qabağına çıxan irili-xırdalı daş-qayanı çapasındıra ötüb keçdi. Ulduz öz dəmir nalları ilə daş qayadan od çıxara-çıxara tufanı, çovğunu qarışdıra-qarışdıra dırmandı, dırmandı. Ara-ara Ziyarət dağının həmin duracağına çatdı. Zülmət qaranlıq içində Ulduzun yuxarılara baxan gözləri yanıb alovlandı. Elə bil ki, Ulduzun bütün ağrısı-acısı, qəzəbi, hiddəti gözlərinə toplanmışdı. Ulduzun burnu körükləndi, qara at ulduz gücünü birdən özünə qaytardı, ulu Tanrıya üsyan edir kimi dayandı, ulu Tanrıdan Ziyarət dağına enməyə, ədalət divanı qarşısında dayanmağa səslədi. Ulduz var gücü, var nəfəsi ilə ulu Tanrını çağırdı, çağırdı, kişnədi, kişnədi... Bu kişnərti Ziyarət dağını, bu dağın bütün daş-qayasını, cəbələrini, övliya-ənbiyalar yatan daş məqbərələri, bütün kahaları, mağaraları, sütunlu-sütunsuz sıldırımları, Ziyarət dağının bütün təməllərini ta yerin təkinəcən doldurdu, doldurdu. Bu kişnərti bütün uğultulara üstün gəldi. Göy gurultularını, ildırım-şimşək çaxnaşmalarını hakiminə hökm ilə dayandırdı, susdurdu. Ulu Tanrını ədalət divanına səsləyən kişnərti kəsmədi, kəsmək bilmədi. Birdən qaralan Ulduz qiyam üçün qanad açıb göyə qalxdı, öz-özünü xeyli qaldırdı. Ziyarət dağından xeyli yuxarılara – buludlara, qara tüstü ilə örtülən, pərdələrlə tutulan kəhkəşanlı aləmə çatdı. Buranı aradı, axtardı, ulu Tanrını tapmadı. Ulduz yenə də həmin kəsilməyən kişnərti ilə özünü götürüb Ziyarət dağının dərin-dərin uçurumlarına atdı, uçurumlar aləmində itdi...

Həmin vaxtdan əsrlər ötsə də, külli-kainat dəyişsə də, Şükranın qəbri üzərində inşa edilib ucaldılan "Ağ oğlan" nişangahının ağ-ağ qülləsindən ağ-ağ daşlar bircə-bircə sınıb tökülsə də, bu qüllənin üstündə bitən kollar göyərə-çürüyə yan-yörəyə səpələnsə də, yenə də Ziyarət dağına qalxanlar, onun dərinliklərinə qulaq verənlər Ulduzun kəsilməyən kişnərtisini eşidərlər. Bəli, indinin özündə də Ziyarət dağına qalxan kəslərin tükləri biz-biz olar. Saçları qabara-qabara qalxar, onlar Ulduzun kəsilmək bilməyən kişnərtisi içində heyrətə düşərlər. Əfsanəvi faciə onların gözləri qabağında əvvəlindən axırına qədər vərəqlənər. Bu faciənin hər bir səhifəsi səhifələnər. Bəlkə bu adamlar bu müsibət dastanını örtməyə cəhd edərlər. Bəlkə adamlar dəhşətlərdən çıxmaq üçün bu dastanın ilk səhifələrinə qayıdıb yenə də Şükranı Ulduzun belində qanad açan görərlər, "Ağ oğlan" qülləsinin ağ-ağ buludlara qalxdığına şahid olarlar. Lakin, hər yana dönsən yenə də Ziyarət dağında ömründə kəsmək bilməyən kişnərtini hey eşidərlər. Bəlkə də Ziyarət dağının həmin cığırı ilə qülləsinə qalxıb ulu Tanrıdan soruşan da tapışar: varsansa bu nədir, yoxsansa bu nə üçündür?!

*20 sentyabr 1968*
*Əyin – Bakı*

## GÜZGÜ GÖL ƏFSANƏSİ

Qədim zamanlarda Kəpəz dağının aşağı sinəsində, Göy gölün yuxarı yaxasında, yamyaşıl meşənin içində, ağ qayaların əhatəsində bir Güzgü göl qaynayırdı. Bu gölün o biri tərəfində mağarada bir maral, bir də bir Qəcələ olurdu. Qəcələ mağaranın içərisinə uzanan vələsin qanadına qonub gecələyir, Maral isə bir tərəfdə daş döşəmənin üstündə yatırdı. Maral sübh tezdən durunca yatdığı yeri qabaq ayaqları ilə eşib-eşib gül kimi təmizləyirdi, üstünə bir toz qonmağa qoymurdu. Kəpəz dağından başlayıb gələn, Göy göl diyarını tez-tez tutan bu yerlərin ağ-ağ yağışlarında Maral yuyunur, yuyunduqca da gözəlləşirdi. Payızdan başlayıb yağan qar isə ağacların qol-budaqlarından Maralın üstünə səpələnir, onun saç-saçağını darayırdı. Dünyanın gözəl guşəsində yaşayan, Göy göldən gözəllik götürən, özü də Göy gölə gözəllik verən Maral düyməçəli-düyməçəli maralotulardan yeyir, doyunca dönüb özünü Güzgü gölə yetirir, bu gölün pul-pul olub dairələnən gümüş suyundan içə-içə öz surətinə tamaşa edir, öz-özünə tamaşa etməkdən hədsiz-hesabsız dərəcədə zövq alırdı. Bir gün deyil, beş gün deyil, bir də il də deyildi, belə idi. Maralın ümdə işi-peşəsi, hey gümüşlənə-gümüşlənə qaynayan Güzgü gölün qarşısında durmaq, öz-özünü süzmək idi. Bu Maralın qəşəngdən-qəşəng qara gözləri özünə o qədər xoş gəlirdi ki, başını Güzgü gölə əyib, gümüş sudan içə-içə birdən də öz gözlərindən öpüş götürməyə çalışırdı. Maral geriyə çəkilib gərdəninə baxa-baxa öz duruşuna tamaşa edir, "Maral, ay Maral" deyə oxunan havaya qulaq asır, Kəpəz dağından qayıdan əks-sədanın fasiləsiz gəldiyini güman edirdi. Ancaq Maralı yaxın dostu Qəcələnin anlaşılmaz hərəkəti odsuz-közsüz yandırırdı. Axı heç zaman Qəcələ Güzgü gölü gərəyincə qiymətləndirmir, hey Zəli göl, ya Qara göl tərəflərə uçur, baxanda bu gün bu gölün, sabah o biri gölün, zığ-zımırığında eşələnir, qarnını doldurub, yenə də axşamına həmin daş dama dönür, vələsin çöldən içəriyə uzanan qanadına qonurdu. Maralla Qəcələ nə qədər üzdə dostluq edib bir mağarada gecələsələr də, yenə də onların söz-söhbəti tutmur, tez-tez ixtilaf baş verir, deyişmələr davam edirdi:

– Nə qədər Güzgü gölə baxmaq olar, ay Maral?

– Bəs haraya baxım, Qəcələ?

– Bir yol Qara gölə, bir yol da Zəli gölə baxsan nə olar?

– Yox, Qəcələ, məndən ötəri nə Qara göl, nə də Zəli göl?
– Ancaq nə bəs, nazlı xanım? Ancaq və ancaq Güzgü göl, Qəcələ!
– Güzgü göldə nə görmüsən, ay Maral?
– Ancaq özümü, Qəcələ!
– Bəs başqası nə təhər?
– Qoy başqası da Güzgü gölə gəlsin, özü özünü görsün!
– Onda bəs Maral xanım niyə özünün "Maral göl"ünə bunca belə bərk-bərk bənd deyildir?!
– Çünki Maral göl özü də gözəlliyimi bu Güzgü göl kimi düzgün göstərmir!..
– Bəyəm sən belə nəsən?
– Mən Maralam, Güzgü göl maralıyam!
– Onda üç gündə bircə dəfə də olsa aşağı en, Göy gölə bax! Axı, Göy göl Kəpəz dağının ətəyində olan bütün göllərin başıdır!
– Bəli, başıdır, bilirəm. Ancaq mən Güzgü gölü bütün göllərdən artıq sevirəm! Ona görə ki... – Maral dönüb umu-küsüyə başladı. – Düzünə qalsa nə vaxtdan sən Qəcələ ilə mən Maral bir daş damın altında oluruq. Ancaq heç bir zaman dilinə düz söz gəlməyibdir!
– Necə? – Qəcələ biz-bic soruşdu. – Nə təhər dilimə düz söz gəlməyibdir, Maral xanım?
– Güzgü göl kimi düzə düz deyəsən!
– Yəni hey səni tərifləyim, eləmi?
– Tərifləsən canın çıxmaz ki?!
– Canım da çıxar, hələ desən uzaq görən bir cüt gözüm də!
– Niyə belə dargözsən, cənab Qəcələ?
– Çünki hədsiz tərif dostun evini yıxar, Maral xanım! Hədsiz tərif dostun başının altına yumşaq yastıq qoyub, onu aldadar, ayıq salmaq əvəzində, onu qəflət yuxusuna verib, uçuruma salar.
– Bəlkə bunlar hamısı paxıl Qəcələnin quraşdırmasıdır?
– Onda daha biz niyə bunca müddət ərzində bir daş damın altında oluruq?
– Əlacım nədir?.. Qəcələ də olsan, yenə də bir nəfəssən!
– Bir başqa nəfəs də vardır! – Qəcələ çevrilib o biri yanı göstərdi. Qəcələ çevrilib o biri yanı göstərdi. – Bax, orada gizlənibdir, Maral xanım! Nə vaxtdan da marıqda durub səni gözləyir.
– Hamı elə başqa bir nəfəs, Qəcələ?
– Bax, odur, bir sarı Çaqqal!

Qəcələ mamırlı daşın daldasında gizlənib bu deyişməyə qulaq verən Çaqqalı çağırdı. Çaqqal daha gizlənmədən, mamırlı daşın daldasından çıxıb gəlməyə başladı.

– Niyə, nə vaxtdan bəriyə belə sapma-supma gəzirsən, Maral xanımın gözlərinə görünmürsən?

– Çünki yemirəm, içmirəm, Maral xanımın xətti-xalına, gül camalına tamaşa edirəm!

– Demək, sən Çaqqal bizim Maral xanıma məftunsan?

– Sözsüz, Qəcələ!

– Bəs niyə özünü göstərmirsən, nə vaxtdan bəri öz vücudunu bu xanımnaza bildirmirsən?!

– Çünki Güzgü gölün qabağında dayanan, heyran-heyran özünə baxan Maral xanıma tamaşa etmək ayrı bir aləmdir. Neçə ildir ki, yaz, yay, payız, qış bu Maral xanım Güzgü göldə, surətinə tamaşa edir, mən də Maral xanıma!

– Bəs belə heyranlıq içərisində yemək-içməyin necə keçir, Çaqqal?

– Ərz etdim ki, Maral xanımın Güzgü göldə əksini tapan gözəlliyi mənim üçün həm ləzzətli yemək, həm də şirin-şərbət içməkdir, Qəcələ!

– Demək, sən meşə Çaqqalı bu Göy göl Maralının belə bir məcnunu olmusan?

– Belədir, nə gizlədim, Qəcələ!

– Çaqqalda belə bir uca eşq?

– Məgər bu dünyada Çaqqal da canlı xilqət deyildirmi, Qəcələ!

– Axı, deyirlər ki, "Çaqqal var gödən çıxarır, qurdun adı bədnamdır?"

– Qəcələ haqqında da min cürə söz deyirlər!

– Məsələn nə deyirlər, Çaqqal?

– Qurd-quş yeyən Qəcələ!

– Hər necə olsa da, bütün bicliklərdən baş çıxaran, bu dünyada yaşamağın qədrini-qiymətini yaxşıca bilən Qəcələ!

– Yaşamaq ancaq qarın üçün deyildir, Qəcələ!

– Bəs daha nə üçündür, tülküləşən Çaqqal!

– Qədir də gərəkdir, Qəcələ!.. Gərəkdir Göy göl Maralının qədrini, qiymətini bilən də olsun!

– Hər halda belə məcnuni-eşq sənin kimi bir meşə Çaqqalına yaraşmır!

– Əgər sən deyən Çaqqal Maral xanıma məftunsan, onun dünya gözəlliyinə səcdə edirsə?

– Bəlkə Maral xanımın yağlı göbəyi Çaqqalın ağzını sulandırır?

– Əsla, Qəcələ!.. Bicdən bic Qəcələ!

– Bəlkə Çaqqal çevrilib imam olubdur?

– Mətləb imamlıqda da deyildir, Qəcələ!

– Bəs nədədir, Tülkü dayısından hiyləgərlik dərsi alıb tülküləşən Çaqqal!

– Gücüm Tülküyə çatmaz, Qəcələ! Tülkü dayı qədər zirək deyiləm ki, toyuq-cücə çalım?

– Bəs onda belə nə ilə yaşayırsan?

– Tör-töküntü ilə!.. Doluya, çovğuna düşən quşların əti ilə, Göy göl dalğalarından atılıb qum üstünə düşən balıqların başı ilə!

– Demək, Çaqqala hazır ruzu gəlir?

– Bəli, Allah göydən nə qismət göndərsə...

– Bəs göndərməsə necə?

– Göndərməsə də göndərməsin!

– Bəs onda səni yaşadan nədir?

– Bir də, iki də, üç də, dörd də ərz edim ki, Maral xanımın gözəlliyi, dünyaya meydan oxuyan, Göy gölü gözəlləşdirən ilahi gözəlliyi!

Bu söz-söhbətə qulaq verən Maralın canına Çaqqalın tərifi sarı yağ kimi yayıldı, Maral xanım gərdənini çəkə-çəkə gərnəşdi:

– Düz danışmaqda dostumuz Qəcələnin dilinə özü boyda bir yaman çıxıbdır!

– Dilinə özü boyda bir yaman çıxsaydı, heç bu Qəcələnin dili belə olardımı? – Üzə çıxan Çaqqal addım-addım Marala yaxınlaşdı, öz tamaşa duruşu ilə dayanan Maralın müqabilində gözlərini göyərdə-göyərdə başını əydi. – Zir-zibildə eşələnən bic Qəcələdən necə ürəyə yatan bir söz gözləmək olar?

Maral xanım nazlana-nazlana hirslənib söyləndi:

– Hə də, bu Qəcələ düz olsa bircə kərə də düzünü deyər!.. Bircə kərə deyər ki, bizim Maral Güzgü gölə, Güzgü göl də Marala yaraşıq verir... Daha məni Zəli gölə, ya da Qara gölə dartmaz ki, oralarda mən qapqara qaralam, özüm də özümə əyiş-üyüş görünəm!

– Yox-yox, – deyə Çaqqal dad-amana başladı, – bizim Maral xanımın güzərgahı ancaq-ancaq Güzgü göldür!

– Bəs sənin güzərgahın necə, Çaqqal? – Qəcələ qanad çaldı. – Bəs sənin yerin necə, gödən çıxaran?

– Sən bunca təhqiri biryolluq burax, bic Qəcələ!

– Bicliyə də əqil gərəkdir! Sən Maral xanımı tülkü dilinə tutub çıxılmaz tələyə salmaq istəyirsən!

– Allah eləməsin, bir tək Allah özü belə bir günü göstərməsin!

– Bir tək Allah eləsə, Maral xanım tələyə düşsə, onda nə edərsən?

– Yüz canım olsa, hamısını bir göz qırpımında Maral xanıma fəda edərəm! Qoy mən, canı çürük Çaqqal, Maral xanımın yolunda ölüm... Bu ölüm mənə əbədi dirilik bəxş edər!.. Mən ölərəmsə ruhum əbədiləşər, əsla ölməz. İndi mən bir qıraqda durub Güzgü gölün müqabilində dayanan, bu Güzgü gölün içində surəti bərq vuran, külli-aləmə gözəllik meydanı oxuyan Maral xanıma hey tamaşa edirəm!..

Çaqqalın bu sözlərindən sonra Qəcələ gözlərini qıyıb Maralı süzdü və qanad çala-çala uçdu, Çaqqal Marala, Maral da Çaqqala yanaşıb yaxınlaşdı!..

Günlər gəlib keçdikcə Çaqqal düşmənləşdiyi Qəcələnin qeybətini qırdı, Maralın müqabilində ixlas ilə dayanıb dedi, axı, Qəcələ nədir, o haranın azan-təzənidir ki, sən Maral xanımın qədrini-qiymətini qansın. Qanıb bilsin ki, sən bu aşağı Göy gölə, yuxarı Kəpəzə yaraşıq verirsən?.. Neçə ağ-ağ duman Kəpəzin gərdəninə dolana-dolana bizim Maral xanımı axtarır? Qəcələ nə qansın ki, necə Kəpəz ağ-ağ dumandan-buluddan sivrilib çıxır, günəş qızıl saçaqlarını səpələyib Maral xanıma zərrin yaraşıq verir. Qəcələ haradan anlasın ki, göydən ağ yağış yağır ki, Maral xanımı dönə-dönə çimizdirsin, yusun, saç-saçağını darasın?.. Qar tökülür ki, Maral xanımın ayaqlarının altını yumşaltsın. Qəcələ nə dərk edir ki, üryan meşələr yaşıl don geyir ki, bəs Maral xanımın gözlərini oxşasın!.. İlin payız fəslində əlvan rəng alır, birdən də donunu dəyişib lütlənir ki, Maralın xoşuna gəlsin.

Tülkü dayısından təlim alan, kim bilir bəlkə də tülkü qarışığı olan, özü də ağ-açıq tülküləşən Çaqqal olmazın, görünməzin dilini işə saldı, Güzgü gölün Maral xanımına bəzək üstündən bəzək vurdu, belə-belə Güzgü gölün Maral xanımını ulduzlardan da yuxarılara qaldırdı:

– Nə bu yerdə, nə də göydə, nə də küll-kainatda bizim Maral xanımın misli-bərabəri yoxdur!

Çaqqalın təriflərini məmnuniyyətlə dinləyən Maral xanım ayağının birini götürüb o birisini qoya-qoya soruşdu:

– Yəni sən bütün bunların hamısını sidq ürəkdən deyirsən, Çaqqal?

– Ürəyimə ox dəysin ki, hamısını lap ürəkdən danışıram, Maral! Özü də hələ bəlkə bizim Maral xanımın misilsiz gözəlliyinin yüzdə birini də deyil, mində birini, bəlkə də milyonda birini deyirəm!

– Bəs sən Güzgü göldə öz misilsizliyini görə bilmirsən? Sən can qurban eləməli cansan, Maral xanım.

– Necə can qurban eləməli canam, Çaqqal?

– Yüz can, min can, milyon can qurban eləməli cansan, Maral xanım!

– Kimin canını belə bir canana qurban etməkdən dəm vurursan, Çaqqal?

– Mənim ərkim ancaq özümə, bir də uzaqbaşı özümünkülərə çatar, Maral xanım!

– Yəni demək istəyirsən ki, yer üzünün bütün çaqqallarını mən Marala qurban etmək, eləmi?

– Bəli, bəli, yer üzünün bütün çaqqallarını! Əgər bütün çaqqallar öz canlarını bir tək sən Maral xanıma qurban edə bilsəydilər, bu dünyanın ən xoşbəxt xilqəti olardılar! Bir gün gələr necə fədakar olduğumu sübut edərəm, Maral xanım!

– Nəyin xatirinə bunca fədakarlıq, qadalı-bəlalı qurbanlıq?

– Güzgü göl Maralının dünya gözəlliyinin xatirinə!

– Sənin əqlin başından oynamır ki, Çaqqal?

– Düzü, mən həqiqətən təpədən-dırnağa Maral xanımın müqabilsiz gözəlliyinə məcnun oluram!

– Necə, nə dərəcədə məcnun?

– Bəli, dəli, dəlidən də dəli, Maral xanım! – deyə Çaqqal Tülkü dayısının məşq-təlimini yadına salır. Maral xanımın qılığına girib, onun zəifdən zəif damarından tutub xoşhallandırırdı. Maral xanım tərif üstündən tərif aldıqda pilə kimi yumşalırdı. Az qalırdı bu halında özünü tamam-kamal tülküdil Çaqqala təslim etsin, utanıb-qızarmadan onun xanımı olsun!.. Vaxta ki, bu Çaqqal Maral xanımın belə bir dünya gözəlliyinin qədrini-qiymətini bilir, daha ona nə lazımdır? Bu dünya gözəlinə səcdə edən bir aşiq gərək deyilmi?.. Elə bir aşiq ki, bu gözəllik ilahəsinin qədrini, qiymətini bax beləcə bilsin! Yoxsa özünü dartanın, tələş-təkəş yeriyənin, get-gedə Maral xanımı gözdən salanın birisi oldu. Maral xanımı bir qədərdən sonra qulluqçu yerinə qoydu, onda

daha ondan Maral xanıma necə yar-yoldaş və sirdaş çıxar?! Özünü Tülkü dayısı kimi, bəlkə Tülkü dayısından da usta aparan Çaqqal Güzgü gölün qırağında dayanan, bu mədhlərin müqabilində daha da artıq heyranlıqla özü-özünə baxan Maralın ürəyinə girib, Güzgü göl gözəlini ovsunlayırdı. Maral Güzgü gölə anbaan daha artıq məftunluqla baxa-baxa öz-özünə düşünürdü ki, taleyini bu Çaqqala təslim edərsə, daha da yaxşılaşacaq, yar-yaraşıqlı olacaqdır... Tülküsifət Çaqqal da Güzgü göl Maralının bu təriflərinin müqabilində gündən-günə necə əridiyini, lap əməlli-başlı əldən getdiyini, həyəcandan, iztirabdan yana az qala solub-sovulduğunu görürdü... Görürdü ki, onun işə saldığı yağlıca tülkü dili bu Güzgü göl gözəlini necə yumşalda-yumşalda mum edir... Gizlicə-gizlicə, qanaddan-qanada uçan Qəcələ də xəlvətcə-xəlvətcə göz qoyur. Maral xanımın bu tülküdil Çaqqalın müqabilində necə əriyə-əriyə getdiyinə diqqət edirdi. Deyirdi görək bu olmazın eşq macərasının axırı haraya gedir? Lovğalanan Çaqqal sol əlini qaldırıb seyrək bığlarına gətirib eşdikcə eşdi. Maral xanım nə qədər kütlük göstərsə də, nə isə duydu.

– Deyəsən, axı, hərdənbir çox dərincə fikrə gedirsən, Çaqqal?

– Bəli, Maral xanım, çox dərincə fikrə gedirəm!

– Belə nəyə görə, Çaqqal?

– Düzü, hey ölüb-dirilirəm, Maral xanım!

– Ölüb-dirilmək nə üçündür, Çaqqal?

– Eşqin alovunda yanmaq, hey yanmaq nə böyük zövq-səadətmiş, Maral xanım!

– Yəni sən mənə belə eşqi yetirmisən, Çaqqal?

– Bəli, mən başlı-bütünlü Güzgü göl Maralına aşiq olmuşam!

– Onun nəyinə aşiq olmusam, Çaqqal?

– Axı, utanıram deyim, Maral xanım!

– Utanma, Çaqqal, düzünü de! De görüm, Maral xanımın harasına daha artıq aşiq olmusan?

– Düzümü?

– Ancaq düzü, Çaqqal!

– Ətir-ənbər saçan dəyirmi göbəyinə!

– Onda yala müşk-ənbərimi, Çaqqal!

Çaqqal ağzını, yağlı dil nəticəsində tovlanıb aldanan Maralın düyməcə-düyməcə məmələrində gəzdirə-gəzdirə onun yağlı göbəyini yalam-yalam yaladı, yaladıqca da şirnikdi, hərisləşdi, Maral isə Güzgü

göldə öz yağlı göbəyinin necə yalam-yalam yalandığına məmnuniyyətlə tamaşa etdi. Tülküləşən Çaqqalın belə canfəşanlığının müqabilində Maral xanım mat qalıb mütəhəyir durdu. Axırdan-axıra qıdıqlandıqca soruşdu:

– Doymadınmı, Çaqqal?

– Bu dərya gözəllikdən doymaq mümkündürmü, Maral?

– Bəs arada bir o diş ilişdirmək nədir, Çaqqal?

– Həvəsdən, ehtirasdan, Maral xanım!

– Necə həvəs, necə ehtiras, Çaqqal?

– Məcnuni eşqin bitib-tükənməz həvəsi-ehtirası, Maral xanım! Mən aşiqəm, özü də haqqaşiqi! Əgər Maral xanımın qaşqabağı bircə anlığa mən tərəfə turşusa, tablamaram, tir-tap düşüb ölərəm!

– Birdən tir-tap düşdün ölmədin, onda bəs necə?

– Yox, ölərəm, Maral xanım, bir tək Tanrıya and olsun, dərhal ölərəm!

– Onda belə sönməz eşqinə görə yala müşk-ənbərimi, Çaqqal! Ancaq heç vaxt dişləmə.

– Baş üstə, Maral xanım, göz üstə, Maral xanım!

– Demək, qəti söz verirsən?

– Bir Allahın şəhadəti ilə söz verirəm!

– Bir də bax, dişlərin müşk-ənbər ətirli göbəyimi didsə, onda eşqimiz biryolluq qurtardı getdi, Çaqqal!

– Bəlkə bu alovlu eşqdən yana əqlim başımdan oynaya, bir balaca dişləyəm?

– Balaca dişləmək böyük dişləməyə keçsə, necə?

– Onda gərək mən haqq aşiqi olmayam!

– Hərdən yamanca tülküləşirsən, Çaqqal!

– Ancaq aşiqini öldür, Maral xanım, ta belə təhqir etmə!

– Necə təhqir, nə təhər təhqir, Çaqqal?

– Mən ki, hiyləgərlikdə ad alan tülkü deyiləm, Maral xanım!

– Bəs siz ikiniz də bir cinsdən deyilsinizmi?

– Hər necə oxşarımız olsa da, başqa-başqa cinsdənik!

– Düzü, adın bir qədər xoşuma gəlmir, Çaq-qal!

– Adımı da dəyişdirib öz adına tabe edə bilərsən, Maral xanım!

– Necə tabe edə bilərəm, Çaqqal?

– Belə tabe ki, hər nə adla istəsən məni çağıra bilərsən. Ancaq məni bu gözəllikdən – müşk-ənbərdən iraq salıb, bu zövq-səfadən

məhrum etməyəsən! Mən haqq aşiqi, gözəllik pərəstişkarıyam! Mən ülvi aləmə varıb gözəllikdən qida alıram!

– Sənin bu dilin lap tamam-kamal tülkü dilinə bənzəyir, Çaqqal!

– Haradan bilirsən tülkü dilinin hiyləgərliyini?

– Anam mənə tapşırıbdır ki, nə tülküyə, nə tülkü dilliyə inanıb əqlini uduzma!

– Maral xanım bir görün məni nə yerinə qoyur? – deyə Çaqqal özünü küskün baxışla haqq aşiq kimi göstərir, çox həssas bir xilqət olduğunu Maralın müqabilində nümayiş etdirir, Maral xanımsa Güzgü gölə baxıb öz xoşallanan gözəlliyinə məftun olub durur. Çaqqal isə tezcənə qaşqabağını açır, tülkü dilini işə salıb Maral xanıma eyni şirmayı tərifdən vurduqca vurur... Aradabir Maral xanım Qəcələnin dediklərini hər necə yadına salıb şübhə etsə də, üstəlik onun yağlı göbəyi göynəsə də, yenə də öz yaxasını bu hiyləgər Çaqqaldan qurtara bilmir, təriflərdən özünü məhrum edə bilmir... Nə olsun Qəcələ, necə olsun Qəcələ? Axı, o tək bircə dəfə də, ürəkdən olmasa da, boğazdan yuxarı dildən də olsa belə bu gözəl sözlərin birisini Maral xanıma demir! Yox, əsla demir!.. Maral xanıma tərif lazım idi!.. Getdikcə tərifə müştaq olub əqlini, şüurunu tərifsiz ötüşdürə bilmirdi... Güzgü gölün müqabilində Göy göl dünyasının günlü günlərində durub özünə tamaşa etməkdən, sığal-tumar verməkdən, Çaqqalın mədhlərini eşitməkdən doya bilmirdi. Getdikcə Maral xanım tərif mərəzinə tutulur, bunsuz ötüşə bilmirdi. Ona elə gəlirdi ki, tərif olmasa birdən-birə qocalacaqdır. Birdən-birə onun köşək gözləri sərçə gözləri kimi balacalaşacaq, üz-gözü qırışacaq, qız duruşundan çıxıb qarılaşacaqdır!

Baxanda bic Qəcələ nə özünü ac qoyur; nə də bir qəribə aşiq-məşuqun bir-biri ilə rəftar və hərəkətini gözdən qaçırıb, qulaqlarından qırağa qoyurdu. Qəcələ oynaq gözlərini bic-bic qıyıb gizlindən-gizlinə qanadlarının altından baxırdı, eşq alovlarından çıxıb gələn aşiqanə sözləri dinləyirdi.

Qəcələ Göy göl diyarının Maralsız qala biləcəyindən qorxurdu. Qəcələyə görə bu dağların Maralı getsə, bu yerlər Çaqqala qalsa, nəinki bir tək Güzgü göl, bəlkə də bütün göllər gözündən batar, bu dağlar öz gözəlliyini itirər. Qəcələ fikrə gedib düşününcə Maral xanımın heç bir fəlakət-faciəsinə razı ola bilmirdi. Axı, bu Maralın bir baxışı yüz min Çaqqala dəyər! Göy göl necə Çaqqala qala bilər? Çaqqalın yeri qızdırmalı bataqlıqdır, qarğı-qamışlıqdır, çəyəndir, ilğındır,

orada-burada tülkü hiyləgərliyi ilə gəzməkdir, yeri düşəndə fərədən-beçədən qapıb qaçmaqdır. Maral isə ayrı aləmdir, füsunkar təbiətin vüqarla dayanan gözəlidir. Heç zaman belə bir Maral meşənin bir yanıq Çaqqalına qismət ola bilməz... Maral öz xoş taleyini arayıb tapmalıdır. Çaqqalın tülkü dilinə aldanıb özünü ona təslim etməməlidir! Qəcələ qorxurdu ki, Çaqqalın tərifində uyan Maral xanım birdən özünü daha da artıq unudar, heç müşk-ənbər göbəyinin bu sarı Saqqalın dişlərində necə didildiyinə də fikir verməz, belə mübaliğədən mübaliğəli mədhlərin məstedici sərxoşluğu içində yuxuya gedən kimi, məhv olub gedər. Qəzələ qanad çala-çala vələslərin başında dövrə vurub düşündü, qeyrətinə sığışdırmadı ki, bəs belə bir gözəli bir hiyləgər aldada, nəticədə bu füsunkar dağlar, bu dəniz dalğalı meşələr, bu aynalı Güzgü göl Maralsız qala... Maralsız bu diyarın nə diyarlığı?! Onda bu füsunkar diyarı qalın-qaranlıq bir kölgə basıb-bürüməzmi?.. Yox, Maral xanım mütləq yaşamalıdır, bu əfsanəvi aləmi öz füsunkar gözəlliyi ilə gözəlləşdirməlidir! Ancaq necə etmək ki, Maral xanımı Çaqqaldan uzaqlaşdırmaq mümkün olsun?

Çaqqal bu nazəndə mələyin göbəyini də, qara gözlərini də yemək istəyir. Hətta qənaət edib uzun bir müddətdə bu Maralı özünə ruzu etmək istəyir. Yox, tezcə tərpənmək gərəkdir! Ayrı cür gec olacaqdır, özü də çox-çox gec olacaqdır! Narahatçılığa başlayan, böyük bir təşvişə düşən Qəcələ bir-birinə vurulan aşiq-məşuqə yaxınlaşdı. Gördü ki, gərək necə olsa da Maral göl tərəfə səyahətə çıxaq. Oranın da gözəlliyindən götürəsən, gözəlliyin üstünə daha artıq gözəllik gətirəsən.

– Yəni deyirsən ki, əzizim Çaqqal, o yanlara yol eləsək, daha gözəlləşərəm, eləmi?

– Bəs necə? Bəs Maral göl məhz Maral xanıma oylaq deyilmi?

– Ancaq mən göz açandan bu Güzgü gölə müştağam!

– Onu əcəbdən-əcəbə görürəm də, bilirəm də!

– Görürsənsə, bilirsənsə bəs niyə Maralı bu yandan qoparıb o yana dartırsan, Çaqqal?

– Deyirəm ki, Maral xanım Maral göldə də gözəlləşsin!

– Yəni, Çaqqal, Maral göldən gözəllik götürmək mümkündürmü?

– Bəli, tamam mümkündür, Maral xanım!

– Axı, sən bunu nədən bilirsən?

– Ondan bilirəm ki, bu Göy göl diyarında Maral göl ayrıca bir gözəllik dastanıdır.

– Bəs mənim Güzgü gölün necə?

– Sənin öz Güzgü gölün həmişəlik Maral xanımın ixtiyarındadır, istəyən zaman dəyirmi bir güzgü kimi cibindədir!

– Yəni Güzgü göl ancaq və ancaq Maral xanıma məxsusdur?

– Əlbəttə, başqa bir yana səfər etsək, sənin üçün Güzgü gölü də götürüb gedə bilərik!

– Deyəsən, bu, başabatan məsləhətdir, Çaqqal!

– Belə bir səfər, belə bir səyahət Maral xanımın yaraşığını çox yamanca artıracaqdır!

– Haradan bircə iynə ulduzunca gözəllik götürmək olsa, oraya da getmək gərəkdir, Çaqqal!

– Mən də elə bunun üçün təkid etmirəmmi?

Maral xanım quzu kimi qabağa düşdü, özünə xas nazla Maral gölə tərəf addımladı.

Çaqqal isə itiləşən dişlərini qıcayıb sarımtıl gözlərini qıyınca Qəcələ qırğı çevikliyi ilə üstünü aldı, kəlləsinə qondu, o yandan-bu yandan öz qanadlarını gətirib Çaqqalın hər iki gözünü örtdü. Çaqqal çapaladı:

– Kimdir belə ərkyana zarafat edən?

– Gərək özün tapasan!

– Qanadlarından duyuram ki, dostum Qəcələsən!

– Dostun yox, düşmənin Qəcələ!

– Görünür, qırğıya dönən Qəcələ Güzgü gölün Maral xanımını çox yamanca qısqanır!

– Qısqanmaqdan da artıq qorqanır!

– Qanadlılara göy, biz ayaqlılara da yer verilməyibmi?

– Bizə göy də, yer də verilibdir!

– Nə olar, qoy yer sizin də olsun... Biz Qəcələ kimi dargöz deyilik!

– İndi mən səni tamam gözsüz qoyacağam!

– Hansı ədalətə görə? – deyə Çaqqal başını o yan-bu yana fırlasa da Qəcələ qopmadı. Çaqqal atılıb-düşdü, kol-kosun arasından keçdi, nəfəsini dərincə yenə də həmincə sayaqda Qəcələnin bir qırğı kimi kəlləsinə qonduğunu, qanadları ilə bərk-bərk gözlərini tutduğunu gördü, əlacsız halda dayanıb durdu.

– İndi məndən nə istəyirsən, qırğılığa qurşanan Qəcələ?

– Bu Göy göl diyarından bir yolluq rədd olub uzaqlaşmağını istəyirəm!

– Onda haranı mənə məskən buyurursan, cənab Qəcələ?

– Aşağılarda bir qamışlığı, bataqlığı, şoranlığı, yovşanlığı, ilğınlığı!

– Görünür, məni qovub bu Kəpəz dağının hökmdarı olacaqsan!

– Yox, mən Qəcələ olub bu diyarda beləcə Qəcələ də qalacağam!

– Bəs onda sənin belə bir dargöz xəyanətinə nə ad vermək olar?

– Xain sənsən, sən özünsən, Tülkü dayısından dil öyrənən, Çaqqal!

– De görüm belə yanıqlı danışdığın yerdə sənə nə xəyanət etmişəm, Qəcələ?

– Mənə yox, Marala xəyanət edirsən, yalquzaq Çaqqal!

– Əgər Maral xanım özü xoşallanırsa, öz göbəyini mənə yalatdırırsa, onda bəs necə?

– Sən vəsflərində Maralı aldadırsan, Çaqqal!

– Mən hansı görkəmimə görə onu aldada bilərəm, insafsız, mürvətsiz Qəcələ!

– Ovsunlu dilinlə!

– Tutaq ki, belədir, sənə nə dəxli var?

– Mənə dəxli çox-çoxdur, Çaqqal!

– İşdir, Maralın göbəyini yalaya-yalaya gödəni sökülərsə, sənə də bir qismət düşəcəkdir, deyilmi?

– Bəs indiyəcən deyirdin mən xain deyiləm, mən Maral xanıma məftunam?! Mən olmazın eşq alovları içində yana-yana məftunam, məcnunam, dəliyəm, divanəyəm!

– Bəli, mən Maral xanıma məftunam, məcnunam, onun pərəstişkarıyam, onun ülvi gözəlliyinin dəlisiyəm, divanəsiyəm!

– Ancaq-ancaq yağlı göbəyinə görə!

– Tutaq ki, bircə anlığa belədir!

– Onda indicə bircə an içində mən səni gözsüz qoyacağam! – deyə Qəcələ hirslə, qəzəblə öz iti dimdiyini işə saldı, Çaqqalın sağ gözünü çıxarıb yerə atdı. Çaqqal çöm oturdu.

– Məni yerli-dibli kor etmə, Qəcələ!

– Yox, mən səni tamam-kamal kor qoyacağam.

– Günahımdan keç, Qəcələ!.. Yalvarıram! And içirəm, Qəcələ!

– Nəyə and içirsən, Çaqqal?

– Böyük Qəcələnin hökmdar başında günəşdən rəng alıb, günəşə rəng verən zərrin cıqqasına.

– Qəcələnin belə təmtəraqlı nə cıqqası ola bilər, Çaqqal?

– Qəcələnin mənim bu tək gözümdə par-par parlayan şah tacına ürəkdən and içirəm!

– Ay yağlı dil! – deyə bu təmtəraqlı təriflərdən az-az da olsa əqli çaşan Qəcələ başına buladı. Çaqqal isə hələlik bir tay gözünün üstündən keçib tək canını xilas etməyə can atdı:

– Sənin böyük şahanə cıqqana qəsəm qılaram ki, nə sənə, nə də Maral xanıma qarşı heç bir xəyanətə getməyəcəyəm!

– Bəs dediyim sayaqda buradan biryolluq rədd olub getməyin necə?

– Böyük hökmdarın verdiyi bu ağır cəza özü də mən biçarə Çaqqala bəs deyilmi?

– Necə ağır cəza? – deyə huşu az-az qayıdan Qəcələ Çaqqalı dolamağa başladı. – Hansı cəza, ay Çaqqal?

– Taygözlük cəzası, böyük Qəcələ!

– Demək, öz dərsini qandın?

– Ömrümdə belə bir dərsi unutmaram, böyük hökmdar!

– Unutsan o biri gözünü də çıxmış bil, Çaqqal!

– Ancaq böyük tacdardan tək bircə xahişim vardır!

– Desin görüm, nədir taygöz Çaqqalın xahişi?

– Onda qəti söz versin, tacdar!

– Söz verirəm, Çaqqal!

– And içsin əlahəzrət!

– Nəyə, necə and içsin, sənin yaltaqlandığın “əlahəzrətə”?

– Öz cıqqasına, tacına and içsin!

– Sənin bu yağlı dilin məni də yox-yox, beləcə-beləcə mürur-mürur yumşaldır. Tülkü dayısını geridə buraxan Çaqqal!

– Görünür, düz sözün istəməsən də sənə təsir edir, tacdar!

– Onda söylə görüm mətləbin nədir, Çaqqal?

– Məni bu diyardan uzaqlaşdırıb Maral xanımın müqəddəs surətindən, Güzgü göl tamaşasından məhrum etmə!

– Maral xanıma qəfləti xəyanət etməzsən ki?

– Mən hökmdar tacına and içmədimmi?

– Andını unutmazsan ki, Çaqqal?

– Heç zaman, əlahəzrət!

– Bəlkə bu iltimasçı cildinə girməklə, məni tərifin zərli tozanağına basmaqla girəvəmi əlinə keçirib məndən öz gözünün intiqamını almaq istəyirsən?

– Nə intiqamı bundan sonra?

– Çıxarılan gözünün intiqamını!

– Məncə çıxan göz çıxıbdır, sənsə mənə bu qalan sol gözümü bəxş edirsən!.. Mən çıxan gözümə görə intiqam almaq deyil, qalan gözümə görə sənin böyük mərhəmətinə, bassan da axıra qədər kəsməyən, biryolluq məni hər iki gözdən canaqlama kor qoymayan igidlik mərhəmətinə minnətdaram!..

Az əvvəl Güzgü göldən aşağı düşən Maral xanım Göy gölün yaxası yuxarı qalxdı, Maral gölə sarı yol aldı. Tumurcuqlardan yeni-yeni çıxan yaz meşəsinin yaşıllığı anbaan artdı, əkslərini Göy gölə saldı. Baxanda bu yaşıl-yaşıl ağaclar Göy göldə üzürdü. Kəpəz dağının aşağı ətəyində yamyaşıl meşələrin əhatəsində qıvrıla-açıla dalğalanan Göy göl Maral xanıma görünməzin yaraşıq verirdi. Lakin Maral xanım hər necə Göy gölə baxsa da, Güzgü göldə görünən sayaqda öz gözəlliyini görə bilmədi. Nədən ki, Maral buradan bir növ göyərmiş və göyümtül görünürdü. Güzgü göldə görünən sayaqda öz gözəlliyini hər hansı bir təfərrüatına qədər ayırd edib seçə bilmirdi. Maral xanım orada Güzgü göldə olan sayaqda Göy göldə öz-özünə aludə ola bilmirdi... Bəlkə, Göy gölün özünə xas əfsanəvi gözəlliyi Maral xanıma üstün gəlirdi? Ya Maral xanımın xudpəsəndliyi Göy gölün gözəlliyini olduğu kimi yaxşı-yaxşı görüb seçməyə imkan vermirdi? Ya iki gözəllik ilahəsi bir-birini inkar edirdi? Bir də gözəllər nə qədər bir-biri ilə rəqabətdə olsalar belə yenə də baxanda, qıraqdan tamaşa edəndə öz duruşları ilə bir-birinə yaraşıq vermirlərmi? Baxanın, tamaşa edənin gözlərini doyurmurlarmı?.. Dünya başdan-başa gözəllə dolu olsa yaxşı idi, yaxud belə təzadlı və müxtəlif? Bəlkə də, təbiətin ahəngi ilə birlikdə təzadı olmasaydı, gözəl ilə qeyri-gözəl fərqlənib seçilməzdi?

Maral xanım Göy göl sahili boyu ensiz cığırla nazlana-nazlana addımlayır, addımladıqca da sanki Göy göl Maral xanıma, Maral xanım da Göy gölə naz satırdı. Sanki Maral xanımın seçib bəyəndiyi, özünə güzgü etdiyi o Güzgü göl, öz əsrarlı əfsanəsi ilə özündən min-min dəfə böyük olan dalğalı, ləpəli Göy gölə qarşı çıxıb meydan oxuyurdu! Baxanda ləl-cavahirat da az tapılır. Düzə səpələnən düz olar. Maral xanım Göy gölə naz sata-sata boylanır, yuxarıda Kəpəzin gərdəninə qardan da ağ duman zolaqları dolanır, at-ağ buludlar da Göy gölün şırımlanan səmasında hərəkət edir, Kəpəzin zirvələrində bahar günəşinin qızıl telləri Göy göl diyarına nur səpələyib, əfsanəvi behişt dünyası yaradırdı. Əlvan çiçəklər də oyanmış torpaqdan baş qaldırırdı.

Ağ papaqlı göbələklər də tala-tala ağarırdı. Kəpəzin döşündə eynən buz, qar suya dönür, üzüaşağı şır-şır axırdı. Bütün şırlanlar şırıldaya-şırıldaya Göy gölə tökülürdü. Maral xanım yenə də üzünü ulduza qaldırıb Göy göllə rəqabətə girirdi:

– Mənim Güzgü gölüm hara, bu özünü çəkə-çəkə, qıvrıla-qıvrıla qalan Göy göl hara?

Maral xanım hər necə xudpəsəndlik etsə də, bu dünya gözəlliyinin gözü Göy göl barəsində çox-çox şeyi xatırlayırdı... Xatırlayırdı ki, bir zaman onun anası öz qızı bu Marala necə də Göy gölün əmələ gəlməyindən danışmışdı. O nəql etmişdi ki, necə bu dağlar dəhşətli zəlzələyə məruz qalmışdırlar!.. Necə də aləmi sarsıdan, dağları qapaq kimi atıb-tutan zəlzələ nəticəsində, belə təbii bərkinti içində bu Göy göl əmələ gəlmişdir. Ağ suyun yuxarılarından, Maral göldən atlana-atlana, ağara-ağara gəldiyini də, bu Göy gölə töküldüyünü də demişdi... Demişdi ki, necə də Göy gölün ayaq tərəfindən, nəhəng qayaların altınca bir çay axıb gedir. Ancaq nə edəsən ki, Maral Güzgü göl məftunu idi. Çünki Güzgü göl Maral xanımın istədiyi kimi göstərirdi. Çünki Güzgü göl Maral xanımın gözəlliyinə heç bir göy kölgə salmırdı. Belə olanda iki gözəl bir-birinə qısqanır və naz satırdı:

“ – Keç get, Maral xanım!”

“ – Sən də yat qal, Göy göl!”

“ – Mən yatmıram, hərəkətdəyəm, mənim ağ-çağ suyum səndən yüz qat artıq məsafəni qət edir, Maral xanım”.

“ – Ötüşə bilməzsən mənsiz, Göy göl!”.

“ – Yox, Göy göl Marala görə mahnıya düşübdür”.

“ – Görünür, sən özünə çox aludəsən, Maral xanım!”

“ – Sən məndən də artıq özünə aludəsən, Göy göl!”

“ – İndi bu savaş nə üçündür, Maral xanım?”

“ – Deyirəm ki, gərək hər necə kəc dursaq da, düz danışaq, Göy göl!”

“ – Yəni hey Maral xanımı tərifləyək?”

“ – Yox, düzünü deyin!”

“ – Düzü budur ki, sən özünü çaqqal-çuqqal tərifindən gözlə!”

“ – Necə çaqqal-çuqqal?”

“ – Özün əcəbini bilməmiş deyilsən, Maral xanım!”

Maral xanım dönüb geriyə baxdı, Çaqqalın onun ardınca gəlmədiyini müəyyən etdi.

“ – Bu Çaqqal harda qalmış olsun?” – deyə Maralın gözü məddahını axtarırdı. O, addımların yeyinlədib tutaş meşəyə girdi, Göy göllə deyişməkdən öz canını qurtardı. Meşə, nə meşə? Şiv-şiv vələslər göyə ucalır. Ağcaqayınlar, vələslər bir-birinə qarışır... Bir kökün üstündə bəzən beş, bəzən on vələs durur. Onlar da öz gözəlliklərini Maral xanıma göstərib deyirdilər: “Biz də özümüzə görə bir tamaşayıq! Heç də sən Göy göl diyarında tək gözəl deyilsən!” Maral xanım gözəllərə xas köşək gözlərini odlu-odlu göz yaşları ilə doldurub deyirdi:

“ – Qəcələdən tutmuş, Göy göldən bəri siz gövdəli vələslərə qədər niyə bir tək mənim üstümə düşürsünüz?”

“ – Necə üstünə düşürük, Maral xanım?”

“ – Belə də, beləcə, bax bu iynə-iynə dil ilə!”

“ – Biz Maralsız qalmaq istəmirik!”

“ – Onda niyə bu iynə-iynə diliniz bir tək mənim üstümə uzanır?!”

“ – Biz hamımız səni ayıq-sayıq salmaq istəyirik, Maral xanım!”

“ – Nə barədə belə, vələslər?”

“ – O barədə ki, sən Maral xanım tülküdil Çaqqala inanmayasan, öz qılça-paçanı ona arxayın olmayasan, yağlı göbəyini Çaqqala yalatmayasan, hərdənbir də dişlətməyəsən!”

“ – Yəqin ki, bu xəbəri sizə o zəhərdil Qəcələ çatdırıbdır?”

“ – Bəli, bu xəbəri Qəcələ çatdırıbdır”.

“ – Çaqqal ya qeyri Çaqqal, hər nə edirəmsə, o mənim öz işimdir, vələslər!”

“ – Yox, Maral xanım bizim hamımız üçün eyni dərəcədə əzizdir, bəlkə də əzizdən əzizdir!”

Maral xanım sehrli Çaqqalın başına bir qəzanın gəldiyini, bic Qəcələninsə binəva aşiqin başına bir cəncəl açdığını gümanına gətirsə də, vələslər aləmindən də aralandı, sanki bütün təbiət, bütün gül-çiçək, bütünlüklə Kəpəz və Göyü göl beyni yeyilən Maral xanımı xəbərdar etdi, onu utandırıb qızartmaqla Çaqqaldan çəkindirmək istədi. Ancaq Güzgü göl Maralı alışdığı tərifçinin əlindən çıxarmaq, özündən uzaqlaşdırıb qaçırmaq istəmədi. Öz dünya gözəlliyi barəsində gündə min-min mədhnamə yazılmağını arzu edən Maral xanım üçün bu yoldan dönüb qayıtmaq nəinki çətin idi, hətta qeyri-mümkün idi. Necə yəni Maral xanım onun gözəlliyini rəvan, cazibəli dil ilə mədh edənin mədhini eşitməsin, qulaqdan kar olub dursun! Yox, bunlar hamısı bic-bicəngə Qəcələnin dargözlülüyündən gələn xəbərçilikdir ki, hər yana yayılıbdır.

Belə qəribə və mürəkkəb vəziyyətə düşən özü özlüyündə küsüb-küskünləşən Maral xanım dərindən ah çəkə-çəkə Maral gölə tərəf addımladı. Onun ah-zarı meşənin içində gizlənib qalan, lakin yaz günəşinin təsirindən çəkilməyə başlayan dumanlara qarışdı. – Sən bu xəbərçi bicəngə Qəcələni görürsənmi? – Maral xanım hirs-hikkə ilə söyləndi. – Kimin nə borcuna ki, Maral xanımın müşk-ənbər ətri verən dairə göbəyini bir Çaqqal yaladı, ya yalamadı?..

Maral xanım Göy göl meşəsinin arasınca küskün-küskün gedirdi... Bu küskünlük özü də Maral xanıma əlavə gözəllik gətirirdi. Bu halında Maral xanımın qəlbinə dəymək onun gözəllik güzgüsünü sındırmaq çətin, Çaqqalın yağlı-yağlı tülkü dilinin müqabilində Maral xanımı arxayınlıqla özbaşına buraxmaq da çətin idi!

Acıdil Qəcələ istər xəbərçilik etsin, istər etməsin, bütünlüklə Göy göl diyarı dilə gəlib deyirdi, sən ey öz gözəlliyinə aludə olan Maral xanım, özünü sərvqəd saxla, sənə yalmanan, zəif damarını tutub sənə qəsidə qoşan tülküdil Çaqqaldan özünü qoru! Sən özünü Göy göl diyarı üçün, Kəpəz dağı üçün sağ-salamat və ləkəsiz saxla. Bəli, bu aləmdə olan füsunkar gözəllik, bu diyara qədəm qoyan füsunkar baharın özü də Maral xanımın başından bir tük əskik olmağını istəmirdi!.. Burada nə qibtə, Maral xanım barəsində hansı məqsədlə başqa bir qibtə ola bilər?! İnsafla baxanda Maral xanım bu diyara, bu diyar da Maral xanıma gözəllik, yaraşıq verirdi. Maralsız necə Güzgü göl və ya Göy göl diyarı?! Göy göl diyarı olmadan necə Maral xanım?..

Çaqqal və Maral!

Çox qəribə və gülməli görünsə də belə idi!

Həqiqət hər necə acı olsa da, Maral xanım adət edib alqışladığı, tərifin doğurduğu məstedici nəşədən əl çəkə bilmirdi.

Maral xanım ağır addımla yırğalana-yırğalana, həm də küskünlüyün doğurub gətirdiyi gözəllik içində nazlana-nazlana gedə-gedə axır ki, Maral gölə yetişdi. Üzü danlanan, iztirab keçirə-keçirə küskünləşən Maral xanım gölə baxdı. Köşək gözlərindən gilə-gilə gələn yanıqlı göz yaşlarına xeyli tamaşa etdi. Maral xanım öz-özünə ağladı-ağladı, bəsdi deyincə ağladı!.. Birdən də özünü götürüb bu dərin gölə atdı: – Qoy boğulum, qoy canım çıxsın, biryolluq ölüm qurtaram. Ta bu xəbərçi Qəcələnin əlindən xilas olum! – dedi. Ancaq Maral xanım özünü bu göldə boğmaq, canını çıxarmaq istəmədi, ötərgi hisslərindən tezcə qurtarıb qol-qılça çala-çala, ağaran qılça-paçasına gözəl köksünə,

dairəvi göbəyinə baxa-baxa süzdü, başını döndərə-döndərə hərləndi. Maral göldə Maral gözəlliyinin ayrıca büsatını tapdı. Baxdıqca Maral Marala qarışıb Güzgü gölün Maral xanımını müşayiət edirdi. Dalğalarda Maral, ləpələrdə Maral, Maral gölün hər yerində Maral!.. Bir də yox, bəlkə də yüz Maral! Maral xanım üzdükcə marallar onu müşayiət edirdi. Maral xanımın özü-özünə, öz əkslərindən, surətlərindən qat-qat artıq gözəl görünürdü. Maral xanım Güzgü göldə bir maral görürdü, özü də olduğu kimi görürdü. Ancaq burada Maral göldə üzən zaman özünün dalğalandırdığı dalğalarda onun böyrüncə, ardınca, yan-yörəsinsə sayı-hesabı bir-birinə qarışan nə qədər də Maral görünürdü!.. Maralın köşək gözləri öz gözəlliyinin yeni-yeni əlamətlərini tapmış kimi hərisliklə işıldayırdı. Kimə, nəyə, hər necə gülməli, ya ağlamalı görünsə də Maral xanım indi ancaq bir tək öz məddahı Çaqqalı görmək, bir qıraqda dayanıb boylanan Çaqqalın qara burnuna baxmaq, onu özünə tərəf səsləmək, onu da özü ilə üzdürmək istəyirdi.

O, Çaqqalın mədhlərini, qoşmalarını və qəsidələrini eşidə-eşidə öz qılça-paçasına Çaqqalın gözü ilə, həsrəti ilə baxa-baxa, özü də bu dalğaları daha da Maralla doldura-doldura, maralların müşayiəti ilə üzürdü, üzdükcə gözəllik üstünə gözəllik gəldiyini yəqin edə-edə, özü öz misilsizliyinə inana-inana üzürdü!..

Qarğıya dönən Qəcələ tərəfindən ağır cəza alan, sağ gözü çıxarılıb bir tək sol gözünə möhtac qoyulan cənab Çaqqal getdikcə kinlənir, Qəcələyə qarşı qeyzlə dolurdu. Cənab Çaqqal istəyirdi ki, Tülkü dayısı kimi fəndgirliklə marıqda dursun, xəbərçi Qəcələnin dolaşdığı, tez-tez eşələndiyi Qara gölün, ya Zəli gölün yanında bir kolun içində gizlənsin, Qəcərə eşələnən zaman yerindən sıçrasın, qəflətən Qəcələni qapıb qənimini başlı-gözlü içəriyə ötürsün. Öz yanan ürəyini soyutsun, çıxarılan sağ gözünün hayıfını beləcə alsın. Dönüb Maral xanımın yanında özünü dartıb desin ki, mən necə yırtıcıyam, necə leşi-leş üstünə tullayan bir canavaram, yalquzağam!

Sağ gözü çıxarılan Çaqqal qızışa-qızışa danışandan, hirsini soyudandan sonra iki canlı məxluq onun tək gözünün qabağında qoşa dayanırdı. Birisi dayısı şələ quyruq tülkü!.. O birisi də öz qulaqlarını cütləyən, şıqqıltı, hənirti eşidincə irəliyə cuman, qaynar qandan qorxmayan, qabağına düşəni boğan, söküb-dağıdan leşi-leş üstə tullayan həmin-həmin yalquzaq Canavar!.. İndi bu taygöz cənab hansını özünə

mürşüd seçsin? O hansının müridi olsun?.. Tülkününmü?.. Canavarınmı? Çaqqal sağ gözündən axan al-qanı sol əli ilə silə-silə bu qərara gəldi ki, bəs ona daha yaxın olan, onun ürəyindən xəbər verən tülkü dayısının yolu, yəni kələyi, hiyləgərliyi birinci növbədə daha artıq gərəkdir! Ancaq yalquzaq canavar cəsarəti, fürsəti fövtə verməmək məharəti, onun hər hansı xapa-xaplığı hopa-hopluğu məqamı çatanda ola bilər! Buna görə də taygöz Çaqqal ilkin tülküləşib yazıqlaşmağı, bacardıqca daha məzlumlaşmağı qərara aldı. Çaqqal üçün tülkülüklə öz canavarlaşan sifətini də, dişini də gizləmək, öz quyruğunu tülkü quyruğu kimi şələləşdirib toz-tozanaq qaldırmaq, açıq ayıq gözlərə kül üfürmək gərək idi! Yoxsa Çaqqal sol gözünü də qurban verməli, yazıq, miskin hala düşməli idi. Çaqqal kor olduğu üçün də uçurumdan düşməli, nəticədə bu acıdil, xəbərçi Qəcələyə qismət olmalı idi. Vəziyyətin gərginliyini, ciddiliyini öz tay gözünün qabağına gətirən Çaqqal, Güzgü gölün yuxarısında yaşıl mamırlı daşın arasına girib, ufuldamağa, sol gözü ilə sağ gözünün dərdinə ağlamağa başladı. Elə bu zaman da Maral gölündə gərəyincə yuyunan, öz istəyincə daranıb düzələn, bahar günəşi altında qurulanan, daha da artıq gözəlləşən, əyri-üyrü cığırla dırmanıb yuxarı qalxan Maral xanım gərdənini çəkə-çəkə Güzgü gölə yetişdi. O, Güzgü gölün müqabilində həvəslə dayandı, qıyqacı nəzərlə özü-özünə tamaşa etməyə başladı. Maral xanım Maral göldən gözəllik götürüb, gözəllik üstünə yenə də gözəllik gətirdiyinə inandı. Ancaq bunu təsdiq və tərif edən hanı? Qəcələmi?! Yox, xəbərçilik edən, Göy gölün də, vələs-ulası da, az qala bütün dağı-daşı da Maral xanımın üstünə qaldıran, onu dilə-dişə salan Qəcələdən düşmənçilikdən başqa nə gözləmək olardı?

Əgər belə deyildisə, bəs düşmən nə təhər olardı? Düşmənin başında buynuz bitməz, çığıra-çığıra car çəkməz ki, mən sənin barışmaz düşməninəm, nizə buynuzlarımla sənin qarnını dağıdıb axırını da itirəcəyəm!.. Yox, düşmən elə acıdil Qəcələ kimi ürəyi qurdludur ki, Maral xanımın gözəlliyini dansın, onun paxıllığını çəksin, özünə dəxli olmayan işə qarışsın, bir xəlvətdə bu Çaqqala Maral xanımın öz göbəyini yalatdığını aləmə açsın, bu nazəndəni beləcə rüsvayi-cahan etsin?! Yox, bu xəbərçi Qəcələ dünyanın birinci xəbərçisidir, xəbərçi özü də şeytandır, şuğuldur, niyə də gərək Maral xanım sarı yağ kimi canına yayılan mədhlərdən, təriflərdən, qəsidə-qoşmalardan özünü məhrum etsin?! Bir gözəlliyin ki, qədri-qiyməti bilinmədi, daha o gözəllik

nəyə gərəkdir?.. Axı heç də mətləb gözəlin yeyib-yatmağında deyildir, mətləb gözəlin dopdolu qiymətinin sözlə səxavətlə verilməyindədir.

Güzgü göl Maral xanımı Maral göldə üzəndən, çiməndən, üzə-çimə öz qılça-paçasına tamaşa edəndən sonra artan, üst-üstə gələn gözəlliyini öz parlaq aynasında göstərir. Maral xanım öz gözəlləşən surətini, qaş-gözünü, oxa dönən kirpiklərini, əl-ayağını, hər yerini, hər yanını qıyqacı süzür, bu Maral xanım tərpəndikcə o Maral xanımı da tərpədir, hətta birdən Maral xanımın gözündə Güzgü göl üstündə köşək gözlərini gəzdirə-gəzdirə gəzdirə, sonra da üzüyuxarı ağ sinəli Kəpəzə doğru gərdənini çəkdi... Öz tülkülüyü ilə Maral xanımın necə intizar içində boylandığını, necə olmazın iztirab keçirdiyini, məhz onu, cənab Çaqqalı axtardığını bilincə bu taygöz sürünə-sürünə üzüaşağı endi. Maral heyrət etdi:

– Sənə nə sədəmə toxunubdur, əzizim Çaqqal?

– Qana düşmüşəm, Maral!

– Necə qana? Söylə!

– Sənin yolunda sağ gözümü itirmişəm!

– Necə, mənim yolumda sağ gözümü itirmisən, əzizim?

Maral xanım diqqətlə onun çanaqlama çıxarılan sağ gözünə baxdı.

– Bəlkə mənim ardımca Maral gölə gələn zaman öz gözünü bir tikana, ya bir qələməyə ilişdirmisən?

– Yox, amansız bir hərami yolumu kəsibdir!

– Yəni bu diyara oxlu bir ovçu da gəlibdir?

– Oxlu-kamanlı ovçu belə bir həramidən, haramzadədən min pay ədalətli olardı!

– Bəs onda sənə nə bədbəxtlik üz veribdir, əzizim?

– Sizin qəddar düşməniniz Qəcələ sizin fədakar dostunuzun yolunu kəsibdir.

– Sən nə danışırsan, mənim əzizim? Qəcələdə belə qırğılıq, belə çalağanlıq?

– İndi Qəcələnin qırğıdan da yaman qılıncı qında durmur!

– Nəyə görə Qəcələ belə qudurubdur, niyə qılıncın qəbzəsindən belə zalimana yapışıbdır?

– Mənim sizə olan intəhasız eşqimə görə, xanım!

– Xəbərçi Qəcələ, qılıncı qında durmayan haramzadə öz xəbərçi, acıdan-acı dilini işə salıb, Göy göl diyarına yayıbdır ki, bəs sarı-sısqa

Çaqqal bu diyarın Maral xanımının müşk-ənbər ətri verən dairə göbəyini yalam-yalam edibdir!

– Qoy heç zaman gizlin qalmasın ki, mən Maral xanıma necə müştağam, necə aşiqəm, necə məftunam, necə məcnunam!

– Buna indi daha artıq inandım, Çaqqal!

– Demək, Maral xanım öz məcnununun necə aşiqi-sadiq olduğunu ürəkdən təsdiq edir?

– Bəli, tamamən ürəkdən, özü də tərəddüdsüz təsdiq edirəm, Çaqqal!

– İlahi, mən nə qədər xoşbəxtəm, – deyə Çaqqal Tülkü dayısının məharəti ilə hər iki əlini göyə doğru qaldırdı, çıxarılan sağ gözündən qanlı yaş tökdü. – İlahi, sən özün şahid ol ki, mən aşiqi-sadiq Maral xanımın yolunda nəinki salamat qalan sol gözümü də, əzab-əziyyətdən, eşq-məhəbbətdən üzülən bircə canımı da qurban verməyə hazıram!..

Qollu-qanadlı vələsin mamırlı haçasında gizlənən, ümumən bu ara-bərədə xəlvətcə-xəlvətcə dolanan, bu budaqdan o budaca ehmallıca uçan Qəcələ bacardıqca heç nəyi gözdən qaçırmır, taygöz Çaqqala Maral xanımın bütün münasibətlərinə göz qoyurdu.

– Çaqqal, niyə yalamırsan gözəlləşən müşkümü?

– Maral xanım, hələ ki, ibadətlə məşğulam!

– Necə ibadətlə məşğulsan, Çaqqal?

– Görmürsənmi Allah dərgahında necə də süst dayanmışam? Necə də şükür sənə edirəm ki, xudaya, gör mən nə xoşbəxtəm ki, öz məcnuni eşqimin yolunda sağ gözümü bu gözələ qurban verdim. Necə də o Qəcələ xəbərçinin, yalançının, külli-aləmi aldadan bir carçının paxıldan paxıl bir əclaf olduğunu sübut etdi... Düzü, bundan belə yıxılıb ölsəm də ürəyimdə heç bir arzum yoxdur, Maral xanım!

– Niyə bəs belə bir vüsal pilləsində özün nagahani ölüm istəyirsən, Çaqqal?

– Nədən ki, indi Maral xanım öz aşiqinə tamamən inandı və şəkk-şübhədən çıxdı, canı, ürəyi, diləyi, arzusu Maral xanım olan Çaqqal dünya gözəllərinin zər-zibalı tacdarına, Göy göl diyarının gözəllik ilahəsinə qolu bağlı qul oldu və quldan da artıq bu gözəl xanımın ayaqlarına sərilib torpağa dönməyə hazır olduğunu sübut etdi!

– Uzatma belə-belə söz-söhbəti, yala müşk-ənbərimi, Çaqqal!

– Düzü, elə bir sevinc, elə bir həyəcan, elə bir eşq girdabındayam ki, heç cürə Maral xanıma yaxınlaşa bilmirəm!

– Canını dişinə tut, yala ənbərimi, Çaqqal!
– Əsla, Maral xanım!.. İndi mən heç də o halda deyiləm!
– Öz qəsidələrin ilə məni qızışdırırsan, ancaq alovlarımı söndürə bilmirsən, Çaqqal!
– Mən, Maral xanımın ehtiraslı alovlarında hey yanmaq istəyirəm! Mən Güzgü göl gözəlinin sönmək bilməyən odunda yana-yana kömürə, külə dönmək istəyirəm!
– Sən məni bax belə bir sehrli dilinlə yandırırsan, sağ gözünü yolumda fəda edən qəhrəman!..
– İlahi, gör nə xoşbəxtəm!.. İlahi, görəsən bu dünya üzündə məndən də xoşbəxti varmı?
– İbadəti burax, Çaqqal!.. Gəl müşkümü yalam-yalam elə, özü də nə qədər istəyirsən dişlə, lap istəyirsən bu yağlı göbəyimi, bu məni dəli-divanə edən müşk-ənbər ətri verəni ye! Ye ki, ta canım biryolluq bu intəhasız əzab-əziyyətdən qurtarsın!
– Heç belə ilahi gözəlin müşk-ənbər ətri saçan göbəyinə qıymaq olarmı?
– İbadəti burax, Çaqqal! Gəl lap məni başlı-bütünlü ye! Ye, canımı bu ehtiras alovlarından xilas et. Ye, məni qurtar ki, cəhənnəm alovları içində bunca qovrulmayım!
– İlahi, ilahi!..
– Yenə də əllərini göyə qaldırırsan, Çaqqal?
– Çox həyəcanlıyam... Elə həyəcanlıyam ki, diqqətlə baxsan görərsən ki, necə də tir-tir titrəyirəm!
Vələsin haçası arasında Qəcələnin başını çıxarıb itiləşən dimdiyini göstərdiyini görən taygöz Çaqqal birdəncə dönüb əsim-əsim əsməyə başladı.
– Allah dərgahında niyə belə əsirsən, Çaqqal? – deyə Maral xanım köşək gözlərini döndərib, uzun kirpiklərini süzdürdü. – Elə bil ki, doğrudan da boğulursan?!
– Məcnuni-eşqin girdabında ölürəm!
– Onda əlac nədir ki, mən öz məcnunumu itirməyim?
– Əlac məcnunu özbaşına buraxmaqdır!
– Yəni nə etməkdir?
– Qoyun mən öz mağarama sürünüm, Maral!
– Orada nə edərsən?
– Can verərəm!

– Deməк, mən dul qalaram?!
– Yox, yox, ölsəm də ilahi eşqin əbədiləşən ruhi aləminə gedərəm. Tamamən təmizlənib, paklanıb bir də Maral xanımın yanına qayıdaram!
Qəcələnin qorxusundan tir-tir əsən Çaqqal Güzgü gölün yanında olan məlum mağaraya süründü.
Qəcələ yuxarıdan dilləndi. Maral boylandı:
– Eşidirsənmi məni, Maral xanım?
– Sənsən, xəbərçi Qəcələ?
– Bəli, mənəm, xəbərçi Qəcələyəm!
– Bəs niyə bayaqdan bəriyə qənşərə çıxmırsan?
– Çünki Maral xanımın yerə-göyə sığmayan belə nagüvara hərəkətinin müqabilində utanıram, qızarıram, yerə girirəm.
– Sən çox-çoxdanın zəhər-zəqqum dilli Qəcələsisən!
– Bəs sən necəsən, Maral xanım?
– Mən öz eşqimin əsiriyəm!
– Hansı eşqinin? Bəlkə, tülküləşən Çaqqalın yağlı dilinin əsirisən?!
– De görüm, məndən nə istəyirsən, Qəcələ?
– İstəyirəm ki, aldanmayasan, öz taleyini Çaqqala tapşırmayasan! – deyə Qəcələ böyük vələsin haçasından çıxdı, gəlib Güzgü gölün yanında dayanan, öz əksinə baxan Maral xanımın müqabilindəki şiş qayanın başına qondu.
– Qoy bu gözəllik səni uçurumlara aparmasın! Qoy bu gözəllik səni çaqqal-çuqqalın ayaqları altına atmasın!
– Yəni Qəcələnin də elə bir atəşin eşqi var ki, belə qısqanır?
– Yox, əsla!.. Bir quşun, Qəcələnin Maral xanıma qarşı atəşin eşqi ola bilər?
– Bəs onda bu diyarda kimin eşqi mənə gərəkdir?
– Sizə müqabil bir buynuzlu Maralın!
– Əgər buynuzlu Maral bu diyarda qəhətə çıxıbsa?
– Səbriniz olsa, öz taleyinizi tələm-tələsik çaqqal-çuqqala tapşırmasanız, hamısı düzələr!
– Elə mən də gecikən, indiyəcən gəlib çıxmaq bilməyən elə bir bığlı bəyin acığına gözəlliyimi görən, bəyənən, öz sağ gözünü yolumda qurban verən Çaqqalı görürəm, özünü də bərk-bərk tuturam!
– Siz ağlayacaqsınız, Maral xanım, özü də yamanca çox hönkür-hönkür ağlayacaqsınız!

– Sözündən belə çıxır ki, Çaqqal məni dirigözlü yeyəcəkdir?
– Bəli, siz öz müşkünüzü o sarı-sısqaya yalatdıra-yalatdıra özünüzü dirigözlü yedirəcəksiniz!
– Çaqqal nə qədər məni yesə də qurtarmaz!
– Çaqqal yeyib-yeyib səni qurtaracaqdır, Maral xanım!
– Bəlkə sizə, Qəcələyə də məndən bir pay düşər?
– Yox, mən Güzgü gölü Maralsız, Göy gölü belə gözəlsiz qoymaq istəmirəm!
– Mənim başımı çox yamanca ağrıdırsan, Qəcələ! – deyə Maral xanım küskün-küskün mağaraya tərəf yollandı. Qəcələ budaqdan-budağa uça-uça car çəkdi. – Qoy eşidən eşitsin, bilən bilsin ki, sən necə zırın-zırın ağlayacaqsan, Maral xanım! Necə də öz boynunu büküb bu Güzgü gölün sahilində zar-zar ağlayacaqsan!

Bütün bu oyunu başa düşən, bic Qəcələnin müqabilində tamamən tülküləşən taygöz Çaqqal bir abidə dönüb Allah dərgahına əl qaldırmaqla öz ürəyitəmizliyini, Maral xanıma olan böyük eşqinin paklığını nümayiş etdirirdi...
Axı, gözəlliyin gətirib bəxş etdiyi xoş səadəti qorğanan ayıq baş gərəkdir! Yoxsa, gözəlliyin sərməstedici sərxoşluğu gözəlin başını kərm edib qızışdırdı, daha bu gözəllik talan-qarət olub gedəcəkdir, gözəllikdən hər nə varsa, hədər yerə itib-batacaqdır, səadət əvəzinə fəlakət-faciə baş verəcəkdir. Gözəlin marığında dayanan çaqqal-çuqqaldan qorğanmaq üçün çaqqal-çuqqalın ağzına vuran qəti iradəli keşikçi gərəkdir! Yoxsa, bu sərvət talan olacaq, bu sərvəti çaqqal-çuqqal dartıb aparacaq, kefi istədiyi kimi kef çəkəcəkdir! – Mütəfəkkirləşən Qəcələ özü üçün düstur düzəldir, öz gələcək xətt-hərəkətini dürüstləşdirib aydın etmək istəyirdi. Buna görə də Qəcələ üçün mütəfəkkirləşməkdən başqa daha da mühərrikləşmək, çevikləşmək, cəldləşmək, qırğılaşıb amansızlaşmaq gərək idi ki, göz-qulaq olub görsün bu Çaqqal haçan öz andını pozur, haçan Maral xanım öz məddahının çıxılmaz toruna düşür, özü də necə və nə təhər düşür? Elə olsun ki, Maral xanım bic Qəcələnin həyəcan və tələblərinin heç də əbəs yerə olmadığını görsün, bilib başa düşsün ki, Maral xanım öz qızışan göbəyinin od-alovu içində ölüm-dirimlə oynayır!
– Yox, belə deyildir, belə də olmamalıdır, – deyə Qəcələ qanaddan-qanada qona-qona hərləndi, xəlvətcə gəlib daş mağaranın ağzından

içəriyə süzən həmin Vələs qanadında qərar tutdu. Maral xanım heç nə duymadı. Lakin sol gözünün dərdinə qalan, Qəcələnin özünü belə aldatmaq, Maral xanıma tamam-kamal yiyələnmək istəyən Çaqqal bic Qəcələnin necə gəldiyini duydu, onun vələs qanadında necə gizləndiyini də bildi. Onu titrətmə tutdu, güclə dişlərinin şaqqıltısını saxladı. Qəcələ gördü ki, Maral xanım özünün sərxoş və küskün gözəlliyi ilə üzünü Çaqqala tərəf döndərib qol-qılçasını da boş-boşuna uzadıb yatıbdır. Çaqqal isə ehtiyat üzündən öz üzünü daşa tərəf çeviribdir və sağ gözünün çanağından yenə də qanlı yaş tökməkdədir. Maral xanım hələ də Saqqalı öz halına qaytara bilməyibdir. Alovlanan müşkünü Çaqqala yalada bilməyibdir. Küskünləşən, müəyyən dərəcədə bədbinləşən gözəl Çaqqala da olsa həmdəm olub, ovunmaq istəyirdi. Axı, Maral xanımın gözəlliyindən də artıq qıcıqlanan ehtiras selabı onu götürüb yumarlaya-yumarlaya aparırdı. Sərməstlik içində fikrə, xəyala gedən Maral xanım gah Maral gölə düşüb onun dalğalarında üzür, ləpələrində qıvrılıb-açılır, onu müşayiət edən Maral surətləri çoxaldıqca çoxalır... Maral xanım burada bəsdi deyincə üzəndən sonra çıxıb, Qazandurmaz dağına qalxır, oradan Qoşqar dağına tamaşa edir. İntəhası görünməyən çaylar, çəmənlər Maral xanımı özlərinə çağırır... Maral xanım buradan da qayıdıb haçadil Kəpəz dağına dikəlir, oradan da o tərəf dağlara, meşələrə boylanır. Birdən də Maral xanım buradan düşür, qaça-qaça uzaqlaşır, ancaq nə Çaqqalın ondan üzüldüyünü, nə də özünün Çaqqaldan üzülə bildiyini görürdü... Ümumən, Maral xanım harda idi, Çaqqal da orada idi...

Maral üzü o tərəfə yatan Çaqqalı tərpətməli oldu:

– Niyə üzünü bəri döndərmirsən, Çaqqal?

– Niyə döndərim, Maral xanım?

– Bəs bayaqdan əmr etmirəm ki, bu alovlanan müşk-ənbəri yala, yala və soyut...

– Düzü, Maral xanım, yamanca həyəcanlıyam. Düzü, burada zarısam da, ibadətdən ayrıla bilmirəm!

– Sən mənə ibadət et, Çaqqal!

– Axı, ibadət edən Allah dərgahındadır!

– Lap Allahın özcə gözünün qabağında yala ənbərimi, Çaqqal!

– Günah olmazmı, Maral xanım?

– Qoy günah olsun, qoy sənin ibadət etdiyin Allahın məni cəhənnəm odunda yandırsın!

– Axı, mən Maral xanımı behiştdə görmək istərdim!
– Aşiq-məşuq üçün cəhənnəmin odu da qorxulu deyildir, Çaqqal!
– Belə nəyə görədir, Maral xanım?
– Çünki aşiq-məşuqun od-alovu özlərinə bəs edər!
– Yəni Maral xanım belə sönmək bilməyən əbədi atəş içindədir?
– Bəli, Çaqqal! – deyə Maral xanım öz əlini bərkdən Çaqqalın belinə ilişdirdi. Ancaq Qəcələnin cıqqasına and içən, öz adında sadiq olduğunu qanadda gizlənən Qəcələyə göstərən, öz sol gözünü də elə indicə bu mağaranın içində güdaza vermək istəməyən Çaqqal dönüb çömbəldi, hər iki əlini yuxarıya qaldırdı:
– Mən məşğulam, Maral!
– Yenə də abidliyə qurşandın, Çaqqal?
– Bəli, Maral xanım, biçarə bəndəniz bu hüdudsuz səadətə şükürsəna edir!
– Yoxsa, arayıb-axtarıb, düzü dünyanı dolanıb, özümə bir başqa Çaqqal taparam ha, seyrəkbığ oğlan!
– Mən Maral xanımın əbədi kölgəsinə dönərəm, həmişə onunla olaram!
– Bunca uzun-azadı ibadətin nə üçündür, Çaqqal?
– İbadətim onun üçündür ki, Allah-təala bizim qonşumuz Qəcələnin ömrünü uzatsın!
– Axı, nə üçün Allah-təala düşmənimiz olan xəbərçi Qəcələnin ömrünü uzatsın?!
– Düzü, indicə yadıma düşür ki, Maral xanıma olan eşqim üçün o mənə necə ibrətamiz təlimat keçibdir!
– Sən zəhərdil, xəbərçi Qəcələnin adını bərqəsd mənim yanımda çəkib məni əsəbiləşdirməkmi istəyirsən, Çaqqal?
– Gərək hər necə olsa da, qonşumuz Qəcələ ilə sazişə girib onunla dil tapaq!
– Düşmənlə nə dil, Çaqqal?
– Elə indicə, bu an Allahdan belə bir vəhy gəldi ki, bəs siz barışın!.. Axı, müharibə aparanlar belə bir gün cana doyurlar, əyləşib sülhdən, sazişdən danışıb bir-biri ilə dil tapmağa cəhd edirlər!
– Sən lap dayın tülküdən də yaman bir tülküsən, Çaqqal!
– Mən ancaq və ancaq haqq aşiqiyəm, Maral xanım!
– Haqq aşiqi, haqq aşiqi... Bilmirəm, heççə nəyi mən...

– Bəli, indicə bu an belə vəhy gəlir ki, haqq aşiqi olanlar vüsaldan binəsib olurlar!

– Necə binəsib olurlar?

– Bax, beləcə yıxılıb can verirlər və nakam ölürlər! – deyə ibadətini yarımçıq qoyan, tülküləşən Çaqqal Qəcələnin qorxusundan birdən tir-tap düşdü. Maral xanım Çaqqalın iztirablarına inansa da, bic Qəcələ inanmaq istəmədi. Qəcələ öz gündəlik nəzarətini artırmağı, bu macəralı oyunun oynana-oynana necə davam edəcəyinə göz qoymağı qət etdi, gözlərini dörd edib daha sərvaxtlıqla gözləməyə başladı.

Belə bir vəziyyət həm gülməli, həm də ağlamalı deyildimi? Bic Qəcələnin özü də bilmədi bu hala gülsün, necə gülsün, ağlasın, necə ağlasın?!..

Qəcələ rəqibi Çaqqalın üstündə göz olan kimi, Çaqqal da hər necə ölüb-dirilsə, yenə də Qəcələnin üstündə göz olmağa, girəvəni əldən verməməyə cəhd edirdi. Qəcələ rəqibdən də artıq düşmən kəsildiyi Çaqqala gözətçilik edən kimi, Çaqqal da ölə-dirilə Qəcələnin üstündə göz olmağa, bacardıqca fürsəti fövtə verməməyə cəhd edirdi. Sağ gözü çıxarılan, sol gözü də çıxarılmaq təhdidi altında olan Çaqqal istəmirdi ki, Qəcələnin əlinə tutalqa versin, ehtiras alovları içində yanan Maralın göbəyini Qəcələ görə-görə yalasın, bir də təzədən Qəcəlini qırğılaşdırıb kəlləsinə qondursun, sol gözünü də sağ gözü kimi güdaza versin. Lakin Qəcələnin gözləri qabağında dönə-dönə ölüb-dirilməyə hazır olan Çaqqal hər necə olsa da Maral xanımdan üzülmür, gizli məqsədindən geriyə durmur, aradabir xəlvətcə-xəlvətcə mağaranın içində, zülmət qaranlıqda Qəcələ yuxarı qanadda mürgüyə gedən zaman yavaşca-yavaşca başını döndərib Maral xanımın qılça-paçasını tumarlayır, Maral xanım oyanınca onun əmrinə əməl edib öz dilini onun ənbərinə uzadır, tələm-tələsik yalayıb xanımı xoşhallandırırdı. Bu vaxt Maral xanım özünü boş qoyur, Çaqqala heç bir maneçilik göstərmir, sağ gözünü ona qurban verən aşiqindən zövq alır, həm də öz aşiqinə nəşə verib, ona borclu qalmaq istəmirdi. Ancaq Maral xanım bilə bilmirdi, niyə bu Çaqqal əvvəl vaxtlarda olduğu kimi, indi daha öz dişlərini işə salmır, az-maz da olsa yağlı göbəyini dişləyib qıcıqlandırmaqdan, ehtiraslandıran hərəkətdən boyun qaçırır...

– Nə olub sənə, Çaqqal, niyə belə sustlaşmısan, ölüb-ölgünləşmisən?

– Yavaşca, Maral xanım, – deyə tülküləşən Çaqqal ustalıqla xısın-xısın danışıb, Maral xanımı da onun kimi xısın-xısına öyrədirdi. Maral xanım da hər necə möhtəris olsa da mütilik göstərir, tezcə yumşalıb məddah və pərəstişkarı olan Çaqqal bəyin dediklərinə əməl edir, o da eynən xısın-xısın cavab verirdi.

– Soruşuram, nə üçün belə sustalmısan, Çaqqal bəy?

– Niyə sustalıram, Maral xanım?

– Belə ki, bir cürə asta-asta nəzakət və ədəblə tərpənirsən?! Axı əzəlləri az qala sən yalquzaqlaşırdın, canavarlaşırdın! Didib-dağıtmaq, yalquzaq canavar sayağında cumub parçalamaq istəyirdin!

– İndi daha sənə elə bir kobudluğu qıymıram, Maral xanım!

– Qıy, Çaqqal, qıy! Mən sənə hər necə istəsən, elə də ixtiyar verirəm!

– Hər necə ixtiyar versəniz də, mənim dişlərim daha Maral xanımın göbəyindən qan çıxarmaq istəmir!

– Az-maz qan çıxar, Çaqqal!

– Qorxuram qızışam, çox qan çıxaram!

– Çıxar!.. Mənim qanım da, canım da sənə halaldır, Maral?! Mən tamamən sənin sərəncamındayam!

– Məni tez-tez Allah dərgahından çıxarma, Maral! Hər dəfə Maral xanımın iltifatından doğub gələn səadət sədaların eşidəndə mən öz əllərimi dərgah qapısına qaldırmalıyam! Abidləşmək, lap peyğəmbərləşmək istəyirəm!

– Bəyəm peyğəmbər olan kəs məcnuni-eşqdən məhrum olur?

– Yəni deyirəm ki, o qədər ki, Maral xanımdan lütf görürəm, səadətə qovuşub ilahiyyat aləminə varıram... Cismən yerdən üzülüb, ruhən ərş-əlada Maral xanıma qovuşuram!

– Mənə göy yox, yer gərəkdir, Çaqqal!

– Hansı yer, necə yer, Maral xanım?

– Bax, bu daş mağara, Çaqqal!

– Bəs niyə belə, Maral?

– Nədən ki, odlu-alovlu xanımlar deyərlər ki, ərim ər olsun, kol dibi də evim!

– İlahi, ilahi, – deyə Çaqqal yenə də yağlı dilini işə saldı. – Maral xanım mən binəva taygözün əlinə necə də öz ali fəzilətini təslim edir!

– Çün eşq atəşim şiddət kəsb edir, Çaqqal!

– İlahi, bu şiddətli eşq atəşində məni yax-yandır, öldür!

– Yenə ölmək, dirilmək istəyirsən, Çaqqal?

– Bəli, ölmək, ancaq ölmək istəyirəm!

– Bəs birdən öldün, heç dirilmədin, onda necə?

– Hanı o səadət, ilahi? Hanı, ilahi, eşqin elə bir iti qılıncı ki, göydən boynuma düşə, məni belə bir əbədi eşqin intəhasız səadətinə qovuşdura!

– Tezcənə şairləşib mütəfəkkirləşmə, Çaqqal!

– Bəs nə edim, Maral?

– Göbəyimi yalaya-yalaya, az-az da dişlə!

– Göbəyini yalaya bilmərəm, dişləməyə gəlincə, qıymaram!

– Az-maz dişlə, Çaqqal!

– İsti qan tökülər, Maral!

– Qoy isti qan tökülsün, Çaqqal! Tökülsün, belə bir göbəyin qanı ki, sahibini dəli-divanə edir. Qoy tökülsün belə müşk-ənbərin qanı ki, gözlərimi tutub örtür!

– Bəlkə, Maral xanım eşqin yolunda etdiyi hərəkətlərindən peşman olur?

– Deyə bilmərəm! Özüm də özümdən heç baş tapmaram!

– Əlbəttə, sənin iltifat göstərdiyin Çaqqal, Göy göl diyarının Güzgü göl gözəlinə layiq deyildir!

– Bilmirəm nə üçün sən mənim ürəyimi belə ovladın, Çaqqal! Mən sənə belə bənd olmağa başladım?

– Sədaqətimlə, eşqimin, məhəbbətimin əbədi alovları ilə, Maral xanım!

– Bu eşqin sirrindən özüm də baş aça bilmirəm.

– Nə vaxtı Maral xanım bu eşq macərasından peşman olsa, öz qulunu qapısından qova bilər!

– Onda bəs Maral xanımın bu alovlanan müşkünü kim yalayar?

– İstəsən Qəcələ cənabları az-az dimdiklər!

– Qəcələ acıdildir!.. Qəcələ zəhərdildir... Qəcələ xəbərçidir!.. Qəcələ heyvərədir! Nəhayət, Qəcələ qanadlıdır!

– Bəli, Qəcələ bizim hər ikimizin qəddar düşmənidir!

– Sən Qəcələdən qorxursanmı, Çaqqal?

– Qəcələ çox amansızdır! Özü də neçə müddətdir acdır... Bir az əvvəl duydum ki, uçdu. Bilirəm ki, Qara gölə, ya Zəli gölə qurd-quş axtarmağa getdi!

– Onda bəs niyə qorxu içində belə sıxılıb xısın-xısın danışırıq, Çaqqal?

– Düşmənimiz çox bic və hiyləgərdir, Maral! Əgər Qəcələ bir qanadı ilə orada, Qara göldə, ya Zəli göldə isə, istəsə o biri qanadı ilə burada, bizim mağarada ola bilər!

– Bir qanadı ilə burada olsa, bu xısın-xısın danışığımızı eşitsə, onda Qəcələ sənə nə edər?

– Onda mütləq mənim sol gözümü də çıxarar.

– Yəni amansız Qəcələ səni tamam-kamal kor qoya da bilər?

– Bəs onda biz bu Qəcələnin əlindən nə edək?

– Gərək hər cürə olsa, Qəcələnin gözlərindən yayınıb uzaqlaşaq!

– Haraya?

– Uzaqlara!

– Uzaqlara gedə bilərəmmi?

– Niyə gedə bilmirsən?

– Bəs mənim Güzgü gölüm?

– Oralarda da göl taparıq!

– Mən bu Güzgü gölü heç bir yanda tapmaram.

– Güzgünün özünü taparıq.

– Güzgünün özü də Güzgü gölün yerini verə bilməz!

– Demək, Maral xanım Güzgü gölsüz dura bilməz?

– Heç bircə gün də olsa, yox!

– Niyə bəs belə, Maral xanım?

– Maral xanım adətincə, öz gözəlliyinə Güzgü göldə doyunca, bəsdi deyincə tamaşa etməsə yaşaya bilməz!

– Oralarda da göl taparıq, özün-özünə tamaşa edərsən.

– Mən bütün dünyanın heç bir yerində belə bir Güzgü göl tapa bilmərəm.

– Demək, Maral xanım bu Güzgü gölə cismən və ruhən bitişibdir?

– Bəli, beləcə ayrılmaz surətdə bitişibdir!

– Bə sənin sevimli Çaqqalın necə?

– O da cismən və ruhən Maral xanıma bitişibdir!

– İlahi, ilahi, gör necə də xoşbəxtəm!..

– Yenə tezcənə həmin-həmin abid olma, Çaqqal!.. Yala, mənim hər yerimi. İlahi, ilahi, bu ümman etibara min-min şükür!

– Ümman etibardan da artıq məni burulğanlara salan insafsız ehtirasa!

– Belə ehtiras alovuna min-min şükür, ilahi!..

Maral xanımın qızışdığını görən Çaqqal mətləbinə yaxınlaşmaq məqsədi ilə sözü döndərib dedi:

– Hər nə olur olsun, ancaq mən Maral xanımı bir qəribə yerə aparmaq istərdim!

– Haraya belə?

– Bir xəsilliyə!..

– Xəsillik nədir?

– Gözəllik xəzinəsi!

– Yəni istədiyin qədər gözəllik götür, eləmi?

– Belə, Maral xanım!

– Lap Maral göldən də çox?

– Bəli, Maral-göldən də çox, Maral xanım!

– Göy göldən də artıq?

– Bəli, Maral xanım, Göy göldən də artıq!

– Bu gözəllik xəzinəsi belə haradadır, Çaqqal?

– Harada olduğunu bir tək mən özüm bilirəm!

– Uzaqdır, ya yaxın?

– Bir qədər uzaqdır, Maral xanım!

– Elə bir uzaq yola düşsək yorulmarıq ki, Çaqqal?

– Bir az yorularsan, Maral xanım!

– Sonra bəs necə?

– Sonra Maral göldə çimərsən, yorğunluğun çıxar!

– Onda elə bu dəfə daha yaxın Göy göldə çimərəm!

– Olsun, Göy göl!

– Sonra da Güzgü gölə baxaram, görüm sənin o tərif etdiyin gözəllik xəzinəsindən nə qədər gözəllik götürmüşəm?!

Ənbərini yalada-yalada xoşhallanan Maral xanım üçün gözəllik xəzinəsi deyilən xəsilə baş vurmaq, həmin xəsillikdən də gözəllik götürmək, dönənbaşı Göy göldə çimib yol yorğunluğunu çıxarmaq, buradan çıxıb Güzgü gölün sahilinə gəlmək, xəsillikdən vücuduna, qanına, canına nə qədər, nə dərəcədə gözəllik hopduğuna tamaşa etmək gərəkdi!

Çaqqal öz tülkü dili və məkrlə Maral xanımı bişirəndən sonra, Qəcələnin gözündən özünü də, Maral xanımı da yayındırıb, aşağıya, axar-baxara, gözəllik xəzinəsinə doğru aparmağı qəti olaraq qərara aldı.

Taygöz Çaqqal məşuqəsi Maral xanımı gözəllik xəzinəsi xəsilliyə çəkib aparanda bilirdi nə edir!.. Çünki Çaqqal hələ neçə-neçə il bundan əvvəl bu axar-baxarı gəzib dolanmışdı, bilirdi ki, burada ümumən ox atan, tələ qurub ov tutan ovçuların oylağıdır! Burada gözündən tük yayınmayan, ov ovlayan, quş quşlayan ovçular var! Bunlar ara-ara, ovları diri-diri tələyə salır, dəstgir edirlər. Yəni Çaqqal qabaqcadan bilirdi ki, bu Maral xanımı tovlaşdırıb aşağılara endirmək, gözəllik xəzinəsi adlandırdığı xəsisliyə aparmaq nə deməkdir!.. Çaqqal üçün Maral xanımı Qəcələnin gözündən yayındırıb uzaqlaşdırmaq, məşuqə xanımı tez-tez duyuq salan Qəcələdən kənarlaşdırmaq, Göy gölü, vələsləri, dağ-daşı belə öz xəbərləri ilə dolduran bir xəbərçidən yayındırmaq çox zəruridir. Bu axar-baxarlı meşə talası dairələrdə qatışbulaşdı, get-gəldi, heç kəs heç kəsin ərizəsini oxumur. İşdir, Qəcələ duyuq düşüb bunların dalınca gəlsə, güman ki, bunları çox çətin tapsın, bu yerdə tələyə salınan Maral xanıma əhəmiyyətli bir kömək göstərə bilsin. Bəs belə olan halda taygöz üçün bu axar-baxarlı yer, gözəllik xəzinəsi xəsillik təhlükəli deyildimi?.. Əlbəttə, bu yerlər Çaqqalın özü üçün də təhlükəli idi. Ancaq bu təhlükəli dairədə girəvəsinə salıb Maral xanımı daha da artıq qorxutmaq, göz açmağa macal vermədən tovlaya-tovlaya başını piyləmək olar. Qəcələ bu Güzgü göl səmti, Göy göl diyarında Çaqqala aman-iman verməz, necə deyər ona bütün bir göz deyil, yarıca bir göz qoysa da, iynə ulduzunca işıq verməzdi! Qəcələ öz dimdiyi ilə onu başına döyə-döyə gəbərdərdi. Qəcələ getdikcə Çaqqal üçün quşların yırtıcısı və tacdarı olan qartaldan da qat-qat qorxulu görünməyə başlayırdı. Çünki Qəcələ bu Çaqqala öz zərbdəstini göstərmişdi. Bir də Qəcələ Çaqqalın girəvəsini əlinə keçirincə, onu çox yamanca bir divana çəkəcəyi də sarı-sısqa üçün aydın idi! Bəlkə də, belə bir divan davam edəcəkdi:

" – De görüm, sən Çaqqal, dar ayaqda mən Qəcələnin çıqqasına and içdinmi?"

" – Bəli, and içmişəm!"

" – Bəs onda niyə sən heyvərə öz andını tülkücəsinə pozub Marala xəyanət edirsən?"

" – Düzü, cənab Qəcələ, mən Çaqqal hər necə boyun qaçırıramsa, yenə də Maral xanımın öhdəsindən gələ bilmirəm".

" – Niyə?

“ – Belə ki, Maral xanım mən Çaqqalı çox nagüvara işlərə məcbur edir!”

“ – Maral xanım səni nagüvara işlərə necə məcbur edə bilər?”

“ – Deyir ki, hey məni qıdıqla!”

“ – Necə yəni hey məni qıdıqla?”

“ – Yəni eyib də olmasın, Maral xanım mən Çaqqalı hey məcbur edir ki, göbəyimi yala!”

“ – Daha Maral xanım sən Çaqqalı niyə və nəyə məcbur edir?”

“ – Dinləməyə!”

“ – Necə dişləməyə?”

“ – Bərk-bərk dişləməyə! Deyir ki, sən Çaqqal bərk-bərk dişlə göbəyimi!”

“ – Yəni deyir ki, gödənimi də çıxart?”

“ – Az qala belə də buyurur, cənab Qəcələ!”

“ – Deyir, axı “Çaqqal var gödən çıxarır, ancaq qurdun adı bədnam olur!”

“ – Yox, mən Çaqqal o gündən bu günə cıqqasına qəsəm qıldığım Qəcələnin qarşısında öz andımı pozmamışam!”

“ – Əgər sən Çaqqal mən Qəcələyə öz tək bəbəyinin ortasına qədər yalan deyirsənsə?”

“ – Nədən bilirsən ki, mən Çaqqal sənin kimi bir cənaba yalan deyirəm?”

“ – Gecənin zülmətində daş mağarada sən Çaqqal tovladığın, qəsidələrinlə qanına susadığın Maral xanımı xoşhallandırmısanmı?”

“ – Daha mən Çaqqal biçarə o alovlanan Maral xanımın öhdəsindən gələ bilmədiyim zaman nə edə bilərdim?”

“ – Demək, sən Çaqqal mənə olan andını pozmusan?.. Demək, sən Çaqqal mən Qəcələnin cıqqasını, ya şah tacını götürüb ayaqlar altına atmısan?” – deyə Qəcələ belə hüquq dili ilə apardığı əzmli, aydın istintaqdan sonra, düz birbaşa qartal zəhmilə Çaqqalın kəlləsinə qonub onu gicəlləndirər, döyə-döyə aparıb bir uçurumdan uçurub dərin bir dərənin dibinə tullar, leşini hazır cəmdək gözləyən qarğa-quzğuna qismət edərdi. Özü isə keflə, damaqla havada qartalsayağı süzər, Kəpəzdən Murovdağa, Murovdağdan da Qoşqara şığıyardı.

Yox, Çaqqal üçün girəvəni Qəcələyə vermək, ölüb-itib getmək gərək deyildi! Çaqqal üçün zirək olmaq, olmazın tərif və qəsidələrlə başını piylədiyi, qılça-paçasına yol aldığı Maral xanımı başlı-bütünlü

gəmirmək gərək idi!.. Özü də bəs harada? Güzgü göl üstündəmi? Göy göl diyarının qalın meşəsindəmi? Yoxsa, xeyli aşağılarda, axar-baxarlı bir yerdə, xəsillikdəmi? Əlbəttə, aşağılarda, gözəllik xəzinəsi xəsillikdə! Elə oradan da Çaqqal üçün daha aşağılara düşmək, aranlara enmək, Kür və ya Araz çayının qalın-qalın qamışlıqlarında çaqqallara qarışmaq özünə bərabər bir quru çaqqalla sevişmək, birləşmək, özü kimi çaqqal nəslini artırmaq olardı. Elə orada da Tülküyə deyə bilərdi ki, ay dayı, mən hara düşmüşdüm!.. Necə sənin tülkü dilin mən Çaqqala kömək etdi!.. Necə Qəcələ mənim sağ gözümü çıxartdı, sənin dilini işə salıb sol gözümü bəladan qurtardım, necə ay dayı, mən sənin dilinlə Maral xanımı tovlaşdırdım, necə göbəyinə yol alıb gödənini çıxartdım, xanımın aşını bişirdim... Onda şübhəsiz, tülkü dayısı da Çaqqal bacıoğlusunun hünərini bəyənər, yan-yörədə olan tülküləri də, çaqqalları da toplayıb deyər ki, baxın, mənim təlimatımdan düstur alan bu hünərməndə! Görün, bacıoğlum Çaqqal Göy göl diyarında necə bir dastan açıbdır!..

Belə dəyiş-düyüşlü fikrə gedib, özünü zora salan Çaqqal əlini qaldırıb gicişən başını qaşıdı, Güzgü göl qarşısında dayanan, yorulmadan öz surətinə tamaşa edən, özündə yüzdən də artıq gözəllik nişanəsi tapan, gözəllik xəzinəsi xəsislik aləminə gedib daha artıq gözəlləşmək həvəsində olan Maral xanım soruşdu:

– Nə fikirdəsən, Çaqqal?

– Necə bəyəm, Maral xanım?

– Bayaqdan görürəm nəyi isə özlüyündə ölçüb-biçirsən?

– Maral xanım, deyiblər ki, yüz ölç, bir biç!

– Bəli, mən də eşitmişəm belə bir məsəli!

– Mən də elə bu müdrik məsələ əməl etmək istəyirəm! İstəyirəm ki, buradan gözəllik xəzinəsi xəsilliyə gedəcək yolumuzu dürüstləşdirim!

– Yəni bu yol belə qorxuludur?

– Ehtiyat igidin yaraşığıdır.

– Bəli, igid Çaqqal, belə bir məsəli də eşitmişəm!

– Buna görə də mən bütün yolu, bəndərgahları nəzərə almaq istəyirəm!

– Əgər, əzizim Çaqqal, o yol belə qorxulusa, onda gəl elə buradaca Güzgü göldə qalaq, axşamları mağaramıza dönüb, gecəmizi keflə keçirək, daha heç bir axar-baxara gedib özümüzü iti-iti qələmələrə pərçim etməyək!

– Bəs bizim Maral xanım özü üçün yenə də gözəllik götürməsin?

– Deyirsən ki, Çaqqal, yəni o axar-baxarda olan xəsillik eləcə bir olmazın gözəllik xəzinəsidir?

– Bəli, Maral xanım, mən deyən xəsillik də "ab-həyat" kimidir! Əbədi olan dirilik suyu! Maral xanım o xəsillikdə doyunca gəzib dolansa, bacardıqca çox görüb-götürsə, heç bir yanda misli-bərabəri olmayan dünya gözəllərinin gözü olacaqdır!

– Necə edək ki, Çaqqal, sonra da dönüb səninlə birlikdə dirilik suyuna gedə bilək?

– Gözəllik xəzinəsi xəsillikdən sonra dirilik suyuna getməyin də yolunu öyrənərik.

– Həm dirilik suyuna getməyin, həm də buraya, bizim Güzgü gölə rəvanca qayıtmağın kəsəcə yolunu, Çaqqal!..

– Bəli, – deyə Çaqqal məmnuniyyətlə xanıma can-başla xidmət etməyə hazır olduğunu bildirdi. – Görünür, sizin nəzərinizdə Güzgü göl əfsanəvi bir güzgüdür! Deyirəm daha dünyada hansı güzgü Maral xanım buyuran sayaqda, onun surətini Güzgü göldə olan kimi, öz əla dərəcəsilə göstərə bilər!

– Düzü, dünyanın heç bir güzgüsü məni beləcə olduğum sayaqda yaraşıqlı göstərə bilməz! – deyə Maral xanım Çaqqalın uydurmalarına inanır, hətta onu gözəllik xəzinəsi xəsilliyə yollanmaq üçün tələsdirməyə də başlayırdı.

– Tez gedək, canım-gözüm Çaqqal! Yoxsa, gözəllik xəzinəsi xəsillikdən hər nə varsa tezcə gəlib götürərlər, daha mənə heççə bir zad qoymazlar qala!

Bəs bu zaman Qəcələ harada qalmışdı?

Qəribə bu idi ki, Qəcələ yox idi. O neçə vaxtdan bəriyə ac qaldığından Qara göl və Zəli göl tərəfə uçub getmişdi... Orada öz qarnını doydurmağa, taqətdən düşən qanadlarını da qüvvətləndirməyə başlamışdı.

Çaqqal fikir edib kəsdirmişdi ki, indi fürsətdir, heç vaxt bu fürsəti fövtə verməк olmaz! Özü də bir halda ki, Maral xanım gözəllik xəzinəsi xəsillik üçün sinov gedir. Daha necə dayanmaq, necə tay gözünü döyə-döyə durmaq olar?! Cəld tərpənib çox tezcə Maral xanımı Güzgü göldən qoparmaq, Qəcələnin nəzarət altında saxladığı dairədən uzaqlaşdırmaq gərəkdir.

– Deyirsən ki, çıxıb gedək buradan, Maral xanım?

– Gözəllik xəzinəsi xəsilliyə tezcə varıb gedək, Çaqqal! Sən də, əzizim Çaqqal, az-maz özünü düzəltsən, Maral xanıma yaraşsan, heç də bəd olmaz!

– Bəlkə, mən Maral xanımın gözlərinə eybəcər görünürəm?

– Gözümə hər necə və nə təhər görünsən də biryolluq ürəyimə girmisən!

– İlahi!

– İbadət vaxtı deyil, Çaqqal... Yoxsa, o zəhərdil Qəcələ gəlib çıxsa qanımızı qaraldacaqdır! Hələ, bəlkə, tamam-kamal binəva Çaqqalı kor qoyacaqdır! Onda bəs kim Maral xanımı əzəlcə gözəllik xəzinəsinə, sonra da "ab-həyat" çeşməsinə aparacaqdır?

– Bütün dullar vəfadar olmurlar!

– Mən vəfadaram, Çaqqal! Gedək, tələsək, – deyə Maral xanım bir də Güzgü gölə baxdı və döndü: – Haradan gedək, Çaqqal?

– Düz dalımca gəl!

Maral xanım boynu qumrovlu əl quzusuna dönüb, Çaqqalın ardınca addımladı... Çaqqal isə Maral xanımı dağdan keçirib, daşdan aşırdı, dərələrdən-təpələrdən adlatdı, gətirib qayalı təpəyə çıxardı.

– Yorulmadın, Maral xanım?.. Ayaqların ağrımadı, əzizim?

– Yamanca yoruldum, ayaqlarım yamanca ağrayır, Çaqqal!

– Onda bir az yat dincəl, Maral! Bəlkə, bir az aşağıda, göbəyin səmtində yatım, Maral?

– Yox, indi əsla olmaz, Çaqqal! Çünki yamanca yorulmuşam!..

– Demək, Maral xanım dincəlmək istəyir?

– Səninlə, döş-döşə, nəfəs-nəfəsə dincəlmək istəyirəm, Çaqqal! Bəs gözəllik xəzinəsi xəsilliyə hasan?..

– Sabah sübh tezdən çatarıq.

Çaqqal tülkü ehtiyatı ilə aşağı düşdü. Pöhrədən-pöhrəyə keçdi, talalardan ötdü, nəzərdə tutduğu xəsilliyə Ay işığına yetişdi. Baxanda ağ-ağnar göydən gümüş səpələnir, xəsillikdə gümüş-gümüş şeh tuturdu. Baxdıqca bu xəsillik Göy gölün ayrılmaz bir hissəsi kimi gömgöy görünürdü. Orada göy ipəyə bürünən Göy göl ləpələnir, onun geyindiyi göy, ipək libası öz zərifliyi ilə öz əynində qıvrıla-açıla, işıldaya-işıldaya bərq verir, Ayın gümüş nuru içində bəzən də gümüşü rəng alır... Çaqqal yorğun düşüb yatan Maral xanımın gözü ilə gözəllik xəzinəsi xəsilliyə baxdıqca baxır, Maral xanımın xoşuna gələcəyinə, onun huşu başından çıxacağına şübhə etmirdi... Axı, hesaba görə

gözəllik hərisi olan, öz gözəlliyindən böyük zövq alan, öz gözəlliyini bu dünyada hər nə göz qamaşdıran ləl-cavahirat varsa, hamısından qiymətli sayan Maral xanım istədiyi qədər buradan yenə də gözəllik götürə bilər... Şübhəsiz, bu yaşıl dərya Maral xanımın ürəyinə yamanca yatacaqdır. Buradan Güzgü gölə dönüncə necə öz gözəlliyinin üstünə yenə də gözəllik gətirdiyini görəcəkdi! Amma Çaqqal heç də Maral xanımı bura gətirməmişdi ki, gözəllik götürüb, Güzgü gölə qayıtsın, hey özünə baxsın. Çaqqal da hey çənəsi çıxa-çıxa onu əşar dili ilə bəzək-düzəkli sözlərlə tərifləsin, sonra da göbəyini yalıya-yalıya xoşhallandırsın, bu xanımına hey nökərçilik eləsin. Bic Qəcələ də birdən qırğılaşıb onun sol gözünü də çıxartsın, hansı uçurumdansa uçursun, qurd-quşa qismət eləsin!

Çaqqal asta-asta gəzdi dolandı, nəhayət, xəsilliyin ortasında, nəzərdə tutduğu yerdəcə, torpağın ortasına vurulan möhkəmcə bir tələnin qurulduğunu gördü...

"İndi dünya gözəli, Güzgü gölün Maral xanımı öz əlimdə, öz ixtiyarımda, öz sərəncamımdadır. İndi onu xoşhallandıra-xoşhallandıra buraya gətirmək, göbəyini yalamadan, birdən-birə və birbaşa dartıb dağıtmaq gərəkdi! Yoxsa, gec olacaqdır, yoxsa özüm quyuya düşəcəyəm. Qəcələnin cıqqası mənə qənim olacaqdır". Çaqqal sağ əlini qaldırıb seyrək bığlarını eşim-eşim eşdi, dayanmadan dönüb üzüyuxarı qayıtdı... Qulaq verdi... Maral xanımı həmincə pöhrəli təpənin üstü yastanada yatılı gördü. O, canavarlaşmaq istəsə də, hələlik tülkülüyünə qayıtdı. Yavaş-yavaş Maral xanımın əl-ayağını yaladı, sonra titrək dilini Maral xanımın göbəyinə uzatdı. Maral xanım gözəllərə xas sərbəstliklə gərnəşdi.

– Sənsən?

– Bəli, mənəm.

– Gözəllik xəzinəsi xəsilliyi tapdınmı?

– Tapdım, Maral xanım!

– Haçan gedirik?

– Elə bir azdan! – deyə o, Maral xanımı xoşhallandırıb, sərxoş etmək üçün müşkünü yaladı... Maral xanım da yalana-yalana xoşhallandı, birdəncə yuxuya getdi. Çaqqal istədi buradaca yorğun düşən Maral xanımın işini bitirsin. Ancaq yenə də yalquzaqlaşmaqdan döndü, məqamına qədər tülküləşməyi vacib bildi. – Qoy bu Maral xanım çıxılmaz tələdə öz nazlı canını mən canavara təslim etsin! – deyə xəbisliklə ürəyindən keçirdi. Hələ bir qədər də özünün tülkü

sifəti ilə irişdi. – Yoxsa, Maral dik atılıb qalxar, hər necə yaralı olsa da, əlimdən qurtulub qaçar!"

Bunlar burada olsun, görək Qəcələ haradadır?.. O, hələ gün-günorta yerinə gəlməmişdən Qara göldən qarnını doydurub qanadlarına qüvvət qaytarandan sonra uçmağa başlamışdı, Güzgü gölün dörd dövrəsinə dolanmışdı. Qanad açıb bütünlüklə Göy göl ətrafını araq-varaq axtarmışdı. Qəcələ xınalı qayalara qalxmışdı. Qızıl qum təpəciklərinə qonmuşdu, o taylı-bu taylı talalara göz gəzdirmişdi. Maral gölü də gözdən keçirmişdi. Özünə güc verib Kəpəzin kəlləsinə də qalxmışdı. Heç yanda Maraldan bir iz görməmiş, bir nişana tapmamışdı. Qəcələ yenə də geriyə qayıdıb dönə-dönə Güzgü gölə baş çəkmişdi. Güzgü göl Maralı hanı? Güzgü göldən səda çıxmamışdı. Ancaq onun gözlərində kədərli gilələr görünmüşdü. Yoxdu, Maral xanım xeyli zamandı, yoxdu! Qəcələ bilirdi ki, Maral xanım hər haraya getsə tezcə də dönüb buraya gələcək, öz gününün çoxusunu bu Güzgü göldə keçirəcəkdir!

Nə Maral xanım var idi, nə də Qəcələnin cıqqasına and içən taygöz Çaqqal!.. Deməк, nə isə vardır, nə isə olubdur, Çaqqal tülkülüklə Maral xanımı tovlayıbdır. Bəlkə, canavarlığını, yalquzaqlığını da işə salıbdır!..

Yer-göy Qəcələnin başına daraldı. O, Çaqqalın bu Qəcələ kimi bic başını aldatmağına nə demək olardı? Qəzəblənən Qəcələ istədi ki, özünü götürüb daşa çırpsın. O, Çaqqal kimi hiyləgər düşməni sağ, Maral xanım kimi gözəli dəstigir qoymaq istəmədi. Qəcələ yenə qanadlandı, yenə gəzib-dolandı, bütün əhvalatı olduğu kimi gördü. Gördü ki, Çaqqal Maral xanımı dümsükləyib güclə oyadır. Maral xanım da güclə gözlərini ova-ova, həm də gərnəşə-gərnəşə durur.

– Yəni deyirsən durub gözəllik xəzinəsi xəsilliyə gedək, Çaqqal?

– Gərək sübhdən, gün çırtaçırtda özümüzü çatdıraq, Maral!

– Bir az-maz geciksək olmaz?

– Niyə gecikmək? Nə üçün gecikmək, Maral xanım?

– Düzü, yorğunluğum canımdan çıxmır. Düzü, sümüklərim sınır... Özü də çox ağır bir qəramət məni basır?!

– Gözəllik götürmək dəmində tərəddüd göstərib tənbəllik etməyin, Maral xanım!

– Əlbəttə, gəlmişkən gedirik, tezcə də özümüzü Güzgü gölə çatdırarıq!

– Di onda tez tərpən, xanım! Di onda tez qalx, Maral! Yoxsa, gün qalxıb yağlananda amansız bir ovçu oxuna rast gələ bilərik!

Maral xanım ağır-ağır ayağa qalxdı, sümükləri sınır sayağında ağır-ağır gərnəşdi. Güzgü göldə özünə baxan kimi baxmaq istədi... Axı, Maral xanım mağaradan çıxar-çıxmaz Güzgü göl sahilinə gəlib öz surətinə baxar, həm də ürəyini oxuyar, nəşəlimi, kədərlimi olduğunu da görərdi. Beləliklə, onun gündüz işi başlardı.

Sözü çərlətmək istəməyən Çaqqal cəld dönüb qabağa düşdü, Maral xanım da onun ardınca addımladı. Onlar pöhrəliklə sinə aşağı endilər. Özünü buraya çatdıran, görünməzin sehri ilə gizlənən, son söhbəti öz qulaqları ilə eşidən Qəcələ bunların ardınca düşdü. Qəcələnin qanadları qəzəbindən titrəyirdi. Elə indicə, bu an Çaqqalın sol gözünü də çıxarmaq istəyirdi. Ancaq Qəcələ bilirdi ki, Maral xanım küsəcəkdir, heç şübhəsiz, bu Çaqqal üçün qaralıb yas da saxlayacaqdır. Bəlkə küskünləşib bədbinləşəcək, heç məftunu olduğu Güzgü gölə də dönməyəcəkdir... Güzgü göl bu Maral xanımsız daha nədir?! Maralsız qalan Güzgü göl öz gözündən quruya bilməzdimi? Göy göl diyarının tərtəmiz güzgüsünü toz-torpaq basmazdımı? Bu diyara alışan Maral xanımın Güzgü gölə necə vurulduğunu görən acıdil Qəcələdə nə isə bu mənzərəyə, bu aləmə qarşı olmazın bir hüsn-rəğbət oyanmışdı. Qəcələnin xəbərçiliyini heç də ayrı bir iş üçün deyildi. O, Güzgü gölü Maralsız qoymaq istəmirdi. Qəcələ belə bir gözəli Çaqqala qismət edə bilməzdi...

Maral xanım təhlükə idi! Xanım təhlükəyə düşməsə, tülküləşən Çaqqalın necə yalquzlaşıb-canavarlaşdığını öz iriləşən gözləri ilə görməsə, əqli başına gəlməyəcəkdi. Maral xanım məddahı Çaqqaldan dönməyəcəkdi!.. Yox, öz məqamına qədər gözləmək gərək idi.

Çaqqal qabaqda, Maral xanım dalda xəsilliyə doğru sallanırdılar. Göy gölə bənzər göy xəsillik yenicə çırtan günəşin qızıl şüaları altında parlayırdı. Xəsilliyi tutan, bürüyən şeh zər-zəbərçat dənələrinə dönürdü. Baxınca Maralın hər iki gözü birdən qamaşırdı.

– Hə, necədir, Maral xanım?

– Tamam gözəllik dəryasıdır, Çaqqal!

– Di gəl dalımca! – deyə Çaqqal şehliyin içi ilə adda-budda iz qoya-qoya yeridi. Gah xəsillə gözəlliyə baxan, gah da xəsillikdən gözəllik götürüb gözləri göydə gəzən Maral xanım birdən xəsilliyin ortasında büdrəyib ilişdi, tələyə düşüb yıxıldı.

– Buradayam, Maral xanım! – deyə məqamı çatınca tülkülükdən də çıxıb canavarlaşan Çaqqal Maral xanımın zəhri-bağrını yara-yara onun üstünə cumdu, cəld iti dişlərini işə saldı.

– Parçalama məni, Çaqqal... Parçalama məni, canavar!..

– Sənin nazını çəkdiyim daha bəsdir! – deyə ağ-aşkara canavarlaşan Çaqqal öz qanlı başını qaldırınca bu dəfə qırğılaşmaqdan da artıq qartallaşan Qəcələ öz caynaqlarını Çaqqalın kəlləsinə ilişdirdi, bircə göz qırpımında onun salamat qoyduğu sol gözünü də çıxardı və Maralın qorxudan bərələn gözlərinin qabağına atdı... Çaqqal vaqqıldaya-vaqqıldaya tülkü dayısı kimi vaysınıb, qulaqları kəsilən körpə küçük kimi zingildəyə-zingildəyə, geri-geri sürünüb, şehli xəsilin içi ilə əyri-üyrü iz aça-aça pöhrəliyə girdi, böyürtkən kolunun iti-iti tikanlarına ilişib çapalaya-çapalaya qaldı...

Qəcələ fürsəti fövtə vermədi. Maral xanım düşən tələni dimdiyi ilə söküb dağıtdı, ağac-dəmiri bir-birinə bənd edən yay-girişləri, quru bağırsaqları da didim-didim didib hər qırığını bir qırağa tulladı. Maral xanımın əl-ayağı açıldı, yaralı xanım, yaraları isti itən ağrını-acını duymadan durdu, üzüyuxarı qaçdı...

Qəcələ qanad açdı, Çaqqalın izi üstünə süzdü, yenicə böyürtkən tikanlarından öz ilişiyini açan Çaqqalın kəlləsinə həmincə qəzəblə qondu, cinayətkarı qartal dimdiyi ilə döydü-döydü, döyə-döyə də gətirib bir uçurumun başından üzüaşağı buraxdı. Qəcələ yenə də qartalsayağı qanad açdı. Göy göl diyarına çatdı. Gördü ki, bəs Maral xanım da yenicə yetişibdir. Yenə də Güzgü gölün qabağında durubdur. Yaralı Maral bu dəfə qorxaq-qorxaq, ürkək-ürkək durubdur... Qorxaq, ürkək duruşlu Maral yenə Güzgü gölə baxır. Baxır ki, necə tariflənib, necə tovlanıbdır... Baxır ki, ürək qızdırdığı, əzizi, iki gözü onun gözəlliyinə necə təcavüz edibdir. Necə yalam-yalam yalatdığı müşk-ənbər ətirli göbəyi pardaqlanıbdır. Baxır ki, onun pardaqlanan göbəyindən necə də damcı-damcı qan dammaqdadır.

Taqətdən düşən Maral xanım Güzgü göldə dizlərinin necə tir-tir titrədiyini görürdü... Hər necə atır olsa da Maral yıxılmadı, yıxılmaq istəmədi. Başını güclə, ağır-ağır qaldıran Maral ancaq Qəcələni axtardı. Onu müqabil tərəfdə Güzgü gölün üstünə əyilən vələsin qanadında gördü. Maral minnətdarlıqla Qəcələyə baxdı, ağladı. Hər iki gözündən gildir-gildir yaş gəldi, damcı-damcı Güzgü gölə töküldü.. Qəcələ də ağladı... Qəcələ ağladı ki, görəsən, Maral bu ağır yaradan sağalacaqdır, ya Güzgü göl maralsız qalacaqdır?!

*Bakı,1967*

# ARPAÇAY ƏFSANƏSİ

Qədim vaxtlarda Muğanda iki elat olurdu. Elatın birinin qoyun sürüləri ağ, o birininki isə qara idi. Qoyun sürüləri ağ olana "Ağqoyunlu" qoyun sürüləri, qara olana "Qaraqoyunlu" deyirdilər. Hər iki elatın qoyun sürülərindən başqa, yalmanlı at ilxıları, buynuzlu mal-qaraları, əyriboyun dəvələri var idi. Hər iki elat öz sərhədinə çox çətin sığışırdı. Payızda-qışda aranda, yazda-yayda yaylaqda otlaq üstündə həmişə savaş gedirdi. Birdən o tərəf o tərəfdən, bu tərəf də bu tərəfdən öz çuxalarını çıxarıb sol qoluna dolayıb, bəlgə düzəldir, adamlar qızışır, qol-qılça sınır, baş-göz dağılırdı. Gah bu onun, gah da o bunun otlaq sərhədini tuturdu. Arada ədavət artır, düşmənçilik güclənirdi... Canı cəzana gələn hər iki tərəfin başbilən ağsaqqalları bir gün Muğanda arada olan sərhəd təpə üstünə toplaşdılar. Məsləhət-məşvərətdən sonra belə qərara gəldilər ki, daha dava-dalaş olmasın, arada qan qohumluğu başlasın, bir-birinə yapışıqlıq-qonşuluq yaransın. Bu tayfa, o tayfa sözü bilmərrə götürülsün, tayfalar bir-birinə qız versin, qız alsın. Belə də oldu. Daha sərhəd dava-şavası düşmədi, otlaq üstündə heç bir çəkişmə-didişmə getmədi. Elatların oğlan-qızları bir-birinə qarışdı. Oğlan-qız toyunda, el bayramlarında zurnanın cingiltisi, nağaranın gumbultusu, sazın-sözün sədası sümüklərə düşdü. Cavanlar ağ-qara çuxada əl-ələ tutuşub yallı getdilər... Cavanları belə görən bığıburma kişilər, kəlağayılı qadınlar, bunlardan sonra qocalar, qarılar cərgələndilər, barmaq barmağa keçirib yallı getdilər. Babanın birisi o tərəfdən, birisi bu tərəfdən gülə-gülə üz-üzə, göz-gözə baxdılar. Qohumların yallıları bir-birinə qarışdı.

Günlərin bir günü Ağqoyunlu elatının qızı ilə Qaraqoyunlu elatının oğlu Ağgöllə Qaragöl arasında başlanan el şənliyində görüşüb, bir-birini sevməyə, yavaş-yavaş dillənib danışmağa başladılar:

– Qız, adın nədir?

– Bəs sənin adın, oğlan?

– Mənim adım Xançoban!

– Mənim də adım Sara!

– Gəl sevişək, qəşəng qız!

– Buyy, nə tezcənə, Xançoban?!

– Niyə tezcənə? Sən yetkin qız, mən də ərgən oğlan!

– Qoy hələ bir-birimizi yaxşı-yaxşı görək, yaxşı-yaxşı bilək, yaxşı-yaxşı sınayaq.

O gündən Xançoban bir könüldən min könülə Saranı sevdiyi kimi, Sara da Xançobanı sevməyə başladı. Gündən-günə eşq-məhəbbət sevdası özünə aydın yol açdı. Sara Xançobanın tütək səsini alınca, heyran-heyran o səmtə boylandı, cana yayılan, ürəyə işləyən çoban neyinə bənd oldu. Xançobanın ecazkar neyi Saranın iliyinə, sümüyünə işlədi... Elə oldu ki, sübh tezdən bu ney sədasına Sara ulu babasından yadigar qalan sədəfli sazını götürdü, qabarmağa başlayan sinəsinə basdı, öz-özünə saz çalıb söz qoşdu. Xançoban özünün tütəyinə ara verib, Saranın sazına-sözünə qulaq asmağa başladı. Cavanlar bir-biri ilə uzaqdan-uzağa nəğmə dili ilə danışdılar. Qohumlaşan tərəflərdən heç birisi bu sevginin qabağını almaq istəmədi, dedilər qoy Xançobanla Saranın sevgisi Əsli-Kərəm, Leyli-Məcnun, Tahir-Zöhrə sevgisi olsun, heç kəs bu sevginin qabağına çıxmasın, bu arada heç bir müsibət baş verməsin. Qoy ağqoyunlularla qaraqoyunlular daha möhkəm birləşsinlər, qaynayıb-qovuşsunlar. Deyirlər eşqin gözü qızdımı baş alıb gedəcəkdir, sevginin qoruq-qaytağı olmayacaqdır. Doğrudan da, Xançobanla Sara sevgisinin heç bir qoruq-qaytağı olmadı. Hər iki tərəfin ata-anası, baba-nənəsi, qaraqoyunluların və ağqoyunluların adətincə Ağgöllə Qaragöl arasında olan çiçəkli çəməndə el süfrəsi açıb, bu birliyə qol qoydular. Payızına dönən başı Muğanda məhsul bolluğunda hər iki tərəf ellikcə Xançobanla Saranın toyunu edəcəklərinə əhdi-peyman bağladılar. Sevgililər bir-birinə daha möhkəm bağlandılar. Bir-birindən bircə gün də olsa ayrı dura bilmədilər.

Bir gün qoyun sürüsünü yuxarı güneyə verən Xançoban öz neyini dayandırıb, əyin-başını çıxartdı, özünü bu elat tərəfində hesab olunan Qaragölə atdı. Üzdü, üzdü, öz üzgüçülüyünü Saraya sübut etdi. Sanki Xançoban eşq-məhəbbət macərasında üzürdü. Sara öz köynəkli sazına söykənib bu üzgüyə tamaşa etdi. Ta uşaqlığından başlayıb ensiz çaylarda, göllərdə üzüb, üzgüçülük öyrənən Xançoban indi də boylana-boylana Qaragöl dəryasında üzürdü.

Günlərin bir günü ağqoyunluların Ağgöllər güneyinə sürüsünü sürən Xançobanın ney səsini eşidən Sara geyinib-keçindi, özünə tumar verdi, anasının icazəsilə ağ alaçıqdan çıxdı, gedə-gedə gümüş kəməri ilə öz incə belini boğub daha da incələşdirirdi. Xançoban gözü dolusu qızı süzüb sözə başladı:

– Gəldinmi, Sara?
– Düzü, sənsiz dura bilmirəm, Xançoban!
– Mən də sənsiz dayana bilmirəm, Sara!
– Bircə bu toyumuz tezcə olaydı.
– Arana enməyimizə, Muğana çatmağımıza az qalıbdır, Sara!
– Nə qədər qalıbdır, Xançoban?
– Cəmi-cümlətanı iki ay.
– İki ay məndən ötrü iki ildir, Xançoban.
– Məndən də ötrü iki ildir, bəlkə də üç ildir! Elə bil ki, hər günüm bir ildir!
– Elə bu yaylaqda toyumuz ola bilməzmi, Xançoban?
– Böyüklərimiz Muğan düzünə şərtləşiblər, Sara!
– Bəlkə, sən qoyun sürünü qaytarasan Muğana, Xançoban?
– Deyirlər elatla birlikdə!
– Bəlkə, hər iki elat sənin sürünün ardınca arana sallandı?
– Yox, elatın adəti, Muğana qayıtmağın vaxtı-vədəsi vardır.
– Haçan, nə zaman?
– Quyruq doğanda, Sara!
– Quyruq haçan doğacaqdır?
– Gecələri dəvələr üzü arana yatanda!
Dəvələrin dili olsaydı onlara yalvarardıq, üzlərini arana – Muğana döndərərdik!
Bu söhbətdən sonra Xançoban ney çalmağa, Sara da sazını köynəkdən çıxarıb asta-asta dindirməyə başladı. Ara verdilər, aşiq məşuqəsinə, məşuqə də aşiqinə həsrətlə baxdı.
– Mən də bu ağ göldə üzə bilərəm, Xançoban!
– Necə üzərsən, Sara?
– Xançoban Qaragöldə üzən kimi.
– Qərq olmazsanmı, Sara?
– Sənin gözünün qabağında qərq olmaram!
– Mən özümü gölə atıb səni qurtarınca gec olmazmı!
– Gec olarsa, cənazəmi çıxararsan!
– Onda mən öz başımı itirib dəli olaram.
– Mən indicə öz sazımı sənə yadigar verərəm!
– Nəyə görə belə tələsik, Sara?
– Mən olmazsam da bu saz mənim ürəyimi sənə danışar, Xançoban!
– Sən belə bəduğur söz danışma, Sara!

– Həqiqi aşiq-məşuq dastanı həmişə nakam məhəbbətlə başa gəlir.
– Biz isə uzaqda yox, məhəbbətin, eşqin astanasındayıq, Sara!
– Ancaq məhəbbətin, eşqin astanasında, Xançoban!
– Astanada dayanan tək bircə addımla içəriyə də girə bilər!
– Görək bu bir addımlıq astanada tale bizə nə deyir?

Hansı hissinə görəsə, Sara sazını allı-güllü köynəyinə qaytarıb yaşıl qaytanla bağladı.

– Mən bu sazı elə bu an bizim Xançobana yadigar verirəm!
– Demək, Xançoban çobanlıqdan çıxıb aşiqliyə başlamalıdır!
– Qoy mənim sazım sənə əbədi yadigar olsun, Xançoban!
– Nə üçün belə uğursuz danışırsan, Sara?
– Mən ürəyimin gizli çırpıntılarını sənə açıram, Xançoban!

Sara əlini sinəsinə gətirib geyimini tərpədincə, qızın toxunulmaz ağ mərmər sinəsi göründü. Xançobanın ağlı başından oynadı, birdən əlini atıb Saranın sazını götürdü, bağrına basdı. Sara üst paltarını çıxarıb, alt nazik geyimində gümüş kimi ağaran Ağgölə girdi. Xançoban da Saradan sonra soyunub Ağgölə girmək istədi, göldə üzən Sara əlini qaldırıb gülə-gülə "yox, yox!" işarəsini verdi. Xançoban müti olub dayandı. Saraya zəndlə, diqqətlə baxdı. Sara Xançobanın acgöz-acgöz baxdığını görüb alovlandı, hələ də qıraqlarında qar kəməri qalan buzlu gölü vecinə almadan üzdü... Sara əl-qol ata-ata, hərlənə-hərlənə, fırlana-fırlana üzdü, açılıb sökülən qumral hörüklərini Ağgöldə səpələyə-səpələyə üzdü, üzdü. Ətrafdakı çiçəklik içindən göyə qalxan quşlar da ləpələr üstündə qanad çala-çala dünya gözəlinə nəğmə dedi. Xançoban Saranın sazını köynəyindən çıxarıb, quşların cəh-cəhinə uyğun aram-aram sarı simləri dindirdi... Birdən sazı köynəyinə keçirib, xınalı qayaya söykəndi... Yenə də öz tütəyini götürdü, gölün ləpələrini də, ətraf güneyləri də ney səsi ağuşuna aldı. Qoyun sürüsü mələşə-mələşə geriyə qayıtdı. Sara qara qoyun sürüsünə baxınca, onun ala gözləri qaraldı. Bilmədi bulud günün qabağını kəsdi, ya necə oldu?! Tezcə başını buzlu suya vurdu, xeyli görünməz oldu. Xançoban soyunub özünü Ağgölə atmaq istədi, Saranın qəşəng başı Ağgölün ortasından qalxdı, ağ sinəsi o yandan bəriyə bərq vurdu. Sara güldü, güldü, onun gülüşü Ağgölü doldurdu...

Belə-belə Sara gözdən yayınıb tək-tənha göldə üzməyə alışdı. Bir gün uzaq çayda üzüaşağı, üzüyuxarı üzməyə başladı. Səs ağızdan-ağıza düşüb dildən-dilə yayıldı. Saranın üzgüçülüyünə heç bir söz olmadı.

“Qız idim, soltan idim, nişanlandım, xan oldum!” – deyə Sara öz şıltaqlığından – üzməyindən qalmadı. Belə olunca Xançobanın nigarançılığı da, qısqanclığı da artdı. Eyni zamanda onun sevgisi də Arpa çayından güclü olub, aşıb-daşdı. Elə bu zaman yuxarı dağlarda ildırım dalınca ildırım çaxdı, dağların seli selə qarışdı. Arpa çayı həddini aşıb-daşdı, dağlardan güclənə-güclənə gələn sel Saranı alıb qaçdı... Xəbər Xançobana çatdı. O, əlindəki tütəyini Qaragölə atıb, Saranın yadigarı güllü köynək sazı götürdü, özünü Arpaçaya çatdırdı. Gördü ki, Arpaçayının o tay-bu tayı adamla doludu. Hətta qızın xilası üçün özünü selə atan da olub, ancaq nə edəsən ki, sel Saranı alıb qaçıb. indi adamların dilində yalnız bu hüznlə nəğmə səslənməkdədir:

Arpa çayı aşdı, daşdı,
Sel Saranı aldı, qaçdı.
Apardı sellər Saranı,
Bir alagözlü balanı!

Xançoban Saranın sazı əlində səri-sərgərdan gəzdi, dolandı, oxuyanlara qarışmaq istəsə də, bacarmadı. Bilmədi necə eləsin? Saradan əlini üzüb geriyə, Qaragölə dönsünmü? Necə deyərlər, gedənlə getmək, ölənlə ölmək olmaz!

Xançoban dayanmadan Arpaçayı aşağı düşdü, Saranı səslədi. Arpaçaydan “Yoxdur, Sara! Yoxdur!” – əks-səda qayıdınca, Xançoban üzünü sellərə tutdu:

– Bəs axı niyə siz Saranı aparmısınız?
– Biz aparmışıq Saranı, özümüz də heç bir kəsdən gizləmirik!
– Niyə, nə üçün siz sellər belə bir allahsız iş görmüşsünüz?
– Çünki sellər kükrəyəndə özlərinə qız qurbanı istəyirlər!
– Demək, Sara siz sellərə qurban gedibdir?
– Bəli, Sara biz sellərin qurbanı olubdur!
– Onda mən Saranı çayaşağı axtaracağam!
– Harayacan axtaracaqsan, çoban?
– Arpaçayı aşağı Araza qədər!
– Axı nəyə görə?
– Saranı tapmaq, saçlarından da olsa özümdə yadigar saxlamaq üçün!
– Bəs o saz nədir əlində?
– Bu saz Saranın mənə yadigarıdır!
– Bu yadigar ömürlük bəsindir!

Xançoban elə bildi ki, yaxşı üzməyi bacaran Saranı heç zaman boz-bulanıq sellər biryolluq batıra bilməz! Bəlkə, Sara Arpaçayı uzunu üzə-üzə arana enmişdir? Bəlkə, Arpaçay Araza tökülən yerdə Sara atılıb bir qırağa çıxmışdır, Arazın tutac qamışlığında çılpaq üşüyə-üşüyə, dona-dona qalmışdır. Özü də bir dar ayaqda kimi gözləyir? Ata-anadan, qardaş-bacıdan da qabaq Xançobanı! Sara gözləyir ki, Xançoban onun harayına çatacaqdı. Xançobanı birdən görəcəkdi... Görəcəkdir ki, indicə Xançoban necə də özünü ona çatdırdı. Necə də çiynindəki saçaqlı yapıncısını çevirdi, üryan Saranı öz yapıncısına bürüdü, qızı qüvvətli qollarının arasına aldı, onu nəfəsiylə qızdırdı, qolları üstündə Ağgölə çatdırdı, qızı ağ alaçığına apardı. Sara tezcənə alaçıqda öz allı-güllü geyiminə girdi, dönüb Xançobandan yadigar verdiyi sazı soruşdu:

“ – Haradadır saz, Xançoban?

– Sənin yadigarın buradadır, Sara!

– Bəs çoban tütəyin?

– Çoban tütəyini Qaragölə atdım.

– Nə üçün?

– Bu gündən aşıq olmağa, saz çalıb söz qoşmağa başlamağım üçün.

– Ay səni, mənim Xançobanım!

– Necə yəni, Sara?

– Yamanca sınaqdan çıxdın!

– Necə yamanca sınaqdan çıxdım, Sara?

– Heç bir aşiq öz məşuqəsinin cəfalı yolunda mənim Xançobanım kimi sınaqdan çıxmamışdır!

– Çoban həmişə cigərli olur, Sara!

– Mən öz cigərli çobanıma öz ürəyimlə cavab verirəm!”

Xançoban gedə-gedə xəyalat aləminə qapıldı, yenə tezcə özünə qayıtdı, yenə də Arpaçayı aşağı axtara-axtara Araz qırağına sallandı. Saranın sazını qoltuğuna alıb Araz nəhrinin yaxası ilə, üzüaşağı yıxıladura addımladı, hər necə ac-susuz olsa da, öz axtarışından qayıtmadı. Göz qoyub görənlər dedilər, bəs bu necə aşıqdır ki, heç bir kəndəkəsəyə, elə-obaya dönmür? Hey Araz aşağı gedir, gözünü Arazdan çəkmir.

Bəli, Xançoban qoltuğunda güllü-köynəkli saz, əlində çoban çomağı ağ köpüklü dalğalara baxa-baxa, “indicə Sara Arazdan çıxacaqdır” ümidilə Arazın yaxasiylə gedirdi.

Araz geniş vadidən çıxıb dərin dərələrə düşürdü. Birdən də baş-başa gələn uca dağlar, sıldırım qayalar arasından xam at kimi boğulunca kişnəyirdi, görünməzin kişnərti qoparırdı. Bu kişnərtidən gələn səs-səda dağa-daşa düşürdü.

Gedin, deyin Xançobana,
Gəlməsin bu il Muğana!
Muğan batıb nahaq qana.
Apardı sellər Saranı,
Bir ala gözlü balanı!

Külli-aləm bu müsibəti səsi dolusu oxuyur. Saranın selə düşüb getdiyini yanıxa-yanıxa deyirdi... Arpaçayı "qan-qan" deyə qıjıltı qopararaq axınından qalmırdı. Araza qovuşunca oranın özündən belə səda qayıdırdı:

"Gedin, deyin Xançobana,
Gəlməsin bu il Muğana!"

Sarasız Xançoban Muğana gedə bilərdimi? Getsə də Muğanda özünə yer tapa bilərdimi? Xançoban hansı üzlə Saranın ata-anasının, ağqoyunluların, qaraqoyunluların üzlərinə çıxa bilərdi? Yox, nəinki bu ili, gələn ili də Xançoban dönə bilməzdi! Bu, nakam məhəbbətə görə adamların üzünə baxa bilməzdi! Ona deyilməzdimi, Xançoban, sən qumral hörüklü Saraya üzməyi öyrətməsəydin, o da Ağgöldə üzə-üzə üzgüçülüyə alışıb Arpaçaya getməzdi, orada daşqına düşüb batmazdı. Gərək bircə göz qırpımı da olsa, sən Xançoban öz Saranı nəzərindən qoymayaydın.

Düzü, Xançoban istəyirdi ki, Saranı seldən xilas edə bilməsə də, hamının gözü qabağında onunla qoşalıqda axaydı, nə adamlardan, nə dağlardan-daşlardan, nə də Arpaçaydan, nə də gur-gur guruldayan Arazdan belə danlağı eşidəydi:

"Gedin, deyin Xançobana,
Gəlməsin bu il Muğana!"

Nə bu ili, nə də altdakı ili, nə də sonrakı ili Xançoban Sara olmayan Muğana dönəsi deyildi!

Bəli, Xançoban heç zaman Muğana gedəsi, orada qalası, adam olanın üzünə çıxası deyildi! Onun Muğanda heç bir itiyi itməmişdi. Onun Sarası Arpaçayında itmişdi, Araz nəhrinə çağlayıb calanan Arpaçayı Saranı Araza qovuşdurmuşdu! Araz da Saranı götürüb arana aparmışdı. Bəlkə nə Arpaçayı, nə də Araz nəhri Saraya güc gələ bilməmişdi? Sara özü üzə-üzə arana getməkdədir?! Bəlkə də, Araz axınınca üzən Sara Xançobanı harayına çağırır, onu gözləyir ki, Xançoban özünü çatdırsın, güclü axına düşən qızı qurtarsın? Onlar birlikdə Muğana dönsələr, dəvələr ağzı arana yatıb quyruq doğulduğuna görə Ağqoyunlu, Qaraqoyunlu elini də yuxarı yaylaqda deyil, Muğanda görsünlər. Onlar hər iki elatı Muğanda salamlasınlar, onların hər ikisini qohumlaşan, birləşən elat bağrına bassın, olmazın, görünməzin, eşidilməzin möcüzəyə sevinsinlər, özünü Araza atıb Saranı xilas edən əfsanəvi bahadırı – Xançobanı tərifləsinlər, alqışlasınlar! Tütək tütəyə, ney neyə, saz saza, söz sözə qarışsın, iki elatın birləşən toyu təmtəraqla başlasın, yallı dəstələri Xançobanla Saranı araya alsınlar, əvvəlcə onlar ikilikdə, sonra da yallı dəstələrində oynasınlar, gecənin bir aləmində göylərə qaldırılan məşəllərin alovlu işıqlarında onlara təzəcə düzələn toy-alaçığı, içi xalılı-gəbəli, məxmər mütəkkəli, məxmər döşəkli, qanovuz yorğanlı yataq yeri göstərsinlər? Cavanlar öz arzularına, kamlarına çatsınlar. Aylar ötüb, illər dolanınca onların bir-birindən gözəl, qıvrımsaç qızları, qarasaç oğlanları hər iki elata təzə nəfəs gətirsinlər, boy atıb qalxsınlar, yaşa dolan Xançobanla Sara öz eşq-məhəbbətlərinin, iztirab və həyəcanlarının bəhrələrilə sevinsinlər; şadlansınlar!

Yox, bu belə olmayacaqdı, bu ancaq xəyal idi! Olan olmuşdu, Sara Arpaçayının selinə düşüb Araz aşağı axmışdı. Özü də biryolluq axıb getmişdi. Saranı bu axından qurtaran, ona nəfəs verib həyata qaytaran, onun zərif dodaqlarını tərpədib, azacıq da olsa güldürən heç bir qüdrət görünmürdü. Xançobanın varlığında nə vardısa, zərrəciyinə qədər yerli-dibli yoxa çıxmışdı.

Xançoban üçün geriyə dönüb dəvələr üzü arana dönüncə, quyruq doğunca özünü aran adamına qatsın-qatmasın bir idi, onun üçün daha heç nə yox idi. Onun aləmində bir fəlakət vardı, faciə bir idi, Sara yox idi!

Demək, Xançobanın əli bütün dünyada misli-bərabəri olmayan Sarasından, öz eşqindən, məhəbbətindən üzülmüşdür! Bəs o nə üçün Arazdan uzaqlaşmır, Saranı axtarmaqdan qalmır, Muğandan baş götürüb

getmir? O, başqa bir tanınmaz-bilinməz yana çobanlığa olsa belə getmək, həmin yad, uzaq yerlərdə bir tütər, yanağı qara xallı gözələ ürək aça bilməzdimi? Xançobanın aləmində indinin özündə də, sonra da varsa Sara idi, yoxsa da. Saranın ona yadigar qoyub getdiyi güllü köynəkli sazı əlindən buraxmadan, Xançoban yenə də çomağına söykənə-söykənə baş-başa dayanan dağlardan enirdi, Arazın yaxası aşağı öz yoluna davam edirdi. O, tapacaqmış kimi Saranı axtarırdı. Heç olmazsa Arazın dalğalarında onun səpələnən qumral saçlarını görmək, bu saçlarla birlikdə Arazda axmaq istəyirdi... Xançoban qışqırmaq, haray salmaq, cümlə-cahanı köməyə çağırmaq, Saranın cənazəsini buradan çıxarmaq, onu Muğanda, həminsə iki elatı birləşdirən baş bilənlər təpəsində, ağqoyunlularla qaraqoyunluların sərhədində dəfn etmək, türbə ucaltmaq istəyirdi. Həm də bu türbənin yan-yörəsində gül-çiçək əkmək, aşağılardan sənək-sənək su daşımaq, eşqin susan məbədini çəmənzara tutmaq gərək idi! Qoy desinlər, Muğanın Xançobanı Ərəbistan Qeysindən füzun Məcnun olubdur! Qoy hər nə deyirlər desinlər, Xançobana necə ad verirlər versinlər, təki Xançoban öz Sarasının qumral saçlarını Arazın axıb gedən dalğalarında görə bilsin!..

Sonrasını da Xançoban özü bilsin. O bütün dünyaya göstərsin ki, məşhur aşiqlərin cərgəsindədir. Muğanın eli çomaqlı, qoltuğu sədəf sazlı oğlanı eşq-məhəbbət aləmində "Xançoban və Sara" dastanı düzəltsin. Bu dastan hamını heyran eləsin.

Gedin, deyin Xançobana,
Gəlməsin bu il Muğana!
Muğan batıb nahaq qana,
Apardı sellər Saranı,
Bir ala gözlü balanı!

Belə bir xəyal ilə, arzu ilə, ümidlə Xançoban Araz aşağı öz axtarışından qalmırdı. Saranı axtarmaqdan yorulmurdu. O gedə-gedə Arazın hər iki sahilini birləşdirən Xudafərin körpüsünə çatdı. Saranın selə düşüb axdığını eşidən o taylı-bu taylı elatlar Muğanın bu gözəl gəlinini tapmaq, xilas etmək üçün toplanıb gəlmişdilər. Onlar əli çomaqlı, qoltuğu sazlı Xançobanı görüncə onu Xudafərin körpüsünün üstündə araya aldılar, dinməzcə durdular. Bu dinməzliklə də Xançobana başsağlığı vermiş oldular. Xançoban daha dayanmadan "Xudafərin"dən

dönüb çıxdı, yenə də Araz aşağı aran yoluna davam etdi. Hamı gördü ki, Muğanın Xançobanı çobana xas mərdliklə, dəyanətlə, sədaqətlə öz Sarasının axtarışındadır. Onun qumral saçlarından bir nişanə da olsa tapmayınca əl çəkən deyildir.

Xançoban gedib Arazla Kür qovuşana yetişdi. Demək, bu itkidə Kürdə heç bir günah yoxdu! Arazda necə? Arazda da günah yoxdur! Arpaçayındamı? Düzünə gəlincə Arpaçayda da günah yoxdur! Bəs günah nədə, haradadır? Görünür, günah göylərin buludlarında, şimşəklərində, ildırımlarındadır. Bəli, şimşəklər, ildırımlar buludları yandıra-yandıra Arpaçayının başına boşaldır. Bu çayın suyunu aşdırıb-daşdırır, sellər də Sara kimi gözəlləri alıb qaçır. İndi Xançoban necə qanad açsın, dağların başına qalxıb göylərə necə uçsun, buludları, şimşəkləri, ildırımları necə sorğu-suala çəksin? Yox, Xançoban öz Sarasını sularda, dalğalarda axtarmalıdır! Ağırlıq etməsin deyə, o, çomağını Arazla Kürün qovuşuğuna atdı. Ümidini təkcə Saranın yadigar qoyub getdiyi saza bağladı. Obalar, ellərarası gəzə-gəzə Dədə Qorquddan üzü bəriyə gələn ozanlığa qurşandı! Çoban geyimindən çıxıb ozan geyiminə girdi. Arazla Kürün birləşdiyi yerdə, üzü Xəzərə doğru çoban dəyələrində gecələdi, balıqçı komalarında gündüzlədi, ozan oldu, ozan kimi oxudu, saz çalıb söz qoşdu, öz sözlərini "Apardı sellər Saranı, bir ala gözlü balanı" avazıyla qurtardı. Eşidən, görən dedi, bu sinəsi dolu ozan, əslində haqq aşığıdır! Bu ozanın sözləri Kəraminkindən yanıqlıdır, Məcnununkundan dərindir, Tahirinkindən tutarlıdır!

Xançoban Kür körpüsündən o tərəf-bu tərəfə keçdi. Aylar ötdü, illər dolandı, əvvəlcə onun qar kimi ağaran saqqalı qurşağına dəydi, yavaş-yavaş dizlərini bürüdü. "Apardı sellər Saranı" havası dildən-dilə gəzdi, ağızdan-ağıza düşdü...

Yayın qızmar bir günündə Xançoban özünün yetmiş yaşına çatan zamanında, Kür-Araz birləşməsi ilə üzüaşağı Xəzərə sallandı... Xəzər xışıldayırdı... Dənizin dalğaları sahili şillələyib-döyəcləyirdi. Ucu-bucağı görünməyən dərya köpüklənə-köpüklənə üzü bəri gəlirdi. Sıxıla-sıxıla, sıvxırıla-sıvxırıla geriyə çəkilirdi.

Başına şiş çalma bağlayan, əyninə gen çuxa geyən, dizlərinə qədər yumşaq məs çəkib belinə qurşaq bağlayan bu ozan diqqətlə dənizə baxdı. O, çuxura düşən işıldaq gözlərilə gördü ki, necə də Kür-Araz birləşib dənizi yara-yara üzü o yana gedir, sonra da dənizin dərinliyində əriyə-əriyə itir. Elə dənizdən və Kür-Araz birləşməsinin çayırlı-

çəmənli hövzəsinə doğru Sara saçlı bir su pərisi üzə-üzə gəlir... Bu zaman Xançobanın gözünə pəriləşən Saranın qumral saçları səpələnmiş halda göründü... Onun ürəyi qəfəsdəki quş kimi çırpındı. Ozan az qala uçmaq, Saranın saçları üstündə qanad çalmaq, "Mən Xançobanam!" deyə özünə Saraya çatdırmaq istəsə də, heyrət içində dayandı. Xançoban əlini atıb, Saranın yadigar qoyub getdiyi, bu uzun müddət ərzində işlənib köhnələn sazı götürdü, sinəsinə basdı. Su pərisinə dönüb dənizdə əbədiləşən Sara qocalan, tamam-kamal dəyişib başqalaşan Xançobanı tanımasa da, öz sazının iniltisini-sızıltısını eşidən kimi qurşağa qədər qalxdı. Xançoban Saranın mərmərləşən ağ sinəsini heyran-heyran süzdü. "Apardı sellər Saranı!" mahnısını eşidən su pərisi kirpiklərini sıxıb "nakam məhəbbəti" göz yaşlarını inci kimi, səyriyən yanaqlarına tökdü. Bu qadir qüdrətin əsrarəngizliyi müqabilində saz çalıb, "Apardı sellər Saranı!" nəğməsini oxuyan Xançobanın taqətdən düşən dizləri qatlandı, sivri saqqalı torpağa düşdü. Ürəyi həsrətlə qovrulan bu ozan böyrü üstə bükülüb, əbədi yuxuya getdi...

*Bakı, 26 may 1978*

# GÜLƏN BALIQ

Gün çıxan tərəfdə bir məmləkət vardı. Bu məmləkətin bir padşahı vardı. Bu padşah nə yerə sığırdı, nə də göyə... Dil tərpədənin dilini kəsdirir, baş qaldıranın başını vurdururdu. Əmrini yerinə yetirməyənin, bir sözünü iki eləyənin boğazına yağlı kəndir keçirtdirib, meydanlarda qurdurduğu dar ağaclarından asdırırdı. Bu padşah rəiyyətin-rəncbərin dərisini soydurur, xəzinəsini lal-cavahiratla doldururdu.

Padşah öz sarayından çıxıb məmləkətin hansı vilayətinə yollansa hamı onun pişvazına çıxır, qabağında səcdəyə düşürdü. Əyilib atının dırnaqlarından öpməyənlərə divan tutdururdu. Başı zülmə qarışan padşah nə məmləkətdə əməlli-başlı bir yol çəkdirir, nə də susuz yerlərə su çıxartdırırdı. Bu padşah nə eldə-obada bir məktəb-mədrəsə açdırır, nə xəstələr üçün mərizxana dərdinə qalırdı. Padşahın yan-yörəsini bürüyən vəzir-vəkilin də işi-peşəsi ancaq, “bəli, beçeşm” demək idi. Şayəd bir gün vəzir-vəkildən birisi padşahın gözünə bir cürə, şübhəli dəysə, gecəsinə onun başı fərmanda idi. Buna görə də padşahın vəzir-vəkilini bir-birindən seçib ayırd eləmək çox müşkül bir iş idi. Baxanda bu vəzir-vəkilin hamısı tutuquşu sayağı, eyni cürə, yastı-yastı danışır, eyni vaxtda yatıb eyni vaxtda dururdu... Onların hamısı bir cürə hərəkət edir, padşahın hüzurunda bir-birinə baxa-baxa bir dərəcədə ucadanmı, astadanmı gülürdülər. Bunlardan heç birisi başqa birisindən ayrılmır, nə səsini endirir, nə də qaldırırdı. Padşahın gözü vəzir-vəkilin üstünə çevrilib ağarcağın hamısı birdən sarısını udur, hamısı eyni rəngə-rufa düşürdü... Padşahı mədh etməyənlər, onun şücaətindən vəsf açmayanlar qaranlıq və rütubətli zindanlara doldurulur, burada yarıac, yarısusuz saxlanılır, sonra da göysüz-göyərtisiz quru boş səhralara sürgün edilirdi.

Ancaq padşah gücünü həm içəri, həm də çöl qoşununa verir, yaraqlı-əsbablı qoşun düzəldirdi. Kefi istəyincə bu gün bu eli, qoluna qolay bu qonşusunu, sabah o eli, o biri qoluna qolay qonşusunu sıxıb-sıxışdırır, əzib-əzişdirir, torpaq dalınca torpaq tuturdu. Bu torpaqlarda da ancaq öz qayda-qanununu qoyur, sinəsinə yatan, gözü su içən adamdan vəzir-vəkil təyin edir, özü isə başda dayanır, gözəl-göyçək qızların əli ilə şəvə saqqalına zəbərcəd dənələri düzdürürdü. Padşah tacını hey təzədən bəzədir, bu gün bu əbasını, sabah o əbasını qızıllaşdırır, əl ağacını belə ləl-cavahiratla işlədib par-par parıldadırdı. O, düşmən saydıqlarının boynunu vurdurur, kəsik başlarına doyunca

baxıb ləzzət alır, birdən də uğunub gedir, bu başları kos kimi təpiyilə diyirlədirdi.

– Siz, bunun başına baxmayın, açıqca gülən dişinə baxın, heyvərənin... – deyə padşah çiyin ata-ata qəşş edirdi.

Bu zaman vəzir-vəkil də bir-birini dabanlaya-dabanlaya şaha uyğun olan əda ilə gülür, padşahın müqabilində öz başlarını əyib, elə bil ki, bir ağızdan deyirdilər: "Ədalətli şahımız, bizim də başımız sənin fərmanındadır. Nə vaxt istəsən günahkar boynumuzu vurdura bilər, gərəksiz başımızı da kos kimi diyirlədə bilərsən. Amma bizim heç birimizin kəsik başı sizin hüzurunuzda elə gədalıq göstərib, ədəbsiz-ədəbsiz irişməyəcəkdir."

Padşahın cəmini tapanlar onun daş-qaşlı silahını, qılıncını, qalxanını tərif edənlər şahdan bəxşeyiş alır, süd gölündə üzə-üzə məst olurdular... Bəzən padşah özü də yemək-içməyini bilmərrə unudur, bütün günü başdan-başa tərif yeyir, şişə-şişə köpəşirdi. Padşaha elə gəlirdi ki, bu dünyada ondan böyük heç bir dağ da yoxdur! Padşah hər hansı dünya dağından ucadır, özü də çox yaşayacaqdır. Hər yaranan ölsə də, bu padşah ömründə ölmək bilməyəcəkdir. Padşaha elə gəlirdi ki, əcəl haçan kimin üstünə necə qılınc çəkib, onu qara torpağa sərsə də, onun üstünə qılınc çəkən, onu torpağa sərən heç bir əzrayıl olmayacaqdır.

Amma elə bir gün gəldi ki, kefi kök, damağı çağ padşahın ovqatına çox acı bir soğan çırtıldı... Bəs necə oldu ki, bu boyda, bu zabitədə padşahın ovqatına birdən-birə çox acı bir soğan çırtıldı?.. Mətləb dərindir... İndi görək bu mətləb niyə dərindir, nə dərinliyindədir? Çay dərinliyindədir, ya dərə dərinliyində, yaxud lap dərya dərinliyində? Hər nə dərinliyində olsa gərək arayıb-araşdırıb dərinliyin dərəcəsini çatdırasan!.. Yoxsa olmaz!..

## I

Bir gün sübh tezdən balıq ovuna çıxan bir qoca balıqçı dəryaya atdığı qurğuşunlu torunda ömründə görmədiyi gözəl bir balıq gördü. O daha toru dəryadan çıxarıb qumun üstünə salmadı, ləpələrdə saxlayıb balığa tamaşa eləməyə başladı:

– Nə gözəlsən, ay balıq!

Balıq dilləndi:

– Mən sehirli balığam, qoca!

– Necə, sehirli balıq?.. Axı, mən bu çağacan heç bir balığı nə bu yaraşıqda, nə də danışan görmüşəm?! Xudaya, bəlkə məni qara basır?!

Bəlkə mənim huşum başımdan çıxır?! Bəlkə mən ölürəm, ya ölmüşəm, heç dərya qırağında da deyiləm?!

– Qorxma, qoca, sən sağsan, özü də yuxu-zad görmürsən!

– Bəs həqiqət necədir, balıq?

– Həqiqəti budur ki, sən tez tərpən, məni dərya suyu ilə dolu bir teştə qoy, apar padşahınızın hüzuruna, böyük ənam al, kasıblığın daşını biryolluq at.

– Axı, yanımda teştim yoxdur, balıq!

– Get evindən teşt gətir!

– Evimdə də düzü heç bir teştim yoxdur!

– Qonşundan borc al!

– Mən gəlincə dəryanın dərin yerinə qaçmazsan ki?

– Sən tora düyün vur!

– Toru da özünlə dartıb dəryaya aparmazsan ki?

– Torun dəstəsini yanındakı əncir ağacının kökünə bağla!

Qoca torçu balıq deyən sayağı elədi, cəld gedib qonşusundan balıq yerləşən, üzüb tərpənən bir teşt alıb qaçaraq gətirdi.

– Sən buradasanmı, dost?

– Bəli, sən məni tordan çıxar! Əgər sən məni əlinlə belə dəryaya atsaydın, yenə də mən qoyub getməzdim!

– Axı, səbəb nədir, balıq? Səbəb nədir ki?! Bəlkə Allah-taala özü mənim yoxsulluğuma rəhm edib, özü səni göndərib ki, mən səni padşaha təqdim edib kasıblığın daşını atım? Onun verəcəyi ənamı qənaətlə sərf edə-edə qoca ömrümün qalan qismini xoş güzəranla başa vurum? Bax, balıq, gör ayaq üstə necə də tir-tir titrəyirəm?.. Düzü yeddi yaşından ta yetmişə qədər mən bu duzlu suya batıram, çürümürəm, ölüb itmirəm, dəryadan balıq tutub obalarda una, dənə dəyişə-dəyişə bir çətən külfətimi saxlayıram, ap-acı ruzigar keçirirəm!

– Mən səni ap-acı ruzigardan qurtaracağam, qoca!

– Bütün məmləkət az qala dilənçiyə-sayıla dönüb, balıq!

– Mən çalışacağam ki, məmləkətin də gözünü açım!

– Xudaya, xudaya, mən dəli olmuram ki?..

– Qoca, ağlını başına topla, deyilənə əməl et!..

Qorxuya düşən qoca balıqçı deyənə əməl etdi, mis teşti yarıya qədər dərya suyu ilə doldurdu, balığı tordan çıxarıb teştə saldı. Baxanda balıqdır! Ancaq indiyə qədər qocanın tutduğu balıqların heç birisinə bənzəməyən qəribə, gözəgəlimli balıqdır... Qoca duzlu suyu süzülənən qurğuşunlu torunu dəstələyib şelləndi, teşti də üsullu qucağına

qaldırıb aramla yollandı, özünü padşahın qəsrinə yetirib içəriyə izn istədi. Padşahdan xəbər qayıtdı ki, bəs qoca balıqçını mənim hüzuruma gətirin. Qoca balıqçını qızıllı-gümüşlü otaqlardan keçirə-keçirə ləl-cavahirata batan salona apardılar. Padşah öz faxir libasında o yandan bəriyə çıxıb:

– Nə var, qoca? – deyə qabağında balacalanıb büzüşən, müqabilində yumağa dönüb müti dayanan kişidən soruşdu.

– Nə var belə, balıqçı?

– Şah sağ olsun, sizə çox qəribə bir balıq gətirmişəm!

– Necə çox qəribə bir balıq, qoca?

– Belə ki, yetmiş illik ömrümün ərzində belə gözəl, əcəb balıq görməmişəm!

– Bir bəri göstər görüm!

Qoca, teşti padşahın müqabilində titrək əlləri üstündə tutdu.

– Mən də heç belə əcəb balıq görməmişəm, qoca!

– Bəli, şahım!

– Bəs diləyin nədir, qoca?

– İltifatınızdan asılıdır, şahım!

– Bəlkə iltifatım sizi qane etmədi, qoca?

– Bir quruş da olsa, şah əlindən qəbulumdur!..

– Yox, qoca, – deyə şah baş vəzirə tapşırdı, – özün apar, bu qocanı baş hərəmin barigahına, qoy o özü balığı qəbul edib, öz ənamını versin, çünki var-dövlətim onun əlindədir, xəzinəm onun sayəsində aşıb-daşır.

– Mən şəxsən sizdən iltifat diləyirdim, şahım!

– Sözü çərlətmə, qoca!

Baş vəzir işarə ilə qocanı lal olmağa çağırdı. Onu döndərib baş hərəmin barigahına apardı. Baş vəziri görən, ondan şahın sərəncamını eşidən xacə, baş hərəmə xəbər çatdırıb, əhvalatı bildirdi. Baş hərəmin qəzəbli qışqırtısı eşidildi:

– Xacə Təbarək, gər balıq məhrəmdirsə, dişidirsə alın mənə gətirin, naməhrəm erkəkdirsə, elə qapıdan qaytar!

Baş vəzir yerində dondu. Qoca qorxusundan qurudu. Ancaq, teşti dalğalandıran balıq quyruğu üstə qalxdı, şaqqa çəkib imarət dolusu güldü. Bir göz qırpımında saray əhlinə xəbər yayıldı ki, bəs balıq baş hərəmin barigahında necə şaqqa çəkib gülübdür! Olan əhvalatı gizlətməyə cürəti çatmayan, hər anda dili dartılıb boynunun kökündən çıxarıla bilən baş vəzir qoca balıqçını öz teşti ilə geriyə döndərdi, padşahın hüzuruna gətirdi, əhvalatı açıb necə ki var, elə də şaha söylədi:

– Yəni, bu balıq əməlli-başlı güldü, vəzir?
– Bəli, şahım, bu balıq əməlli-başlı imarət dolusu güldü!
– Nə zaman, nə zaman, vəzir? Bir də təzədən olduğu kimi tamam-kamal söylə!
– O zaman ki, sizin baş hərəminiz, "balıq məhrəmdirsə, dişidirsə alın mənə gətirin, naməhrəm erkəkdirsə qapıdan qaytarın!" – deyə qəzəblə qışqırdı, balıq quyruğu üstə dikəlib şaqqa çəkib güldü.
Padşahı olmazın şübhə götürdü:
– Yaxşı, qoca, teşti buradaca qoyub, – deyə sağ əli ləl-cavahiratlı ağacında titrəyə-titrəyə sərəncam verdi, – özün də üzüstə evinə qayıt! Özün də bax sirri ağzında saxla, hər nə zaman ki, bu balığın nəyə güldüyünün sirri mənə əyan oldu, sən də ənamını onda alarsan!..

II

Şah tez sərəncam verib, bütün vəzir-vəkilini hüzuruna çağırdı:
– Açın, söyləyin görək, bu balıq niyə və nəyə gülmüşdür?!
Vəzir-vəkil başını aşağı saldı, padşahın qəzəbi bulanıq sel kimi aşıb-daşdı:
– Əgər sabaha qədər bu sirri mənə açmasanız, bax hər birinizin başını bircə-bircə özüm öz qılıncımla bədəninizdən cida edəcəyəm... Müftə yerə yeyib-yatıb, tənbəl-tənbəl oturub-durub, tənbəl-tənbəl mənə baxırsınız! Elə bil ki, gecəni sabaha qədər yatmayan, bu boyda məmləkətin dərdini çəkən mən deyiləm, sizsiniz!.. Bəs niyə dinmirsiniz?.. Niyə cıqqırınızı çıxarmırsınız?! Yoxsa, hamınız ayaq üstdə ölüb müqəvvaya dönmüsünüz?
Baş vəzir titrəyən qədəmlərlə qabağa yeriyib aman istədi:
– Şahım, qəzəblənməyin, səbir edin, görək necə olur?
– Yəni deyirsən ki, balıq niyə və nəyə güldüyü gedib başqa məmləkətlərə də çatsın?
– Sərhədi qapayarıq, şahım, qoymarıq xaricə səs çıxa!
– Bəs gələn elçilər?! Bəs gedən səfirlər?!
– Nə xaricə bir nəfəs, şahım, nə də daxilə!
– Şübhəli bir söz deməzlərmi? Bunun özündən şübhələnməzlərmi? Söyləməzlərmi, bəs nə var ki, o məmləkətdə, oraya nə azar daraşıb ki, belə edirlər?
– Şahım, kimin sizin daxili işinizə nə dəxli? Məmləkət sizin, sərəncam da sizindir!

– Küt başına daş düşsün! – deyə şah ağacını qaldırıb baş vəzirin başını taqqıldatdı: – İçi bomboşdur, kəndçilərin çəpərlərində quru tağlarda sallanan qupquru balqabaq kimi bomboşdur!

– Şahım, bəndənizi bunca əqilli vəzir-vəkilinizin birisi ilə əvəz edə bilərsiniz!

– Bəs sən cənab necə olarsan?

– Mən də qulunuz ollam, şahım! Lap tövlənizdə mehtər olub atınızı tumarlaram!

– Elə biz həmişə şahın qolubağlı qulu olub, tövləsində mehtərliliyə başlarıq, – deyə bir-birinə macal verməyən vəzir-vəkil dilləndi. – Daha biz hansı ağızla haranın köpəkləriyik ki, şahın bəndəliliyindən çıxa bilək?! Hərəmizin bir canı var, ona da padşahın yolunda can-başla qurban verməyə hazırıq!

– Yaxşı, sakit! – deyə padşah ləl-cavahiratlı ağacını döşəməyə döydü. – Siz elə qorxaq tülkü, elə hiyləgər qurnazlarsınız ki, başınızı bəladan qurtarmaq üçün siçan deşiyini satın almağa, özünüz də siçana çevrilib bu deşiklərdə gizlənməyə hazırsınız!

– Şahım, onda durun öz əlinizlə sınaq üçün bircə-bircə bizim boynumuzu vurun, ta sizin hirsiniz soyuya, sizin vücudi-alinizə zərər-ziyan toxunmaya!

– Vuracağam,bu qılıncla bircə-bircə sizin boynunuzu, əgər siz günü sabah, bax, düz bu vaxtacan bu sirri açıb mənə agah etməsəniz, niyə bax bu teşt içində sərfnazlıqla cövlan edən bu balıq baş hərəmin barigahında elə şaqqa çəkib gülmüşdür?

– Bəlkə, şahım, bu balıq gülməmişdir?

– Onda baş vəzir hamının müqabilində doğrusunu desin!

– Şahım, bu balığın necə güldüyünü, bütün barigah əhli öz qulaqlarıyla eşitdi, çoxları da gözləri ilə gördülər!

Padşah əmr etdi:

– Xacə Təbarəki mənim hüzuruma çağırın!..

Xacə Təbarək də gəldi, balığın gülməyini təsdiq etdi.

– Bəlkə, sən özün bu sirri açasan, kaftar!

– Şahım, mənim boynumu vurdurun!

– Niyə, xacə Təbarək?!

– Axı, xacə Təbarək sizin aciz bir bəndəniz, bu vəzir-vəkil səf çəkib sizin qarşınızda boyun-boyuna duran məqamda nə qələt edə bilər?

– Bəlkə, bunlarsız, bu kütbeyin qoyunlarsız sən özün xacə Təbarək pünhanı, bu sirri açıb mənim qulağıma pıçıldayasan?

– Əsla, şahım!.. Mən heç zad bilmirəm. Axı, bu ağalar bu sirri aça bilməyən yerdə, mən necə "balıq niyə güldü" sirrini aça bilərəm? Axı indiyə qədər bu dilsiz-ağılsız dərya sakininin heç bircəciyinin də hansı məmləkətdə olsa belə güldüyünü görən, eşidib-bilən olubmu?.. Yenə də sizin bütün dünyanın vəzir-vəkilindən ağıllı-kamallı vəzir-vəkilinizin baş sındırmağı gərəkdir, bildirsinlər ki, bəs bu balıq niyə nə nəyə güldü?

– Rədd ol, sən də qoca, rədd ol hüzurumdan, tüksüz tülkü! – Şah bar-bar bağırdı. – Guya, mən bilmirəm bu aciz-avaralar nəyə gərəkdir? Əgər bunların başı olsaydı, burada nə gəzirdilər?

– Onda şahım, özünüzə başlı vəzir-vəkil cəm edin! Yoxsa, bu ağılsız-qundur başlarla məmləkəti uzağa apara bilməzsiniz!

– Bəs, qundur başlar acından qupquru quruyarlar ki... – deyə şah zəbərcədli əl ağacı ilə vəzir-vəkilin başına bir neçə dəfə vurub taqqıldatdı. – Gör, bunların hər birisindən necə də kar-küt səs çıxır, xacə Təbarək!

– Bəs, onda bəndə bilmir bu başlar daha sizin nəyinizə gərəkdir, şahım?

– Bax belə, taq-taq taqqıldatmağa!.. Əgər, bunların bircəciyi gülən balıq sirrini açsaydı, mən öz taxtı-səltənətimdən imtina edib küllən ona bəxş edərdim!

– Bizim heç birimizdə belə cəsarət ola bilməz, şahım!

– Niyə olmur, tənbəl öküzə bənzəyən vəzirlər, vəkillər, ağalar, əyanlar, niyə olmur?!

– Çün, şahım, bizim heç birimizdə elə bir baş yoxdur ki, şahın başından ağıllı-kamallı ola, elə də səltənət iştiyaqına düşə, – deyə vəzifəsi mövcibincə baş vəzir cavab verməli olurdu. – Şahım, biz sizin aciz bəndələrinizik, öl-öl, qal-qal! – Baş vəzir şahın qarşısından dizləri üstə səcdəyə düşüncə bir-birinə macal verməyən vəzir-vəkilin başı fərşə getdi, otuza yaxın göbələk baş göründü.

– Sən niyə səcdəyə düşmürsən, xacə Təbarək?

– Şahım, mən sizin zəhminizdən elə qurumuşam ki, daha əyilməyə də tab-tavanım qalmayıbdır!

– Demək, xacə Təbarək də heç bir tab-tavan qalmayıbdır?

– Balıq gülәndən mən elə quruyub heyrətdə qalmışam!

Padşah cərgəsi ilə donqalanan belləri öz əl ağacı ilə döyəcləyib fəqərə sütunlarını əzib-əzişdirdi. Sonra da qəzəbnak əmr etdi:

– Qalxın ayağa! – Şah qışqırınca neçəsinin fərş üzərində tərpənə bilmədən qaldığını gördü.

– Kim ayağa dura bilmirsə, xacə Təbarək, sən özün sürü o biri yana sal, – deyə padşah sərəncam verdi. Onun qəzəbli gözlərindən alov saçılmağa başladı.

– Hamınızın beli, bax belə qırılacaqdır! Hamınızın başı boynundan atdırılacaqdır! – Şah qılıncını çəkincə boyunlar tez əyildi, baş vəzir bir az da qabağa durduğu üçün qılınc onun boynunda da parladı, bədən yerə sərildi, başı bir qırağa düşüb qırıq-qırıq danışdı:

– Balıq... Balıq... Güldü ki?!..

Qəzəbli şah ayağının ucu ilə kəsik başı tərpədincə, dodaqlar çəkildi, dişlər ağara qalıb güldü. Bütün vəzir-vəkil vahimədən tir-tir titrədi. Onların da dodaqları eynən qaçdı, dişləri də açıqda qalıb səssizcə güldü.

III

Boynu vurulan baş vəzir üstü örtülü quylandı... Guya bu işi nə görən, nə də eşidən olubdur!? Ancaq, görəsən "Balıq niyə və nəyə güldü?" – deyə sarayda xısın-xısın, qıraqda ağ-açıq danışıldı, söz yayıldıqca yayıldı. Bu söz-sov bütün məmləkətdə hərlənib dolandı, hətta qapalı sərhədləri ötə bilən quşların qanadlarında göndərilən namələrdən də aydın oldu ki, bəs filan məmləkətlə belə bir hadisə olubdur, balıq baş hərəmin barigahında şaqqa çəkib gülübdür?! Bu məmləkətlərin də padşahları öz vəzir-vəkilini cəm edib baş sındırdı; ancaq "Balığın niyə və nəyə güldüyünə?" cavab tapan olmadı. Hamısı öz yerində mat-məəttəl qaldı, bütün dünya heyrətə düşdü... "Balıq niyə güldü?! Balın nəyə güldü?!". Nə etmək olardı? İndi padşahlar öz dəryalarında olan balıqları qırdırsınlarmı? Hər necə balıqları qırdırsan da, yenə də bir balıq sağ qalıb istəyəndə gülə bilməzdimi? Bu gün bu padşahın, sabah o padşahın baş hərəminin barigahında şaqqa çəkə bilməzdimi? Yaxşısı budur, heç bir balığa dəyib-dolaşmayasan! Mümkün edib dəryaya tor salıb balıq tutmayasan ki, bir balıq da bir padşahın sarayında, ya onun baş hərəminin barigahında gülə?! İndi bəs necə olsun?!

Əgər, bu padşah özü əyriağız qılıncı ilə bir tək baş vəzirin deyil, bütün vəzir-vəkilinin başını bədənindən atdırsa, yaxud bütün əyanlarının bel-buxununu sındırıb şil-şikəst etsə, yenə də sirr sirliyində, düyün düyünlüyündə, müşkül müşküllüyündə, müəmma müəmmalığında qalırdı ki, qalırdı! Belə də olsa, üstündən neçə-neçə il ötsə də, qalacaqdı ki, "balıq niyə və nəyə güldü?".

Padşah yemir, içmir, vəzir-vəkildən hansı birisi özünü yorğan-döşəyə yıxıb bir mərəzə giriftar sayıb hıqqıldayıb-zıqqıldasa da yenə, yenə daş-divar gəmirən padşah onu cəbrən yerindən qaldırıb hüzuruna gətirdir, onları birlikdə, yaxud ayrı-ayrılıqda dara qısnayıb, divara dayayıb, balığın gülməkliyinin səbəbini soruşurdu, ancaq bildim deyən olmurdu ki, olmurdu! Bəs daha necə olsun?.. Padşah üzü üstə yıxılıb bu əlacsız-çarəsiz dərdlə ölsünmü? Ölüb bu dünyadan sinəsi dağlı-düyünlü getsinmi? Axı, lap torpaq altında da padşahın sümükləri soruşar: "Balıq niyə və nəyə güldü?" Bəlkə padşah baş hərəmdən xəbər alsın?! Yox, baş hərəm özü də bilməz! Bu boyda vəzir-vəkil bilməyən yerdə, o haradan bilə bilər. "Baş hərəm xəzinəni göz bəbəyi kimi qoruyan, padşahın var-dövlətini çin-çin yığan, qənaət edən bir qadındır, balıq dilini, balıq xasiyyətini o haradan bilə bilər?" – deyə fikirləşən padşahın yuxusu ayıq vaxtına ayıq vaxtı da yuxusuna qarışırdı: "Balıq niyə və nəyə güldü?" Bu sirri öyrənməmiş, açmamış, qulaqlarına gələn xısıltını kəsməmiş, min-min deyil, milyon gözləri "balıq niyə və nəyə güldü" intizarından qurtarmamış, padşah rahatlanıb yata bilmirdi.

Padşah düzəltdirdiyi qızıl hovuzda balıq zərrin rəng ala-ala üzür, naçar padşah hey ona tamaşa edirdi. Bir axşam padşahın əmri ilə nə sarayda, nə də məmləkətdə bir çıraq yandırıldı. Bütün məmləkət yasa batan kimi qaranlıqda qaldı. Yalnız padşah özü bir şam yandırıb əlinə aldı, balıq üzən hovuzun kənarına qoydu, özü də əllərini döşündə çarpazlayıb durdu?

– Yalvarıram, balıq, de görüm sən niyə və nəyə görə baş hərəmin barigahında şaqqa çəkib güldün?

Balıq dinmədi, səs çıxarmadı, qızıl hovuzda mənalı dolandı.

– Axı səndə böyük bir sirr vardır, balıq!

Birdən balıq dönüb cavab verdi:

– Balıq, mənim sinəmdə cavab verdi:

Padşah sevindi, elə bil ki, bütün dünyanı birdən fəth etmiş oldu:

– Onda bu sirri bir tək mənə aç, balıq!

– Bu sirri bir tək sənə açsam, nə edərsən?

– Sənin bu hovuzunu indiki kimi zərdən deyil, tacımdakı zəbərcəddən düzəldərəm!

– Mən istərdim, şahım, sən məni dəryaya buraxasan!..

– Sən bu sirri mənə açsan, mən səni dəryaya da buraxdıraram!

– Əvvəlcə məni dəryaya burax, oradan sirri sənə açım!

– Yox, üzüb-üzüb başqa məmləkətlərin dəryalarına gedərsən, mənə aid sirri orada açarsan!

– Onda şah mən deyənlərə gərək bircə-bircə əməl etsin!

– Buyursun, görək balıq!

– Bütün zindanlarda çürüyən məhbusları şah gərək azad etsin!

– Axı, onda balıq bütün məmləkətdə asayiş pozular, papaqaldı qaç düşər!

– Onda şah günü sabahdan məmləkət daxilində bütün əyalətləri bir-birilə bağlayan yol çəkdirməyə girişsin!

– Bunu heç edə bilməyəcəyəm, balıq!

– Niyə, şahım?

– Çünki düşmənim çoxdur, balıq, düşmən rəvan yolla məmləkətin içinə yeriyib bizi məğlub eləyə bilər?

– Bəlkə, şahım əyalətlərdə xəstəxanalar açdıra?

– Əsla, mümkün deyildir, balıq.

– Nə üçün, şahım?

– Çünki hər şeyə qadir olan Allah öz bəndələrini saf-çürük edir, yəni çıxdaş etməlini də vaxtlı-vaxtında çıxdaş edir. Daha mən Allahın iradəsinə qarşı çıxıb onun qəzəbinə gələ bilmərəm!

– Onda şahım, el-obanın balaları üçün mədrəsələr, məktəblər açdırın!

– Bu da mümkün deyil, balıq!

– Niyə mümkün deyildir, şahım?

– Çünki el-obanın balaları mədrəsələrə cəm olunsalar, əkin-biçin işlərimiz bərbad olar, bütün məmləkətdə başdan-başa aclıq başlar, hamı tələf olar!

– Demək, şahın nəzərində savadın, təhsilin ziyanı vardır?

– Bəli, balıq! İzafi savadın-təhsilin ziyanı vardır!

– Bəs savadsız-təhsilsiz məmləkəti necə dolandırmaq olar, şahım?

– Nə qədər ki, savadlı xidmətçi gərəkdir, o qədər də vardır. Burada daha ölçü-biçini pozsaq, daş-daşın üstə dayanmaz, zəlzələ başlar, nəinki bir tək insanlar, siz balıqlar da məhv olarsınız!

– Mən deyənlərin heç biri mümkün deyil, şahım?

– Əsla, mümkün deyildir, balıq! Sən, bil ki, onda bütün məmləkət xarabazara çevrilər, mən özüm də o dünyada cəhənnəmi olaram!

– Demək, şahım, siz göydəki Allahın yerdəki vəkilisiniz?

– Mən onun kölgəsiyəm, quluyam, balıq!

– Onda mənim niyə və nəyə gülməkliyimin səbəbini siz ondan soruşun!

– Onun belə-belə işlərlə məşğul olmağa vaxtı yoxdur!
– Yox, siz ondan soruşun şahım!
– Bu da əsla mümkün deyildir, balıq!
– Niyə siz, hər şeyə qadir ola-ola, bu işə qadir deyilsiniz, şahım?
– Qadirəm, lakin?..
– Onda bu sirri açmağa qüdrətiniz olsun!..
– Yox, bu sirri açacaqsan, əziz balıq!
– Əgər, açmaramsa?
– Açacaqsan, yalvarıram!
– Aç-ma-ramsa?
– Onda mən şeypur çaldırıb baş vurdurduğum o böyük meydanda alovu göylərə dirəklənib, buludları yalayan bir tonqal çatdıraram, hamının gözü qabağında səni o tonqalda yandıraram, yer üzündə heç bir izin-əlamətin qalmaz!
– Onda sirr də, sirr qalar!
– Onda səni bu qızıl hovuzdan çıxarıb quru teştin içinə, qoyaram, bir ləhzədə tələf olarsan!
– Onda sənin özünü də bu sirr hökmən tələf edər!
– Necə, necə?
– Sən bu sirrə tablamazsan, şahım, ürəyin partlar!
– Bəs indi necə olsun, möhtərəm balıq?
– Onda bu sirrin üstünü vurmuyun!
– Necə, nə təhər?
– Sirrin üstünü vurmuyun! Mən burada üzüm, sən də orada sarayda gəzin!
– Axı, mən az qala heç gəzə bilmirəm!
– Niyə, nə üçün şahım?
– Çün baxıram, qədəmlərim tutulur, az qala?!
– Onda loğmanınızı çağırın, dərdinizə dərman qılsın!
– Heç bir loğman, heç bir dərman! Mən istəyirəm bilim, axı sən niyə və nəyə güldün? Mən bu sirdən agah olmaq istəyirəm!
– Bu sirr açılsa, sən peşman olacaqsan, şahım!
– Olmaram, balıq!.. Sən bu sirri aç! Mənim partlayan ürəyimə cavab ver! – Padşah dizləri üstə düşüb qızıl hovuzda asta-asta üzən balığa yalvardı, sonra da dəsmalını çıxarıb gilə-gilə yaş gələn gözlərini sildi.
– Peşman olacaqsan, şahım!

– Olmaram, peşman!.. Aç camaatın qarşısında bu sirri söylə görək, axı sən niyə, nəyə güldün? Niyə və nəyə görə sən başqa bir yerdə yox, ancaq mənim baş hərəmimin barigahında güldün?!

– Onda mənim bütün şərtimə sözsüz əməl edərsizmi, şahım?

– Bəli, sənin bütün əmr və sərəncamlarına müti bir qul kimi mütləq əməl edərəm!

– Bu sirri açmaq məsləhət deyil, şahım?!

– Sən sözünü döndərə-döndərə məni çərlətmə, balıq! Bax, mən sənin bu quyruğundan yapışıb başını divara çırparam!

– Mən əslə ölümümdən qorxmuram, şahım! Ancaq bilirəm ki, bu sirr səni çox tezcə öldürər!

– Bəli, bu sirrə agah olmasam məni tez öldürər!

– Bəlkə, bu sirr açılmaqdansa, şahı öldürsə yaxşıdır?!

– Onda, mən bu dünyada əzrailə də can vermərəm! Yüz əzrail birdən yığılıb, başımın üstünü alsa, mən fateh sərkərdə heç birinə can vermərəm!

– Bəs bu sirrin açılması, şahın özünün ölümündən betər olsa, necə?

– Mən razıyam, mən tamamən sənin bütün şərtlərinə razıyam, balıq! Aç bu sirri, axı niyə, nəyə görə sən dəryadan çıxırdın? Axı sən, niyə, nəyə görə buraya yollarındın? Axı o məlun qoca niyə, nəyə görə səni bu mis teştə qoyub düz buraya gətirirdi?! Aç sirri, söylə səbəbini!.. Qoy hər nə olur olsun söylə, əsla bir nöqtəsini də gizləmə! Bax belə, öz ürəyini yeyə-yeyə şahlıq etməkdənsə, ürəyini bir yolluq torpağa təslim etmək min pay yaxşıdır! İndi gündüzlər də, gecələr kimi mənim gözlərimə tar-zülmət görünür. Başqa-başqa məmləkətlərdən sərhədlərə elçilər göndərilir, kağızlar gəlir, hamısı soruşur, “balıq niyə və nəyə güldü”, mən cavab verə bilmirəm!

– Bəs şahın bunca yeyib-yatan, yatıb-yeyən vəzir-vəkili?

– Dedim, sənə, dedim ki! – Şah balığın boğazından yapışınca, balıq saray dolusu güldü.

– Demək, sən orada da beləcə gülmüsən!

– Bundan da güzlü gülmüşəm!!

– Onda sirri mənə aç, onda hamısını bircə-bircə mənə aç, söylə!

– Axı, özün buyurdun ki, camaat qarşısında açım!

– Bəli, camaat qarşısında aç! Peşman olmaq deyil, ölüm də olsa aç söylə, axı bütün məmləkət mənə baxır, axı milyon göz mənə zillənib!.. Sən niyə gülmüsən? Sən nəyə gülmüsən? Sən mənim baş hərəmimin barigahında lap zəif toxunumlu bir yerimdə ancaq, bir tək mənə gülmü-

sən! Bəlkə burada güləydin, bax beləcə, indiki kimi orada gülmiyeydin... Onda mən heç zaman pəjmürdə olmazdım, bunca təşvişə düşməzdim!

– Bəlkə, şah məsləhətə qulaq asa, öz baş hərəmindən, onun bütün sirlərini soruşa?..

– O mənə hər nə desə də, balığın niyə və nəyə güldüyünü deyə bilməz!

– Bəlkə dedi?

– Yox, əsla!

– Bəlkə, sirr çox üzdədir, şahım?

– Yox, sirr dərindədir, balıq, dərya qədər dərində! Yoxsa, sən o dərin dəryadan çıxmaz, məlun qocanın qırışıq əli ilə bu mis teştə salınmaz, saraya gətirilməz, mənim səltənətimi belə tir-tir titrətməzdin?!

– Demək, şah mənim baş hərəminin barigahında niyə və nəyə güldüyümün səbəbini, camaat qarşısında açılmağını qeydsiz-şərtsiz istəyir? Razıdır?

– Bəli, bəli, mən bu sirri mütləq, hər nəyin bahasına olur olsun bilmək istəyirəm! Axı niyə mənim fateh qılıncıma məmləkətlər baş əyən zaman mən belə aciz olmuşam?!

Şah çox deyib, çox təkid edəndən sonra onlar sabaha yaxın şərtləşdilər. Balığın şərtinə görə məmləkətin hər yerindən, hər bir yanından xeyli adam çağırıldı. Saray əhlindən də beli əzilən vəzir-vəkildən başqa hamı toplandı. Şeypur çalındı, qoşun səf-səf dayandı, qoca balıqçı həmin teştə qoyulan balığın yanında əsə-əsə durdu. "Balıq niyə və nəyə güldü?" – sirrinin açılacağı hamının ürəyini aramsız döyündürməyə başladı. Yüz mindən yuxarı göz balığa və padşaha zilləndi.

– Hamı mənim əmrimə əməl etməlidir! – deyə balıq teştin içindən dikəlib hakim səslə dilləndi.

Şah onun qarşısında əyildi:

– Bəli, burada hamı, hər kəs, qoşunun hər bir nəfərinə qədər bu balığın əmrinə əməl etməlidir!

– Onda and için!

– And içirik, balıq!

## IV

Hamı səs-səsə verdi. Balıq buyuranın hamısına əməl edəcəklərinə and içdilər.

– Onda tərpənirik, baş hərəmin barigahına tərəf!

– Bəli, yeriyirik baş hərəmin barigahına tərəf!

Padşahın rəngi sapsarı saraldı.

– Bəlkə, şahım, peşman olursunuz?

– Xeyr, mən öz andıma əməl edirəm, balıq!

– Mənim bütün şərtlərimə!

– Bəli, camaat qarşısında balığın bütün şərtlərinə əməl edirəm!

– Bəs rəngin niyə saraldı, şahım?.. Bəlkə bu ziyanın yarısından...

– Camaat qarşısında ölüm də olsa, mən fateh sözümdən qayıtmaram!

– Ölümdən betər olsa, necə?

– Yüz ölüm də olsa mən boyun əyərəm!

– Əgər, yüz ölüm cəzasını özünüz-özünüz üçün qazanmış olsanız, necə?

– Hər kimsə qoy öz əkdiyini biçsin, balıq!

– Sən öz əkdiyini indi çox tez biçəcəksən, şahım.

– Mən əkdiyimi çox tez də biçib qurtarmaq istərəm, balıq!

Doğrudan da peşman olan şah balığın üstünə cumdu. Ancaq balıq çəkinmədən amiranə əmr etdi:

– Sən peşmansan, şahım, görürəm, artıq necə peşmansan! Mən əmr edirəm öz andını pozan şahın qolu tez, cəld bağlansın!

Şahın taxt-tacına çoxdan göz dikənlərdən bir neçəsi birdən töküldü, hər birisi öz qurşağını tezcə açıb şahın qolunu belinə bağlamağa çalışdı.

– Heç də yaxşı deyil ki, camaat qarşısında öz tüpürdüyünü yalıyasan, gəda!

– Vurulmalı boyun sizinmiş, əyan-əşrəf!

– Artıq gecdir, çərənləmə, gəda! Qoy görək, axı bu balıq, sənin baş hərəminin barigahında niyə və nəyə gülübdür?!

Balığın əmri ilə baş hərəmin barigahının qapıları taybatay açıldı, ancaq bilən olmadı xacə Təbarək hansı cəhənnəmdə gizləndi. Baş hərəm saçlarından çəkilib ortaya atıldı. Xanımın nazla yeridiyi fərşlər bircə-bircə qaldırıldı, döşəmələr tərpədildi. Fərş döşənən, aşağıdan, lağımlardan qırx nəfər bığıburma yad adam dartılıb bu yana atıldı.

Balıq daha ucadan gülə-gülə dilləndi:

– Bax, mən buna gülmüşəm ki, ölkəni başdan-baha zindana çevirən bu qolu bağlı caninin baş hərəmi əyləşdiyi, gəzindiyi bu fərşlərin altında görün nə qədər də yad-yadırğa adam vardır. Bunlar, bu gözlərindən qan damanlar, xəzinəni talayıb bu daş-qaş içində itən xanımın

atası evinə lağımla xəlvətcə yeridənlərdir. Bu zəngin imarətdə əlini ağdan-qaraya vurmayan, özünü axmaq şah ərinin gözündə sədaqətli göstərən bu qadın, ölkənin, xalqın malını bir görün necə talan edir. Bax, məni güldürən də şahın gicliyi, şah arvadının bicliyi oldu.

Hamı heyrət etdi, ayaq üstə ölən padşah ayaq altına salınıb, cəsədi tapdaq altına düşdü. Camaat mis teşti əl üstünə aldı:

– Bizə başçı təklif et, balıq!

– Bax bu qoca balıqçını sizin məmləkətə başçı təklif edirəm, camaat!

– Qoca balıqçıdan məmləkət başçısı olarmı?

– Əgər bu qoca balıqçı məmləkətin ağıllı-kamallı, insaflı, biləndə şəxslərini öz başına toplaya bilsə, ondan böyük məmləkət başçısı olar!

– Axı, sənin etiqadın nəyədir, balıq?

– Etiqadım bunadır ki, zəhmət adamı, zəhmətkeşin qanını gecəli-gündüzlü eyş-işrətdə zəlisayağı sormaz, xalq malına qənaət edər, zülmkar padşahın gördüyü işləri görməz, görmədiyi işləri görər!

Eldən, obadan tökülüb gələn adam padşah tərəfinə həmlə edib güc gəldi. Nəhayət, qoca balıqçını məmləkətin başçısı seçdilər. Yan-yörəsini də balıq deyən kimi ağıllı-kamallı vəzir-vəkillə bərkitdilər. Nəhayət, balığa üz tutdular:

– İndi biz sənə necə qulluq edə bilərik?

– Heç bir qulluq gərək deyildir, ancaq sizdən bircə təvəqqem vardır!

– Biz hamımız canla-başla sənin sərəncamını yerinə yetirərik!

– Siz yenə də məni su ilə dolu bir mis teştin içində aparın, həmin yerdən dəryaya buraxın!

– Yox, biz səni sarayda saxlarıq, balıq! Bax orada, qızıl hovuzda üzərsən, özü də qulluğuna neçə-neçə qulluqçu desən, qoyarıq!

– Deyərlər el içində, öl içində. Mənimki dəryadır, balıqdır.

Daha balığın sözünü döndərən olmadı. Məmləkət başçısı qoca balıqçı məyus olsa da balıq buyurana əməl etdi. Onlar mis teşti götürüb axın-axın yeridilər, mis teşt bu əldən o ələ keçdi. Balığı apardılar, həmin yerdən dəryaya buraxdılar... Göz qoydular... Balıq köpüklü dalğalarla üzə-üzə uzaqlaşdı, yenə də dəryaya, yar-yoldaşının yanına getdi, qıraqdan boylanan min-min adamın gözündən itdi...

*fevral 1963-cü il*

## OVQAN VƏ İLAN

Aran ölkəsinin Muğan elində Ovqan adil bir çoban vardı. Ovqan çox əliaçıqdı. Ağartısızlara ağartı verir, əlacsız dul arvadlara, yoxsullara qoyunun dişisindən damazlıq paylayırdı. Ovqan qışda öz qoyun bölüyünü aranda otarır, yayda yuxarıya, başı buludlara dayanan yaylaqlara qaldırırdı. El yolu üstündə taxıl zəmilərini dağlara qalxan tərəkəmə köçərilərinin sürülərindən qoruyan, əli dəyənəkli, toqqası xəncərli qoruqçular Ovqanla xoş-beşlə görüşür, daha başqalarına olduğu kimi, ona tumturş sifət göstərmir, hələ taxıl arası şırım otlaqda onun bölüyünə yer də verirdilər. Ovqan çoban öz iş-peşəsini xaqanlıqdan da yuxarı tutur, zoğal şivindən kəsib, tonqalda ütüb düzəltdiyi başı toppuzlu çomağına söykənir, ota yayılan bölüyünə tütək çalır, hava qoşub quşları dilə gətirir, istəyəndə mələşdirirdi. Ovqan çobanın şöhrəti el-obaya yayılır, bir tək Muğanı deyil, bütünlükdə Aran ölkəsini tuturdu. Ovqanın adı-sanı bir gün gedib Loğmana da çatdı. Loğman yelqanadlı qızıl boz atını minib, özünü Aran ölkəsinin Muğan elinə yetirdi. Axtarıb Ovqan çobanı bölüyünün başında tapdı. Loğman tanışlıq verməsə də, Ovqan qərib qonağı xoş sifətlə qarşıladı, bacardığı hörmətdən elədi. Ovqan çoban qonağına xınaquyruq əmlik kəsib, ocaqda qızartdı, cam-cam süd içirtdi, öz qarğı dəyəsinin yuxarı başında yataq yeri düzəltdi. Düz bir ay Loğman çobanın əziz qonağı oldu. Loğman gözü ilə görüb inandı ki, Ovqan deyilmişkən varmış. Ovqanın geyimi-kecimi özünə yaraşan idi: çiyinlərində saçaqlı yapıncısı, başında saçaqlı papağı, ayaqlarında quşburnu çarığı, əlində isə deyildiyi kimi girvənkə başlı toppuz çomağı vardı. Onun üz-gözündən nur yağır, yanaqları solub-saralmır, gecə də, gündüz də köz kimi qızarırdı. "Tək bircə anaş qoyunla, bircə buynuzuburma qoç qalsa, mənə bəsdir", – deyə Ovqan əsla ürəyini sıxmır, dünya görən Loğmanı heyrətə salırdı.

– Bu qoyun ki var, ömründə qurtarası deyildir, – deyə Ovqan qonağına söz açırdı. – Əgər bu bölükdə ürəklə zəhmət çəksən, qoyunu halallıqla becərsən, sən bir verəndə, yerinə ikisi gələr, onda qoyun əkiz doğar, üçəm doğar, dişi doğar. Vay ondadır ki, bu bölüyə haram qatasan, başqasının sürüsündən bir axsaq toğlunu bölüyə qarışdırasan, onda elə bil ki, quyunun dibinə daş atdın, damazlığını dibindən kəsdin. Onda qoyun nə əkiz doğar, nə də üçəm! Onda qoyuna azar düşər, görərsən ki, bir həftənin içində batıb...

Loğman diqqət yetirir, getdikcə Ovqanın ağlına, kamalına, səxavətinə daha artıq heyran olurdu. Ələlxüsus da Loğman Ovqanın sapsağlam olduğuna, heç bir azar-bezarı eyninə gətirmədiyinə təəccüb edirdi. Hər necə olsa da, ayrılıq zamanı Loğman dostu Ovqanı toqqadan yuxarı soyundurub canını yoxladı, ürəyinə qulaq verdi. Loğman gördü ki, canı-başı sağ-salamat olmaqla Ovqanın misli-bərabəri, bəlkə də, bütün dünyada az-az tapılar. Necə deyərlər, onun canı buz baltası kimidir! Loğman çoxlarının dərdini müəyyən edib dərman eləmişdi, amma Ovqanda heç bir dərd tapmadı. Durub mənalı nəzərlə intəhasız bozaq düzəni süzdü:

– Sənə bir tapşırığım var, – deyə öz gözlərini çobanın bulaq kimi qaynayan gözlərinə zillədi, onun şəvə kimi qara bığlarını əli ilə tumarlayıb, ata məhəbbəti ilə sözünə davam etdi, – mənim saçım da, saqqalım da, bax, o yuxarı dağların qarı kimi ağarıbdır, Ovqan! Sözümə qulaq ver, sənə bir tapşırığım var!

– Can-başla tapşırığına əməl elərəm, Loğman!

– Gərək canla-başla əməl eləyəsən ki, dağı-aranı gəzə-gəzə azı yüz il yaşayasan!

– Lap son nəfəsimə qədər mən bu qoyunun içində olacağam, Loğman!.. Nə vaxt ki, küləklər tütəyimin səsini sənə çatdırmadı, onda bil ki, daha mən ölmüşəm!

– Bəs mən necə? Bəyəm mənə ölüm-itim yoxdur?

– Nağıllardan yəqin bilirəm ki, Loğmana ölüm yoxdur, onun ömrü dünya durduqcandır.

– Sənə bir tapşırığım vardır, Ovqan! Gərək, sən ayıq-sayıq olasan, gərək sən ilan-çayandan özünü qoruyub, gözləyəsən!

– Ayıq-sayıq olmuşam, amma urcahıma çıxan heç bir ilan-çayanı öldürməmişəm.

– Bəs niyə? Bəs nə üçün bu qədər ehtiyatsızlıq eləmisən?!

– Düzü, həmişə yoluma çıxan ilan-çayanı sağ-salamat buraxmışam!

– İlan-çayan sənin girəvəni alıb, ya sən ilan-çayanın?

– Düzü, indiyəcən mən ilan-çayanın girəvəsini almışam!

– İnnən belə urcahına çıxan ilanın başını, bax bu toppuzla əzginən, Ovqan!

– Axı, ilan hər dəfə mənim qabağımda dil çıxarıb yalmayır?

– Atalarımız əcəb deyib: “İlanın ağına da lənət, qarasına da!”.

– Bu misallardan mən özüm də çox bilirəm, Loğman!

– Bəs onda niyə bilə-bilə əməl eləmirsən?

– Düzü, Loğman, qarşıma çıxan ilan dil çıxarıb toppuza təslim olandan sonra demişəm, qoy sürünüb rədd olsun cəhənnəminə!

– Bəlkə, sən ilandan qorxursan, Ovqan? Qorxursan ki, birini acıdasan, dönüb qoşun düzəldə, üstünə sürü-sürü gələlər?

– Xeyr, gücə görə yox, yalmanıb-yalvardıqlarına görə! Yoxsa mən ilanın da, əjdahanın da gücünə güc göstərərəm, necə ki, canavarlara güc göstərirəm!

– İlan canavardan qorxuludur, Ovqan!

– Ancaq canavar heç zaman ilansayağı yalmanmır!

– Buna görə də dil çıxaran ilan diş göstərən canavardan qorxuludur!

– Düzdür, ölüm ayağında ilan göz yaşı töküb ağlayır, amma canavar ölüm ayağında daş-qayanı gəmirir!

– Qarşında dil çıxarıb yalmanan, göz yaşlarını gilə-gilə töküb axıdan, sənin toppuz çomağından sovuşmağa çalışan ilan canavardan qat-qat qorxuludur, Ovqan! Sən ayıq-sayıq olsan, bu sağlam canınla, şübhəsiz, yüzdən yuxarı yaşayacaqsan, amma ilana güzəştə getsən, ömrünü vaxtsız-vədəsiz çürüdəcəksən!

– Onsuz da mən yüzdən yuxarı yaşayacağam, ilan mənə heç nə edə bilməz!

– Axır bil ki, ilan ilandır!

– Yəni demək istəyirsən ki, o öz xasiyyətini dəyişməz?

– Əsla!

– Əgər, mən urcahıma çıxan ilana aman verib, ona öz xasiyyətini dəyişdirtdirsəm, necə?

– Belə möcüzəyə inanmaram, Ovqan!

– Əgər, mən Loğmanı inandırsam, necə?

– İnansam, yəqin quruyub daşa dönərəm!

– Yaxşı, baxarıq! – deyə Ovqan Loğmanın yelqanadlı qızıl boz atını çəkib gətirdi. Loğman atına minməzdən qabaq ayaq saxladı. Ovqana bərk-bərk tapşırdı ki, bəs dara düşəndə mənə xəbər yetirərsən.

– Necə xəbər yetirim, Loğman?

– Küləklə, tufanla!

– Əgər külək-tufan olmasa?

– Buludlarla bildir!

– Əgər göy üzündə buludlar olmasa?

– Günlə xəbər göndər!

– Gün də olmasa?

– Sən məni ürəyindən keçir, hər harada olsam, bir göz qırpımında yanına gələrəm, dadına-imdadına çataram!..

Ayrılıq zamanı nə içə hər iki dost birdən kövrəldi, onlar qol-boyun oldular. Loğman yelqanadlı boz atının belinə qalxıb, cilovunu tərpətdi, Muğan düzündə gözdən itdi.

Bu söz-söhbətdən sonra Ovqanın boynuna ağır yük düşdü. O, iki il aranda ilan axtardı, urcahına heç nə çıxmadı. "Bəlkə, Loğman ilanların dilini bilirdi", – deyə Ovqanın fikri dolandı. – "Bəlkə o, mənim dərdimdən ilanları dilə tutub, Muğandan çıxarıbdır? Bəlkə də boz atının üstündə qanadlanıb Muğana sehrli dava-dərman səpib, ilan-çayanı tamam qırıbdır?. Axı necə ola bilər ki, ildə azı-azı yüz ilanla rastlaşan Ovqanın urcahına bir ilan da çıxmasın, onun toppuz çomağının qabağında dil çıxarıb yalmanmasın? Nə isə, Loğmandan ayrılanın üçüncü ili Ovqan qoyunlarını yaylaqdan aran şoranına endirirdi. Gün qovurmuş torpağın cadarından kömür kimi qara qartmaqlı bir ilan çıxıb, onun üstünə cumunca, Ovqan çomağını çəkib "İlanın ağına da lənət, qarasına da!" – deyə cəld bu məlunun başını əzmək istədi. İlan əyri-üyrü dişləri arasından nazik dilini çıxarıb yalmandı, zil qara şüşəni andıran gözlərindən gildir-gildir yaş tökdü.

– Öldürmə məni, Ovqan!

– Axı, sən məni öldürəcəkdin. İndi mən hansı hesaba görə səni sağ-salamat buraxım?

– Əvvəlki yüz-yüz hesaba görə!

– Necə əvvəlki yüz-yüz hesaba görə?

– Çünki mən hər ili azı-azı yüz kərə səni çalmaq istəmişəm, ancaq sən mənə girəvə verməmisən, məni sağ-salamat buraxmısan!

– Bəs niyə indiyəcən məndən üzülüb əl çəkməmisən?

– Çünki ilan olanın xasiyyəti belədir!

– İndi bəs mən haradan bilim ki, sən xasiyyətini dəyişib, bir günü girəvə tapanda məni çalmayacaqsan?

– And içirəm sənə, Ovqan, sənə and içirəm! Mənim bu əyri-üyrü dişlərim heç zaman sənin bu sapsağlam canına qıymayacaqdır!

– Bəs andını pozsan necə?

– Həmişə ayıq olarsan, Ovqan! İşdir sənin qəsdinə duraramsa, bu başımı o qurğuşun çomağınla əzərsən, sonra da bir qaratikan kolunun üstündən üzüaşağı asarsan, ta gecə göydə ulduz görüb öllləm!..

– Mən sənin andına inansam, öz zəhər tuluqlarınla sağ-salamat qoysam necə?

– Sən məni salamat buraxsan, mən əhdimə vəfa edib, dostun Loğmanın hikməti ilə əzəlki halıma qayıdıb, mələk ollam!

Bu söz-söhbətdən sonra Ovqan toppuzbaşlı çomağını dayandırdı. Qara qartmaqlı ilan bir bölük qoyunun da keşiyini çəkməyə başladı. Ovqan ürəkdən inanıb, ilanla ülfət bağladı. Yazda ilan selə düşəndə onu dartıb çıxartdı, qışda ilan donanda onu öz yapıncısının altına alıb, qızdırıb donunu açdı. Belə-belə yenə də azı yüz kərə ilana aman verib, onu ölümdən qurtardı. Ancaq qara qartmaqlı ilan hər il yenidən qabıq qoysa da, dişlərinin dibindəki zəhər tuluqları ilə birlikdə dəyişməz qaldı. Xeyirxah niyyətlə yaşayan Ovqana elə gəldi ki, zahiri görünüşünü dəyişə bilməyən ilan içəridə xasiyyətini dəyişibdir. İndi bu ilanı bir neçə sınaqdan da çıxarmaq gərəkdir ki, Ovqan Loğmanı çağırsın, əhvalatı açıb ona desin, təvəqqe eləsin, ilanı ilanlıqdan çıxarıb, əzəlki mələkliyinə qaytarsın!

Ancaq buna aman olmadı. Ovqanın ovqatı gündən-günə təlx oldu. Onun ağzında dad qalmadı. "Yəqin qızdırma tutmuşam", – deyə Ovqan gümana düşdü... Yerdə sərili qalan Ovqanın dili tərpənəsi olmadı, ürəyindən Loğmanı keçirdi. Yelqanadlı boz atını minən Loğman özünü Ovqana yetirdi, ancaq dostu ilə kəlmə kəsmək mümkün olmadı. Loğman qar kimi dümağ saqqalına həkimanə əl gəzdirib düşünə-düşünə durdu. Dönüb diqqətlə yan-yörəyə baxdı. Qamış dəyənin qapısının astanasında, yumşaq torpaq üstündə əyri-üyrü iz gördü... O, tez Ovqanın bütün bədənini diqqətlə yoxladı. İlanın dişindən çobanın bədənində heç bir iz-əlamət görmədi. Loğman mühakiməsi ilə müəyyən etdi ki, öz əhdini ağ-açıq poza bilməyən, çobanın fürsətini oğurlayıb, girəvə tapa bilməyən ilan Ovqanın xörəyinə zərrə-zərrə zəhər damızdırıb, ömrünü azı-azı altmış il azaldıbdır. İş işdən keçdiyinə görə, Loğman dostunun dərdinə dərman tapa bilmədi. Nəhayət, Ovqanı Muğan torpağına tapşırdı.

Loğman onun toppuzbaş çomağını yadigar götürdü, atına süvar olub getdi. Bir bölük qoyun qəbrin yan-yörəsində mələşə-mələşə qaldı. Elə bil ki, Muğan düzünə heybətli ağlaşma düşdü. Ovqanın ölümünün ili tamam olunca, Loğman çomağı götürüb yelqanadlı boz atını mindi, dostunun qəbrini ziyarətə gəldi. Üstündə ot-ələf dikələn qəbrin bir yerdən oyulub-deşildiyini gördü. Loğman tamam-kamal şübhədən

çıxdı, hər iki gözündən dümağ saqqalına qanlı göz yaşı axıtsa da, axır ki, özünü toxtatdı. Loğman uzağa getmədi, girəvədə durub gözlədi, gecə-gündüz gözünə çimir gəlməyə qoymadı. Bir sabah ertə qara qartmaqlı ilan qəbirdən çıxar-çıxmaz Loğman Ovqanın toppuzbaş ço-mağını qaldırdı, girəvəsi kəsilən ilan eynən dilini çıxarıb yalmansa da, Loğman fürsəti fövtə verməyib, onun başını əzdi, göydəki ulduzu görüb biryolluq ölməyi üçün onu çomağı ilə ortasından götürüb quru qaratikan kolunun başından üzüaşağı asdı. "İlanın ağına da lənət, qa-rasına da!" – deyib Ovqana xatırlatdığı misalı özlüyündə dönə-dönə təkrar etdi, boz atının belinə qalxıb Aran ölkəsinin küləklərinə qarışdı...

*iyun 1963-cü il*

## MÜNDƏRİCAT

| | |
|---|---|
| Buraxılışa məsul: | *Əziz Güləliyev* |
| Texniki redaktor: | *Rövşən Ağayev* |
| Tərtibatçı-rəssam: | *Nərgiz Əliyeva* |
| Kompyuter səhifələyicisi: | *Rəşad Həmidov* |
| Korrektorlar: | *Elmira Teymurova*<br>*Pərinaz Səmədova* |

Yığılmağa verilmişdir 22.11.2004. Çapa imzalanmışdır 07.06.2005.
Formatı 60x90 $^{1}/_{16}$. Fiziki çap vərəqi 18. Ofset çap üsulu.
Tirajı 25000. Sifariş 147.

Kitab “Şərq-Qərb” mətbəəsində çap olunmuşdur.
Bakı, Aşıq Ələsgər küç., 17.